AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI
ŞƏKİ REGİONAL ELMİ MƏRKƏZİ

# ŞƏKİDƏ MƏHƏLLƏ ADLARI, SOYLAR VƏ LƏQƏBLƏR

## I KİTAB

(QORUQ ƏRAZİSİ)

Bakı – 2004

Hazırlayanlar: **Zəkəriyyə Mabud oğlu,**
**Sevinc Bəharəddin qızı**

Redaktoru
filologiya elmləri doktoru, prof.
**Məhərrəm Qasımlı**

**Şəkidə məhəllə adları, soylar və ləqəblər, I kitab** (qoruq ərazisi). "Nafta-Press" nəşriyyatı: Bakı, 2004.

Kitab qədim Şəkinin məhəllə adları, soyları və ləqəblər mövzusunda geniş əhatəli araşdırmalar istiqamətində sonuncu yüzillikdə irəli atılan ilk addımdır. Kitab bu və ya digər səbəbdən öz doğma yurdundan, el-obasından ayrı düşmüş, lakin qohum-qardaşları haqqında cüzi bir məlumat əldə etməyi özlərinə böyük xoşbəxtlik hesab edən mühacir soydaşlarımız üçün və ali məktəblərin tarix, coğrafiya və filologiya fakültəsinin tələbələrinə, eləcə də məhəllə komitələri və bələdiyyə işçilərinə məhəllələrin sərhədlərinin dəqiqləşdirilməsi və tarixi şəxsiyyətlərin-toponimlərin, etnonimlərin və əcdadlarımız üçün müqəddəs hesab olunan yerlərin qorunub saxlanması işinə köməklik göstərmək istəyənlər üçün nəzərdə tutulur.

Ş $\frac{0505000000-1}{071-2004}$ Qrifli nəşr



## DÜNƏNİ YAŞADAN, SABAHLARA İSƏ SORAQ APARAN KİTAB

Azərbaycanın istər maddi, istərsə də mənəvi mədəniyyət baxımından ən koloritli, ən unikal bölgələrindən biri sayılan Şəkinin hər daşı, hər zərrəsi özündə sirli-sehrli bir tarix yaşadır. Bu ulu torpağın daşında, divarında olduğu kimi, el-ulusunun səsində, ləhcəsində, yüyrək, xətrixoş danışıq tərzində, zəngin ekzotikaya malik etnoqrafik yaşam biçimində də Azərbaycanımızın qədimliyi, əski çağlara gedib çıxan ilkinliyi qərarlaşıb. Qədim türklərin qürur və güvənc yeri olan «sak» tayfalarının Şəkinin etnik yaddaşını – tarix içindəki milli-mənəvi özül daşını təşkil etməsi mötəbər mütəxəssislər tərəfindən dönə-dönə təsdiqlənib. Oğuz və qıpçaq boylarının folklor-etnoqrafiya, eləcə də dil-ləhcə özünəməxsusluğunun burada bənzərsiz bir mühafizəkarlıqla qorunduğunu müəyyənləşdirmək elə də böyük zəhmət tələb etmir. Yaşı yeddidən yetmiş yeddiyə qədər olan hər bir şəkilinin söz-söhbətində, yerişduruşunda, dünyabaxışında bu keyfiyyətlər qabarıq cizgilərlə görünməkdədir.

Dulusçuluqdan, dəmirçilikdən tutmuş ta zərgərliyəcən ən müxtəlif sənət sahələrində öz işinin ustası kimi tanınan, ticarətin, alış-verişin halallıq üstündə qurulmasına böyük önəm verən, şirniyyatçılıq, ipəkçilik kimi zərif və həssas peşələrin incəliklərini misilsiz məharətlə mənimsəyib nümayiş etdirən şəkililər həm də söz sərrafıdırlar. Eyhamlı danışmağı, sözümətləbi dolayısıyla çatdırmağı, narazılıqlarını, inciklikərini belə nəzakətli bir təbəssümə bürüyərək yetirməyi xoşlayandırlar. Sözdən söz çəkən olduqlarından ölçülü-biçili danışarlar, hər hərəkətin, hər addımın mizan-tərəzidən keçəcəyini bildiklərindən həm özlərinin, həm də başqalarının davranışlarına həssaslıqla yanaşarlar. Şəki müdrikliyi bax beləcə ərsəyə gəlib. Gələni-gedəni xoş növaziş, mehr-məhəbbətlə elə qarşılayıb yola salıblar ki, ipək-şəkər almağa gələndən tutmuş

saz-söz xiridarınacan hər kəsin ürəyində unudulmaz bir Şəki şirinliyi qalıb.

Yüzilləri müdrik bir təbəssümlə yorub yola salan Şəkimiz zərif, incə memarlığın, naxışlarının misli-bərabəri olmayan qədim şəbəkə sənətinin əzəli, ana beşiklərindəndir. Bir yandan boşalıb bir yandan dolan karvansaralar, Tanrı dərgahında ibadətə hər zaman müntəzir dayanan minarəli məscidlər, daş döşəməli dolanbac küçələr, dalanlar, qapı-pəncərələri, aynabəndləri heyrətamiz şəbəkə naxışları ilə süslənmiş əhtişamlı imarətlər, öz adı – öz dadı olan buz bulaqlar, gözəlliyi ilə göz doyduran bağ-bağatlar, səliqə-sahmanlı həyət-bacalar... Tarix içindən üzü bizə sarı bu görkəmdə gəlir xan duruşlu, xan saraylı Şəkimiz!

Bu ulu torpağa, bu sevimli xətrixoş camaata ad-san, əsl-nəcabət gətirən onun adamlarıdı. Peşəsinə, kök-köməcinə, qabiliyyət, davranış və məharətindən tutmuş boy-buxununa, geyim-keçim tərzinəcən ən müxtəlif əlamətlərinə görə hər məhəllə, hər nəsil-tayfa Şəki nizam-tərəzisindən bir ad alıb, ləqəb qazanıb: Giləhli, Papaxçılar, Qəssab Qədirlər, Hacı Mahmud əfəndilər, Gəncəlilər, Qoç Abbas Hamamı, Ətəyidaşlılar, Peyğəmbər Giləhli və s. bunların hər birisinin arxasında tarix içindən gələn sirli-hikmətli mətləblər, folklor, etnoqrafiya materialları, maddi və mənəvi mədəniyyətimizə dair unikal informasiyalar dayanır. Bu mənada adlarda, nəsil-soylarda, ləqəblərdə yaşayan tarixi cizgilərin öyrənilməsi olduqca vacib və əhəmiyyətlidir. Təkcə daşın-divarın, qalanın, memarlıq abidələrinin deyil, dil-ləhcə, folklor və etnoqrafiya realilərinin də qorunması, yazıya alınıb incələnərək şərh olunması bir çox qaranlıq problemlərin aydınlaşmasına imkan aça bilər. Şəki memarlığının, mətbəx mədəniyyətinin, lokal ləhcə elementlərinin, regional toy-yas adət-ənənələrinin, güzəran özəlliklərinin daşıyıb gətirdiyi adlar, sirli-hikmətli sözlər hər birisi əslində qatı açılmamış bir tarix yadigarıdı. Onlara qarşı həssas və qayğıkeş olmaq hər birimizin borcumuz, vicdan işimizdir. Çünki Şəkidə daşlara, imarətlərə, məhəllələrə və hətta ləqəblərə hopmuş adların böyük əksəriyyəti tarixi adlar – tarixi sözlərdi. Həmin tarixi adlar – toponim, oykonim, patronim, etnonim, hidronimlər əsrlər, qərinələr boyudur ki, Şəkinin tarixini daşıyır, yaşadır. Şəkinin tarixi isə istər maddi, istərsə də mənəviyyat baxımından Azərbaycan tarixinin ayna axarlarından, şah damarlarından biridir.



Uzun illərdən bəridir ki, Azərbaycan Milli Elmlər Akademiyasının Şəki Regional Elmi Mərkəzində Şəkinin mənəvi və maddi mədəniyyət tarixi ilə bağlı sistemli və dəyərli işlər aparılmaqdadır. Oxuculara və elmi ictimaiyyətə təqdim olunan «Şəkidə məhəllə adları, soylar və ləqəblər» kitabı da sözü gedən istiqamətdə hazırlanmış qiymətli tədqiqatlardan biridir. Gərgin və ağır zəhmət bahasına ortaya çıxmış bu əsər həm tarixi-informativ qaynaq, həm də folklor, dil və etnoqrafiya materialı kimi olduqca əhəmiyyətlidir. Burada qorunan, əzizlənən, sevilən, qürur duyulan tarixlə yanaşı, sabahı yüzillərə, gələcək nəsillərə ləyaqətlə təqdim edilən bir elmi ərmağan, əmanət qərarlaşıb. İki cild olaraq nəzərdə tutulan toplama-tədqiqatın birinci hissəsi kimi təqdim olunan bu kitabın indinin özündə də əhəmiyyət və dəyəri misilsizdir. Ancaq onun bir məxəz, unikal qaynaq şəklində yüz, iki yüz il sonra hansı mərtəbəyə və qiymətə yüksələcəyini də düşünmək və görmək də gərəkdir.

**Məhərrəm Qasımlı**
*professor*

*Görkəmli tarixçi alim, Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü, gözəl insan, qayğıkeş müəllim mərhum **Mahmud İsmayılın** əziz xatirəsinə ithaf olunur*

# GİRİŞ

Bismillahir-rahmanir-rəhim. Bütün canlı və cansız Aləmlərin yaradıcısı, həm də bu dünyamızın və qiyamət gününün sahibi olan allah-təalanın adını uca tutaraq, zəngin milli-mədəni ənənələrə, eləcə də özünəməxsus seçimli folklor sərvətinə malik qədim Şəkidə məhəllə adları, soylar və ləqəblər kimi olduqca məsuliyyətli və müqəddəs bir mövzunun işlənməsinə başladıq. Mənsub olduğu xalqın, yaşadığı yurdun tarixini, adət-ənənəsini, hər bir irili-xırdalı dəyərlərini bilən, yurdunu küçəbəküçə, nəsilbənəsil, adbaad tanıyan-bilənlər həmişə dəyərli, sayımlı-seçimli şəxsiyyətlər olmuşlar. Bu bilgi və maraq yurda bağlılığın, xalqına sevginin təzahürlərindən biridir.

Qədim Şəki islami qayda, dədə-baba adət-ənənəsi ilə yaşayan şəhərdir. Qədim yurdun müsəlmançılıqdan öncə tarixən türk yurdu olduğu da danılmazdır.

Mövcud yerüstü maddi mədəniyyət abidələri, aparılan arxeoloji tədqiqatlar bu yurdun qədim yaşayış məskəni olduğunu lazımınca təsdiq etmişdir.

Qədim məskənlərin hər birində olduğu kimi, bu yurdun da toponimik adları xalqın mənsub olduğu təbii iqlim və ehtiyatları ilə, dini, inkişaf dərəcəsi və psixologiyası ilə, sevimli məşğuliyyəti, geyim növləri, bər-bəzəyi ilə, tayfa, nəsil, tirə adları ilə bağlı yaranıb.

Cünləri, ayları çevrələyən gərgin axtarışlarla, min bir zəhmət bahasına damla-damla topladığımız məlumatları qənimət bilərək işləmişik. Yaşlı nəsil nümayəndələri, xüsusən də XX yüzilliyin əvvəllərində doğulanlar az qaldığı üçün araşdırmalarımız son dərəcə çətin olsa da, gələcək nəsil üçün çox əhəmiyyətlidir.



Çar Rusiyasının və qırmızı imperiyanın işğalı, tuthatutu, repressiya qurbanları, varidat və mülk talanı bu qədim şəhərə həmişə göynər yaralar vurub.

Nəticədə mövcud quruluş bütün sahələrdə xələflər və sələflər arasında bir əsrə bərabər ayrılıq yaratmışdır. Nəvə-nəticələr öz ata-babalarının yazı dilini, tarixini, soy-kökünü bilməz olmuşlar. Qədim, qiymətli kitablar, əlyazmalar taraş edilmiş, oğurlanmış, yığılıb yandırılmışdır. Ev xanımlarının çoxu qorxudan təndirlərdə qalaq-qalaq qiymətli kitablar yandırırdılar. O zaman çox təndirlər ağappaq ağarmışdı.

Necə deyərlər, min ilin sərvətini beş-on ilin içində ivanla vartan yox etdi, qalanını da dövran əlçatmaz etdi. Bu qeyd olunanlar bir növ təkrar da olsa, fakt faktlığında qalır. Məlumdur ki, dini mənsubiyyətindən asılı olmayaraq Azərbaycana qarşı min illər boyu ərazi iddiasında olan qonşular müxtəlif bəhanə və uydurmalarla nəyin bahasına olur-olsun Şimali Azərbaycan türklərinin bu məkana sonralar gəldiyini iddia edir və bu hesaba Şimali Azərbaycanı parçalayıb, torpaqlarını özününküləşdirməyə çalışıblar. Bu işdə mənfur qonşuların qarşısına elmi əsaslandırılmış sübut və dəlillər qoymağa icazə verilməmiş və buna səy göstərənlər daim millətçi damğası ilə işgəncələrə məruz qalmış, təqib olunmuşlar.

Nəhayət, çox şükürlər olsun ki, ulu tanrının himayəsi altında gec də olsa respublikamız öz müstəqilliyini bəyan etmiş və qeyd olunan siyasi xarakterli qoruq-qadağalar aradan götürülmüşdür. Və son on-on beş ildə bu səpgidə bir çox qiymətli əsərlər, samballı elmi məqalələr dərc edilmişdir.

Qeyd olunanlara bir qədər aydınlıq gətirmək məqsədilə görkəmli tarixşünas alim professor Yusif Yusifovun bu məsələ ilə əlaqəli yazdıqları bəzi məqamlara diqqət yetirək (53).

"Azərbaycan xalqının mənşəyi" problemi əsrimizin otuzuncu illərinin zillətli qeyri-milli siyasəti ilə yanlış bir istiqamətə yönəldildi. Aydındır ki, "Azərbaycan xalqı" dedikdə onun türk dilində danışan çoxsaylı əhalisi nəzərdə tutulurdu. Həmin

dövrün ortalarında bu xalqın mənşəyi problemi heçə endirildi, "türk" və "türk dili" sözləri "azərbaycanlı" və "Azərbaycan dili" sözləri ilə əvəz edildi. Azərbaycan türk xalqı və dili yer adını təmsil edən ümumi məfhum içində əridildi. Azərbaycan xalqının yetkinləşməsi gedişində türk etnoslarının iştirakı tədqiqat obyekti kimi sönükləşdi, adda-budda eşidilən səslər isə siyasi yollarla susduruldu.

Midiyalılar Azərbaycan xalqının əcdadları kimi qələmə verilməyə başlandı. 30-cu illərdə xarici elmi ədəbiyyatda midiyalıların mənşəyi barədə iki fikir mövcud idi. Bir fikrə görə, onlar İran (fars) dillərinin birində, digər fikrə görə, yerli qədim dillərin birində, yaxud elam dilinə yaxın bir dildə danışırdılar. Azərbaycan Sovet elmində ikinci müddəa üstünlük təşkil edirdi.

Lakin 60-cı illərdə bu müddəanı birinci fikir - yəni midiyalıların İrandilli olması fikri üstələdi.

Azərbaycan xalqının mənşəyi problemi dolaşdırıldı, tədricən irandilli etnoslar onun mənşəyində iştirak edən əsas etnik komponent kimi təbliğ edilməyə başlandı. Beləliklə, hələ 20-ci illərdə İran, sonra Sovet tarixşünaslığında türk etnoslarının Azərbaycana XI-XII əsrlərdən etibarən gəlməsi ideyası yenidən baş qaldırdı. Bu əsassız ideyanı əbədiləşdirmək istəyən qüvvələr müəyyən siyasi məqsəd güdürdülər, guya Azərbaycan türkləri bu əraziyə gəlmədirlər. Bu minvalla Azərbaycanın şimal hissəsi qədimdə Dağıstan dilli (ləzgi, udi-udindilli) əhalinin məskəni olması və sonralar onların türkləşməyə məruz qalması ideyası tədricən ortaya atıldı.

Heç bir əlavə tədqiqat aparılmadan köhnə fikirlər yenidən canlandırıldı. Eyni zamanda 60-cı illərdə türk etnoslarının Azərbaycanda XI-XII əsrlərdən əvvəl yaşamaları barədə ilk tədqiqatlar aparılmağa başlandı. Yeni tədqiqat istiqamətləri meydana gəldi.

70-ci illərdə erkən orta əsr qədim erməni qaynaqlarında türk mənşəli sözlərin, şəxs və yer adlarının ayırd edilməsi sahəsində mühüm iş görüldü.



Sübut olundu ki, erkən orta əsrlərdə Azərbaycan ərazisində müxtəlif etnik ad altında türk etnosları yaşayırdı, oğuz dilləri əsasında Azərbaycan türk dili yetkinləşirdi və ünsiyyət vasitəsinə çevrilirdi.

80-cı illərdə bu istiqamətdə tədqiqatlar davam etdirildi və yeni istiqamətdə araşdırmalar aparılmağa başladı. E.ə. III-I minilliklərə aid mixi, yaxud mismari yazılarda türk mənşəli sözlər, şəxs və yer adlarının müəyyənləşdirilməsi sahəsində ilk elmi addımlar atılmağa başlandı. Bəlli oldu ki, türk etnosları ta qədim dövrlərdən bu ərazilərin sakinləri idilər və hələ ən qədim dövrlərdə geniş bir ərazidə türk etnoslarının yerdəyişmələri baş verirdi. Deməli, türk etnosları Azərbaycana gəlmə deyil, onun ən qədim sakinləridirlər. 90-cı illərin ortalarında tarix, etnoqrafiya və toponimika sahəsində çoxlu elmi məqalələrin və elmi əsərlər müəllifi görkəmli alim professor Q.Qeybullayevin geniş oxucu kütləsinə təqdim etdiyi "Azərbaycan türklərinin təşəkkülü tarixindən" adlı dərin məzmunlu monoqrafiyası bəzi diletant tarixçi alimlərə sanballı cavab oldu (53).

Alimin toponimik tədqiqatları bir daha sübut etdi ki, "Azərbaycan türkləri bu ölkənin qədim sakinləri olmuş və öz doğma yurdlarında dillərinə uyğun yer adları yaratmışlar. Məlumdur ki, hər hansı bir xalqın etnik tarixi barədə məlumat yazılı məxəzlərdən əldə edilir. Əgər yazılı qaynaqlarda kifayət qədər məlumat qalmamışdırsa, onda müxtəlif dövr yazılarında əks olunmuş yer (toponimlər) və şəxs (antroponimlər) adları başlıca məxəz yerini tutur. Qədim və orta əsr yer və şəxs adlarının dil mənsubiyyətinin müəyyənləşdirilməsi mürəkkəb bir elmi prosesdir".

Bu qeyd olunanlar araşdırılmasına başladığımız mövzunun əhəmiyyət və aktuallığının yalnız bir tərəfi-tarixi etnoqrafik istiqamətdə vacibliyinə dəlalət edir. İkinci daha əhəmiyyətli məsələ Azərbaycan türklərinin bu ərazidə məskunlaşdıqdan sonra, hansı tayfa və qəbilə birləşmələrinin iştirakı ilə təşəkkül tapıb, ortaq dillər hesabına vahid danışıq dilinin yaranması və

mövcud arxaik sözlərin hansı dildən götürülməsi tarixinin müəyyənləşdirilməsidir-yəni dilçilik tarixinin bəzi mübahisəli məqamlarının dəqiqləşdirilməsinə folklor örnəklərinin yeni məlumatları ilə kömək etməkdən ibarətdir.

Q.İ.Məşədiyevin qeyd etdiyi kimi, toponimlər bu və ya digər xalqın, tayfanın adından və həmin xalqın danışığındakı sözlərdən, coğrafi obyektlərin ünvanlarından ibarət olduğuna görə tarix, dilçilik və coğrafiya elmləri ilə sıx bağlıdır (59). Xüsusilə qeyd etmək lazımdır ki, coğrafi adların-toponimlərin öyrənilməsi bir çox mübahisəli məsələlərin düzgün araşdırılmasında müstəsna rol oynayır. Azərbaycan toponimiyasının tədqiq olunmasının böyük elmi əhəmiyyəti ilk növbədə Azərbaycan türklərinin, həmçinin burada mövcud olan etnik qrupların və tayfa birləşmələrinin Azərbaycan tarixində oynadığı rolun müəyyən edilməsində, yer adlarında əks olunan mədəni irsin öyrənilməsindədir. Müxtəlif tayfa və xalq adlarını əks etdirən coğrafi adlar (etnotoponimlər) xalqın tarixini öyrənmək üçün daha qiymətlidir, çünki etnotoponimlər aid olduğu xalqın, tayfanın etnik mövcudluğunu əks etdirən amillərdən ən əsaslısıdır. Etnotoponimiya xalqın müxtəlif tarixi dövrlərdə, müxtəlif etnolinqvistik qruplar və etnik birləşmələrlə mövcud olmuş əlaqələri müəyyən etməyə imkan verir. Dil tarixinin, eləcə də xalqın tarixinin və etnoqrafiyasının öyrənilməsində onomastik göstəricilər etibarlı mənbələrdən biridir. Çünki bunlarda nəinki coğrafi adlar, etnonimlər, şəxs adları, toponimlər və s., hətta dilin leksik-morfoloji xüsusiyyətləri müəyyən sinxronik aspektdə əks olunur.

Bu qeyd olunanlarla yanaşı, Azərbaycan türklərinin qədim yaşayış məskənlərindən biri hesab olunan və bir çox özəllikləri ilə respublikanın digər rayonlarından xeyli fərqlənən Şəkidə məhəllə adları, soylar və ləqəblərin öyrənilib araşdırılması nəticəsində aşkar olunacaq bir çox məlumatlar gələcək tədqiqatçılar üçün öz ixtisasları üzrə aparacaqları araşdırmalarda qiymətli mənbə rolunu oynayacaqdır.



Beləliklə, bu qısa məlumatlardan sonra, "Şəkidə məhəllə adları, soylar və ləqəblər" kitabının möhtərəm oxucularına bir qədər də bu ideyanın yaranma tarixcəsindən məlumat vermək yerinə düşərdi. Azərbaycan folkloru ilə maraqlanmağa başladığımız on-on beş ildə bu elmin nə dərəcədə vacib, əhəmiyyətli, elmlərin digər sahələri ilə də əlaqəli olmasını dərk etdikcə, belə bir qənaətə gəlmişik ki, bütün elmlərin başlanğıcında o sahəyə aid folklor örnəkləri araşdırılıb, müasir dövrlə müqayisə edildikdə alınan nəticələr daha mükəmməl, daha dolğun və etibarlı olur. Ona görə də folkloru öyrənmək, ondan hər yerdə, hər zaman istifadə etmək, müəllifi kamilləşdirməklə yanaşı, onun zəhmət çəkib yazdığı əsəri də gözəlləşdirir. Folklor örnəklərinin müxtəlif janrları ilə tanış olduqca bu elmin zənginliyi ilə yanaşı, əcdadlarımızın bu şifahi xalq yaradıcılığı memarlarının müdrikliyinə valeh olmamaq olmur.

Deyirlər keçmişini bilməyən xalqın gələcəyi də olmur. Bəzi yerlərdə keçmişi axtarıb, tapa bilməsələr də, Şəkidə yaxın və uzaq tarixlə rastlaşmaq bir o qədər də çətin deyil. Burada qədimilik keçmiş hər yerdə, hər işdə, adət-ənənədə, danışıqda, ləhcədə, mətbəx mədəniyyətində, çətin anları, məqamları yumorla, bəzən də istehzalı gülüşlə yola vermək o qədər geniş yer alıb ki, kənar adamlar bura təzə gələndə çox vaxt çaş-baş qalır, nəyin ciddi, nəyin zarafat olduğunu, danışıqda işlədilən arxaik sözlərin mənalarını, deyilən sözlərin ahəngini başa düşüb ayırd edə bilmirlər.

Bəzi arxaik sözləri hətta yerli sakinlərin özlərinin müxtəlif cür yozmaları və bir çox ləqəblərin mənalarını bilmədiklərini gördükdə bizdə öz-özümüzə belə bir sual yarandı ki, biz yerli sakinlər özümüz doğma Şəkimizi, özünəməxsus xüsusiyyətləri ilə seçilən bu qədim diyarı yaxşı tanıyırıqmı?

Eyni zamanda özümüzə məlum olmayan bəzi sözlərin, məhəllə adları və ləqəblərin mənalarını bizim Bakıda yaşayan tanınmış ziyalı və elm xadimlərindən soruşduqda, onların da qaneedici cavab vermədiklərini gördükdə bizdə belə bir qəti

fikir formalaşdı ki, xeyir biz Şəkini lazımınca yaxşı tanımırıq! Ona görə də Şəkini şəkililərə, yetişməkdə olan gənc nəslə tanıtmalıyıq.

Burada əziz oxuculara bir məsələni də xatırlatmağı vacib hesab edirik ki, doğma Azərbaycanımızın hər bir guşəsi, hər eli-obası bizim üçün olduqca əziz və qiymətlidir. Ona görə də hər hansı bir bölgənin, rayonun və ya kəndin adı, danışığı və ləhcəsi, adət və ənənəsi, geyimi və mətbəx mədəniyyəti heç vaxt, heç kəsin rişğənd obyektinə çevrilməməlidir. Əksinə, belə düşünənlərə başa salınmalıdır ki, bu əlamətlər, adlar, ləhcələr, adət-ənənələr qədim tarixə malik soydaşlarımızın minilliklər boyu qoruyub saxladıqları qəbilə və tayfalarının qan yaddaşının izidir, nişanəsidir. Onlar mütəxəssislər tərəfindən öyrənilib, araşdırılıb düzgün mənalandırılmalıdır. Unutmamalıyıq ki, bu qeyd olunan regional özünəməxsusluğun hər biri bizim qədim tariximizin qaranlıq səhifələridir. Həmin fikir eynilə də Şəkidə məhəllə adları, soylar və ləqəblərinə də aiddir. Məhəllə adları da, ləqəblər də öz-özlüyündə çox mətləblərdən xəbər verən, xalqın müdrik insanlarının uzun illərin müşahidələri nəticəsində müəyyənləşdirdikləri dəqiq informatik əlamətlərdir. Bunlarda da heç bir gülüş və ya istehzadan, rişğənddən söhbət gedə bilməz.

Və nəhayət, sonda bu kitabın nəşrə hazırlanmasında bizə öz faydalı məsləhətləri ilə köməklik göstərmiş sevimli xalq şairimiz Bəxtiyar Vahabzadəyə, işlərimizin gedişi ilə vaxtaşırı maraqlanıb, bizə mənəvi dayaq olduğuna görə Şəki şəhər İcra Hakimiyyətinin başçısı Əşrəf Məmmədov cənablarına, kitabın çapını səbirsizliklə gözləyən, mətndə adları çəkilən, tanıdığı din xadimləri haqqında öz səmimi xatirələrini danışıb ürəkdən xeyir-dua verən Şəki-Qəbələ bölgəsinin Qazisi hörmətli Hacı Səlim Əfəndiyə, məlumatların toplanıb nəşrə hazırlanmasında yaxından iştirak etmiş Regional Elmi Mərkəzin "Folklorşünaslıq və el sənətləri" laboratoriyasının əməkdaşları Nərgiz Saleh, Ulduz Bəşir qızı, Hədiyyə Şəfagül ilə yanaşı, R.Vəliyevə, H.Mustafabəyliyə, M.Osmanovaya, G.Məcidovaya, R. Əli-



yevaya, Y.Bəkirovaya, S.Məmmədova, rəssam T.Həmidliyə və toponimlərin dəqiqləşdirilməsi işində bizə köməyini əsirgəməyən Milli Elmlər Akademiyası Coğrafiya İnstitutunun aparıcı elmi işçisi Vasif Quluzadəyə, Xəritəçilik və toponimika şöbəsinin elmi işçisi Mahirə Əkbər qızına, bir də bizə öz nəsilləri, ata-babaları, əcdadları həqqında bildikləri, eşitdikləri məlumatları məmnuniyyətlə verən hər bir soydaşımıza dərin minnətdarlığımızı bildiririk. Xalqımızın milli-mənəvi dəyərlərinin qorunub saxlanması və eləcə də təbliğində əməyi olanların fədakarlığını yüksək qiymətləndiririk.

Məhəllə adları və ləqəblərin araşdırılmasına keçməzdən əvvəl, Şəki və Nuxa adlarının etimologiyası haqda elmi mənbələrdə və ağız ədəbiyyatında olan fikir və mülahizələri, şəhərin yaxın keçmişini hörmətli oxuculara bir daha xatırlatmağı məqsədəuyğun hesab edirik.

Bəzən şəhərlərin də taleyini insanların taleyinə bənzədir, onlarda nə isə bir oxşarlıq axtarırlar. Şəhərlər də öz istəkləri ilə yaranmır, yavaş-yavaş böyüyüb, genişlənib inkişaf edir, məşhurlaşıb varlanır, dövlətlənirlər. Ərazilərində olan dəbdəbəli saraylar, zəngin məhəllələr bəzən onlara bədbəxtlik gətirir, qəsbkarlar tərəfindən talan edilib, yerlə-yeksan olurlar, tarixlərdə yalnız adları qalır. Bəzən də əkiz şəhərlər olur. Əkiz-iki yerdə eyni adlı şəhərlərdən biri də sakini olduğumuz qədim Şəki, doğma Şəkidir.

Şəki haqqında ərəb, fars, türk, erməni, gürcü mənbələrində və orta əsr Avropa müəlliflərinin əsərlərində məlumat verilmişdir. "Şəki" toponiminə gəldikdə isə, bu toponim eramızdan əvvəl VI əsrdə Azərbaycanda məskunlaşmış Saka adlı qədim türk etnosu ilə əlaqələndirilir. I əsrdə yaşamış Yunan coğrafiyaşünası Strabon yazırdı ki, saklar Ermənistanda (bu, indiki Ermənistana heç bir aidiyyatı olmayan qədim türk məskəni olan coğrafi əraziyə aiddir) ən yaxşı yerləri tutaraq, oraya öz adlarını - sakasena vermişlər. Şəki toponimi qədim erməni mənbələrində və daha sonra ərəb mənbələrində məhz "Şakaşen" formasında xatırlanır. Buradan görünür ki, şakasaka etnoniminin fonetik şəklidir. Sakların həmin ərazilərdə olmasını sübut edən daha bir toponim Kiş çayının ən selli qollarından biri olan Çuxadurmaz dərəsi qarşısındakı Sarıgüney qolunun sol sahilindəki "Saklar talası" adlanan toponimdir.

Qeyd etmək lazımdır ki, bu toponim Şəki-Zaqatala zonası toponimləri kitabına adı düşməyən və tarixçilərimizə məlum olmayan ilkin məlumatdır (74).



Bununla yanaşı, Qax rayonu ərazisində qeydə alınmış "Sakan dərə" mikrotoponimi də sakların bu yerlərdə qədim məskənləri olmasına dəlalət edir. Burada "an"- "məkan", "yer" mənasını bildirir.

Özbək alimi D. Aytmuradov Sakların türksoylu olmasını qeyd edərək göstərir ki, saklar türk xalqlarının məskənləri olan Ön Aralda, Tyan-Şanın ətəklərində və Altay ərazisində yaşamışlar (74).

Bizans tarixçisi Menandr hələ 568-ci ildə yazmışdır ki, türklər qədimdə "saka" adlanmışlar. Şəki formasında bu toponimə ilk dəfə bizim eranın VI əsrə aid məlumatında rast gəlirik. V əsrə aid qədim gürcü mənbəyində Şirvan, Qax, Bərdə ilə yanaşı Şəkinin də adı çəkilir (53).

Digər Şəki (əkiz tayı) Qafqaz Albaniyasında qala, xarabalığı indiki Ermənistanın Sisian rayonunun Şəki kəndi yaxınlığında Bazarçayın sol sahilində Darvazatəpə dağındadır. Eyniliğında tarixi vilayətin mərkəzi olan Şəki qalası Biçənək aşırımında Arrana gedən yolun üzərində mühüm müdafiə nəzarət məntəqəsi rolunu oynamışdır. IX əsrin ikinci yarısında alban knyazı Səhl İbn Sumbatın əsas iqamətgahı olmuşdur (53).

Şəki şəhərinin 1772-ci ilədək Kiş çayının Əyriçaya töküldüyü yerdə, indiki Qaradağlı yaxınlığında yerləşdiyi güman olunur. Həmin ildə Kiş çayının daşması nəticəsində güclü sel Şəkini dağıdıb, əhali yaxındakı Nuxa kəndi ərazisinə köçmüşdür. Müəyyən müddət Şəki Nuxa adlandırılmışdır (43).

Maraqlı burasıdır ki, Nuxa da Azərbaycanın qədim yaşayış məskənlərindən biri olmuşdur. Nuxa adını Ptolomeyin (II əsr) "Coğrafi təlimnamə" əsərində adı çəkilən Niqa ilə eyniləşdirirlər.

Tarixi baxımdan eyni adlı vilayətin mərkəzi olmuş Şəki Qafqaz Albaniyasının mühüm şəhərlərindən idi. IV əsrdə Xristianlıq yayıldıqda Şəki əyaləti Qafqaz Albaniyasının dini mərkəzlərindən biri olmuşdur.

VII əsrdə Şəkini ərəblər işğal etmişdi. Ərəb-Xəzər müharibələri zamanı Şəki dəfələrlə əldən-ələ keçmişdi. Ərəb xilafətinin zəiflədiyi dövrdə Şəki əyalətində müstəqil hakimlik yaranmışdı. XI əsrdə Şəki Şirvanşahlar dövlətinin hakimiyyətinə keçmişdi. Azərbaycanın şimal-qərb torpaqlarını işğal etməyə çalışan gürcü feodalları bir neçə dəfə Şəkiyə hücum etmişdilər. Monqol işğalı Şəkinin iqtisadi həyatına ağır zərbə vurmuşdu. Lakin Elxanilər dövründə Şəki yenidən inkişaf etməyə başladı. Əhali sənətkarlıq, ticarət, çəltikçilik, bağçılıq, ipəkçilik və s. məşğul olmağa başladı.

Elxanilər dövlətinin tənəzzülü dövründə Şəki müstəqil hakimliyin mərkəzinə çevrildi. Bu dövrdə ölkəni Sidi (Seyid) Əli idarə edirdi. Teymurun Şəkiyə hücumu zamanı Sidi Əli ona ciddi müqavimət göstərdi. O, 1397/98-ci ildə şəkililərdən ibarət qoşunla Əlincəqalanın müdafiəçilərinə köməyə gəldi.

Sidi Əlinin ölümündən sonra hakimiyyətə keçən oğlu Sidi (Seyid) Əhməd Şirvanşah I İbrahimin vasitəçiliyi ilə Teymurla münasibətləri yaxşılaşdırdı. 1524-cü ildən Şəkini Dərviş Məhəmməd Xan idarə edirdi. Səfəvi şahı I Təhmasibin Şirvana hücumu zamanı Dərviş Məhəmməd Xan Şirvana köməyə gələrək qızılbaş qoşununa qarşı vuruşmuşdu. Bu, 1551-ci ildə Səfəvilərin Şəkiyə hücumu üçün bəhanə olmuşdu. Gələrsən-Görərsən qalasında Səfəvilərə kəsgin müqavimət göstərən Dərviş Məhəmməd Xan döyüşlərin birində öldürüldü.

Şəki əyaləti Səfəvilər dövlətinə birləşdirildi. Səfəvi-Osmanlı müharibələri zamanı 16-cı əsrin 80-cı illərindən Şəki Osmanlıların tabeliyinə keçdi. Şəki eyniadlı sancağın mərkəzinə çevrildi. 1606-cı ildə Şəki yenidən Səfəvilər dövlətinə qaytarıldı. Nadir şahın dövründə Şəkidə İran əsarətinə qarşı narazılıq artdı. 1743-cü ildə şəkililər üsyan edib, Nadirin Şəkidəki vəkili Məlik Nəcəfi öldürdülər. Hakimiyyəti üsyanın başında duran yerli feodal Hacı Çələbi ələ keçirdi. Nadir şahın ölümündən sonra Hacı Çələbi bütün Şəki əyalətində möhkəmləndi. Onun dövründə Şəki xanlığı Azərbaycanın ən qüdrətli xanlıqlarından birinə çevrilmişdi (44).



Möhtərəm oxucularımızı və yetişməkdə olan gənc nəsli qədim Şəkinin yaxın keçmişi ilə daha yaxından tanış etmək və sonuncu yüzilliklərin abı-havasını, məişətini, ulu babalarımızın həyat tərzi və yaşayış səviyyəsini, eləcə də bu məkanın tarixi coğrafiyasını təsəvvürlərdə daha yaxşı canlandırmaq məqsədilə həmyerlimiz görkəmli tarixçi alim AEA-nın müxbir üzvü, Şəki haqqında bir çox qiymətli əsərlər müəllifi Mahmud İsmayılın Şəki kitabının bəzi məqamlarını xatırlayaq. Müəllifin qeyd etdiyi kimi, XVIII əsrin sonunda Şəki xanlığının ərazisi 8 mahala bölünmüşdü: Şəki, Xaçmaz, Qutqaşən, Ərəş, Padar, Ağdaş, Alpaut və Göynük mahalları xanın təyin etdiyi iri feodallar-mahal naibləri tərəfindən idarə edilirdi.

Xanlıqlar dövründə Şəki əhalisi əsas etibarilə ipəkçilik, sənətkarlıq və ticarətlə məşğul olurdu. Yuxarıda qeyd olunduğu kimi, 1772-ci ildə Kiş çayının daşması nəticəsində qədim Şəki şəhəri demək olar tamamilə məhv olmuş, şəhər əhalisinin bir qismi tələfata uğramış, bir qismi başqa yerlərə köçüb getmiş, bir qismi isə indiki şəhərin yerləşdiyi ərazidə məskən salmışdı. XVIII əsrin sonunda Şəki şəhərində 6 min adam qalmışdı.

Şəki şəhərinə üz vermiş fəlakət hətta XIX əsr mətbuatının da diqqətini cəlb edirdi. "Kafkaz" qəzeti yazırdı: "Dərədən böyük sürətlə çıxan Kiş çayının daşması nəticəsində Nuxa yerləyeksan oldu, yaşayış evləri və zəngin ipəkçilik bağları əvəzinə böyük daş səhrası əmələ gəldi, minlərlə adam qudurmuş selin qurbanı oldu. O vaxtdan nuxalılar dərənin şərqində olan dağ ətəklərinə köçdülər və indiki Nuxanı saldılar".

Şəki şəhəri 1765-ci ilə qədər orta əsr şəhərləri kimi qala divarları ilə əhatə olunmamışdı. Ona görə də düşmən hücumu zamanı əhali "Gələrsən-Görərsən" qalasına çəkilirdi. 1765-ci ildə isə şəhər qala hasarları ilə əhatə olundu. Tarixi mənbələrdə olan məlumatlara əsasən bu vaxtlar şəhərin iki darvazası var idi. 1772-ci il fəlakətindən sonra yeni yerdə dirçələn şəhər də

qala divarı ilə əhatə olunmuşdu. Bundan başqa, burada daha iki istehkam-qala tikildi: birincidə şəhərin kənarındakı qala və şəhərdəki Məhəmmədhəsən xan qalası, ikinci qalada Xan sarayı yerləşirdi.

Həmin qalaya saxsı borularda su kəməri çəkilmişdi. Bundan başqa, qalada iki su quyusu var idi. Şəhərin mühafizəsini yaxşılaşdırmaq məqsədilə Şəkidən aralı hündür yerlərdə qüllələr tikilirdi. Bu qüllələrdə keşikçilər yerləşir və düşmən təhlükəsini od yandırmaqla xəbər verirdilər. XX əsrin əvvəllərində Şəki ətrafında Bürcüstü, Xoçik qəbiristanlığı, Ağ qaya, Xan bağı, Cəfərabad kəndində keşik qüllələri qalmaqda idi. Burada xarici ticarətlə yanaşı, daxili ticarət də genişlənirdi.

Şəhərdə daxili ticarətin inkişaf etməsini göstərmək üçün təkcə onu qeyd etmək lazımdır ki, Şəkidə yüzlərlə dükan var idi. Feodal hökmdarlar ticarətdə fəal iştirak edirdilər. Məhəmmədhəsən xanın 264 şəxsi dükanı var idi.

Yeri gəlmişkən qeyd etmək lazımdır ki, Şəki xanlarından Məhəmmədhəsən xan eyni zamanda Şəkidə ən varlı feodal idi. Xanlıq ərazisindəki 233 tut bağı, Şəkinin özündə 4 və ətrafında 6 dəyirman, şəhərin bütün təsərrüfat həyatının iltizama verilməsindən alınan bütün gəlirlər, karvansaralar şəxsən ona məxsus idi.

Şəhərdə sənətkar və alverçilərə məxsus 317 dükan, karvansaralarda isə xana məxsus 52, ayrı-ayrı şəxslərə məxsus isə 48 dükan var idi. Şəhərdə kənd təsərrüfatı məhsullarını, həmçinin xaricdən gətirilmiş malları satmaq üçün bazarlar var idi. Xaricdən, xüsusən Rusiyadan mallar dəniz yolu ilə Bakıya, oradan isə Azərbaycan şəhərlərinə, o cümlədən Şəkiyə gətirilirdi. XVIII əsrin 60-cı illərində Qızlar və Həştərxan tacirləri karvan yolları ilə Şəki və Şamaxıya hətta qadağan olunmuş malları gətirirdilər. Bundan başqa, tacirlər gizli yolla Şəkiyə külli miqdarda Rusiya pulu gətirirdilər. Təkcə 1767-ci ildə Şəki və Şamaxıya 105 min manat pul gətirilmiş, bu pula hər biri 6 pud olan 400 tay ipək alınmışdı. İpəyin pudu 36-48 gümüş



manata idi. Ümumiyyətlə, ipək almaq üçün hər il Rusiyadan Azərbaycana 600 min manata qədər pul gətirilirdi. O zaman üçün bu çox böyük məbləğ idi. İpək alveri və başqa ticarət əməliyyatı karvansaralarda və bazarlarda aparılırdı. R.Əfəndizadənin verdiyi məlumata görə, Şəkidə 8 dalan bazarı var idi.

O vaxt Şəki xanlığında da tranzit ticarəti gedirdi. İrandan bura İran və Qərbi Avropa malları gətirilirdi. Qərbi Avropada istehsal olunmuş parçalar və metal məmulatı İran körfəzi vasitəsilə gətirilərək İran və Cənubi Azərbaycanın sənətkarlıq məhsulları ilə birlikdə Xəzərin cənub limanlarından dəniz vasitəsilə Bakıdan, Salyandan keçərək Muğan düzü ilə Azərbaycanın şəhərlərinə aparılırdı. Bunun çox hissəsi Şəki bazarına aparılır, oradan isə Dağıstana və digər vilayətlərə göndərilirdi. Türkiyədən gətirilən türk və fransız malları Naxçıvana və Tiflisdən Şəkiyə çatdırılırdı.

Göründüyü kimi, Şəkidən ipək və başqa digər kənd təsərrüfatı məhsulları-taxıl, düyü, meyvə, yağ, bal, tütün; diri heyvanlar- inək, camış, at və s. ixrac olunduğu kimi, Şəkiyə də çoxlu mallar gətirilirdi. Bunlar boya, çit, qənd, dəmir şeylər, sabun, İran və Rusiyadan müxtəlif geyim şeyləri, taxta-şalban, neft, duz, mis, xalça-palaz, barıt, kəndir və s. ibarət idi.

XVIII əsrdə Şəki xanlığın siyasi mərkəzi olmaqla bərabər, mühüm mədəniyyət mərkəzi idi. Burada mədrəsələr də fəaliyyət göstərirdi.

Hazırda Şəkidə qorunub saxlanan Xan sarayında XIX əsrin birinci yarısında bəzi dəyişikliklər edilmişdi. İndiki saray binası keçmiş iri ansambldan qalan yeganə binadır. Sarayın yaxınlığında xanın hərəmxanası yerləşən bina və bir çox başqa tikililər var idi. Bəzi tikililər təmiz uçub-dağılmış, bəziləri isə dağılmaqdadır.

Qaladan cənubda Qurcana çayının sağ sahilində iki karvansara tikilmişdi. Bu karvansaralar indi də qalmaqdadır. Yuxarı karvansara fasadının memarlıq xüsusiyyətlərinə görə digər binalardan fərqlənir. Bu karvansara orta əsr Qərbi Avropa

tikililərinə oxşayır. Möhtəşəm ikimərtəbəli bina olan karvansaranın sütunlu qalereyaları (dəhlizləri), böyük həyəti və iri darvazaları var. Hər iki karvansaranın XIX əsrin əvvəllərində tikildiyi güman olunur.

Ümumiyyətlə Şəkidə "İsfahani", "Təbriz", "Ləzgi", "Şamaxı" adlı bir neçə karvansara var idi. Bu, Şəkiyə iri karvanların gəlməsini və onun böyük ticarət dövriyyəsinə malik olmasını göstərirdi (44).

Sırf feodal orta əsr şəhəri olan Şəkidə evlər plansız tikilirdi. Yalnız 1834-cü ildə Şəkidə böyük yanğın nəticəsində 369 daş dükan və bir karvansara yandıqdan sonra şəhərə memar dəvət olunmuş, yanmış və sıradan çıxmış binaların yeri təmizlənərək planlı tikililər inşa edilmiş, küçə və meydanlar salınmışdı. 1836-cı ilə dair olan məlumata görə, Şəkidə 2791 ev var idi. Bu evlərin çoxu xanlıq dövründən qalmışdı. Qala hasarları içərisində 24 bina hərbi məqsədlər üçün, həmçinin poçt, hərbi xəstəxana və s. üçün ayrılmışdı. Qalada olan Xan məscidi 1827-ci ildə bəzi dəyişikliklər edildikdən sonra qarnizon kilsəsinə çevrilmişdi. Şəhər dağ çeşmələrindən saxsı lülələrlə axıdılan su ilə təmin olunurdu. Yaşıllıqlara qərq olmuş şəhərin gözəlliyi şəhərə gələnləri valeh edirdi. Böyük rus şairi A.S. Puşkinin müasiri və dostu N.N.Rayevski öz qohumlarına yazırdı ki, mən Şəki xanlığının mərkəzi Nuxanın yaxınlığında düşərgədəyəm. Nuxa gözəldir. Bu, Baxçasarayın yüksək pilləsidir.

Şəhər əhalisinin ictimai tərkibi haqqında məlumat çox azdır. 1824-cü ilin məlumatına görə, şəhərdə ailə üzvləri də daxil olmaqla 503 nəfər birinci dərəcəli, 389 nəfər ikinci dərəcəli, 138 nəfər üçüncü dərəcəli tacir, 4141 nəfər xırda alverçi və sənətkar, 7 minə qədər kəndli, 375 nəfər müsəlman ruhanisi, 39 nəfər xaçpərəst din xadimi və b. yaşayırdı. 1845-ci ilin məlumatına görə isə şəhərdə 207 bəy, 174 müsəlman və 23 xaçpərəst ruhani, 7299 kəndli, 211 soldat, 7 məmur, 25 xarici tacir, 3100 yerli tacir, dükançı və sənətkar yaşayırdı. Göründüyü kimi, əhalinin ictimai tərkibi haqqındakı məlumat o qədər



də aydın deyildir. Şəhər əhalisinin 7299 nəfəri kəndli zümrəsinə daxil edilmişdi. Əslində isə onlar kənd təsərrüfatı ilə bağlı olsalar da, sənətkarlıq və şəhər təsərrüfatının başqa sahələrində çalışırdılar.

Şəki Rusiyaya birləşdirildikdən sonra, keçmiş xanların müəyyən etdiyi vergi və mükəlləfiyyətlər olduğu kimi saxlanılmaqla yanaşı, yeni vergilər qoyulmuşdu. Bir çox vergilər pulla toplanmağa başlanmışdı. Hətta çar məmurları etiraf edirdilər ki, heç bir əyalətdə Şəkidəki qədər müxtəlif adlı çoxlu vergilər saxlanılmamışdır.

Burada sənətkarlıqla yanaşı, ticarət də get-gedə inkişaf etməkdə idi. Sənətkarların çoxu öz mallarını bilavasitə özləri satır, xırda alverlə məşğul olurdular. 1824-cü ildə Şəkidə 400 dükan və həftə bazarları var idi. Burada əsasən kənd təsərrüfatı məhsulları satılırdı.

Xarici ticarətdə ipək ixracı mühüm yer tuturdu. 1834-cü ildə Şəkidən 7805 pud, 1842-ci ildə 11289 pud ipək ixrac olunmuşdu. O vaxtlar Şəkidə olan karvansaraların sayını xarici ticarətin inkişafının göstəricisi kimi qəbul etmək olar. İpək almaq üçün Şəkiyə gəlmiş xaricilər bu karvansaralara düşürdülər. Yerli tacirlər də ipək ixrac edirdilər. Şəki tacirlərinin Rusiyadan başqa Fransa, İtaliya, İsveçrə, İran, Türkiyə, həmçinin Zaqafqaziya şəhərləri ilə sıx ticarət əlaqələri var idi. Buradan ipəkdən başqa, ipək və pambıq parça, baş yaylığı, yun örtüklər də ixrac olunurdu.

Şəki ixrac ilə yanaşı idxal da edirdi. Belə ki, Bakıdan neft, duz, dəmir, zəfəran, Tiflisdən qənd, mismar, dən, kağız, Təbrizdən bez, kirman şalı, qax, Rusiyadan parça malları, Kaxetiyadan çaxır, Dağıstandan yapıncı, yun, silah gətirilirdi. Şəhərin ticarət balansı aktiv idi. 1846-cı ildə Şəkidən 436450 manatlıq mal ixrac edildiyi halda, cəmi 89335 manat 40 qəpik məbləğində mal gətirilmişdi. Bu məbləğdən 27420 manat İranın, 14580 manat Rusiyanın payına düşürdü. Şəki tacirlərinin xeyli hissəsinin kapitalı çox az idi. 1827-ci ildə Şəkidə kapitalı 1000 manatdan

20000 manata qədər olan 166 tacir var idi ki, onlardan yalnız 10 nəfərinin kapitalı 20000 manata çatırdı. Hər il yerli azərbaycanlı tacirlərdən 15 nəfəri Təbrizə mal gətirməyə gedir, üç nəfəri ipəklə Tiflisə və Nijneqorod yarmarkasına gedirdi.

XIX əsrin ikinci yarısında Şəkidə sənətkarlıq daha da inkişaf etməyə başlayır, onun bir çox yeni sahələri yaranırdı. 1862-ci ildə Şəkidə sənətkarların sayı 1735-ə çatırdı ki, onlardan 592-si usta, qalanları isə usta köməkçiləri və şagirdlər idi.

Şəkidə təkəldüzçuluq sənəti bu dövrdə daha da inkişaf etmişdi. Bu nadir sənətkarlıq sahəsi təkəldüz malına maraq artdıqca, inkişaf edərək ev sənətkarlığı mərhələsindən sənətkarlıq, hətta əmtəə istehsalı sahəsinə çevrilirdi. Şəkidə 25 təkəlduz ustası və onların 50 şagirdi var idi. Onların illik gəliri 3000 manata bərabər idi.

Şəki təkəldüzçularının məhsulu çox məşhur idi. 1872-ci ildə Moskva Politexnik sərgisində usta-təkəldüzçu Məşədi Abdul Məşədi Rza oğlu mahud üzərində rəngli ipəklə işlədiyi tikmə gözəlliyinə görə "Böyük gümüş medal" almışdı. 1882-ci ildə Moskva bədii-sənaye sərgisində şəkili Əli Əkbər "müxtəlif əl işlərinə görə" mükafatlandırılmışdı. Lakin 90-cı illərdən başlayaraq Şəkidə təkəldüzluq sənəti tənəzzülə uğramağa başlamışdı. Bunun səbəbi həmin sənət sahəsinin çox zəhmət müqabilində az gəlirli olması idi.

Şəki gön-dəri istehsalı sahəsi üzrə Azərbaycan şəhərləri içərisində mühüm yer tuturdu. Şəhərin aşağı hissəsində dabbaqxana adlanan bütöv bir məhəllədə gön-dəri istehsalı ilə məşğul olan sənətkarlar-dabbaqlar yerləşirdilər. 1850-1881-ci illərdə Şəkidə 15 dabbaq emalatxanası olmuş və onlarda 60-85 fəhlə çalışmış, illik istehsal məbləği isə 13000 manata qədər olmuşdur.

1884-cü il və 1899-cu illərdə dabbaq müəssisələrinin orta sayı 34-40, fəhlələrin sayı 150-200, istehsal məbləği isə 35-50 min manat olmuşdur. Beləliklə, 1850-1870-ci illərə nisbətən, 1890-cı illərdə müəssisələrin sayı iki dəfədən çox, fəhlələrin



sayı 3 dəfəyə qədər, istehsal məbləği isə 4-5 dəfə artmışdı. 90-cı illərdə hər dabbaq emalatxanasına orta hesabla 5 fəhlə düşürdü. Şübhəsiz ki, bu emalatxanaların bəziləri kiçik olub, 1-2 fəhləsi var idi, bəzilərinin isə fəhlələrinin sayı 10-12 nəfərə çatırdı. Müəssisələrdə istehsal olunan gön əmtəə xarakteri daşıyırdı. Bütün bunlar Şəkidə dabbaqlıq sənətinin necə inkişaf etməsinin və kapitalist yoluna çıxmasının göstəricisiydi.

1886-cı ildə Şəkidə 31 zərgər emalatxanası işləyirdi. Hər emalatxanada bir-iki usta köməkçisi, xeyli şagird çalışırdı. Emalatxanalar yuxarı və aşağı bazarlarda yerləşirdi. Şəki zərgərlərinin işi geniş şöhrət tapmışdı.

1896-cı ildə Nijni Novqorodda açılmış Ümumrusiya sənaye və bədii sərgisində şəkili zərgər Eyyub Mehdi oğlunun qızıl və gümüşdən hazırladığı bəzək şeyləri mükafatlandırılmışdı. Şəkidə saatsaz, misgərlik, qalayçılıq, dəmirçilik və s. sənətkarlıq sahələri də inkişaf etmişdi. Əldə olunan məlumatlara əsasən XVIII əsrin sonu, XIX əsrin I yarısında Şəkidə 147 başmaqçı, 33 keçəçi, 178 dabbaq, 39 boyaqçı, 36 daşyonan, 56 dəmirçi, 27 qalayçı, 29 dəyirmançı, 157 dərzi, 42 xarrat, 235 papaqçı, 82 baftaçı, 20 nalbənd və 41 zərgər fəaliyyət göstərirdi. Burada sənətkarların sənətkar birləşmələri, daha doğrusu sex təşkilatları var idi, bu birləşmələr «həmkar», yaxud «əsnaf» adlanırdı.

Qərbi Avropa sexlərində olduğu kimi, əsnaflar da öz birliklərini nümayiş etdirərək, sənətlərə görə müəyyən küçələrdə və məhəllələrdə yerləşirdilər. Sənətkar və tacirlərin müəyyən bir yerdə cəmləşməsinə xanlar özləri də maraqlı idilər. Məhz buna görə də onlar həvəslə sənətkarların yerləşmələri üçün karvansaralar və dükanlar tikirdilər. Qədim şəhərlərdəki küçələrin adları bunu bir daha sübut edir. Nuxada belə məhəllələr daha səciyyəvidir: 1.Şalbaflar (şaltoxuyanlar), 2.Xarratlar, 3.Zərgərlər, 4.Dulusçular, 5.Dabbaqlar, 6.Çanaqçılar, 7.Çolmaqçılar, 8. Bağbanlar, 9. Sərkərlər, 10. .Sabunçular və s. Sənətkar təşkilatlarında özünəməxsus sex iearxiyası mövcud

idi. Əsnaf və həmkarlarda təxminən aşağıdakı qaydada iearxiya sistemi müşahidə edilirdi: ustabaşı və ya ustakər-sex təşkilatının başçısı, onun köməkçisi, ağsaqqal, xəzinədar, igidbaşı-qasid, usta.

XIX əsrin ikinci yarısı XX əsrin əvvəllərində Şəkinin iqtisadi həyatında ticarət həlledici rol oynayırdı. 1854-1864-cü illərdə Şəki Rusiya və Qərbi Avropaya barama ixracında mühüm yer tuturdu. 1854-cü ildə Şəki qəzası bütün Zaqafqaziyadan ixrac olunmuş 150300 pud baramanın yarısını vermişdi.

Şəkidə ipək ticarətinin yüksəlişi illərində Fransa və İtaliyada qattina-ipəkqurdu xəstəliyi yayılmışdı. Bu xəstəliyə tutulmuş yumurtacıqlardan ipəkqurdu çıxmır, çıxanlar isə tələf olurdu. Fransa və İtaliya ipəkçiləri barama istehsalını lazımi səviyyədə saxlamaq üçün sağlam ipəkqurdu toxumunu Yunanıstandan almaq istədilərsə də, bu bir nəticə vermədi. Yunanıstan hökuməti ölkədən ipəkqurdu toxumunu çıxarmağı qadağan etdi. Türkiyədən də ipəkqurdu toxumu almaq cəhdi baş tutmadı. Türkiyə hökuməti də toxum ixracına qadağa qoydu. İtaliya və Fransa ipəkçilərinin son ümidgahı Zaqafqaziya, xüsusən Şəki oldu. Rusiya hökuməti xarici ipəkçilərin toxum almaq üçün Zaqafqaziyaya gəlmələrinə, toxum ixrac etmələrinə mane olmadı. Bu,əvvəllər ipək və toxum ticarətinin inkişafına böyük təkin verdisə də, sonralar Zaqafqaziya ipəkçiliyinə çox ciddi zərbə vurdu. Belə ki, xarici nümayəndələr burada da ipəkqurdu xəstəliyini yaydılar.

1856-cı ildən Zaqafqaziyaya, xüsusən Şəkiyə gələn Fransa və İtaliya nümayəndələrinin sayı ildən-ilə artırdı. "1863-cü ildə Şəkidə ipək və ipəkqurdu toxumu ticarəti çox gur gedirdi. Bu ticarət çoxlu Avropa tacirlərini və nümayəndələrini cəlb etmişdi. Əcnəbilər içərisində fransalılar daha çox idi və onların sayı 500-600-ə çatırdı. Onlardan sonra italyanlar üstünlük təşkil edirdi. O dövrün mətbuatı xaricilərin barama və ipəkqurdu toxumu ardınca Şəkiyə gəlmələrini geniş işıqlandırırdı.



Xarici ölkələrin nümayəndələri" təkcə ipək və ipək məmulatını deyil, bu yerlərdə istehsal olunan və xarici ölkələrdə tələb edilən malları da xaricə ixrac edirdilər... Beləliklə, yerli ticarətlə dolanan Nuxada xarici kapitalistlərin dövriyyəsi meydana çıxmışdı. "Bu yerlərin ticarətində əmələ gəlmiş həmin dönüş hər şeydən çox ipək sənayesini əhatə edirdi. Təzə barama" ... alınmasının həcmi o qədər böyümüşdü ki, əvvəllər bu heç adamın xəyalına da gəlməzdi. Barama ixracı... ilbəil artaraq çox böyük rəqəmə –20 min puda çatmışdı. Bu minvalla ipək ixracı da artırdı. Amma xaricilərin ən böyük dövriyyəsi toxum alverində idi. Bu dövriyyə... çox böyük rəqəmi əhatə edir və Nuxanın illik ipək ticarəti dövriyyəsinin, demək olar ki, üçdə birini təşkil edirdi. Qiyməti 850 min manat olan 1700 pud toxum ixrac olunurdu.

Həmin illərdə Zaqafqaziyadan hər il bir milyon manatlıq ipəkqurdu toxumu aparılırdı. Sonralar nəzarətsizlik ucbatından qattina xəstəliyi Şəkidə də yayıldı, daha doğrusu xarici ölkələrin nümayəndələri bu xəstəliyi burada da yaydılar. Həmin il xaricə aparılmış toxum istifadəsiz qaldı. Marseldə olan toxumun miqdarı... daha çox idi. Beləliklə Nuxa toxumu artıq öz əhəmiyyətini itirmişdi.

50-60-cı illərdə ipək ticarəti ilə yanaşı, başqa mallarla da ticarət ildən-ilə artır, istehsal müəssisələrinin sayı get-gedə çoxalırdı. 1854- cü ildə Şəkidə artıq 653 dükan və üç karvansara var idi. 1858-ci ildə dükanların sayı 1200-ə, 1861-ci ildə 1230-a, karvansaraların sayı isə 5-ə çatırdı. Ticarət əməliyyatında İstambulda olan yunan kommersiya bankı, Lion kommersiya evinin nümayəndələri, Rokle ticarət evi, yunan tacirləri Qropios və başqaları da iştirak edirdilər.

Şəki bazarı da öz həcmi və ticarət dövriyyəsinə görə Azərbaycanın digər şəhərlərində olan bazarlardan üstün mövqe tuturdu. Bir mənbədə deyildiyi kimi, Nuxadan başqa, bizim Qubada, Kür vadisində, Şamaxıda və Şuşada da bazarlarımız vardır. Lakin sonuncular bütövlüklə Nuxa bazarlarından

asılıdırlar, belə ki, bu yerlərin dövriyyəsinin xeyli hissəsi orada (Şəkidə –M.İ.) cəmləşirdi. Şəkinin hər gün fəaliyyət göstərən bazarlarının illik dövriyyəsi 1868-ci ildə 600000 manat, 1869-cu ildə isə 4000000 manat olmuşdur.

70-ci illərdə Şəkidə 45 ipəksarıma müəssisəsində orta hesabla 200 fəhlə çalışırdı, illik istehsal məbləği isə 85600 manata bərabər idi. Sonrakı illərdə fabriklərin sayı getdikcə artır, xırda, kustar tipli müəssisələrin sayı isə azalırdı. Aleksеyev və Voronin qardaşlarının fabrikini 1869-cu ildə Mirzəyev aldı. Lakin bu fabrik əvvəlki kimi işləmirdi, o, gah tez-tez dayanır, gah da ildə bir neçə ay işləyirdi.

1875-ci ildə 3 yeni ipək fabriki işə salındı. Bunların hər birinin I buxar mühərriki var idi. 1879-cu ildə daha bir fabrik açıldı, bu fabrik iri kapitalist müəssisəsi idi və sonralar onun fəhlələrinin sayı 170-ə, illik istehsal məbləği isə 120 min manata çatdı.

1880-cı illərdə fabrik tipli müəssisələrin sayı xeyli artmışdı. 1881-1888-ci illərdə altı, 1889-cu ildə isə dörd yeni fabrik işə salınmışdı. Bir fabrik istisna olmaqla, bu fabriklərin hamısı Azərbaycan burjuaziyası nümayəndələri tərəfindən tikilmişdi.

1815-ci il məlumatına görə, 85 ipək fabriki buxar mühərrikləri ilə işləyirdi. Bu fabriklərdə 89 buxar qazanı, 111 ipəkburan maşın var idi. 1915-ci ildə təxminən 10 milyon manatlıq ipək emal edilmişdi. Bu rəqəmi 1901 və ya 1902-1904-cü illərə dair rəqəmlə müqayisə etdikdə təxminən 5 dəfədən çox, bəzi illərdə isə daha çox artım görürük.

XIX əsrin ikinci yarısı-XX əsrin əvvəllərində Şəkinin ticarət və sənətkarlıq mərkəzi olmaqla yanaşı, ipəkçilik sənayesi mərkəzinə də çevrilməsi şəhərin ümumi görünüşünə, şəhər əhalisinin artmasına, şəhərin böyüyüb genişlənməsinə təsir göstərmişdi. İpək emal fabrikləri çoxalıb qüvvətləndikcə, Şəkiyə gələn xarici ipək alverçilərinin sayı da artmağa başlayırdı. Onlar özlərinə kontor binaları, yaşayış evləri tikdirirdilər.



Təşəkkül tapmaqda olan ticarət və sənaye kapitalı nümayəndələri də yeni kontor və yaşayış binaları inşa etdirirdilər. Eyni zamanda, Şəkinin gözəl mənzərələri və iqlim şəraiti bir çoxlarını burada yaşamağa cəlb edirdi.

Evlər əsasən şəhəri iki hissəyə bölən Qurcana və Dəyirman çaylarının axarı boyu Dodu və Qışlaq istiqamətində tikilir, şəhər şimal-qərb tərəfə genişlənirdi. Başqa cür də mümkün deyildi, çünki qərbə tərəf görülən tikinti işləri Kiş çayına qədər uzanırdı. Şimal tərəfə doğru gedən tikinti işləri Böyük Qafqaz dağlarının cənub ətəklərinə, Xan yaylağına qədər qalxa bilərdi. Şəhər şimal-şərq tərəfə də genişlənirdi, fəqət Almalıdan o yana tikinti işlərinin qarşısını Aslan dağı kəsirdi. Beləliklə, şəhər ərazisi onun coğrafi vəziyyətinə uyğun olaraq genişlənirdi.

XIX əsrin II yarısının lap əvvəllərində çar hakimiyyəti orqanları şəhəri idarə etmək üçün onu iki məhəlləyə böldü: Şəki və Qışlaq. Bu dövrdə Qışlağın ərazisi hələ şəhər ərazisi ilə birləşməmişdi. Qala, qala ətrafı, ticarət və sənaye müəssisələri olan hissəsi şəhərin mərkəzi hesab olunur və iki hissəyə bölünürdü: yuxarı və ya ticarət hissəsi, aşağı və ya erməni hissəsi. Şəhər ətrafı hissələri Yuxarıbaş, Gəncəlibaşı və Nuxa-Qışlaq hesab edilirdi. Yuxarıbaş hələ XVIII əsrin sonu XIX əsrin əvvəllərində, Qaladan şərqə doğru salınmışdı. Bu hissə XIX əsrin II yarısında daha da genişlənmiş və şəhər əhalisinin xeyli hissəsi burada yaşayırdı. M.F. Axundovun yaşadığı ev də Yuxarıbaşda yerləşir. Şəhərin bu sahəsinin bir hissəsi Giləhli məhəlləsi adlanırdı. Şəki şəhərinin ərazisi, 1871-ci il məlumatına görə, 3000 desyatinə bərabər idi.

Şəhər ərazisinin belə böyük sahə tutmasının səbəbi şəhərdə çoxlu bağlar, yaşıllıqlar və hətta ətraflarda əkin yerlərinin olması idi. Belə ki, şəhər ərazisinin yalnız üçdə bir hissəsi küçələrdən, müxtəlif tikililərdən, həyətlərdən, dalanlardan ibarət idi. Şəhərdə olan bağların sayı 800-ə çatırdı. Təkcə tut

bağlarının sahəsi 220 desyatin idi. Şəhər bütövlüklə yaşıllıqlara qərq olmuşdu.

Şəkinin ərazisi getdikcə böyüdüyü üçün çar hökuməti orqanları şəhərdə əlavə iki inzibati məhəllə yaratdı və 1860-1865-ci illərdə şəhər artıq iki məhəlləyə deyil, 4 məhəlləyə bölünürdü. Birinci məhəlləyə Qala və onun ətraf yerləri, ikinci məhəlləyə şəhər ətrafı daxil edilmişdi və buranın əhalisi əsasən kənd təsərrüfatı ilə məşğul idi. Üçüncü məhəlləyə dabbaqxana daxil idi. Buraya başqa sənətkarlıq sahələri, o cümlədən boyaqçılar da daxil idi. Dördüncü məhəllə haqqında sənədlər məlumat vermir. Görünür bu məhəlləyə tacir və sənətkarların yerləşdiyi Baş küçə və onun ətrafları daxil idi.

Şəhərin dükanlar və emalatxanalarla dolu olan mərkəzi küçəsi ətrafında varlıların yaraşıqlı ikimərtəbəli Avropa tipli evləri ucaldılırdı. Başqa küçələrə, yollara isə heç bir əhəmiyyət verilmirdi. Qafqaza səyahəti zamanı Şəkidə olmuş böyük Fransız yazıçısı Aleksandr Düma Şəkinin gözəlliyinə valeh olduğunu bildirməklə bərabər, şəhər küçələrinin bərbad vəziyyətdə olmasını qeyd edir. Şəhərdə olan 40 küçədən yalnız Baş küçəyə və Şeytan-bazara daş döşənmişdi. 1874-cü ildə Qala divarları yaxınlığında bulvar salınmışdı.

Şəhərin gəliri tacir və sənətkarlardan, mülklərdən, karvansaralardan və s. toplanan vergilər hesabına yığılırdı. 1863-cü ilin məlumatına görə, Şəkidə 3449 daş ev, 30 məscid, 4 kilsə, 5 karvansara, 896 dükan, 5 hamam, 3 buzxana və 42 dəyirman var idi. 1863-cü ildə 10 yeni dükan tikilmişdi. Bunlarla yanaşı, 2 hökumət binası və bir həbsxana mövcud idi.

Qurcana çayının məcrası kərpic və daşdan tikilmiş hasar içərisinə alınmışdı ki, bu da yağışlı günlərdə çayın daşması nəticəsində şəhərə ziyan dəyməsinin qarşısını alırdı. Çayların üstündə kərpic və daşdan tikilmiş bir neçə körpü, hələ xan dövründən qalmış 7 hamam var idi. XIX əsrdə daha 5 hamam tikilmişdi.



XX əsrin əvvəllərində Şəki sürətlə böyüyürdü. 1904-cü ildə şəhərdə 3998 yaşayış binası var idi. Bunlardan 50-si dəmirlə, 3798-i kirəmitlə örtülü daş bina idi. Yalnız 150 daş binanın üstü samanla örtülmüşdü. 1910-cu ildə şəhərdə olan evlərin sayı artıq 4757 –yə çatmış, yəni altı il ərzində 759 yeni ev tikilmişdi. Evlərin hamısı daşdan olub, üstü kirəmit və qismən də dəmirlə (100 ev) örtülmüşdü.

Evlərin, yaşayış və digər binaların sayının sürətlə artmasına baxmayaraq, şəhərin abadlığı işi yenə də əvvəlki kimi, yarıtmaz vəziyyətdə idi. 1910-cu ildə Şəki küçələrinin və dalanlarının sayı 1160, səkilərin uzunluğu 1,5 verst, meydanların sayı (bulvarla birlikdə) üç idi.

Heç şübhəsiz ki, bu qeyd olunanlar qədim əcdadlarımızın yaşadıqları ağrılı-acılı günlərinin tarixə düşən cüzi bir hissəsidir. Bu məlum tarixi məlumatları sizlərə bir daha xatırlatmaqda məqsədimiz nə isə yeni bir fikir söyləməkdən ibarət olmayıb, sadəcə bir-birimizə çox vaxt verdiyimiz "biz niyə beləyik?" sualına cavab axtarmaqdır. Yuxarıda qeyd olunan məlumatlardan, şəhərdə fəaliyyət göstərən sənətkarların say tərkibindən, əhali artımının miqyasından, ticarət dövriyyəsindən o da aydın olur ki, həmin illər əhalinin yaşayış səviyyəsi xeyli yüksək olmuşdur.

Şəki toponimi ilə əlaqəli ağız ədəbiyyatında söylənilən fikirlər də müxtəlifdir. Şəki dağlar qoynunda yerləşib, vaxtilə müqəddəs sayılan o ulu dağlara elə bil dəstək verən evlər uzaqdan baxanda dağların səkisinə bənzədiyindən onun adının da "səki" sözündən yarandığını düşünənlər də var. Nuxanın mənasını isə buranın sakinlərinin Nuh peyğəmbərin nəvələri olmaları fikri ilə və burada Nuh və Nuhbala adlarının xeyli yayılması ilə əlaqələndirirlər.

Şəki ziyalıları nəslindən olan maarifçi, pedaqoq, mükəmməl dini biliklərə malik Qazi Hüseyin İsmayıl oğlu Əfəndiyevin 1937-ci ildə yazdığı, hazırda Azərbaycan Milli Elmlər Akademiyası Füzuli adına Əlyazmalar İnstitutunda M-184 şif-

rəsi altında saxlanan "Nuxu və ya indiki Şəki şəhərinin tarixi" əlyazmasına istinadən aşağıdakı tarixi məlumatları qeyd etmək vacibdir.

Müəllifin yazdığına görə, o, yaşlı adamların söhbətləri ilə yanaşı, tarixi mənbələr olan "Tarixi-Risaleyi-qəndiyyədən", "Tarixi-Aləmi-Arayi" və Şəkixanovlar nəslinin bir nümayəndəsi olan Kərim Ağa Fatehin "Şəki xanlarının müxtəsər tarixi" kitablarından istifadə edərək, aşağıdakıları yazmışdır: "Şərq ölkələrində baş verən ictimai-siyasi hadisələrlə əlaqəli əmələ gələn ixtişaşlar, qırmaq-qırılmaq təhlükəsi yarandığından əhali hər bir diyara dağılışmaq təlaşına düşmüşdür. Bunlardan bir tayfa ki, Oğuz və ya assurilərdir (keçmiş zamanlarda bu yerlərə Şirvanat deyərlərmiş) ki, köçüb bu yerlərdə yurd salıblar. Bunların rəisləri iki qardaş Oxud və Nuxud olubdur. Bu qardaşlardan Nuxud Kiş çayının şərq tərəfində, Oxud isə qərb tərəfində vətən salıb, oturublar. Sonralar get-gedə adamlar hər tərəfdən yığılıb, Nuxudu genişləndiriblər. Ağızlarda Nuxud sözü çox işləndiyi üçün dəyişib Nuxu olub. Oxud sözü isə dəyişilməmiş qalıb. Bu iki qardaş camaatı ilə İslam tayfasından olmayıb, Oğuz və assuri olublar. Nuxunun içində məhəllələrdə onların qəbirləri vardır. Qəbirlərdən dəmir xalxal (bilərzik) və qeyri qab-qacaq da çıxır. Qəbirlərin yönü nə şərqədir, nə cənuba. Görünür, onlar qəbir həyatına inanan olublar ki, pal-paltar, qab-qacaqla birlikdə dəfn olunublar".

"Şəki xanlığının tarixindən" əsərinin redaktoru F.Babayevin yazdığı kimi, əsərin bir hissəsində Nuxanın qədim dövrünə aid olan məlumatlar əsasən rəvayət və əfsanəyə əsaslandığı halda, əsərin digər hissələrində XVIII əsrin ikinci yarısı və XIX əsrin birinci rübündə Şəkidə baş verən tarixi hadisələr haqqında çox maraqlı və Şəki Xanlığı tarixini tədqiq edənlər üçün olduqca qiymətli materiallar vardır. Bu əsərdə də "Nuxa" sözü "Noxu" kimi yazılır. Belə bir rəvayət də danışılır ki, burada qədim zamanlarda "Nuğayilər" adında tayfa yaşadığından Nuxa sözü o addan götürülmüşdür.



## ALEKSANDR DÜMANIN NUXA TƏƏSSÜRATI

İndi isə yuxarıda adı çəkilən görkəmli fransız yazıçısı Aleksandr Dümanın "Qafqaz səfəri" əsərindəki təsvir etdiyi Nuxa təəssüratının bizim araşdırmalarımızla əlaqəli bəzi hissələri ilə oxucuları tanış etməklə, Şəkinin o vaxtkı dövrünə "Avropadan bir baxışla" nəzər salaq. Aleksandr Dümanın "Qafqaz səfəri" kitabını Azərbaycan türkcəsinə tərcümə edən görkəmli alim Qəzənfər Paşayev yazır: "Səyahətlə əlaqəli əsər yazmaq həm çətin, həm də şərəflidir. İlk dəfə gördüyün ölkənin həyat tərzi, xalqın adət-ənənəsi, bir sözlə hər şey sənə qeyri-adi təsir bağışlayır (5).

Hissə qapılmadan nəyi qələmə alasan, nədən yazasan ki, gələcək nəsillər səni hörmətlə yad etsin, yazdıqlarından bəhrələnsin. Bu təbii ki, böyük həyat təcrübəsi, dərin biliyi, müşahidə qabiliyyəti olan yazıçıların payına düşür. «Qafqaz səfəri»ni vərəqlədikdə istər-istəməz bu qənaətə gəlirsən ki, Aleksandr Düma (ata) bütün bu xüsusiyyətləri özündə cəmləşdirən xoşbəxt yazıçılardandır".

1859-cu ildə Qafqaz səfəri zamanı Nuxada da olmuş görkəmli yazıçının o vaxtki şəhərlə əlaqəli qeydlərindən və eləcə də təəssüratlarından bəzi seçimlər:- İki-üç saata hər tərəfini gəzmək mümkün olan bu şəhər çox səfalıdır. Şəhərin mərkəzi və ticarət nöqtələri olan küçələrlə yanaşı, hər bir evin füsunkar həyətyanı baxçası, ağacları, özünün bulağı vardır. Bu bulaqların çoxu həyətlərin sıx yaşıl çəpərlərindən kənara çıxaraq yolu keçib, köpüklənə-köpüklənə axıb gedirdi.

Polkovnik Tarkanovun iqamətgahı şəhərin kənarında olduğundan biz mərkəzi küçəyə gəlib çatana qədər xeyli yol qət etdik.

Küçənin ortası ilə çınqıllı kiçik bir çay axırdı. Çayın bir sahilində evlər, o biri sahilində isə dükanlar cərgə ilə düzülmüşdü. Mağazaların önü seyrangah idi. Küçənin hər iki tərəfindən ucalan ağaclar bir-birinə qovuşaraq köpüklənən suyun üzərində həm ürək oxşayan kölgəlik əmələ gətirmiş,

həm də dağın ətəyində şairanə bir mənzərə yaratmışdır. Adamlar çayın bu sahilindən o sahilinə taxta körpülərlə və ya kökü bu sahildə, başı isə o biri sahildə yerlə birləşən ağac gövdələrinin üstündən keçirdilər.

Hərəkəti çətinləşdirən budaqlar kəsilsə də, qalan budaqlar ağacın yaşamasına və köklərini yerin dərinliklərinə işlətməsinə imkan verirdi.

Bir az aralıda buludlara dəyən, şairanə və səfalı dağlar elə gözəl mənzərələr yaradırdı ki, bu mənzərələri sözlə ifadə etməkdə çətinlik çəkirəm. Ucsuz-bucaqsız sahəsinə görə bir balaca Gızlara (Kizlyar şəhəri) bənzəyən belə ecazkar mənzərəli yeri mən heç vaxt görməmişəm. Nəhayət, biz heç bir faytonun heç vaxt keçmədiyi, birdən-birə sola burulan cığırla yoxuşa qalxdıq və dağın döşündəki bazara çatdıq. Orada insan əlindən tərpənmək olmurdu. Elə-belə gəzən kim, alan kim, satan kim. Bir basabas vardı ki, gəl görəsən. İynə atsaydın yerə düşməzdi. Küçənin hər iki tərəfini əhatə edən dükanlardakı tacirlərdən başqa, kasıb, lakin şərq axar-baxarlığı ilə seçilən balaca dükanlarda hərə yalnız və yalnız bir şey satırdı. Bəziləri qılınc və xəncər, bəziləri tapanca və Quba silahları, digərləri Şamaxı xalıları, ipək və s. satırdılar. Adama məhəl qoymayan bu tacirlər özlərini elə aparırdılar ki, guya mallarını satmaya da bilərlər. "Malım budur! Xoşunuza gəlir, buyurun, pulunu verin, alın, götürmürsünüz, xoş gəldiniz. Mən sizsiz də keçinə bilərəm və istəsəm heç satmaram. Açaram dükanımın ağzını, otu-raram içində, odlayaram qəlyanımı, tüstünü havaya buraxa-buraxa gəlib-gedənlərə tamaşa edərəm". Mən deyənləri adamın düz gözünün içinə demirlər. Lakin bütün bunlar sanki sözbəsöz onların üzündə yazılıb. Orada nə desən düzəldirlər. Bazarda can dərmanı desən, onu da satırlar. Gördüyüm külli miqdarda bazarların içərisində üçü mənim ən çox xoşuma gəlib və mən Tiflisin bazarını da istisna etmirəm. Bunlardan biri Dərbənd, biri Bakı və biri də Nuxa bazarıdır.



Mən deyəndə ki, orada hər şey istehsal edir və nə desən satırlar, bunu belə başa düşmək lazımdır: Yəni orada cürbəcür xalılar, silahlar, yəhərlər, patronlar, üstündə yazı olan şəkillər, balınclar, süfrələr, papaqlar, çərkəzi çuxalar, dağlı səndəllə-rindən tutmuş gürcü uzunboğaz tumaş çəkmələrinə qədər hər cür başmaqlar düzəldir və satırlar.

Orada növbənöv üzüklər, qolbaqlar, bir, iki və üç sıra qızıl Azərbaycan pulu düzülmüş boyunbağılar, bizim qaraçı artistlərinin həsəd apara biləcəkləri və hətta Şamaxı rəqqasəsi gözəl Nisəyə paltar tikməyə bəs edə bilən baş örtükləri, sır-ğalar, yaxasında qızıl və ya gümüşdən meyvə şəkilləri toxun-muş koftalar düzəldir satırlar. Belə koftalar burada çox dəb-dədir. Bütün bunlar göz qamaşdırır, işıq saçır, adama gəl-gəl deyir. Səs-küydən qulaq tutulur, dalaşan kim, qırmanc vuran kim, qışqıran, qorxuzan, söyüşən kim, bir-birinə uzaqdan salaməleyk deyən, əlini sinəsində çarpazlayaraq salamlaşan, qucaqlaşan kim, sövdələşən, mübahisə edən, höcətləşən, and içən kim və s. Mən burada 24 manata iki bəzəkli yəhər aldım. Bunları fransada 200 franka almaq olar və ya heç ala bil-məzdik. Elə bu vaxt əyninə çərkəzi çuxa geymiş qəşəng bir zabit bizim yanımıza gəldi, O, İvana bir neçə tərifli söz dedi.

Balaca knyaz mən tərəfə döndü və onu mənə təqdim etdi:- Məhəmməd xandır.

Mən salam verdim. Cavan zabitin müqəddəs Georgi xaç ordeni və çox gözəl silahı vardı. Müqəddəs xaç ordenini hər adama hər hansı bir təsadüf və ya kiminsə məsləhəti ilə vermirlər.

Siz mənə deyəcəksinizmi, bu Məhəmməd xan kimdir, knyaz. - Əlbəttə, elə bu saat.

İndi qulaq asın, sizə deyim bu Məhəmməd xan kimdir? Hər şeydən əvvəl, bu adam Nuxanın axırıncı xanının nəvəsidir. İşdir, əgər bu şəhər və bütün əyalət rusların olmasaydı, onunku olmalıydı. Ona ayrıca mülk verilmişdi. O, mayordur. Bu rüt-

bəni öz ləyaqəti ilə almışdır. Bu məşhur Daniyal bəyin bacısı oğludur.

-Nə danışırsınız? O Daniyal bəy ki, Şamilin naibidir və onun oğlu Hacı Məhəmmədin qaynatasıdır?

-Lap düz tapmısınız.

-Bu necə ola bilər, dayı Şamilə, bacıoğlu isə ruslara xidmət edir?

İlisulu xan kimi Daniyal bəy də ruslara xidmət etmişdir. Daniyal bəyin bir erməni katibi varmış. Bu erməni katibi komandiri general Şvartsa yazır ki, Daniyal bəy Şamilin tərəfinə keçmək istəyir. Məktub göndərilən ünvana gəlib çatmaq əvəzinə, gəlir çıxır Daniyal bəyin əlinə. O, öz katibini bir xəncər zərbəsi ilə öldürüb və atlanaraq doğrudan da Şamilin tərəfinə keçir. Elə o vaxtdan bəri o, Şamilin bütün yürüşlərinin başında durur və bizə çox ziyan vurur.

Kitabın başqa bir yerində oxuyuruq: "Biz yolumuzu davam edirik. Xan sarayı şəhərin ən yüksək bir nöqtəsində, başqa tarixi binalardan fərqli olaraq müasir memarlıq üslubunda tikilmişdir. 1792-ci ildə Məhəmmədhəsən xanın tikdirdiyi Xan sarayı valehedici və insana "gəl-gəl" deyən bir imarətdir. Məmmədhəsən xanın mənsub olduğu Xanədan 1710-cu ildən başlamışdır. Onun əsasını sülalənin ən hörmətli və məşhur adamı Hacı Çələbi xan qoymuşdur. 1735-ci ildən 1740-cı ilə qədər o, Nadir şaha qarşı çox döyüşlərdə iştirak etmiş, bütün Şirvanı azad etmiş, Tiflisə qədər gedib çıxmışdı.

Çar ordusu 1828-ci ildə Nuxanı tutanda Xan sarayı dağıdılmışdı. Xan sarayı elə füsunkar gözəlliyə malik abidədir ki, yalnız memar təxəyyülü onun necə birləşdirildiyini, məlum olmayan saysız-hesabsız şəbəkə və naxışlarını yenidən canlandıra bilər.

Doğrudur adlı-sanlı adamların, knyazların burada gecələməsi üçün Xan sarayı bərpa olunmağa başlamış, lakin bərpa işləri yalnız birinci mərtəbədə aparılmışdır. Bu füsunkar sənət abidəsinin tam bərpasını davam etdirmək əvəzinə, onu başlı-



başına buraxmışlar. Nuxanın çox da böyük olmayan Xan sarayından ayrılanda, ürəyimdən istər-istəməz bir fikir keçdi: "Xudaya, sən özün bu gözəl və tarixi abidəni yadellilərdən qoru!"

Böyük yazıçının Nuxada keçirdiyi axırıncı günə aid xatirələri etnoqrafik səciyyəli olduğundan və o vaxtlar hörmətli qonaqları əyləndirmək məqsədilə həyata keçirilən tədbirlərlə tanış olmaq da maraqlıdır.

Səyahətimizin axırıncı günü biz şəhər gəzintisinə çıxmaq istərkən knyaz bizə məsləhət gördü ki, bu gəzintini sabah səhərə saxlayaq.

-Mən sizə tamamilə azərbaycanlısayağı bir qəbul düzəltmişəm-deyə o, sözünü bitirdi.

Naharın axırına yaxın Bədridze də gəlib çıxdı. Təhərtövüründən görünürdü ki, onun kefi kökdür və elə hey əllərini ovuşdururdu. O, knyaz Tarkanovla qonşu otağa keçdi. Polkovnik tək qayıdıb gəldi. Bədridze isə otağın eyvana açılan başqa bir qapısından çıxıb getmişdi.

Stoldan qalxıb qəhvə içmək üçün eyvana ,çıxdıq. Həyətin ortasında yanında nəhəng qonur qoç olan bir kişi dayanmışdı. Onun ətrafnda isə polkovnikin sanki qonur qoçu döyüşə çağıran qara qoçu hərlənirdi.

Azərbaycanlıların bayramı qoç döyüşü ilə başlanacaqdı. Atasının sirrini bizə açan İvan bildirdi ki, axşam qoç döyüşündən sonra Azərbaycan milli rəqsləri və güləş olmalıdır. Bütün bunlardan sonra isə içəridə rəqs olacaq. Bu rəqsə şəhərin ən məşhur rəqqasları dəvət olunublar. Qonaqlar yavaş-yavaş gəlməyə başlamışdılar. Yaxında olanlar piyada, bir neçə nəfər faytonla, beş-altı adam isə atla gəldi. Onlar Knyaz Tarkanovun iqamətgahından çox da uzaqda yaşamırdılar. Lakin şərqlilər mümkün qədər ancaq atla gəzirdilər. Bütün kişi və qadın qonaqlar adətləri üzrə salamlaşır və get-gedə teatr qalereyasını xatırladan eyvanda öz yerlərini tuturdular.

Axşam saat 6-ya yaxın artıq hamı yığışmışdı. Daha sonra qırx nəfər polis də gəldi. Bunlar hər axşam Knyaz Tarkanovun

iqamətgahını, onun həyət qapısını qoruyan keşikçilər idilər. Keşikçilər təyin olundu. Qalan polislər isə yanında qoç olan adamın ətrafında dövrə vurdular. Tamaşaçılardan xahiş etdilər ki, geri dursunlar, qoçların döyüşü üçün yer qalsın. Uşaqlar başlarını polislərin qıçlarının arasından çıxararaq, qoçlara baxırdılar.

Tamaşanın başlanmasına işarə edildi və qoçları meydana çəkdilər. Gənc knyazın şəxsi keşikçisi, onu heç vaxt tək qoymayan, bütün gecəni qapısının ağzında yatan, səhərdən axşama kimi onu gözdən qoymayan Nikolay qara qoçun buynuzundan tutub, qonur qoçun on addımlığına yaxın bir məsafəyə itələdi.

Öz növbəsində qonur qoçun sahibi qoçunu tumarlayıb sığalladı. Boynunu qucaqlayıb, onu qara qoçun bərabərinə gətirdi. Bu yerdə hər iki qoçu adamların qışqırığı, hay-küyü qızışdırmağa başladı. Əslində onların heç birinin bu adamların köməyinə ehtiyacları yox idi. Onların hər ikisi azad olar-olmaz, iki düşmən süvari kimi bir-birinin üstünə cumdular. Onlar kəllə-kəlləyə gələndə şaqqıltıdan qulaq tutulurdu. Bu səsin əks-sədası bütün həyəti başına götürmüşdü. Qoçlar bir müddət dal ayaqlarını bərk-bərk yerə basıb, bir-birinə güc gələrək, rəqibini geri çəkilməyə məcbur etmək istəyirdilər. Onları aralayıb yenidən buraxırdılar. Qoçlar yenə güllə kimi bir-birinin üstünə cumurdular. Dəhşətli və cingiltili zərbələr qulaqbatırıcı idi. Bu dəfəki zərbədən sonra qonur qoçun qulağının yanında qan göründü. Bir daha onları aralamadılar. Hiss olunurdu ki, qara qoç rəqibini üstələyib. Belə də oldu. Bir az sonra qonur qoç döyüşdən yayındı. Qara qoç qalib gəldiyinə elə bil özü də heyran idi. Başını yuxarı tutub, fınxıra-fınxıra meydanda dövrə vururdu. Qonur qoçun qulaqları sallanmışdı. Hamı qonur qoçun sahibinə lağ edib gülürdü. Qonur qoçun qulaqlarının sallanması qonaqlara və tamaşaçılara heç bir şey vəd etmirdi.

Biz eyvanda dayanmışdıq. Oradan həyətdə baş verən hər şey çox yaxşı görünürdü. Həyət elə hey adamla dolurdu. Tamaşaya gələnlərin içərisində yanında üç dəvəsi olan bir dəvəçi də vardı. Dəvələr, heç şübhəsiz, karvansaraya gəldiklərini yəqin



edib, boyunlarını uzadaraq yatmış, onların sahibi dəvələrdən birinin belinə çıxmış, pulsuz tamaşaya baxmaq üçün özünə ən gözəl yer seçmişdi. Yol keçən başqa atlılar həyətə daxil olmuş, knyazı salamladıqdan sonra, elə atın üstündəcə tamaşanı yaxşı görmək üçün üzəngidə ayaq üstə duraraq, boyunlarını qabağa uzatmışdılar. Azərbaycanlı qadınlar öz dördkünc çarşablarında, erməni qadınları öz uzun ağ paltarlarında ayaq üstə heykəl kimi sakitcə dayanmışdılar. Orada yüzdən çox tamaşaçı olardı. Elə bil onların hamısı buraya qalibi ruhlandırmaq, məğluba lağ etmək üçün yığışmışdılar. Mən qalib deyəndə qara qoçu nəzərdə tuturam. Qonur qoç qələbədən çox uzaq idi. Düzü onun yerinə başqa bir qoç olsaydı, qulaqlarını daha pis sallayardı. Məğlubiyyətin dadını az da olsa hiss etdiyindən sahibi onu camaatın hay-küyü içərisində çox çətinliklə saxlayırdı. Sanki onun ürəyinə dammışdı ki, artıq hamı onun qələbəsinə şübhə edir.

Əvvəlkindən daha dəhşətli döyüş başlandı. Qonur qoç aldığı zərbədən dal ayaqları üstə qıvrıldı və yenidən özünü düzəldib, bir addım geri çəkildi.

Artıq qara qoçun üstünlüyü açıq-aydın hiss olunurdu. İndi qonur qoçun başı da aşağı əyilmişdi.

Qara qoç rəqibinə özünü düzəltməyə imkan vermir, amansızcasına onun üstünə cumur, arxadan, başından haradan gəldi vurduğu hər zərbə ilə onu yıxırdı. İnamını itirmiş yazıq qonur qoç artıq özünü ayaq üstə saxlaya bilmirdi. O, hara gəldi qaçıb, canını qurtarmaq istəyirdi. Lakin dairə vuran camaatın arasından özünə yol aça bilmirdi. Buna qara qoçun özü də imkan vermirdi. Qara qoç onun dalınca qaçır, bütün tamaşaçılar isə alqışlarla onu ruhlandırırdı.

Beləliklə, döyüşə və ya sadəcə olaraq, qalibin qonur qoçu hara gəldi qovmasına tamaşa edən camaat artıq həyəti bürüməkdə olan qaranlıqda qaynaşırdı.

Nəhayət, qonur qoç qaçıb özünü bir arabanın altına soxdu. Tamamilə basılmış yazıq heyvan öz rəqibindən aman diləyirdi. Elə bu vaxt uzaqdan nağara və zurna səsi eşidildi.

Camaatın arasına sakitlik çökdü. Musiqi sədalarının getdikcə yaxınlaşdığına əmin olduqdan sonra hamı küçə qapısına tərəf qaçmağa başladı. Bir anın içində həyət tamam boşaldı. Lakin bir az keçməmiş həyətə bayaqkından daha çox adam doldu. Qapının ağzında iki məşəlçi göründü. Onların arxasınca dörd musiqiçi, daha iki məşəlçi və üç rəqqas gəlirdi. İnsan axını həyəti başına götürmüşdü. Onlar təkcə bayaq qoç döyüşünə tamaşa edənlər deyildi. Onlara həm də şəhərin bütün küçələrindən keçib, knyazın evinə qədər rəqqasları izləyən, onların dalınca tökülüşüb gələn adamlar da əlavə olunmuşdu. Elə bil bütün Nuxa əhli buraya gəlmişdi.

Rəqqaslar düz eyvana qədər gəlib, knyazı salamladılar. Adamlar "ura" qışqıraraq dairə vurdular. Məşəlçilərin dördü də elə yer seçdilər ki, rəqs edənlərin oynadıqları meydançanı daha yaxşı işıqlandıra bilsinlər. Rəqqasların ikisi əllərində toppuza oxşar qısa ağır şeylər tutmuşdular. Üçüncüsü isə əlindəki yarımçevrəyə bənzər, dəmir halqələrlə bəzənmiş qavalı titrədərək çalğıçıları müşayiət edirdi.

Musiqiçilərdən ikisi nağara, ikisi isə zurna çalırdı. Deyəndə ki, iki musiqiçi zurna çalırdı mən səhv edirəm, düzü hər ikisi çalırdı, lakin növbə ilə çalırdılar. Bu tip musiqi alətində çalmaq çox yorucu olur. Axı bunun üçün içəridən nəfəs almağı bacarmaq lazımdır. Azərbaycanlıların sinəsi nə qədər möhkəm olsa da nəfəsləri çatmayanda onlar zurna çalarkən bir-birini əvəz etməyə məcbur olurdular. Musiqi sədaları altında get-gedə qızışan rəqs birdən yaxın məsafədə eşidilən qızğın atışma səsinə dayandırıldı. Rəqqaslar dayandılar, zurna çalanların nəfəsi kəsildi, nağara çalanların əlləri havada qaldi. Polislər silahlara cumdular. Yasovullar hazır dayanmış atların belinə sıçradılar. Həyətdəki bütün tamaşaçılar isə sualedici nəzərlərlə bir-birinin üzünə baxırdılar. Elə bir şey yoxdur, camaat, elə bir şey yoxdur!-deyə knyaz Tarkanov ucadan dedi.-Narahat olmayın, bu Bədridzenin işidir. Öz



adamları ilə məşq edir, onlara düz atmağı öyrədir. Başlayın, rəqsə başlayın!

-Olmaya bunlar ləzgilərdi? –deyə mən İvandan soruşdum.

-Ola bilər, lakin bir haldaki Bədridze ordadır, deməli, narahat olmağa dəyməz. - Sonra isə öz növbəsində o da çalğıçı və rəqqaslara bir neçə ruhlandırıcı söz dedi. Zurnaçılar öz zurnalarını puləməyə, nağaraçılar nağaralarını döyəcləməyə, rəqqaslar rəqs etməyə başladılar.

Yavaş-yavaş hərə öz yerini tuturdu. Ara-sıra tüfəng səsləri eşidilsə də, heç kəs buna əhəmiyyət vermirdi.

Həqiqətən bu rəqs çox gözəl idi. Onun bu qədər maraqlı olması onu göstərirdi ki, rəqqaslar çox məşq etmişdilər.

Əllərində ağırlıq daşı tutmuş iki nəfər bir dairənin iki tərəfində, qavalçalan isə ortada dayanmışdı. Onlar bacarıqla və cəldliklə hərəkət edirdilər. Onları bizim San-Elize çöllərindəki toppuzlarını başlarının üstündə fırladanlara, bir əlindən digərinə və ayaqlarının arasından keçirən ağac oynadanlarla müqayisə etmək olmaz. Üçüncü rəqqas qavalın dəmir halqəciklərini cingildədərək, musiqini gücləndirir, eyni zamanda füsunkar musiqinin müşayiəti ilə çox qəribə hərəkətlər edirdi.

Çalğıçılar bir-birini əvəz edir, zurnanı elə məharətlə çalırdılar ki, musiqi rəqqasların qüvvəsini birə-beş artırır və onları insanın edə biləcəyindən daha artıq hərəkətlər etməyə ruhlandırırdı. Bu hərəkətlərə bizim aramızda ən bacarıqlı adam iki-üç dəqiqə güclə davam gətirər, bunlar isə on beş dəqiqədən çox oynayırdılar. Mən deyə bilmərəm bu vərdiş və ya çeviklikdir. Bir onu bilirəm ki, rəqqasların heç biri yorulana oxşamırdı. Nəhayət, musiqiçilər də, rəqqaslar da dayandılar. Bundan sonra pəhləvanlar məharətlərini göstərdilər. Bu dala-qabağa gedilən hərəkətlərdən ibarət idi. Onlar daşlarla oynayırdılar. Hərəkətlərin yerinə yetirilməsində qollar, ümumiyyətlə, ayaqlardan daha çox rol oynayır. Rəqsdən sonra güləş başladı. Rəqqaslardan ikisi üst paltarlarını çıxartdı.

Əyinlərində enli şalvardan başqa heç nə qalmadı. Onlar knyaz Tarkanovu salamladılar və əllərini toza batırıb ovxalamağa başladılar. Sonra isə bir-birinin üstünə cummaq istəyən iki vəhşi heyvan kimi qarşı-qarşıya dayandılar. Güləş, ümumiyyətlə, bütün tamaşaların ən sadəsidir. Kim heç vaxt arxası yerə dəyməmiş Matves və Rabasonu görmüşsə, deməli Azərbaycan pəhləvanlarını da görmüşdür. Elə təsəvvür etsin ki, onlar elə Kortonlu Alsidamas və Milonu da görmüşdür. Nuxa küçələrindəki balaca dükanların içərisində cızbız satılan dükanları az qala unutmuşdum. Bunlar bir növ bizim qızardılmış kartof satan ticarət nöqtələrinə bənzəyirlər. Yaxşı olar ki, onu evdə bişirəsən (Mən qızardılmış kartofu nəzərdə tuturam). Lakin nə qədər səylə hazırlasan da, bu heç vaxt təzə körpünün üstündə satılan kartofun dadını vermir. Bax Nuxanın küçələrində satılan cızbız da belədir. Bu zəhrimar cızbızın gözəl iyi və dadı var. Mən nə qədər çalışdım, özümü saxlaya bilmədim və knyazdan xahiş etdim ki, ondan yeməyə mənə icazə versin.

Ey Nuxadan keçən səyyahlar, açıq havada dayanıb mütləq cızbız yeyin. Ümumiyyətlə, Qafqazda adam o qədər də yaxşı yeyə bilmir. Lakin mən sizə məsləhət görürəm: belə təsadüfi əldən verməyin, mütləq cızbız yeyin. "Qafqaz səfərinin" Nuxaya aid olan son səhifələrindən birində müəllif yazır:

-Eh! Hayıf ki, Poti də bu sətirləri yazan zaman mənim yanımda Nuxadakı ətçi dükanının dalında, yöndəmsiz bir otaqda çox ləzzətli cızbız yox idi. Əgər olsaydı görün mən necə bayram edərdim. Xatirələrinin sonuncu gününü müəllif qeyd edir ki, bazarı və şəhəri xeyli gəzdik. Elə bil ürəyimə damınışdı ki, daha Nuxadan gözəl bir yer görə bilməyəcəyik. Nuxadan knyaz Tarkanovun bir tüfəngini və bir xalçasını, Məhəmməd xanın bir qılıncını və bir tapancasını, bir xurcun və bir çarpayı örtüyü aparırdım. Biz Nuxadan uzaqlaşdıqca, onun görünüşü daha da gözəlləşir və bütün füsunkarlığı ilə gözümüzün qabağında canlanırdı. Bərqərar olduğu Qafqaz sıra dağlarının dilbər guşəsinə qısılmış Nuxa onu yaşıllığa qərq edən, qoynunda gizlədən ağacların arasında güclə görünürdü. Zirvəsi qarla örtülmüş bu dağların əzəmətli və adamı heyran edən görünüşü vardı. Qafqaz sıra dağlarının tayı-bərabəri olmayan Alazan vadisi ilə irəliləyirik. Bir məntəqədə dayandıq. Buradan Nuxa o qədər gözəl görünürdü ki, Moyne dayanıb onun mənzərəsini çəkdi. Həmin tablo hal-hazırda Qafqaz canişini Bayratinskidədir".

Beləliklə, Böyük yazıçının qələmindən çıxan bu səmimi ifadələr, dəqiq təsvirlər, müdrik seçimlər o qədər düzgün, səlis canlandırılmışdır ki, verilmiş təqdimata valeh olmamaq olmur. Hiss olunur ki, ustad sənətkar təsvir etdiyi hadisələrdə heç bir artıq-əskikliyə yol verməyib, Nuxa necə var elə və Nuxa olduğu kimi prinsipinə sadiq qalıb.

Möhtərəm yazıçı "Qafqaz səfəri" əsərində bir neçə yerdə Şeyx Şamilin də adını çəkir, yeni tanış olduğu Məhəmməd bəy barədə söhbəti, onun dayısı İlisu sultanı Daniyal bəyin də adını xatırlayır. Şeyx Şamil hərəkatının daha bir görkəmli qəhrəmanı Hacı Muradın həyatının son dövrü Şəki ilə əlaqəli olduğundan o illərin daha bir faciəli tarixi haqda qısa məlumatı oxuculara təqdim edirik.

## HACI MURADIN HƏYATININ NUXADA KEÇƏN GÜNLƏRİ

Qafqaz xalqlarının Rus imperiyasına qarşı qəhrəmanlıq mübarizəsinin başında duran əfsanəvi qəhrəman Şeyx Şamilin ən bacarıqlı cəngavərlərindən biri də Hacı Murad olub. Hacı Murad həyatının son illərini Şəkidə keçirmişdir. İmam Mustafayevlə Sadıq Murtuzayevin birgə yazdıqları "İmam Şamil" tarixi publisistik oçerkində Şeyx Şamilin ruslara qarşı apardığı 25 illik qəhrəmanlıq mübarizəsi çox ətraflı təsvir edilib (66).

Əsərin Hacı Murada aid səhifələrindən birində qeyd olunur ki, Hacı Murad Şeyx Şamillə aralarında olan inciklikIə əlaqəli qaçıb ruslar tərəfə keçməli olur. O, yaxınlıqdakı rus qalasına gəlib təslim olur. Qalanın komendantı gənc Vorontsov onu Tiflisə baş komandan olan atasının yanına göndərir. Vorontsov Hacı Muradı böyük hörmətlə qarşılayır. Əsirlikdə olan zaman ona əziyyət verdiklərinə görə üzr istəyir və bunun əsas səbəbkarının Əhməd xan olduğunu bildirir. Tiflisdə qaldığı müddətdə ona böyük maraq göstərilir. Az sonra, ailəsinin Şamil tərəfindən həbs edilməsini eşidib, yaralı aslan kimi vurnuxmağa başlayır, özünə lənətlər yağdırır. Necə olur-olsun ailəsinin yanına qayıtmağı planlaşdırır. Bu ümidlə Arqutinskinin ordusunda qulluq etmək üçün icazə istəyir. Lakin cavab alır ki, gözləsin. Həmin icazə verilənə qədər ibadətlərini rahatca yerinə yetirə bilmək və həm də Dağıstandakı hadisələri daha yaxından izləmək üçün münasib yer olan Şəkiyə getməyə icazə alır və orada xüsusi nəzarət altında yaşayır. Burada həyatı dərin düşüncələr içərisində keçir, olub ötənləri, xətalarını götür-qoy edir, rusların onunla davranışından hər gün üzülür, əvvəlki coşğun, əsrarəngiz gözəlliklərlə dolu həyatı, Şamil və dağlı naiblərin indiki müqəddəs mübarizəsinə qibtə, böyük məhəbbətlə xatırladığı ailəsi, sevimli uşaqları haqqında düşüncələri onu dəli olmaq dərəcəsinə çatdırır. Ailəsini azad etmək



barədə Şamilə göndərdiyi xahişnaməsinə İmam belə cavab verir:

"Ailəni sənin yanına göndərsəm, onlar da sənin kimi Allahdan dönər və mən belə günahı götürə bilmərəm".

Şəkidə göz dustağı kimi hər addımının izlənməsi onu tam dözümsüzlük dərəcəsinə gətirir və yeganə xilasını qaçmaqda görür. İlk fürsətdə, 1852-ci il aprelin 23-də onu ovda müşayiət edən kazaklardan ibarət əsgərləri öldürərək Şəki-Qax istiqamətində qaçır və sağ qalan bir əsgərin məlumatı əsasında Şəkidən göndərilən əlavə ordu dəstələri tərəfindən Qaxın Dayıkənd (indi o kənd yoxdur) kəndi ətrafındakı meşədə mühasirəyə alınaraq, qeyri-bərabər atışmada faciəli şəraitdə öldürülür. Şəki qalasının komendantı Korqanov Hacı Muradın kəsilmiş başını şəxsən Tiflisə aparıb, Vorontsova təqdim edir. Baş komandan da Sankt-Peterburqa – çara göndərir və ordu hissələrində nümayiş etdirib bildirirlər ki, uzun müddət rus ordularını vahimə içərisində saxlayan cəsur Hacı Murad öldürülüb.

Hacı Muradın öldürülməsi xəbərini eşidən Şamil onu böyük müsibət kimi qarşılayıb, inildəmişdi. Bu münasibətlə knyaz Vorontsov demişdi: "Cəsur yaşadığı kimi, cəsurcasına da öldü. Onun qəzəbi ilə cəsarəti tən gəlirdi və hər ikisi sonsuz idi".

Hacı Muradın şəxsində Şamil özünün ən cəsarətli naibini, ruslar da ən qorxulu düşmənini itirmişdilər.

Kitabın məşhur naiblərinin bölməsində – Hacı Muradın qəhrəmanlıqlarından danışılan səhifələrin birində qeyd olunur ki, Hacı Murad ikinci dəfə rusların tərəfinə keçərkən onu Tiflisə Qafqaz canişini knyaz Vorontsovun yanına gətirirlər.

Vorontsov Hacı Muradı yavəri Eldarla birlikdə qəbul edir. Qəribə bir təzad Vorontsovun diqqətindən yayınmır: arıq, axsaq, cılız, ortaboy Hacı Murad və pəhləvan cüssəli Eldar. İlk andan Vorontsovun nəzərləri Eldarın üzərində dayanır. Bunu hiss edən dilmanc knyaza müraciətlə deyir: "Əlahəzrət, Hacı Murad bu birisidir".

Knyaz diqqətini Hacı Murada çevirib, gülümsəyir. Bu istehza Hacı Muradın nəzərindən yayınmır. Dilmanca tərəf çevrilərək sərt tərzdə soruşur:- Knyaz nə üçün gülümsədi? Dilmanc tərəddüd etmədən:

-Görünür, sənin Hacı Murad olmağına inanmır, - deyə cavab verir.

Hacı Murad: -Elə isə knyaza deyin ki, qoy ən qoçaq əsgərlərindən səkkiz nəfər ayırıb at belində, özü də qılınc məsafəsində cüt-cüt düzdürsün. Cərgə boyunca araları 50 metr olmaq şərtilə. Mən 50 metrlikdən at belində onlara yaxınlaşıb, aralarından keçərkən əllərində hazır tutduqları qılıncla qoy mənim başımı vursunlar. Mənə də icazə verilsin ki, onların başını vurum. Həm də mənim xəncərim onlara yetişənədək qında olacaq. Vorontsov təklifi diqqətlə dinlədikdən sonra bildirir:- Bu ki, yaxşı bir tamaşa olar. Əsgərlərə elan edin könüllü surətdə kim bu təklifə qoşulsa və Hacı Muradın başını bədənindən ayırsa, onun başı üçün təyin olunmuş on min qızılı alacaq. Tamaşanın yeri müəyyən edilir. Yarım saatdan sonra Vorontsova xəbər verilir ki, "hər şey hazırdır". Knyaz xanımı və saray əyanları ilə "tamaşa" meydanına gəlir.*

Əsgərlərin həyacanı, atının cilovundan yapışıb sakit-sakit ətrafına baxan Hacı Muradın soyuq nəzərləri diqqətdən yayınmır. Siqnal verilcək Hacı Murad cəld atına sıçrayıb, sürətlə irəli şütüyür. Əsgərlərə çatıb əvvəlcə birinin, sonra da atının qarnı altından fırlanıb digər əsgərin başını bədənindən ayırır. Əməliyyat o qədər tez və çevik baş verir ki, təfərrüatı

---

* **Qeyd:** Hacı Muradın kəllə tası Sankt-Peterburqda Hərbi Tibb Akademiyasının muzeyində saxlanılır, cəsədi isə Şəki ilə Qax arasında indi mövcud olmayan Dayıkənd qəbiristanlığında qocaman bir palıd ağacının altındakı məzarda uyuyur. Məzar daşının üstündə qəhrəmanın kiçik şəkli (fotosu) və ərəb əlifbasında bu sözlər yazılıb: "Burada Dağıstanın şiri yatır".



seyr etmək belə mümkün olmur. Digər əsgərlər isə vahiməyə düşüb qaçırlar. Sanki bir göz qırpımında baş vermiş müdhiş hadisədən adamlar təlatümə gəlirlər. Nəzərlər bayılmış knyaz xanımının ölü sifətinə, knyazın ağarmış bənizinə dikilir.

Haçandan-haçana o, dilə gəlib deyir:- Pir! (yəni ziyafət). Beləliklə, cəngavər dağlının-Hacı Muradın şərəfinə xüsusi ziyafət verilir.

Hacı Muradın ikinci dəfə rusların tərəfinə keçdiyini eşidən çar deyir:- "Allaha çox şükür. Bunu mən yaxşı başlanğıc kimi qiymətləndirirəm".

Yeri gəlmişkən burada bir maraqlı məqamı da qeyd etmək vacibdir ki, Şeyx Şamil İlisu sultanlarından sonuncusu Daniyal bəylə olan dostluğunu daha da möhkəmlətmək məqsədilə onun qızı "Qafqaz gözəli" hesab olunan Kəraməti sevimli oğlu Qazi Məhəmmədə almışdır. Bir müddət keçdikdən sonra vərəm xəstəliyinə tutulan Kəramət Xanım Kaluqada vəfat etdiyindən orada dəfn edilmişdir. Mərhumun məzarının yad ölkədə qalmasına razı olmayan Daniyal Sultanın qardaşı oğlu, görkəmli alim akademik Əzəl Sultanovun babası Hacı Xəlil bəy Kəramətin məzar qalıqlarını Şəkiyə gətirdib Məhəmməd Əfəndi qəbiristanlığında dəfn etdirmişdir (91).

Beləliklə, Şeyx Şamilin düşmənlərinə qarşı apardığı misilsiz qəhrəmanlıq mübarizəsi o dövrün bir çox dövlət və siyasət xadimlərini, sərkərdələrini valeh etmiş, onun haqqında çoxlu oçerklər, məqalələr yazılıb, rəsm əsərləri çəkilmişdir.

Dahi rus yazıçısı Lev Tolstoy Şamilin məşhur naiblərindən biri, o vaxtlar qəhrəmanlığı dillər əzbəri olan Hacı Murad haqqında əsər yazmaqda israrlı olduğunu qət etdikdən sonra, könüllü olaraq Qafqaz ordusunda xidmət etməyi qərara alır. Bu məqsədlə Hacı Muradın xidmət etdiyi ərazilərin coğrafi mövqeyi və şəraitini daha dolğun, əhatəli təsvir etmək istəyi ilə həmin yerlərə səfərlər edir. Bu sırada elə Şəki mənzərələrinin gözəlliyini, yaz aylarında qaratoyuqların gecə

nəğmələrini, oyanmaqda olan bitki aləminin xoş təravətini çox məharətlə və inandırıcı bir tərzdə qələmə almışdır.

Qədim Şəkinin özünəməxsus təkrarsız gözəllikləri onu ziyarət edən bir çox səyyahların və digər qonaqların yaddaşında həkk olunmuşdur.

Ötən əsrin ortalarında sülh uğrunda görkəmli mübariz böyük türk şairi Nazim Hikmət Şəki Xan sarayını gördükdə ona heyran olmuş və demişdir: "Əgər Azərbaycanın başqa qədim tikililəri olmasaydı, bircə Şəki Xan sarayını dünyaya göstərmək bəs edərdi".

Əlbəttə, yuxarıda qeyd olunanlar Şəki və Nuxa haqqında yazılan əsərlərin və deyilənlərin cüzi bir hissəsi olub, tərəfimizdən araşdırılan mövzu ilə birbaşa və ya dolayısı ilə əlaqəsi olan epizodlar və məqamlardan nümunələrdir.

İndi isə həmin yazılarda bu günümüz üçün bir qədər aydın olmayan bəzi fikirlərə və eləcə də tarixi mənbələrdə bilərəkdən və yaxud təsadüfən dolaşdırılan məsələlərə, qısa da olsa, öz münasibətimizi bildirək.

Bu baxımdan, ilk növbədə yəqin ki, Şəki və Nuxa toponimləri haqda bu günə kimi tarixi mənbələrdə və elmi ədəbiyyatda bir-birinə zidd fikirlər üzərində dayanmalıyıq.

Şəki xanlarının nəslindən olan Kərim Ağa Fatehin "Şəki xanlığının tarixindən" kitabında Şəki vilayət, Nuxa vilayətin mərkəzi kimi qeyd olunur (səh. 25, 26, 27).

Maraqlı burasıdır ki, bu əsərdə 1772-ci ilin sel fəlakəti haqqında da heç bir məlumat verilmir. Hörmətli alim, Mahmud müəllimin Şəki kitabında yuxarıda qeyd olunan həmin ilin təbii fəlakəti haqqında məlumat və sonralar "Qafqaz" qəzetindən gətirilən sitatlarda da Şəki və Nuxa adlarında ərazilərin dəqiqləşdirilməyə ehtiyacı olan məqamlar az deyil. Əsərdə qeyd olunduğu kimi, şəhərin mərkəzindən axan Qurcana və Dəyirmanarxı çayları şəhəri iki hissəyə bölür. Adından göründüyü kimi, "Dəyirmanarxı" hidronimi vaxtilə bu çay boyu müxtəlif yerlərdə iyirmiyə yaxın dəyirman həmin çayın



suyu ilə işlədiyindən belə adlanıb. Qurcana çay-hidronimi isə qədim türk dillərindəki qurc (qüvvətli, güclü) sözlərindən yaranan güclü çay mənasındadır. Əsərdə qeyd olunur ki, 1834-cü ildə Şəkidə böyük yanğın nəticəsində 369 daş dükan və bir karvansara yanmışdır. Yanğının səbəbi müəyyənləşdirilməyib. 1863-cü ildə Şəkidə ipək və ipəkqurdu toxumu ticarəti çox gur gedirdi. Bununla əlaqəli Şəkidə olan əcnəbilər içərisində fransızların sayı 500-600 nəfərə çatırdı. Onlardan sonra italyanlar çoxluq təşkil edirdi. Xaricilər burada Avropada yayılan ipəkqurdu xəstəliyini yaydılar və ipəkçiliyin inkişafına böyük ziyan dəydi. Xəstəliyin kim tərəfindən yayıldığı bildirilmir.

1848-ci ildə şəhərin mərkəzi hissəsində bütün dükanlarla birlikdə yüzdən çox ev və bir məscid yanmışdı. 1858-ci il yanğını nəticəsində şəhərin şərq hissəsi tamamilə məhv olmuşdu. Yenə də yanğının səbəbi bildirilmir.

Yanğın hadisələrinin hamısının şəhərin yuxarı hissəsində və mərkəzi ərazidə baş verməsi, dükanlar, karvansaralar və məscidin yandırılması, baramaqurdu xəstəliyi- "qattinanın" xaçpərəstlər tərəfindən Şəkiyə də yayılması və bu cinayətlərin səbəbkarları haqda heç bir məlumat verilməməsi belə düşünməyə əsas verir ki, çar Rusiyasının burada həyata keçirdiyi komendant üsul-idarəsi və bu vəzifələrə erməni əsilli hərbçilərin təyin edilməsi bu faciələrin törədilməsində ermənilərin "böyük xidmətləri" olmasına heç bir şübhə yeri qoymur. Necə ola bilər ki, gəlmə xaçpərəstlər yaşayan aşağı məhəllədə heç bir yanğın hadisəsi olmur, kilsələrin heç daşı da tərpənmir, mərkəzi və yuxarı hissədə isə məsciddən tutmuş karvansaraya qədər bir neçə dəfə təkrar törədilmiş yanğında yüzlərlə dükan və evlər tamamilə yanır və Nuxanın komendantı knyaz Tarkanov cinayətkarı cəzalandırmır.

Maraqlı burasıdır ki, 1858-ci ildə baş vermiş yanğından bir il sonra Nuxada olmuş fransalı yazıçı bir çox məsələlər barədə geniş təəssürat yazdığı halda , bu yanğınla əlaqəli bir kəlmə də yazmır. Yəqin ki, Tarkanov ona bu barədə heç bir

məlumat verməyib. Əsərdə adı çəkilən "Şeytan bazar"ın yerini müəyyənləşdirmək o qədər də asan olmayıb. Bir çox yaşlı sakinlərlə apardığımız söhbətlər əsasında çox çətinliklə də olsa həmin ərazini dəqiqləşdirmək mümkün oldu. Hazırda Fətəlixan Xoyski küçəsinin (keçmiş II-ci rayon) III zavod adlanan ipək fabriki ərazisindən başlayıb, indiki Pedaqoji texnikumun binası ərazisinə qədər yerdə olan bazar o vaxtlar "Şeytan bazar" adlanıb. Həmin bazarın bir adı da olub - "Daşlı Bazar". Burada eyni zamanda 8 dalan bazarı olması barədə də məlumat verilir. Bu bazarlar ərazi etibarı ilə çox kiçik bazarlar olub. Onlardan birincisi Dəmirçi bulağı məhəlləsində indiki Mehdi Hüseynzadə küçəsində yerləşib. Digərləri haqda isə məhəllələrin təsnifatında məlumat verməyə çalışacağıq.

İndi isə "Qafqaz səfəri"ndə qeyd olunan bəzi mülahizələrə apardığımız araşdırmalar əsasında bir qədər aydınlıq gətirməyə çalışaq.

Müəllifin dediyinə görə, polkovnik Tarkanovun iqamətgahı şəhərin kənarında yerləşirdi. Bu məlumata əsasən 145 il bundan qabaq Nuxanın kənarının hara olduğunu araşdırmaq imkanı əldə edirik. Yaşlı sakinlər arasında bir çox sorğular apardıq. Şəhərin tanınmış qocaman müəllimlərindən Razi Əfəndiyev atası şair Məhzun Əfəndidən (H.Cavidin yaxın dostu) eşitdiyinə görə Tarkanovun yaşadığı ev indiki 31-ci rayon, Nuxa küçəsindəki 27 saylı binadır. Camaat həmin mülkü "İranlıların binası" (1946-cı ildə Cənubi Azərbaycandan gələnlər) adı ilə tanıyırlar. Binanın yaxınlığındakı aşağı məhəllədə xristianlar da yaşayıblar. A.Dümanın qonaq gəldiyi mülkün yaxınlığında gördüyü Karvansara isə 2 mərtəbəli olub, ətrafında sənətkarların - dəmirçilərin, nalbəndlərin dükanları sıralanmışdır. Onun təsvir etdiyi əlamətlərə görə qonaq qaldığı yerin məhz həmin bina olduğunu güman edirik.

Aleksandr Düma Nuxa ilə bağlı zəngin təəssüratlarını təbiət təsvirləri ilə başlayır. Ustad sənətkar etiraf edir ki, mən bu səfalı dağlar qoynunda yerləşən şəhərdə gördüyüm təbiət



mənzələrini sözlə ifadə etməkdə çətinlik çəkirəm. Biz isə bu məkanda dünyaya göz açıb, burada boya-başa çatdığımızdan, qeyd olunan özünəməxsus gözəllikləri bir o qədər də duyub, dərk edə bilmirik. Qədim Şəkimizə ana təbiətin bəxş etdiyi əsrarəngiz gözəllikləri duymağı, onu qiymətləndirməyi bacarmağı, buranın hər daşında-torpağında neçə-neçə tarixlərin izləri açılmamış sirləri olduğunu heç vaxt yaddan çıxarmamalıyıq. – Belə cənnətməkan guşənin sakini olmağımıza görə hər birimiz qürur hissi keçirməliyik.

Dağın döşündəki insan əlindən tərpənmək mümkün olmayan və iynə atsan yerə düşməz ifadələri ilə təsvir olunan, quş iliyi-can dərmanı da satılan, müəllifin rastlaşdığı üç zəngin (Dərbənd, Bakı, Nuxa) Şərq bazarlarından biri olan o bazar qocaman sakinlərin söylədiyinə görə və yazıçının təsvir etdiyi marşruta əsasən, yuxarıda qeyd etdiyimiz "Şeytan bazara" uyğun gəlir. Həmin bazarın aşağı hissəsi indi də yaşlı sakinlər tərəfindən "Bazar başı" adlanır.

Bazarda belə çox adamın olması, çox güman ki, ətraf rayonlardan, yaxın kəndlərdən, eləcə də Dağıstan və Cürcüstandan bura alver etməyə gələnlərlə əlaqədar olub.

Qonaqlara sonuncu gün tamamilə azərbaycanlısayağı bir qəbul düzəldilmişdi. Qoç döyüşü, milli rəqs, güləş, sonra isə içəridə rəqs olacaqdır deyən İvan atasının sirrini bizə açdı. Əsərdə Qoç döyüşü səhnəsi çox dəqiq və bütün incəliklərinə qədər təsvir olunsa da, bir məqamın açıqlanmasına ehtiyac duyulur. Çoxlarına belə gəlir ki, heyvanların, quşların və s. döyüşdürülməsi elə-belə əyləncə xarakterli bir məşğuliyyətdir. Əslində isə bu belə deyil. Bu tədbirlər zahirən belə görünsə də, əslində həmin əyləncələr daha güclü, daha dözümlü, daha cəld və sürətli fərdləri müəyyənləşdirib, damazlıq cinslərin seçilib toxumluq saxlanması məqsədi ilə təşkil olunur. Burada təsvir olunan güləş səhnəsindən məlum olur ki, rəqqaslar "zorxana" rəqsinin mahir ifaçıları olublar. Zurna çalanların növbə ilə çalmaları qeyd olunur. Beləliklə, məlum olur ki, nümayiş olu-

nan tamaşaların heç birinin mahiyyətini knyaz Tarkanov tam başa düşmədiyindən qonağa da izah edə bilməyib.

Tamaşaçılar arasında dəvə sahibləri dəvələrinin üstündə oturub tamaşa edirdilər-məlumatından aydın olur ki, yaxınlıqda bir karvansara varmış. Nəhayət, sonda yazıçı qeyd edir ki, Nuxanın küçələrində yöndəmsiz balaca dükanlarda satılan cızbızı az qala unutmuşdum. Bu cızbızın gözəl iyi və dadı var. Ey Nuxadan keçən səyyahlar, açıq havada dayanıb mütləq cızbız yeyin.

Bu qeyd olunanlardan bir daha aydın olur ki, Şəki mətbəxinin mahir ustaları o vaxtlarda çox dadlı yeməklər hazırlayıblar.

"Qafqaz səfəri" ilə əlaqəli bir maraqlı məlumatı da hörmətli oxucuların nəzərinə çatdırmağı vacib hesab edirik. Mahmud müəllimin Şəki kitabında göstərilir ki,A. Şanşıyev adlı bir müəllifin 1861-ci ildə xaricilərin fəaliyyəti haqqında Qafqaz canişininə verdiyi məlumat diqqəti cəlb edir. Məlumatda son illərdə Şəkidən barama və ipəkqurdu toxumu almış xaricilərin siyahısı, onların nə qədər mal almaları göstərilir. Bu siyahıda böyük Fransız yazıçısı A.Dümanın da adı vardır. O, 300 pud barama alaraq Fransaya göndərmişdir. Beləliklə, qeyd etdiyimiz aydın olmayan bəzi fikir və mülahizələrin dəqiqləşdirilməsi arxiv araşdırmaları və aidiyyatı əlyazmaları əsasında icra edilməli olduğundan, bizim mövcud şəraitdə buna imkanımız yoxdur. Ona görə də gələcəkdə bu istiqamətdə tədqiqatlar aparacaq mütəxəssislərə bu məsələləri araşdırmaqda uğurlar arzulayırıq. İndi isə yuxarıda qeyd olunan məlumatlarla qısa tanışlıqdan sonra əsas mövzumuzun şərhinə keçək.



## MƏHƏLLƏ ADLARI, SOYLAR VƏ LƏQƏBLƏR

"Məhəllə" sözü ərəb mənşəli olub, bir şəhər, ya da qəsəbənin bölündüyü hissələrdən biri, eləcə də şəhərin iri binalar olan, kəsişən yollar və ya meydanlar arasında yerləşən bölümü mənasında işlədilir.

"Ləqəb" sözü də ərəb dilindən keçmədir. Müəyyən bir səciyyəvi xasiyyətinə görə və ya başqalarından seçilən əlamətinə əsasən adama verilən qeyri-rəsmi ad, ayamadır.

Digər adlarda olduğu kimi, məhəllə adlarının da özünəməxsus xüsusiyyəti və yaranma tarixi mövcuddur. Yəni bu adlar elə-belə, kiminsə istəyi ilə yaranmayıb, özlərində müəyyən bir əlamət, və ya xüsusiyyəti saxlamaqla həmin ərazi ilə birgə uzun müddət yaşayır, işlənir.

Həmin əlamətlər baxımından məhəllə adları bir neçə qrupa bölünür:

a) təbii-coğrafi amillərlə əlaqəli yaranan adlar;

b) tayfa-nəsil, tirə adları ilə əlaqəli yaranan adlar;

c) peşə, sənət və əmək məşğuliyyəti ilə əlaqəli yaranan adlar;

ç) memarlıq və inşaat işləri və digər tikililərlə bağlı adlar;

d) tanınmış şəxsiyyətlərin adları ilə əlaqəli yaranan adlar;

e) əlamətdar mərasimlər və digər tədbirlərin keçirildiyi müqəddəs yerlərin adları.

Onu da qeyd etmək lazımdır ki, əksər rayonlardan fərqli olaraq, Şəkidə hər hansı bir ünvana işarə verildikdə, çox zaman dövlət tərəfindən küçəyə qoyulan rəsmi ad yox, məhəllə adı və ləqəblərə üstünlük verilir.

Məhəllələrin təsnifatında biz qədimliyi əsas götürdüyümüzdən, ilk öncə daha qədim hesab olunan **"Yuxarıbaş"** toponimindən başlamağı məqsədəuyğun hesab edirik. Spesifik əlamət və mövqe bildirən bu coğrafi terminin mənşəyini öyrənmək məqsədilə həmin məhəllə sakinləri arasında apardığımız çoxsaylı sorğular heç bir nəticə vermədi. Təxminən eyni məna kəsb edən iki söz birləşməsindən yaranan bu toponimin məna-

sının izahı haqda yerli sakinlər və digər yaşlı nəslin nümayəndələrindən bizə düzgün məlumat verə bilən tapılmadı. Ona görə də biz görkəmli alim, professor Mahmud İsmayılovun "Şəki" kitabında qeyd etdiyi yuxarıda istinad etdiyimiz aşağıdakı fikirlə razılaşmalı olduq: "XIX əsrin II yarısının lap əvvəllərində çar hakimiyyət orqanları şəhəri idarə etmək üçün onu iki məhəlləyə böldü: Şəki və Qışlaq. Qala, qala ətrafı, ticarət və sənaye müəssisələri olan hissəsi şəhərin mərkəzi hesab olunur və iki hissəyə bölünürdü: yuxarı və ya ticarət hissəsi, aşağı və ya gəlmə xaçpərəstlər hissəsi. Şəhər ətrafı hissələri Yuxarıbaş, Gəncəlibaşı və Nuxa-Qışlaq hesab edilirdi. Yuxarıbaş hələ XVIII əsrin sonu XIX əsrin əvvəllərində Qaladan şərqə doğru salınmışdı.

**"YUXARI BAŞ"** (toponim) - əhatə dairəsinə görə Şəkinin ən iri, qədim baş məhəlləsidir. Dəniz səviyyəsindən 700-750 m hündürlükdə yerləşən, mikroiqlimi xoş və təmiz olan bu məhəllənin adında və görünüşündə böyük əzəmət var.

Dağ yaxasında yerləşən bu məhəllə inzibati bölgüyə görə üç rayonu əhatə edir. I-ci rayona Ə.Haqverdiyev, 2-ci rayona Ceyhun Hacıbəyov, 3-cü rayona Mehdi Hüseynzadə küçələri daxildir.

Yaşlı sakinlərdən Kamal Xudiyevin (76 yaş) atasından eşitdiyinə görə, Yuxarı Başda iki qlavalıq (baş idarə) olub. Biri indiki su anbarı, digərisə Çatqal dərəsi tərəfdə olub. Su anbarı tərəfdə olan baş idarənin böyüyü Hacı Şıxəlibəyovların oğlu Abbas bəy olub.

Yuxarı baş və aşağı baş məhəllə adları Azərbaycanın qədim şəhərlərinin çoxunda paleotoponimik (qədim yer adları) adlar təkin işlədilir.

İstər Xanlıq dövründə, istərsə çar Rusiyasının əsarəti və qısa ömürlü Milli Müsavat, bolşevik-sovet hökumətləri dövründə də Yuxarı Baş – inzibati-idarə üsulunun, adlı-sanlı mülk və soyların, bir sıra tarixi abidələrin yerləşdiyi ərazi olmuşdur. Relyefilə yanaşı bu xüsusiyyətlər əsrlər dönəmində məhəllənin



adını təsdiq etmişdir. Məhəllə əhalisi sırf yerlilərdən ibarətdi. Sonradan gələnlər isə şəhərin müxtəlif tərəflərindən və kəndlərindən olanlardı. Bu böyük məhəllənin əhalisi özünəməxsus antropoloji xüsusiyyətlərə malikdir. Saka türklərinə xas fiziki tipik əlamətləri-ortaboyluluq, qarasaç, qaragöz, nisbətən enlisifət, ağbəniz, girdəbaş və s. olmaları onların təmiz aborigen əhali olduğunu sübut edir.

Yuxarı Baş çox dəyərli adət-ənənənin, milli ruhun saxlandığı ərazidir. Vaxtilə bu məhəllənin çuxasının ətəyi yer süpürən, ruhu göylərdə olan köhnə kişiləri çox olub. Onların adları bu gün də vaxtaşırı məhəllə sakinlərinin dilində səslənir.

Yuxarı Başın birinci rayonu vaxtilə Qurcana çayın sağ sahilindən dağ sirtindən (hündürlüyündən) yaşayış yeri kimi tanınırdı. Hazırda həmin yerdə vaxtilə yaşayıb-yaradanların adı, istifadə olunan yer adları qalıb. Birinci rayonun təkcə qəbiristanlığı həmin yerdədir. Yaşayış evləri və həyətləri isə indi çayın sol sahilindən başlanır.

Camaatın dağ hissəsindən eşidib-bildiyi, tanıdığı yerlər haqqında Məlakə oğlu Aydının (A.Qasımov Hidayət, 80 yaş, təqaüdçü) verdiyi məlumatlar və məhəllə hissə sədri Şəxəliyev Bəşir Soltan oğlunun verdiyi məlumata əsasən aşağıdakı yığcam təsviri yarada bildik.

Xan yaylağından (antroponimik oykonim) da yuxarıda dağ zirvəsində vaxtilə mövcud olan II Gözətçi bürcünün qalıqları var. Dağlıq ərazidə yaşayan əhaliyə dağ hələ qədimdən həm maddi, həm də mənəvi dayaq olmuşdur. Zamanına görə elin şad və bəd günləri, qoruyuculuq işləri dağ başında yandırılan tonqallarla xəbərdar olunardı. Dönə-dönə istinadgahımız olan milli eposumuz "Dədə Qorqud" boylarında da bu ritual söylənilir.

Xanlığa yaxın olan Qafqaz dağ silsilələrinin uca nöqtələrindən müxtəlif məsafələrdə şəhərə girəcək və çıxacaq aydın göründüyü üçün üç yerdə gözətçi xəbərdarlıq bürcləri qoyulmuşdur. B. Şıxəliyevin dediyinə görə, hər üç bürcün qalıqları o

zirvələrdə indi də durur. Dağın yaşıl dona bürünmədiyi vaxt onları görmək də olur.

**"XAN YAYLAĞI"** (antroponomik oykonim) – adından bəlli olduğu kimi, orta əsrlərdə xanlıq dövründə xanın öz əyanları ilə birgə ilin isti mövsümündə yaylaqda çadır qurdurub dincələn vaxtlarına işarə edir.

**"PİŞOOT BULAĞI"** (hidronim) – bu məşhur bulaq dağın yüksəkliyində Xan yaylağına yaxın ərazidə yerləşir. Bu təbii çeşmənin ətrafı pişikotu ilə dolu olduğu üçün həmin ad verilmişdir.

**"SÖYÜDLÜ BULAQ"** (fitohidronim) - bu təbii qaynama çeşməsinin başında söyüd ağacı əkildiyi üçün belə ad verilmişdir. Məcnun söyüd, salxım söyüd adlanan xoş görkəmli bu ağac həm dərman bitkisi kimi, həm də su başında xoş ovqat yaradan bir gözəllik olaraq insanlar tərəfindən sevilmişdir.

**"SOYUQ BULAQ"** (mikrohidronim) – bu çeşmə də dağ yaxasındadır. Çox çətinliklə borular vasitəsilə çayın sol sahilinə Şəmmədlərin bağınacan gətirilib. Bu təbiət töhfəsini məhəllə camaatı, sorağını alıb gələnlər əziyyət çəkənlərinə rəhmət oxuyaraq istifadə edirlər.

**"LƏLƏLİ BULAQ"** (hidronim) – birinci rayonda Qasımovlar evinin yaxınlığında bişmiş kərpicdən çox ustalıqla hörülmüş, mis lüləli məhəllə bulağıdır. Övladı olmayan iki qardaş tərəfindən çəkildiyi üçün həmin ad qoyulub.

**"QURDLU BULAQ"** (zoohidronim) – dağ ətəyində olan, birinci rayon camaatına çox yaxın bir çeşmədir. Suyu yayda sərin, qışda istidir. Deyilənlərə görə suyunda kiçik xırda qurd gördükləri üçün belə ad verilib.

**"ARPA DƏRƏSİ"** (fitooronim) – yuxarıda qeyd etdiyimiz kimi, çayın sağ sahilində dağlıq hissədə yaşayış evləri olmuşdur. Həmin vaxtlarda çökəklik bir yerdə arpa əkərdilər. Ad həmin vaxtdan yaranmışdır.

**"OTDAĞ DƏRƏSİ"** (oronim) – mal-qara yiyələri öz heyvanlarını otlamaq üçün dağa buraxardılar. Heyvanların da



bol şirəli otla zəngin bu dərədə otlamağına görə payızda otundan biçib qurutduqları üçün dərəyə bu ad verilmişdir.

**"KOR DƏRƏ"** (oronim) – dağ yaxasında olan bir dərədir. Otlaq dərəsinə yaxındır. Ətrafında bitən ağacların çətirlərindən dərə görünməz olduğu üçün camaat bura elə ad verib. Kor dərənin yaxşı yarpaq çürüntüləri ilə zəngin humuslu torpağı var.

**"URUS QUYUSU"** (toponim) – Yuxarı Baş camaatına tanış olan bu ad yuxarıda qeyd etdiyimiz kimi, vaxtilə dağ tərəfdə çayın sağ sahilində olan yaşayış hissəsinə aiddir. Hazırda orada yaşayış evləri olmasa da, vaxtı ilə yaşayanların adı ilə bağlı yerlər kimi camaat tərəfindən tanınır.

**"LAHICLARIN YURDU"** (etnooykonim) (lahiclarin yurdu deyilən yerdə hələ də dulus qab-qacaqların qırıntıları aydın görünür), **"HACI ƏHMƏD YURDU"** (antropo oykonim), **"AĞAMMƏD DAYININ YURDU"** (antropo oykonim), **"HÜMMƏT DAYININ YURDU"** (antropo oykonim) olub. Vaxtı ilə Hacı Əhməd dayının əkdiyi əla növ zoğal ağaclarından törənib bu günəcən çatan zoğallığın iri, şirəli və dadlı meyvələrini həvəslə dərib istifadə edirlər. Həmin bu dediyimiz Hacı Əhməd bağatlığının ətəyində vaxtilə kazarmada yaşayan rus əsgərləri gəzməyə gələndə özləri üçün çimməyə quyu düzəltmişlər. Quyuya su hansısa çeşmənin axarından tökülərdi. Elə o vaxtdan "Urus quyusu" adı Yuxarı Başlıların dilində işlənib və yaddaşlarda qalıb.

**"KİRƏC QUYUSU"** (toponim) – yenə də dağda yerləşən bu quyu adından bəllidir ki, tikinti materialı-kirəc istehsal etmək üçün olub. Bərkidici sement materialı olmayan vaxtlarda, kirəc əsas tikinti materialı idi.

**"PİR TƏPƏ"** (ekklezion oronim) – Yuxarı Baş məhəlləsinin I-ci rayonunda Şəmmədlər soyu var. Onların ulu babası dağ yaxasında dəfn edilib. Sonradan həmin yerlər daha geniş şəkildə qəbiristanlıq kimi istifadə olunub. Hazırda dağ yaxasında yerləşən həmin ərazi Yuxarı Başın, xüsusən də I-ci

rayon əhalisinə məxsus qəbiristanlıqdır. Camaat birinci dəfə istifadə edilən hissəyə köhnə qəbiristanlıq, ikinci dəfə istifadə olunan hissəyə isə təzə qəbiristanlıq deyir. Birinci hissədə lap təpədə yerləşən ilkin qəbir həmin dediyimiz **SƏMMƏDLƏR SOYUNUN** lap ulu babalarından birinin qəbridir. İman yiyələri mömin ruhaninin qəbrini vaxtaşırı ziyarət etdikləri üçün həmin yerə Pir təpə adı verilib.

**"SU ANBARI"** (hidronim) – I-ci rayonda Qurcanaçayın sol sahilində, hazırda yaşayış evləri olan bir ərazidə yerləşir. Bu anbar Sovet quruluşu dövründə 1937-38-ci illərdə tikilib. Həm Yuxarı Baş və ona yaxın məhəllələrin suya olan tələbatını, həm də endemik xəstəliklərə görə suyun yodlaşdırılmasını nəzərə alıb anbarı tikmişlər. Anbara su Qurcanaçayın başlanğıcından iri həcmli borular vasitəsi ilə tökülür. Su iri boruya keçən yerdə şadara yerləşdirilib ki, zir-zibillər ilişib daxil olmasın. Ondan sonra bir az xırda zibillər də boruya keçməsin deyə xırdagözlü şadara qoyulub. Hovuzun üzərində şifer materialından (azbest) 6 ədəd borular var. Üçü sağda, üçü solda yerləşdirilib. Bu borular anbarda olan suyun qazını çıxarmaqdan ötrüdür.

**"KÖÇ YOLU"** (dromonim) – su anbarı həndəvərində olan enli, əsas yol belə adlanır. Vaxtilə camaat bu yol ilə Qurcanaçayı keçib yaylaqlara qalxardı. Yaylaq müddəti qurtaranda elat qayıdardı. Elliklə yaylağa gedənlər dünyasını dəyişdilər, zaman da, adətlər də dəyişib yeniləşdi. El yoluna verilən ad isə necə deyilmişdisə eləcə də qaldı.

Məhəllə sakini 75 yaşlı Kamal Xudiyevin söylədiyinə görə, 6-7 yaşında uşaq olanda köç yoluna gələn yüklü dəvələri görüb. Dəvəçilər neft, duz gətirib satırdılar. K.Xudiyev deyir ki, mənim bir hadisə də yadımdadır ki, həmin o dəvəçilərdən biri gətirdiyi ağ neftdən qaba töküb içinə çörək doğrayıb yediyinə heyrətlə baxmışam.

**"GÜNEY DOQQAZ"** (dromonim) - haqqında danışdığımız ərazidə dağa qalxan kiçik bir döngədir. Hündürlükdə



yerləşən, günəş şüalarının düz istiqamətində çox düşdüyü, ağacı az bir döngədir.

**"NAR DOQQAZ"** (fitodromonim) – xırda təpəli, daşlı, sarı torpaqlı kiçik məhəllə döngəsidir. Güney doqqazın yaxınlığındadır. Cır nar topaları çox olduğu üçün döngəyə bu ad verilib. Əhali bu yabanı nar topalarına həmişə qayğı ilə yanaşıblar. Payızın son ayında bu cır narlardan sıxılmış cövhər duzlanıb, şüşə qablara doldurulur. Qış uzunu və yaz aylarında xəmir xörəkləri ilə birgə istifadə edilir.

**"MUSTAFA ƏFƏNDİ MƏSCİDİ"** (antropo ekklezionim) – Yuxarı Başın I-ci rayonunda yoxuşu qalxarkən gözəl biçimli, memarlıq ünsürləri cəlbedici olan əzəmətli minarə görünür. Minarənin üstündə qısaca qeyddə onun 1880-cı ildə bina olunduğu müəyyənləşir. Məscid qabağında yaşayan 86 yaşlı Cəlil Əlibalayevin dediyinə görə, atam söyləyərdi ki, bura vaxtı ilə came məscidi binası olmuşdu. İndi isə onun ancaq özülü qalmışdır.

Minarənin qarşısında həyət tərəfdən hasara alınmış qəbir var. Görkəmli alim Məşədixanım Nemətin "Azərbaycanda pirlər" kitabında yazdığına görə, həmin minarəyə hörülmüş başdaşındakı ərəbcə yazı bu məzmundadır: "Miladi tarixi 24 iyul 1881; hicri tarixi 21 ramazan 1299. Bu məqbərə Məhəmməd Əfəndinin oğlu, mömin, fazil alim Mustafa Əfəndinindir. Cümə günü vəfat etmişdir. Ruhuna fatihə. Haşiyədə azərbaycanca da bir beyt yazılmışdır:

"İsmi pakın həmişə yad edəlim,
Ruhunu fatihəylə şad edəlim".

Deməli, minarənin dibindəki qəbir xalqın müqəddəs məqbərə kimi ziyarət etdiyi böyük alim Mustafa Əfəndinin məzarıdır. Çox güman ki, came məscidi və minarə onun səyi nəticəsində tikilmişdir. Tikintidən bir il sonra o, vəfat etmişdir.

**"GİLƏHLI MƏHƏLLƏSI"**ndə (toponim) -dərə və dağ yolu ilə Yuxarı Başın I-ci rayonuna yaxın olan yerdə -

**"GİLƏHLİ MİNARƏSİNİN"** qabağında Mustafa Əfəndinin vərəsələri yaşayır.

**"MƏHƏMMƏDOV MUSTAFA MİRHƏSƏN OĞLU"** (ləqəbi isə injener Mustafadır). Onun həm Məşədi xanım Nemətə, həm də bizə söylədiyinə görə, Mustafa Əfəndinin 12 övladı – on oğlu, iki qızı olmuşdur. Onlardan yalnız 7 nəfərinin adını bilirlər. Mir Niyaz, Mir Knyaz, Mir Şakir, Mir Həmzə, Mir Həsən, Mir Rövşən, Mir Musa. 1893-cü ildə Şəkidə açılan yeni milli məktəbdə rus dili müəllimi işləmişdir. Bu məktəbdə yeni üsulda dərs deyilir, ərəb-fars, ana dili isə gizli tədris olunardı.

Mustafa Mir Həsən oğlunun dediyinə görə, əmisi Mir Rövşən sonralar Bakıya köçmüş, rus dili müəllimi işləmiş və nəhayət repressiya qurbanı olmuşdur.

Mir Həmzə əmisi isə ruhani alim olmuş, 1917-20-ci illərdə Tiflisdə yaşamış və orada vəfat etmişdir.

M.Nemətin araşdırmalarına görə, Şəkidəki **"MƏHƏMMƏD ƏFƏNDİ ZİYARƏTGAHI"** Mustafa Əfəndinin atasının adıyla bağlıdır. Təəssüf ki, bu ziyarətdə böyük seldən sonra yazılı daş qalmadığına görə ancaq yaşlı nəsildən eşidilənlərə əsasən bunu söyləmək olur. Çünki Məhəmməd Əfəndinin izi gedib Oxud pirinə də çıxır. Oxud pirindəki başdaşlarının birində Məşədi xanım Nemət "Molla Məhəmməd Əfəndinin oğlu Molla Ömər" sözlərini də oxumuşdur. Tarix yazılmış hissə isə xarab olmuş, pozulmuşdur. Şəki ənənəsinə görə kimdənsə hansı tərəfdənsə kimi isə soruşmağın öz qaydası var. Öncə məhəllənin adını, nəslin tanınan adını, yaxud fərdi ləqəbi dəqiq deməlisən. Onda ünvanı və axtarılan kəsi çox tez və asanlıqla tapmaq olur.

Yuxarı başın 1-ci rayonuna məxsus Qasımovları, Ətəyi daşlıları, Yuhları, Qiyaları, Cərroları, Ağabəyləri soraqlasan mütləq məhəllənin əsas nişangahları Pir təpədən, köç yolunun, su anbarının, Mustafa Əfəndi məscidini də səmt kimi göstərmək lazımdır.



Köklü-kümməcli yerli olan bu nəsillər barədə daha geniş məlumatlı məhəllə yaşlılarının və nəsil davamçılarının (K.Xudiyevin, A. Qasımovun, C.Əlibalayevin, S. Əlibalayevanın, H. İlyasovanın) dilindən qeydə aldıq.

**"QASIMOVLAR"** (patronim) – Qasımov Hüseynbala Qasım oğlu və oğlu Hidayət Qasımov I-ci rayonda Köç yolu üstdə Lələli bulağın yaxınlığında mülkləri olan ortabab fabrikant olublar. Mülkləri alt-üst 12 otaqdan, hər iki başdan 20 m-lik eyvanı, iki dalanı, üstünün artırması ilə (artırmadan çardağa pillələr var) iki mərtəbəli binadır. Mülkün 103 yaşı var. I-ci mərtəbədə, alt otaqlarda davellər olub. Hazır ipəyi işlədib, Rusiyaya, İrana, Türkiyəyə, Gürcüstana satmağa aparırdılar.

Qaladan yuxarı məhəllələrin camaatının əksəriyyəti Qasımovların davelxanasında işləyib. Hüseynbala kişi də insaflı, çörək verən, dünyagörüşlü adam olub.

Onların həyətində ayağı dərəyə axan iri hamam var idi. Məhəllə qadınları burada yuyunar, pal-paltarlarını yuyardılar. Qasımov Hüseynbala anlamlı və dünyagörüşlü adam olduğu üçün Sovet hökuməti gələndə qır-qızılını, ipək avadanlıqlarını "öz xoşu" ilə hökumətə təhvil verdiyi üçün onlara toxunmadılar.

Böyük Vətən müharibəsi zamanı bu mülk böyük olduğu üçün alt mərtəbədə əsgərlər, üst mərtəbədə komandan heyəti qalardılar. Əsgərlər təlim keçəndən sonra cəbhəyə gedərdilər. Evin oğlu Hidayətin xanımı Məlakə (Sarı Rəşidin tatar qızından olan övladı) əsgərlərin yeməyini bişirərdi.

Hüseynbala Qasımovun qızı **KİŞBƏR QASIMOVA** Şəkidəki iki illik Institutu bitirdikdən sonra Bakıda ali təhsilini davam etdirib. İnstitutu qurtardıqdan sonra Akademiyanın Aqrokimya və Torpaqşünaslıq Institutunda həmyerlimiz, akademik Cəbrayıl Hüseynovun laboratoriyasında işləmişdir. Azərbaycanda ilk dəfə sarı qılçıq buğda növünü o, yaşadığı binanın damında yetişdirib. Xarici ölkələrin çoxunda olub. Ömrünün

son günlərini ata-baba yurdunda keçirib. 1974-cü ildə vəfat edib. Yuxarı Baş qəbiristanlığında dəfn edilib.

Kişbər Qasımova həmişə gəncləri təhsilli, güclü elm adamları təkin görmək istəyirdi. Dədə-babadan hasar qonşuları olan Bəxtiyar Vahabzadəyə də tez-tez ali təhsil almaq üçün Bakıya getməyini tövsiyə edərdi.

Hüseynbala Qasımovun nəvəsi **HİDAYƏTİN OĞLU HÜSEYN** müəllim ali təhsilli tarixçi olub. O, Şəkinin tarixini, eləcə də bütöv Azərbaycan tarixinin yazılmayan tərəflərini də gözəl bilirdi. 68-70-ci illərdə Xan sarayında məlumatçı da işləyib.

**"ƏTƏYİ DAŞLILAR"** (patronim) – həmyerlimiz, xalq şairi Bəxtiyar Vahabzadəgilin soyuna bu ad deyilir. Baxmayaraq ki, atası Zəkəriyyə enlikürək, hündür, saxalı adam olub, aralarında cürəfəsiz, sısqaları da vardı. Xüsusən də, Zəkəriyyə kişinin kiçik qardaşına sısqa Əhməd deyərdilər. Məhəllədə ona məsləhət görərdilər ki, yuxarıdan aşağıya düşəndə ciblərinə, ətəyinə daş doldurub düşsün ki, Yuxarı Başın yeli-yelpazəsi onu yıxmasın. Adın da yaranması elə buradan olmuşdur.

Deyilənlərə görə (Məcidzadə Səttar Muxtar oğlunun dediyinə görə 1921-ci il), Zəkəriyyə kişinin hündür, qara ulağı var imiş. Yuxarı Başdan Aşağı Başa onunla qalxıb-düşərdi. Səttar babasının dediyinə görə, Zəkəriyyə kişinin cənazəsini qəbiristanlığa aparanda ağırlıqdan cənazə beşiyinin qolu sınmışdı. Zəkəriyyə kişinin arvadı elə Səttar Məcidzadənin bibisi Xanım olmuşdur.

Zəkəriyyə kişinin böyük oğlu Mahmud ağanın **DƏRGAHOVLARIN** - Derjavekovların-Dərgahyanların (bu adların üçü də deyilir, əslində Ter-Gevorkovun) zavodunun, indiki 3-cü zavodun darvazası yaxınlığında Məşədi Salmanın evinin altında hallaf dükanı (növbənöv un dükanı) vardı. Mahmudağanın övladı olmadığı üçün kiçik qardaşı Bəxtiyarı övladlığa götürmüşdür.

Hasar qonşusu Hüseynbala Qasımov rəhmətə gedəndən sonra Mahmud ağa onun arvadı Gülzarla gözəl və yaxşı



olduğuna görə ailə qurublar. Kiçik Bəxtiyara ata və analığı onlar ediblər.

Mahmudağanın digər qardaşı Əliəşrəfin isə xozeyn Məhəmmədsadıq Əliyevin malikanəsi yanında (indiki pedməktəbin yanı) mahud dükanı olub.

Səttar Babanın dediyinə görə, vaxtilə kiçik Bəxtiyarın əlindən tutub məktəbə aparıb. Onun ilk müəllimi Giləhli məhəlləsindən Hacıalpaşaların Müzəffər müəllim, sonra Niyazi müəllim olub. Məktəb isə "dom otdıx" (ist. evi) adıyla tanınmış Hacı Hüseyn bəyin malikanəsində yerləşib.

30-cu illərdə B.Vahabzadənin ailəsinin qalanları Bakıya köçdülər. Buna bir səbəb də onun qardaşları Ələşrəfin, Şirəlinin, Cahangirin, İsfəndiyarın hökumət tərəfindən səslərinin alınması olub.

Hazırda B.Vahabzadənin iki mərtəbəli ata-baba yurdunda 3 saylı uşaq bağçası yerləşir. Şair öz xoşu, halallıq və rəsmiyyətlə buna razılıq vermişdir. Bağçanın kiçik kollektivi binaya son dərəcə qayğı ilə yanaşırlar. Şəhər İcra Hakimiyyətinin köməyi ilə gözəl təmir edilmiş bina olduqca mənzərəli bir ərazidə yerləşir. Təmir zamanı bağçanın müdirəsi Əfruz Məcidzadə, müəllimlərdən Sümayə Əyyubova, Şükufə Ağayeva, Rəhimə Məmmədova, Yeganə Məmmədova, Fəridə Süleymanova fəhlələrlə birgə işləmişlər.

Bu kollektiv uşaqlara da, oturduqları binaya da, şairin özünün onlara bəxşiş etdiyi dədə-baba ev içi avadanlıqlarına-stol, stul, şkaflara da o qədər qayğı ilə yanaşırlar ki, insan məmnun olur. Onlar şairin yaradıcılığından ibarət baxımlı bir guşəni onun anadan olduğu bişmiş kərpic döşəməli otaqda yaratmışlar.

Şairin də, şəhərin də qonaqları çox vaxt olduqca mənzərəli ərazidə yerləşən bu malikanəyə baş çəkirlər. Onlar həyətdə zövqlə düzəldilmiş istirahət guşəsində oturur, yazın ecazkar gözəlliyini, yayın cana yatan dağ sərinliyini duyurlar.

Bu qeyd olunanlar sevimli şairimiz haqqında qohum-qonşuların söylədikləri və öz gözümüzlə gördüklərimiz idi. Bu məlumatları daha da dəqiqləşdirmək məqsədilə 2003-cü ilin avqust ayında Şəkidə istirahət edən böyük sənətkarla görüşüb məqsədimizi ona bildirdik. Ustad şair belə vacib bir mövzunun qələmə alınmasını və bu məsələdə bizim çox gecikməmizi qeyd etməklə yanaşı, onu da dedi ki, gələcək nəslə belə bir qiymətli kitab hədiyyə etmək heç vaxt gec deyil və bu işinizə görə mən sizə qabaqcadan öz minnətdarlığımı bildirirəm. Qaldı ki, mənim uşaqlıq və gənclik illərimin, eləcə də tərcümeyi-halımın ən dürüst təsvirinin 1991-ci ildə Azərnəşrdə çap olunan "Şənbə gecəsinə gedən yol" kitabımdan götürə bilərsiniz.

Biz xalqımızın sevimlisi, dünya şöhrətli şairimizin özü haqqında yazdıqlarını olduğu kimi, hörmətli oxucularımıza təqdim edirik.

Bu vaxta qədər yazdığım tərcümeyi-halların heç birində göstərmədiyim bir mühüm məsələni indi yazıram. Bütün rəsmi sənədlərdə atamın adını Mahmud, anamın adını isə Gülzar yazmışam. Əslində, Mahmud ağa mənim atabir, anaayrı qardaşım, Gülzar isə qardaşımın arvadıdır.

Bəs, bu niyə belə olmuş, mən niyə bu yanlışlığa yol vermişəm?

Əslində, mənim atamın adı Zəkəriyyə, anamın adı isə Xanımdır. Mahmud ağa Zəkəriyyənin oğlu, Xanım isə Mahmud ağanın ögey anasıdır. 1921-ci ildə Mahmud ağa Gülzarla evlənmiş, illər keçmiş, övladları olmamışdır. Mən 1925-ci ildə doğularkən, ögey qardaşım məni öz atasından oğulluğa götürmüşdür. Mən bunu bilməmişəm, gözümü açarkən Mahmud ağanı ata, Gülzarı isə ana kimi tanımışam. Yalnız 1946-cı ildə, 21 yaşında baba kimi tanıdığım Zəkəriyyə ölərkən, onun yasında doğmaca nənəm, yəni Xanımın anası mənə həqiqəti demiş, lakin mən buna inana bilməmişəm. Daha doğrusu, inanmaq istəməmişəm. İndi bu cümlələri yazarkən, o ağrılı yas gecəsində nənəmin dediklərini xatırlayanda, məni dəhşət



bürüyür. O zaman keçirdiyim həyəcanları sözlə izah etmək çətindir. 21 il "ata", "ana" kimi tanıdıqlarım əslində mənim atam və anam deyilmiş. Baba və nənə dediklərim isə atam və anam imiş.

1946-cı ildə biz artıq Bakıda yaşayırdıq. Aldığımız teleqrama əsasən Şəkiyə yasa gəlmişdik. Doğma anam Xanımın oğlu İsfəndiyar müharibədən qayıtmamış, ikinci oğlu, yəni mən isə başqasına töhfə verilmişdim. Xanımın bundan sonrakı güzəranı anasını, yəni nənəmi narahat etmiş, ona görə də bu vaxta qədər gizli qalan sirri mənə açmışdı. Onu da deyim ki,qoca nənəm bu sirri mənə Xanım anadan gizli demişdi. Xanım ana sirrin açıldığını biləndə anasına bərk təpindi. Amma deyilən deyilmiş, həqiqət öz işini görmüşdü.

Mən o gecə yata bilmədim. Qoca nənəmin yerli-yataqlı dediklərinə inanırdım. Ən mühümü də o idi ki, qəlbimin dərinliyində Xanım nənəyə həmişə gizli bir məhəbbət yaşayırdı. Bu məhəbbətin, bu yaxınlığın nə olduğunu dərk edə bilməsəm də Xanım ananın mənə ögey nənə olduğuna heç cür inana bilmirdim. İkinci mühüm cəhət bu idi ki, mən 9 yaşımda doğma ata və anamdan ayrılıb, Mahmud ağa və Gülzarla Bakıda yaşasam da həmişə Şəki, oradakı doğma ocağımız gizli bir hiss ilə məni özünə çəkirdi. Bakıda əmioğlu kimi tanıdığım, əslində isə qardaşım oğlu olan Hikmət yay tətillərində Şəkinin adını belə tutmazdı. Mən isə il boyu yay tətilini gözləyir, may ayı gələn kimi Şəkiyə qanadlanardım. Bunu hiss edən analığım Gülzar həmişə məni Şəkiyə qısqanar, yay aylarında Bakı bağlarına köçmək istərdi. Mahmud ağa ürəklərdə gedən bu hiss döyüşünü başa düşər, həmişə mənə tərəf olardı.

Şəkiyə gələndə mənim sevincimin həddi-hüdudu olmazdı. Biz anamla o zaman Şəkinin aşağı hissəsinə köçmüş Şirəli əmigilə (əslində ögey qardaşım) düşərdik. Elə həmin gün mən baba ocağına getməyə, babam və nənəmlə görüşməyə can atardım. Gülzar ana mənim bu həyəcanıma qısqansa da etiraz

etməz, mənə "yuxarı başa"- babamgilə getməyə izn verər, özü isə getməzdi.

Nənə və baba kimi tanıdığım ana və atamla hər görüşüm həm mənim üçün, həm də onlar üçün bayram olardı. Hər dəfə nənəm (əslində anam) məni bağrına basıb hönkür-hönkür ağlardı. Böyük qardaşım İsfəndiyar orduya gedəndən sonra qocalar o zaman hələ evdə olan Firuzə bacımla başlarını aldadar, arxasız qaldıqlarını unutmağa çalışardılar. 1940-cı ilin yanvarında İsfəndiyar orduya getdi. 1941-ci ildə müharibə başlandı. Yeganə ümidləri cəbhədən qayıtmadı. Bu zaman qocalar mənə ümid gözü ilə baxmağa başladılar. Deyəsən, ürəklərinin dərinliyində təbii bir təəssüf və peşimançılıq baş qaldırmışdı.

Xanım ana Gülzarı gəlinlərinin hamısından çox istəyirmiş, ona görə ki, Gülzar qərib idi. Onun yer üzündə nə ata-anası var idi, nə də qohum-qardaşı. Qəlbi sınıq idi. 1918-ci ildə itkin düşmüş bacı-qardaşlarını axtararmış. Digər tərəfdən, birinci ərindən də Gülzarın övladı olmamışdı. Bizim ocağa düşəndən sonra nə qədər həkimə göstərmiş, dava-dərman eləmişdilərsə də faydası olmamışdı. Həkimlər sonsuz qalacağını üzünə deyiblərmiş. Buna görə də Gülzar ana tez-tez tənhalığa çəkilər, xısın-xısın öz dərdinə ağlarmış. Mən boynuna düşəndə Xanım ana özü ilə demək olar ki, həmyaş olan 4 oğlundan utanırmış, çox vaxt xəcalətdən boyu bərabəri oğullarının üzünə çıxa bilmirmiş. Hətta ara mamaçası ilə görüşmüş, uşağı tələf etmək istəmiş, bundan duyuq düşən Gülzar, Xanım ananın ayaqlarına döşənmiş, uşağı saxlamağı və ona bağışlamağı xahiş edibmiş. Xanım ana Gülzarın istəyini ərinə bildirmiş və razılaşmışlar. Mən dünyaya gələn kimi Gülzar ana məni bağrına basmış, " bu mənimdir"- demişdir. Bütün ailə Gülzarın istəyini qəbul etmiş və qeydiyyatda atam Mahmud ağa, anam isə Gülzar yazılmışdır.

Gülzar ana mənim tərbiyəmə və təhsilimə çox diqqət yetirmiş, ali təhsil almağım, həyatda uğur qazanmağım üçün



özünü çıraq kimi yandırmışdır. Balasını sevməyən, onun yolunda hər cür əzaba qatlaşmayan ana tapmaq çətindir. Bizdə bütün analar balalarının başına dolanan pərvanə misallıdır. Lakin Gülzar ananın mənə bəslədiyi sevgi, göstərdiyi qayğı heç bir ölçüyə sığmazdı. Yalnız onu deyim ki, məktəbdə oxuduğum zaman böyük tənəffüs vaxtı o, mütləq özünü yetirər, məni yedirib sonra gedərdi. Bizi tanıyan bütün ailələr Gülzarın analığına, mənə bəslədiyi hədsiz məhəbbətə təəccüb edər, həmyaşlarım mənə həsəd aparardı. Müharibə illərində o, öz çörək payını yeməz, məni yeməyə məcbur edərdi. Bu gün həyatda qazandığım nə varsa, hamısına görə Gülzar anaya borcluyam.

Əslən meşəçi olan atam və qardaşlarım yeni iqtisadi siyasət dövründə baqqal və həllaf dükanları açmışdılar. Atalarının rəhbərliyi ilə Ələşrəflə Cahangirin baqqal dükanı, Mahmud ağa ilə Şirəlinin həllaf (un, buğda) dükanı varmış. Yeni iqtisadi siyasət dövrü qurtaran kimi atamı və qardaşlarımı səsvermə hüququndan məhrum edirlər. Şəkidə dolanmağın çətin olacağını başa düşən qardaşlarım Ələşrəflə, Cahangir 1930-cu ildə Bakıya köçməli olmuşlar. Qardaşlar Bakıda bir müddət iş tapa bilmir, nəhayət, ipək fabrikində işə düzəlirlər. Dükanını bağlamağa məcbur olan Mahmud ağa da uzun müddət Şəkidə iş tapa bilməmiş, ağır günlər keçirmişdir. Qardaşlar atamı da Bakıya dəvət etmişlər. O biri tərəfdən, Gülzar ana da Bakıya köçməyə can atırmış, mən böyüdükcə o qorxurmuş ki, doğma ata-anamı tanıya bilərəm.

Nəhayət, 1934-cü ildə biz də Bakıya köçdük. Bu köç indiki kimi yadımdadır. Yevlağa qədərki 80 kilometr yolu araba ilə 2 sutkaya gəldik. Şəkinin 35 kilometrliyindəki Suçma (Suçivini) kəndində axşamüstü bizi yağış tutdu. Gecəni kənddəki karvansarada qaldıq. Ertəsi gün səhər tezdən yola düzəlib axşamüstü Yevlağa çatdıq.

Biz Bakıya köçəndən sonra Şirəli əmim də Şəkinin aşağı məhəlləsində ev alır və beləliklə, babam (atam) sonbeşik qızı Füruzə və Xanım ana ilə orada qalır.

**"QİYALAR VƏ YUHLAR"** (patronim) – ilk baxışdan çox cəlbedici, ruh oxşayan bu adları daşıyan nəsillər əslində sayca çox olan, hamısı toplum halında bir məhəllədə yaşayan sadə, zəhmətkeş insanlardır. Kök törəmi bir olan bu nəslin qac ayrımına da Yuhlar deyirlər. Məna açımı üçün çox çalışdıq, özləri də heç bir söz deyə bilmədi. Yu Həsən adıyla tanınan biri də vaxtı ilə dəmirçilik, qaynaqçılıq etmişdir. Mərhuma Yuhların Həsən yox, qısaldılmış halda Yu Həsən deyərdilər. Məhəllənin məscidi həyətində yerləşən dükanın satıcısı Sənubər xalanın dediyinə görə, mərhum ərindən belə eşitmişdir. Yuhlar hazırda oturduqları binanı özləri tikiblər. Əvvəlki qədim binanı söküblər. Özü də oranı sökəndə görünür müəyyən qədər "sarı" tapıblar ki, hərəsi özü üçün ayrı-ayrı mülk yarada biliblər.

Vaxtilə sökülən qədim mülkdə türklər yaşayıblar. O türklər də sovetdən xeyli qabaq buralara gəlmişlər. Hazırda Mustafa Əfəndi adıyla tanınan I-ci rayonun məhəllə məscidi vaxtilə həmin o türk dindarlar vasitəsilə idarə olunardı. İndiki müstəqillik dövründə İrana, Türkiyəyə gediş və gəlişlər asan olduğu kimi, onda da sovet hökumətindən qabaqkı dövrdə də ünsiyyətlər, gediş-gəliş çox sıx idi. Şəki-Qəbələ bölgəsinin qazisi Səlim Əfəndinin söylədiyinə görə, özü mərhum molla Ələddindən eşitmişdir ki, həmin məscidin o əzəmətli minarəsini ulu babaları tikdiriblər.

Sənubər xalanın dediyinə görə, 3-4 il bundan qabaq bir neçə nəfər cavan adamlar əllərində kağız və aparatla bu məscidə gəldilər. Deyiblər ki, türkdürlər, özlərinin ata-babaları vaxtı ilə bu məscidin yaradıcıları və idarə edənləri olublar. Onlar əlləlrindəki çertyoj və aparatla oraları xeyli axtardılar. Sonra onlara aydın oldu ki, bir qədər səhv ediblər. Ata-babalarının vaxtı ilə yaşadıqları ev Yuhların və Qiyaların yaşadıqları məskən olub. Onu da onlar söküblər.

Qiyalar və Yuhlar ulu bir soyun tirə və yaxud kəramətli baba adıyla bağlı ola bilər. Lakin yuh adının ulu "Hu-hu" deyimi ilə səsləşməsini də təxmin edirik.



**"AĞABƏYLƏR"** (patronim) –bu soy barədə əhatəli məlumatı biz onların Şəkidəki ata-baba mülkündə (1870-ci ildə tikilmiş) yaşayan varisi 1920-ci il təvəllüdlü Zülhiccə İbrahim qızı Əbdürrəhmanovadan aldıq.

Zülhiccə müəllimə Şəki Pedoqoji Texnikumunu 36-cı ildə, tanınmış pedoqoq Seyfi Hüseynovun direktorluğu dövründə qurtarıb. Pedoqoji fəaliyyətinə Şəki uşaq evindən başlayıb.

Zülhiccə müəllimə burada işlədiyi müddətin 20 ilini ömrünün qızıl dövrü adlandırır. Çünki o, Şəkidə sahibsiz uşaqlar üçün ilk yetimxananın əsasını qoyub, son günlərinədək bu uşaq evinə qüvvəsini, varını xərcləyərək başçılıq edən Badisəba xanım Köçərli ilə birgə işləmişdir. Zülhiccə müəllimə onun yetirməsi olduğu üçün insanlığın bütün tərəflərinə söykənən qaydalarla işləməyə öyrənmiş, müdirənin tökdüklərini bircə-bircə götürmüşdür. Odur ki, Badisəba xanımdan sonra başqaları ilə işləmək ona həm çətin idi, həm onun qoyduğu müqəddəs qaydaları olduğu təkin görə də bilmirdi.

Ömrünün də 20 ildən artıq bir dövrünü Şəkidə keçirmiş Badisəba xanım tanınmış ziyalımız, repressiya qurbanı, ilk dəfə Azərbaycan ədəbiyyatı tarixini yazan Firidun bəy Köçərlinin xanımı olub. Nazənin gəlin vaxtından qırmızı imperiya nökərləri gənc ər-arvadı bir-birindən ayırdılar.

Qori Seminariyasında dərs deyən Firidun bəy 1920-ci ildə həbs olundu və bir də geri qayıtmadı.

Zülhiccə müəllimə yaşlı gözlərilə Badisəba xanımdan, onun özünün dediyi kimi bədbəxt əri Firidun bəydən eşidib-bildiklərini xeyli danışdı. Filoloq alim Hacı Sabir Əfəndiyevin də 90-cı illərdə Badisəba xanım haqqında yerli qəzetdə yazdığını, oçerkin çox ürəyincə olduğunu söylədi.

Zülhiccə müəllimə şəkililərin bu böyük ürək yiyəsi olan Xatun anaya Badisəba yox, Balsavad xanım deyə müraciət etdiyini də söylədi. Bu 2 gözəl sözdən ibarət adın arxasında saysız-hesabsız təmənnasız yaxşılıqlar silsiləsi durduğu üçün

ona bu ad deyilmişdir. Şəkililərin ad qoyma mizan-tərəzisində ədalətli olduqları bəllidir.

Badisəba xanım daim sevgili əri Firidun bəyin acı taleyinin qəhərini çəkər, mərasimlərdə qara paltar geyinər, axşamlar otağına çəkilib ərinin ruhunu yad edərdi. Gündüzlər yaşadığı 3-cü mərtəbənin eyvanından bədbəxtinin qara mahuddan tikilmiş geyimini sərib günə verərdi. Bir tiyan halva bişitdirib yetimləri Firidun bəyin ehsanından yedizdirərdi. Belə günlərdə onu sevənlərin, təəssübünü çəkənlərin, Firidun bəyin xatirəsini əziz tutanların çoxu - S.Vurğun, M.İbrahimov, İ.Əfəndiyev, Bülbül və başqaları ailəsilə birgə onu görməyə gələrdilər. Axı, özü də himayədar olduğu yetimlərilə birgə binada (Zülqədər Zülfüqarovun malikanəsində) qalırdı. Özünə şəxsi ev ala biləcəyi halda almırdı. Neynirdi ki, evi? Firidunsuz o da yetim idi. Firidun bəyin həbs edildiyi günün sabahı Qoridəki top vursan dağılmayan ev-eşiyinin qapılarını açıb qonşulara demişdir:-Nəyimiz var, aparın halal xoşunuz olsun, Firidun bəysiz bütün bunlar heçdir, mənasızdır.

Özüylə götürdüyü isə ərinin bir dəst paltarı, əlyazmaları, həmişə belində gəzdirdiyi, sevdiyinin ona hədiyyə etdiyi üstü gözəl naxışları ilə birgə 68 ədəd qızıl onluğu olan qızıl kəmər idi.

Badisəba xanım 1954-cü ildə Bakıya gedərkən qatarda vəziyyəti ağırlaşmış, oradan birbaşa xəstəxanaya çatdırılmışdır. Bir neçə gündən sonra dodaqlarında " Firidun" kəlmələriylə vəfat etmişdir. Onu Bakıda bacısı oğlu, tibb elmləri doktoru Fəxri Vəkilov dəfn etmişdir. Zülhiccə müəllimə də, mən də Badisəba xanımın ömrü ilə bağlı xatirə-söhbətə elə dalmışdıq ki, özləri barədə edəcəyimiz sorğu-cavab yarımçıq qalmışdı. Zülhiccə müəllimə yaman kövrəlmişdi. Görünür taleyindəki müəyyən yaxınlıq da buna səbəb idi. Onun təkcə qız övladı məktəbliykən vəfat etmiş, uşağın atası ilə də həyatları başacan olmayıb yolları ayrılmışdır.

Yuxarı Başda çox hörmətli deyilən Ağabəylər adının bu soya haradan gəlməsini Zülhəccə müəllimə belə izah etdi:



-Bu ad nəslimizin lap ilkin ata-babaları Əlixan və Uluxanın adıyla bağlıdır. Babam, atam və əmilərim papaq, kürk tikən sənətkarlar olublar. Atam İbrahimin öz atası Əbdürrəhmandan eşitdiyinə görə, Qaladan yuxarı ərazinin idarəediciliyi Əlixan və Uluxan tərəfindən olub. Hər iki qardaş adlarının gur işığına baxmayaraq çox da var-dövlət hərisi olmayıblar. Sadə xalqla gözəl davranışları və irili-xırdalı saysız yaxşılıqları olub. Ağabəy adı da onların adı və əməllərilə bağlıdır ki, biz bu gün həmin adı ləyaqətlə daşıyırıq. Tarixin hansı dönəmində isə onlar tam müflisləşib, papaqçı və kürkçü sənətini imkanlı vaxtlarında öyrəndikləri üçün çətin məqamlarında dayaqlarına çatıb, elə onlardan üzü bəri gələn bu sənəti babam, atam, əmilərim Yahya bəy, Rəsul bəy, Hidayət bəy də davam etdiriblər. Atam İbrahim sənətçi olsa da, ərəb-fars dillərini gözəl bilib, daim mütaliə edib. Ailə qayğılarına görə təhsil ala bilməyib. Mənim Əbdürrəhman, Əli, Şirəli və Mirəli adlı qardaşlarımdan təkcə biri sağdır. Həmin Mirəli qardaşım indi Neft Akademiyası Universitetində energetika şöbəsində işləyir, tex. elm.namizədidir.

Mərhum Əli qardaşım isə hüquqşünas kimi sistemdə işləyib, çox rayonlarda çalışıb. Özü ilə həmsənət olan Qazaxlı qızı ilə ailə qurub. Onların böyük oğlu İsmayıl hazırda Moskvada Azərbaycan səfirliyində çalışır. Həkim olan həyat yoldaşı Giləhli məhəlləsindən Cəmil müəllimin bacısıdır.

Əbdürrəhman qardaşım müharibədə həlak olub. İndi onun Neymət adlı bir oğlu Bakıda texnikum müəllimidir. Şirəli qardaşım isə kolxozda hesabdar olub.

Əmim Rəsul bəy Giləhli məhəlləsindən Mustafa Əfəndinin oğlu Mir Həmzə Əfəndinin qızı Hənifə xanımla ailə qurmuşdur. Mir Həmzə Əfəndi çox gözəl insan idi. Onun Yuxarı Baş əhalisini siyahıya aldığı yadımdadır. Tuthatut vaxtında Tiflisə getdi, bir də gəlmədi. Onun Qafur adlı oğlu Tiflisdə vəzifədə işləyib, övladı yox idi. Şakir Əfəndiyev adlı oğlu sistem işçisi olub. Bildiklərim bunlardır.

Zülhiccə müəllimənin ölçülü-biçili, səmimi söhbətindən, ev içi səliqə-səhmanından, ona dayaq olan mehriban əmi gəlini Məstan xanımdan yaddan çıxmayan bir ünsiyyətlə ayrıldıq.

**"XİLLOSİLƏR"** (patronim) – adlı nəsil də bu gün Yuxarı Baş məhəlləsinin yaşlı sakinlərinə çox yaxşı məlumdur. Onlara məxsus qədim ev nəslin nəvə-nəticələri tərəfindən başqasına satılıb, özlərisə Bakıya köçmüşlər. Nəslin ulu babası Xillosi adlı bir türk əsgəri olub. O, 1918-ci ildə xilaskar türk ordusu Azərbaycana gələndə Şəkidə qalır, burada Fatmaxanım adlı bir yerli qızla ailə qurur. Nəsil artımı da elə bu adla davam edir.

Sevimli şairimiz Bəxtiyar Vahabzadə "Şəki lətifələri" kitabına (toplayıb işləyəni Sabir Əfəndiyev, 1987) yazdığı ön sözdə Xillosi ilə bağlı belə bir xatirəsini yazmışdı: "Mən uşaqlıqdan lətifələr, baməzə adamlar mühitində böyümüşəm. Atam zahirən çox qaraqabaq idi. Amma yaşıdlarının yanında birdənbirə hazırcavab, zarafatcıl adama çevrilərdi.

Qədim Şəki adətinə görə cavanlar hər cümə günü birinin evinə toplaşar,"Siran gəzərdilər". Növbəti cümə günü Xillosigilə yığışanda ev sahibi plov sinisini süfrəyə qoyub osmanlı ləhgəsində "soxulun"-deyir ("başlayın" mənasında), özü isə ayaq üstə durub qonaqları seyr edir. "Soxulun" sözünə təəccüblənən atam üzünü Xillosiyə tutub: "Şöngü"-deyir. Xillosi: "İtə şöngü deyərlər",-deyə atamın üzünə tərs-tərs baxanda o, halını pozmadan:

-"Soxulunun" cavabı "şöngüdür", bala,-deyə cavab verir.

**"CƏRROLAR"** (patronim) – bu nəslin əzəl soyu Car-Balakən bölgəsindən olduğu üçün o cür deyilir. Cardan gələn Əlibala kişiyə Yuxarıbaşlılar Carrooğlu deyərdilər. Hazırda 86 yaşlı nəvə Cəlil Əlibalayev Abbas oğlunun zəhmətkeşliyinin və qabiliyyətinin şahidi olduq, Bədnəzərdən uzaq, Cəlil dayı bu yaşda qıvraq, gümrah və cəlddir. Əlində ölçülü-biçimli kəsilmiş çiy kərpiclərə baxıb, heyrətləndim. O, 20-25 m məsafədən qayadan üzü aşağı qapıyacan düzlənib, hamar həyətə çevrilmiş ərazini, 2 mərtəbəli geniş, çoxotaqlı abad evi



göstərib dedi ki, baxanlar elə bilər bu həyəti traktorla qazıb səmt-surahlı ediblər. Ancaq onu bu iki əllərim və külüng edib. O boyda ev-eşiyi tikməyimə baxma, hələ qurtarmamışam.

Cəlil baba atasından eşitdiyi, bəzilərini isə uşaq vaxtı özü gördüyü adamların ləqəblərini də bizə dedi. Ona Tanrıdan cansağlığı arzulayıb, səmtimizi başqa soylara saldıq.

**"HACI HEYDƏR ƏFƏNDİLƏR"** (patronim) – Sovet dönəmindən qabaq Güney doqqazda Hacı Heydər Əfəndi adlı məhəllənin sayımlı-seçimli bir Hacısı yaşayırdı. Dərin dini biliyə malik olan, böyük-kiçik tanıyan, insaf, mürvət yiyəsi olan, rəhmətini sağ ikən qazanan bir şəxsiyyət olub. Onun oğlu Molla Ələddin də özü təkin kamil şəxsiyyət idi. Gözəl mərsiyə oxuyardı. Övladı olmayan bu din xadimi 50-60-cı illərdə də yaxşı tanınan, hamının xeyir-şərinə yarayan insan olub. Ömrünün son vaxtlarında o, öz ata-babasından qalan evini bişirtdiyi xeyratla, xeyir-dua və halallıqla kasıb bir adama bəxşiş etdi. İndi çoxlarına örnək ola biləcək bu hadisə yaddaşlarda yaşayır, yeri düşdükcə ibrətamiz misal təkin çəkilir.

**"QUR-QURLAR"** (patronim) – Çox yaşlı adamların dilində balaca, quyraq, yaraşıqlı telefon, qabaq stollarına qur-qur deyildiyinin şahidi olmuşuq. Qur-qur İsmayıl adı ilə tanınan bir dülgər də məhz bu cür avadanlıqların yaradıcısı olduğu üçün o ləqəbi qazanıb. Görünür qurama işi olduğu üçün kiçik stollara qur-qur deyilir. Lakin belə bir faktı da qeyd etməliyik ki, Kuriqur-Kurqir adlı bulqar türk soyları tarixdə mövcuddur. Bu soyun Azərbaycanda Qurqur oykonimi də saxlanmışdır (Mahmud İsmayılov - "Azərbaycan xalqının yaranması", səh.46). Ola bilsin ki, həmin adın yaşanan izidir.

Birinci rayonun yaşlı sakinləri dünyasını dəyişən, ancaq adları ləqəblərilə birgə yaşayan xeyli şəxsiyyətlərdən də məlumat verdilər. Bu məhəllənin Siyah bəy, Əhməd bəy adlı qorodovoyları (milisioner) olub, darğa Abbas, Qaçaq Cəfər, Çörəkçi Vahab, Dəyirmançılar Hacı Şirin oğlu Camal, qardaşı Məhəmməd Fatı, təndirquran Tükəzban, nalbənd Usuf,

meşəbəyi Rəhim, dəmirçi Əlibala adlı tanınmışları məhəllə məscidi ətrafında yığılan gimgənin vaxtaşırı söhbətlərinə ayrı-ayrılıqda mövzu olurlar.

**"RƏHİMOVLAR"** (patronim) – **HACI SƏLİM ƏFƏNDİ SOYU** – Köç yolu üstündə Ənbər, Qənbər, Kərim və Səlim qardaşlarının yurdu var. Hazırda qardaşlardan Səlim əfəndi yaşayır, digərləri isə dünyasını dəyişib. Səlim Əfəndinin dinə olan böyük marağı, həvəsi və qabiliyyəti sonda onun tanınmış din xadimi olmağına səbəb oldu. Hazırda o, Şəki-Qəbələ bölgəsinin qazisidir. Qeyd edək ki, Səlim Əfəndi ilk dini bilgilərini, əski əlifbanı dərin hörmət bəslədiyi mərhum Baxşəli Əfəndidən və Şaxamların Yusif Əfəndidən almışdır.

Onların ata-baba mülklərində şəhər mədrəsəsində çalışan Osmanlı türklərindən ibarət müəllimlər yaşayır. Şəhərin orta hissəsində yaşayan Səlim əfəndi yurdu dindaşlarının istifadəsinə vermişdir. Dini öyrənmək istəyənlər həmin müəllimlərdən dərs öyrənməyə gəlirlər.

**"QOBU MƏHƏLLƏSİ"** (orooykonim) – Yuxarı Başın 2-ci rayonuna düşən məhəllə belə adlanır. Qobu oronimi – dərin yarğanı, çökəyi olan hissəyə deyilir. Şəki məhəllələrinin çoxunda belə olan və adlanan hissələr var. Yuxarı Başın belə Qobu hissəsi məhəllənin ortalığında yerləşir. Qurcana çayın qolunun yaratdığı dərin yarğana baxanda adamın gözü qaralır.

Qobu məhəllədə Hacı Qədir dayıgilin evinin yaxınlığında məscid var idi. İndi o məscid binasının azacıq xırda qalıqları qalmışdır. Məsciddən yuxarıda isə Qızlar bulağı var idi. Suyu qışda isti, yayda sərin olardı. 30-cu illərə qədər çeşmənin gözü tutulmamışdı. Vaxtı ilə al-əlvan ipək geyimli, çiyni güyümlü, əli satıllı qız - gəlinlər bu bulağın üstünün yaraşığı idilər.

**"HACI ŞIXƏLİBƏYOVLAR"** (patronim) – Qobu məhəlləsinin bu qədim soyu 18-ci əsrin ortalarından burada yaşamağa başlayıb. Onlara məxsus, hazırda salamat qalan yaşayış binası 1763-cü ildə, əzəmətli Xan sarayından bir il sonra tikilib. Babalarından eşitdiklərinə görə saraya məxsus qala bürcünün



tuşu istiqamətində bu evin özülü qoyulmuşdur. ASE-nın cildində evin şəkli verilmişdir. 70-ci illərdən üzü bəri bu qədim evdə xeyli dəyişikliklər edilmişdir. Evin divarının qalınlığı 1 m 80 sm-dir. Eşitdiklərinə görə yumurta, baş-ayaq suyu, gəc, çapma daşla yerli ağac materiallarından tikilmişdir. 2-ci mərtəbədəki evlərdən birinin tavanında xonça şəkilli bəzəyin içərisində əski hərflərlə ayrı-ayrılıqda 5 söz yazılmışdır. Onların üzərinə rəng çəkilib, biri isə saxlanılmışdır. Bu sözlərin evin tarixi, kimə məxsus olduğu, ustanın adı, Allah kəlamı olduğunu təxmini dedik. Evin indiki sahibi rəngi siləcəyini, sözlərin yenidən aydın görünməyə çalışacağını dedi. Evin indiki şüşəbəndi 70-ci illərə qədər qoz ağacından düzəldilmiş, eynilə Xan sarayındakı kimi bir-birinə geydirilən xırda ağac parçaları və rəngli şüşələrdən işlənmiş şəbəkə siyirmələrdən ibarət idi. Həmin illərdə evin yaşlı sakini müharibə veteranı mərhum Soltan Şıxəliyev şüşəbəndinin siyirmələrə görə çox soyuq olduğunu, tam işıqlı olmadığını nəzərə alıb, onu müasirləşdirmək fikrinə düşür.

Bəlkə də bu ailədə iki oğlun, qocaman veteranın adi məişət ehtiyaclarının ödənilməsi dövlət tərəfindən olsaydı, o cürə tarixi abidəyə əl vurulmazdı.

Həmin dediyimiz siyirməli şəbəkə şüşəbəndlər sökülür, müasir üslubla əvəz olunur. Təkcə bircə dənəsi çardağa yadigar üçün qoyulur. Qalanları isə məşhur şəbəkə ustası Əşrəf Rəsulova satılır.

Evin ikinci mərtəbəyə və çardağa qalxan pilləkəninin də çox çətinliklə söküldüyünü dedilər. Söküldükcə də hər pilləkənin altından əski yazılı vərəqlər çıxdığını görüblər. Həmin pilləkəni də yenisi ilə əvəz ediblər. Belə dəyişiklik nəyə lazımdır?

Elə bu məqamda bir faktı misal çəkmək istəyirəm. Bizim doğmalarımızdan biri Sahib Bəharəddin oğlu Həsənov səyahəti-turizmi çox sevir. Həmişə ona deyərdik ki, yediyin-geydiyin özününki, bizə də gördüyündən danış. Fransada gördüyü bir şəhər haqqında danışmağı daha çox xoşlayır. Deyir

ki, XVII əsrə kim "səyahət" etmək istəyirsə o şəhərə getsin. Həmin şəhər Fransanın tarixi əyaləti olan Elzasın Yuxarı Reyn departamentindəki kiçik Rikvir şəhəridir. Əslində bu şəhər turist səfərlərinin "mirvarisi" sayılır. Bu şəhərin min nəfərdən bir qədər çox əhalisi olmasına baxmayaraq, ilin bütün fəsillərində bu şəhərdə qələbəlik olur. Buna səbəb odur ki, Elzas Rislinqinin paytaxtı olan Rikvirdə hər şey XVII əsrdə olduğu kimi saxlanır. Hətta şəhərdə minik avtomobillərinin işlənilməsi üçün hədd qoyulub. Gediş-gəliş çox vaxt atlı arabalarla, faytonlarla, furqonla olur. Küçələri fərş döşəməli olan bu orta əsr şəhərində yerli bələdiyyə heç zaman icazə verməyib ki, hansısa bina sökülüb, yenisilə əvəz edilsin. Hansısa yeməkxana, pivəxana yeni görkəmdə olan birisilə əvəz olunsun. Müəyyən təmir, bərpa, qoruyuculuq işləri aparılır, tam müasirlik isə yaxına buraxılmır. Dünyanın hər yerindən bu balaca şəhərə turist axını var. Şəhər öz maliyyə ehtiyaclarının çoxunu da bu turizmdən olan gəlirlə ödəyir. Şəhər idarəediciləri də, əhalisi də çox gözəl başa düşür ki, dünyanın müasirlikdən, texnikadan gözü doyub. Onların marağı həmişə qədim arxitekturaya, qədim ritual adətlərə daha çoxdur.

Bu fakta istinad edərək, demək istəyirik ki, Hacı Şıxəlibəyovlar mülkü dövlət tərəfindən qeydiyyata götürülüb qorunsaydı, tarixi görünüş olduğu kimi qalardı. Qoca veteran bir otaqla, evin oğulları da müəyyən köməklə təmin olunsaydı, ev əvvəlki görkəmini itirməzdi. Çünki vaxt var idi ki, Xan sarayının tamaşasına gələn turistlər sarayın gözətçisi Şirin bəy vasitəsilə bu evə də gəlib baxırdılar.

Belə məlumatlara yiyələndikcə təsəvvür edirik ki, itirdiklərimizin sayı-hesabı yox imiş. Biz hələ nələri görüb-götürüb, özümüzə örnək etməliyik!

Haqqında bəhs etdiyimiz Hacı Şıxəlibəyovlar soyuna məxsus həmin evdə nəslin dördüncü tirəsi yaşayır. Ata-babalarından, onları tanıyıb, eşidib bilənlərdən öyrəndiklərinə görə, nəslin Hacı Şıxəli bəy, Şirin bəy, Mütəllib bəy, Abbas



bəy, Əhməd bəy, Bəhram bəy, Hüseyn bəy, Həsən bəy kimi adlı-sanlı şəxsiyyətləri olub.

Ulu baba Hacı Şıxəlibəy zəngin Şəki taciri olub. Xanın sarayına yaxın, yaxşı tanıdığı bəylərdən olub deyə, ətraf kəndlərdən bir neçəsini xan ona verib. Torpaq paylarından gələn gəlir də onun varidatının üstünə gəlir gətirib.

Nəsil davamçılarından biri olan Abbas bəy Türkiyədə oxuyub. Kazan-tatar qızı ilə ailə qurmuşdur. Abbas bəy elə yaşadığı Yuxarı Baş məhəlləsində bir hissənin qlavası-başçısı olmuşdur.

Əhməd bəy isə əvvəlcə şəhərin Calğalı bulaq məhəlləsində yerləşən kişi gimnaziyasında oxuyub. Vaxtilə onun dediyi sözlər yaddaşlarda qalmışdır: "Gimnaziya geyimini, xüsusən də şapkasını başımızda görən yaşlılar bizi çox danlayardılar ki, oxumağınız yaxşı, örtməyin o papaqları, kafir geyimi geyməyin. Biz də yaşlıları görən kimi şapkalarımızı pencəyimizin altında gizlədərdik".

Əhməd bəy gimnaziyadan sonra Peterburq hərbi məktəbində oxumuşdur. Doğma yurda qayıdandan sonra şəhərdə pristav (milis rəisi) işləyib. Çar Nikolayın vaxtında yolkəsən xırsquldurbasanların zərərsizləşdirilməsində böyük rolu olub. Həmişə də quldurlara qabaqcadan xəbər göndərərdi ki, əl çəkin bu işdən, salamatı yaşamaq yolunu seçin. Bəzən ona yekəxana xəbərlər göndərilərdi ki, "lazım gəlsə sənin özünü də oğurlayarıq".

Pristav Əhməd bəy də bu cavabı cavabsız qoymaz, sağ əli olan çuğul-satqınlar vasitəsi ilə onları tutardı.

Şəki varlılarından olan Ədil xan Yelisuyskinin Daşüzdə olan at zavodu Sovet hökuməti tərəfindən təhvil alınanda nümayəndə Voroşilov gəlmişdi. Həmin vaxt Əhməd bəy Küdürlü Mustafanın dediklərini rus dilinə tərcümə edərdi. Küdürlü Mustafa həm Voroşilovu qarşılayan, həm də təhvil-təslimdə nümayəndə rolunu oynamışdır.

Sovet hökuməti tam bərqərar olandan sonra Əhməd bəy özü vəzifəsindən uzaqlaşdı. Özünün ixtiyarında olan Cəfərabad

yaxınlığında Çolaqlıdakı 4 göz çayıl (dibsiz qaynama, göl) deyilən yerdə özünün dəyirmanı yaxınlığında ömrünü sürdü. Ətrafda olan qaçaqlar, xüsusən də zəyzidli Anqıt oğlu Əhməd və başqaları onun başına yığışıb söhbət edərdilər. Çünki Əhməd bəy həmişə tutduğu qaçaq-quldur oğruları da hər vasitə ilə sağ-salamat qalıb, ailələrinə qayıtmağına çalışırdı.

Əhməd bəyin oğlu Həsən bəy Sovet hökumətinin ilkinliyindən poçt rəisi - naçalniki olub. 43-cü ildə rəhmətə gedib. Həsən bəyin 7 dayısı və Zaman bəy adlı ana babası Türkiyədə yaşayıblar.

Bəhram bəy (Abbas bəyin bibisi oğlu) Şəki üsyanı zamanı ən adlı və igid qaçaq olub. O da Peterburqda oxuyub. Sovet hökumətinin ilkinliyində hərbi komissar olub, 30-cu ildə qaçaqlara başçılıq edib.

M.C.Bağırov həmin ərəfədə ona xəbər göndərir ki, üzə çıx, sənə toxunmarıq. M.C. Bağırovun xarakterindən və onun ətrafındakılardan xəbərdar olduğu üçün təklifi qəbul etməyib, özünü gicgahından güllə ilə vurub.

Bu soyun Bəşir adlı bir dəliqanlısı da hamam xəznəsində öldürülən 90 yaşlı atasının qan intiqamını alıb, yoxa çıxıb. Deyilənlərə görə Türkiyəyə qaçıb. Bəşir çox sərt adam olub. O, özündən kiçik qardaşının bir dəfə evdə arvad paltarı geyib zarafatyana rəqs etdiyini görüb, dəhşətlə bağırıb: "Bu nədi ə! Sən arvadsan, yoxsa kişi?" – deyib, yerindəcə güllə ilə vurub öldürüb.

Digər bir varis, sərt xarakterli Hüseyn bəy də Peterburqda oxuyub, hərbçi olub. O da vətənə qayıtdıqdan sonra Qalada açarçı işləyib. Çox sərt və zalım adam təkin xatirələrdə qalıb. Onun oğlu Şirin bəy Sovet hökuməti vaxtında 70-ci illərə qədər Xan sarayında gözətçi işləyib.

Şirin bəy gözətçi olmağına baxmayaraq ata-babalarından, məhəllə yaşlılarından öyrəndiyi tarixi söhbətləri, olan-olmuşları çox gözəl bilirdi. Xan sarayına gələn hər bir qonaq onun söhbətlərinə maraqla qulaq asır, verdikləri suallara ondan



dolğun, hərtərəfli və elmli cavab alırdılar. Xüsusən də, Şəkinin adlı-sanlı nəsillərindən, repressiya qurbanı olmuş din xadimlərindən, məhəllələrindən etdiyi söhbətləri Türkiyədən, Şimali Qafqazdan, Cənubi Azərbaycandan gələn qonaqların diqqətini daha çox cəlb edirdi. Onların içərisində elələri də olurdu ki, sovet-bolşevik hökuməti qurulan vaxt vətəndən didərgin düşmüş ata-babalarının adını çəkib, nişan verirdi. Şirin bəy onların çoxunu tanıyıb, yerli-yataqlı məlumatlar verər, bəzilərilə qohumluqları olduğunu bildirərdi.

Adət-ənənəyə, mentalitetə bağlı, həyata yaxşı bələd olan Şirin bəyin yaddaşının və dilinin bu qabiliyyəti çuğullar vasitəsilə MTŞ əməkdaşlarına çatdırılırdı. Bir dəfə də onu adı bəlli yerə çəkib, möhkəm əzişdiriblər, incidiblər. Həmin vaxtların raykom katibi Əbdürrəhim Məmmədov onu çağırıb daha danışmamağı tövsiyə etmişdi. Şirin bəy ondan sonra susmuşdu. Susmuşdusa da qəlbi göynəyirdi, o göynərtilə qəbir evinə çox sirlər, söz-söhbətlər apardı.

Hacı Şıxəlibəyovların Həşim Əfəndi adlı bir nümayəndəsi də Yuxarı Başın nüfuzlu din xadimlərindən olub. Bütün qaçaqların ona hörməti olub, bir sözünü iki etməmişlər. 37-ci ildə yalan danosla Sibirə sürgün olunub. Sürgündən gələn adamların dediyinə görə, Həşim Əfəndi olan kalonda milliyyətindən asılı olmayaraq hər kəs ona böyük rəğbət bəsləyirdi.

Kaloniyadakı çətin şəraitə baxmayaraq vaxtlı- vaxtında namazın qılıb, orucun tutan bu nüfuzlu din xadiminin təsirilə çox xristianlar İslam dinini qəbul etmişdilər. İxtiyar yaşlı ruhani Həşim Əfəndinin ölümü də elə Sibirdə olub.

**"SOLTAN ŞIXƏLİYEV ABBAS BƏY OĞLU"** (antroponim) – bu nəslin indiki yaşlılar tərəfindən ən çox tanınan nümayəndəsidir. O, 1919-cu ildə anadan olmuşdur. Adı əvvəl Tələt olub. Abbas bəy türklərin Azərbaycana gəlişi münasibətilə uşağın adını dəyişib Soltan qoyub. Soltan ibtidai təhsilini keçmiş nümunə məktəbində alıb (Nümunə məktəbi əvvəlcə Molla Kazım məktəbi olub, sonra iki illik Müəllimlər

Institutu, daha sonra, 5 saylı məktəb, sonda isə Müəllimləri Təkmilləşdirmə İnstitutu olmuşdur).

1937-ci ildə Bakıda Tibb texnikumunda tibb qardaşı sənəti üzrə təhsil alıb. Təhsili qurtardıqdan sonra iki ilə qədər Ağcabədidə "Tropik yoluxucu xəstəliklər" üzrə epidemioloji stansiyada işləyib. 39-cu ildə Rus-fin müharibəsinə aparılıb. Oradan da 40-cı ildə leytenant rütbəsi verilən hərbi məktəbə oxumağa göndərilib. Müharibənin ilk qızğın çağlarında Brestdə olub. Kremençuqda onun qulluq etdiyi 41-ci diviziya bütün əsir düşdüyü üçün həmin vaxt o diviziya hərbi ştab tərəfindən ləğv olundu.

S.Şıxəliyev Osventsim əsir düşərgəsində 3 ay əsir qalıb. Sonra Polşanın Krakov şəhərinə cuhudlar saxlanılan Qetoya göndərilib. Qeyd edək ki, həmyerlimiz Vəhyəddin və Ələsgər həkim, aqronom Qəni də onunla birgə əsirlikdə olmuşlar.

S.Şıxəliyevin övladlarına danışdığına görə, Qəni əsirlikdə amerikan sektorunda saxlanılırdı. Onun oradan çıxarılıb özləri olan bölməyə gətirilməyinə o özü çox kömək olmuşdur.

Polşada əsirlər işləməyə göndərilərkən o fürsətdən çox istifadə etmiş, polyak partizanlarına silah çatdırılmasında tez-tez kömək etmişdir. S. Şıxəliyev bu barədə uşaqlarına çox danışmışdır.

Polşadan sonra onun yerini əsir kimi Almaniyaya dəyişiblər. Olduğu Nürenberq şəhərində müharibədən sonra da iki il qalıb hərbi komendantın tibb üzrə müavininin köməkçisi olub. Tibbin bir sıra avropasayağı incəliklərini orada öyrənib. Demək olar ki, S. Şıxəliyev vətənə dönəndə tibb qardaşı yox, həkim idi.

Oğlanlarının söylədiklərinə görə, S. Şıxəliyev olduğu kiçik Nürenberq şəhərini çox vaxt dumanlı, çiskinli olduğuna görə xoşlamazdı. Bu balaca şəhərə ilk dəfə daxil olarkən şəhərin yaxınlığındakı kiçik dağları göstərib demişdilər ki, orada təzəlikcə çoxlu sayda əsiri diri-diri torpağa gömüblər. Şəhərin aydın-açıq, havalı günündə o dağdan tüstü kimi buxar qalxdığını görürdük. Deyirdilər ki, diri basdırılanların nəfəsi, istisidir ki, çıxır.



İlk gündən belə pis təəssüratla ayaq qoyduğu yer onun üçün çox cansıxıcı olduğundan burada qalmaq təklifini də qəbul etməmişdi.

Danışırdı ki, qayıdarkən Avstriyada bir gəncəli azərbaycanlı ilə rastlaşdıq. Həmin şux görkəmli, yaşlı adam Azərbaycanda sovet hakimiyyəti qurulan zaman xaricə qaçan Gəncə varlılarından idi. O, təklif etdi ki, getməyin, sizi sovetlər əsir düşdüyünüzə görə çox incidəcəklər. Bizə hədsiz hörmət etdi və təklif etdi ki, getməyin, bu gördüyünüz zəngin ev, dükanlar mənimdir. Qalın, mənim oğlanlarım olun, varidatım öz eloğullarıma qalsın.

Mənimlə gedən göyçaylı oğlan onun təklifini sevinərək qəbul etdi. Mən isə doğma el-obanın təşnəsi olduğumu dedim. 1947-ci ildə Vətənə gələn S.Şıxəliyev Cəfərabad və Bideyiz kəndlərində xəstəxana müdiri vəzifəsində işləyib. Dünyasını 1970-ci ildə dəyişib.

Bu məlumatlardan xeyli sonra S.Şıxəliyevin oğlanları Bəşir Şıxəliyev (məhəllə komitə sədri) və Fariq bizə 1908-ci ildə çəkilmiş bir foto da təqdim etdilər.

Fotonun Musa bəyin oğlu Nəzir bəyin toyunda çəkildiyi şəklin altında qeyd edilmişdir. Musa bəy bu soydan olan Abbas bəyin dayısı olmuşdur. Şəhərin Dodu məhəlləsində yaşayan Musa bəyin Bağbanlar məhəlləsində çox böyük meyvə bağları olub. Bir sıra kəndlərin ixtiyarı onda olub. Şəkinin zəngin bəylərindən olan Musa bəy akademik Əzəl Sultanovun əmisi oğlu Rəsul Sultanovun ana babası olmuşdur. S.Şıxəliyevin isə bibisi uşaqlarıdır.

Qeyd edək ki, bu qədim nəslin şəhərdə, Azərbaycanın müxtəlif şəhərlərində, Gürcüstanda, Türkiyədə, Amerikada qanadları var.

Şəhərin ən iri və qədim nəsilləri Şəkixanovlar, Dadanovlar, Pullu Qulugil, Muşdu-Nəsib bəy Fərzəlibəyovlar, Nəbibəyovlar, İlisu bəyi Daniyal bəy, Sərkərlər və s. bu soyla qohumluq əlaqələri olub.

**"HACI MAHMUD ƏFƏNDİ"** (antroponim) – Qobu məhəllədə İsrafil ağanın mülkünə yaxın yerdə (İsrafil ağanın evi bir müddət Yuxarı Başda məktəb kimi də fəaliyyət göstərmişdir) Hacı Mahmud Əfəndinin yerli ənənəyə uyğun şəkildə tikilmiş mülkü var.

Hacı Mahmud Əfəndi dövrünün tanınmış din xadimi idi. O, təhsilini öncə məhəllə mədrəsəsində (Hacı Qədir soyu tərəfindən tikilmiş) Paşa dayıdan almışdır. Sonra isə Misirdə dini təhsilini başa vurub qayıtmışdır. Yuxarı Başda İmam Əfəndilər məscidində çalışıb, elin güvəndiyi, xətrini əziz tutduğu şəxsiyyətlərdən idi. Hacı Mahmud Əfəndinin çox gözəl kitabları olub. Onların xeyli hissəsini Umar Əfəndi Məscidinə (Yuxarı Cümə Məscidi) vermişdir. Çox təəssüf ki, məscid yananda həmin kitablar məhv olmuşdur.

Hacı Mahmud Əfəndi təzə quruluşun dəhşətli sədalarını eşitdikcə, Tanrıdan özünə ölüm diləyib dərgahına qovuşmağı arzulayırdı. Arzuladığı kimi də Şəkidə sovet quruluşunu görmədən dünyasını dəyişdi. İndi onun ata-baba mülkündə Hacıbaba və Şakir adlı yaşlı övladları, bir nəvəsi yaşayır.

**"PƏHLƏVAN MƏHƏRRƏMLİLƏR"** (patronim) – bu adla tanınan nəslin hazırda yaşayan nümayəndəsi 1921-ci il təvəllüdlü Məcidzadə Səttar Muxtar oğlu öz ata-babasından belə söhbət etdi. Bizim ulu babamızın lap əsli Qazaxlı olub. Şəkiyə gəlib, şəkili qızı ilə evlənib, bu məhəllədə özünə ev qurub yaşayıb. Atamın danışdığına görə, öz əllərilə üstü qamışdan, bir dənə işıxlığı (pəncərəsi) olan 6 m-lik ev tikib.

Həmin pəhləvan Məhərrəm el şənliklərinin yaraşığı idi. Camaat əli xınalı, dizi güzgülü güləşən bu el pəhləvanına çox hörmət edərdi.

Pəhləvan Məhərrəm Göyçay mahalında güləşdə qalib gələndə, ona verilən samovar hədiyyəsiylə məhəlləyə qayıtmışdı. Özündə və yaxınlığındakı qonşuda samovar olmadığı üçün istifadə qaydasını bilmirdilər. Yığışıb samovarın odluğundan su tökmüşdülər. Gecdən-gec istifadə qaydasını anlayıb, samovarda su qaynadıb çayı birlikdə içmişdilər.

Şamaxı mahalında da qalib gələndə yerli bəylərdən biri ona neft çırağı bağışlamışdı. Özü də, bir-iki yaxın qonşuları da qara çıraqdan istifadə edirdi. Neft çırağı bircə onda olduğu üçün axşamlar yandırıb qonşularla birgə oturar, söhbət edərdilər.

Belə bir söhbəti də Səttar baba həvəslə danışdı: Pəhləvan Məhərrəmin sorağını eşidən hansısa bir pəhləvan özgə mahaldan gəlir ki, bəs mən onunla öz yerində güləşib qalib gələcəyəm. Soraqla onun evinə gəlir. Evdə onun yeniyetmə qızı da olur. Qonağın niyyətini bilən qız qonağa lazımi qulluğu edir. Sonra qonağın gözləri qabağında qapının divara hörülmüş əsas tirini qaldırıb onun çarıqlarını hörgü arasına qoyur. Çarıqların ancaq burnu çöldə qalır. Atasının qızı səssizcə öz hərəkətiylə qonağın gəlişinə cavab verir. Qonaq da anlayan adam imiş. Başa düşür ki, qızının biləyində belə güc olan pəhləvanın qabağına çıxmaq özü ağıllı iş deyil. Ona görə də gəldiyi kimi də geri qayıdır. Bu söhbət indi də camaatın dilində yeri gəldikcə söylənilir. Qeyd edək ki, haqqında danışdığımız pəhləvanın soyundan olan, Muxtarın bacısı, Səttar babanın isə bibisi Xanım həmyerli şairimiz Bəxtiyar Vahabzadənin doğmaca anasıdır.

**"ATAYEVLƏR"** (patronim) – bu nəsil çox da böyük olmasa da tanıyıb-bilənlər onlara xüsusi ehtiramla yanaşırlar. Ələkrəm Məmmədov I saylı orta məktəbdə kimya müəllimidir. Təmiz, sadə, candan-ciyərdən şagirdə dərs deyən müəllim olduğu üçün, el arasında hörmətli şəxs kimi tanındığına görə camaat ona qarşı şox ehtiramlıdır.

Onun əmisi Atayev Cavanşir İsmayıl oğlu isə uzun illərdir ki, Patris Lumumba adına Moskva Xalqlar Dostluğu Universitetində metallurgiya sahəsi üzrə mütəxəssisdir. Elmlər doktorudur. Yaşlaşdığına görə indi Şəkiyə tez-tez gələ bilmir.

**"PEYĞƏMBƏR CƏLİLGİL"** (antroponim) – sadə, hörmətli, insaf-mürvətli din adamı olub. Gözəl xasiyyət və rəftarına görə ona bu ad verilib. Oğlu Nurməmməd gözləri kor və xəstə olduğu üçün görüşə bilmədik. Ona da el arasında "Çto Nurməmməd" deyirlər. Danışığında "çto" sözünü çox işlətdiyinə görə ləqəb üçün hazır olan şəkililər onu elə həmin adla da tanıdılar.

**"QƏSSAB QƏDİRGİL"** (antroponim) – Qobu məhəlləsinin bu nəsli elə ata-babadan qəssab olublar. Eyni zamanda da gözəl din xadimləri olublar. Qəssab Hüseyn, qəssab Baxış, qəssab Nadir, qəssab Nəzir, qəssab Nəsif, qəssab Çələbi, qəssab Qədir böyük sülalə olub. Bu qəssablar el dolandıran, fəqir-füqəranı nəzərə alan adamlar olub. Qəssab Baxış və 3 oğlu 30-cu illərdə Sovet hökuməti əleyhinə üsyanda iştirak ediblər. Onları hökumət tutub.

Şəkidə üsyandan qabaq ermənilərlə qarşıdurma vaxtı Nuru paşa köməyə gəlmişdi. Nuru paşa ətrafındakı çovuş və yasovullarla birgə qəssab Hüseynin evində qonaq qalmışdır. Qəssab Hüseyn dövrünün qoçusu olub. Vaxtaşırı başının dəstəsilə erməni varlılarını soyardı.

Nuru paşa onlarda qonaq qalanda arvadı bu böyük şəxsiyyətin, camaatın köməyinə gələn ünlü paşanın gəlişinə çox sevinib ona əl verib görüşmüşdü. Qəssab Hüseyn qoçaq olduğu qədər də, qatı mühafizəkar idi. Qonaq gedəndən sonra arvadı yan otağa çağırıb tüfəngin qundağı ilə qonaqla görüşən əlinə möhkəm vurmuşdu. Arvadın biləyi də, tüfəngin qundağı da sınmışdı.

Qəssab Hüseynin bacısı vardı. Çox arıq olduğu üçün Quru xanım deyərdilər. İranlı bir tacir Yuxarı Başda ev tikib, onu da almışdı. Ancaq nədənsə Quru xanımı da o evdə qoyub, yenidən İrana qayıtmışdı.

Qəssab Qədir üsyan vaxtı əmisi və onun oğlanları, qardaşları kimi üsyana qoşulmamışdı. Vəziyyətə görə aradan çıxıb Balakəndə ət dükanı açmışdı. Ondan ət alanların içərisində bir



xanım xoşuna gəlir, gözü onda çapacağı barmağına vurub, kəsib atmışdı. Qadın da NKVD-də işləyən birinin arvadı olduğu üçün onu tutdurmuşdu. Ata və qardaşlarının əmisi və oğlanlarının üsyankar olduğunu bilib onu Balakəndə türmədə saxlamışlar. Bir müddətdən sonra buraxmışlar. Təzədən Şəkiyə qayıdan Qəssab Qədir və Qəssab Hüseyn hər ikisi uzun ömür yaşamış, 100 yaşında vəfat etmişlər. Hacı Qədirin bir oğlu – Hacı Paşa Azərbaycanın müftisi də olub.

Qobu məhəlləsinin sənətinə, qabiliyyətinə, xarakterinə görə adlı, ləqəbli adamları haqqında soruşanda yaşlı adamlar həvəslə danışarlar.

Loğman Durna xala var idi. Məlhəm bitkilərin dilini, çeşmələrin yerini bilən, gözün içinə, ağzın içinə baxıb, sidiyin rəngi ilə xəstəlikləri təyin edən bilici el loğmanı idi. İndi onun oğlu Kamal anasından öyrəndiyi bilgini insanlardan əsirgəmir. Mərhum Durna xala həm də dava, qan-qada yatıran dəyərli, sayımlı-seçimli el ağbirçəyi idi.

**"YEZİD OĞLU USUF"** (arxaik antroponim) – deyilənlərə görə çox qəddar olduğu üçün bu ad ona verilib. Burux Vəsilə var idi- toylarda özünəməxsus maraqlı burulma, çiyin atmaları, bilək burmaları ilə oyunu varmış. Oynayanda özündən qoşan maraqlı mahnısı var idi: "50 ildi mən gəlin oldum, 10 ildən bir tumanlıq aldım. Hər çətinə dözüb oturdum, 50 ildir mən gəlin oldum, gəlin oldum..."

Tikanlı Paşa adlı baməzə, toylarda şingamlı oynayan bir qəssab vardı. Onun da özünəməxsus oyun tərzi vardı. Toya girəndə əlində iki yekə iti bıçağı bir-birinə sürtə-sürtə, sürtülmədən də qəribə səs çıxararaq ahənginə uyğun oynayardı. Bu səbəbdən ona tikanlı Paşa deyərdilər. Meşəbəyi Rəhim qəşəng oynayardı. Oynadıqca da "akuşqanın milləri, açıb qızıl gülləri, Sizə canım qurban, Yuxarı Baş cahılları" –deyib oxuyardı. Həmişə də onların marağına toyların adamları çox olardı. Yuxarı Başda toy olanda Aşağı Başdan soruşardılar. Toyda kim çalır, kim oynayacaq? Eşidəndə ki, Ağvanların

Əhmədağası dümbək çalır, burux Vəsilə, Tikanlı Paşa, Meşəbəyi Rəhim iştirak edəsidir, o toyun izdihamı çox olardı.

Saqqal oğlu Kərim vardı, kürəsində yapdığı çörəyin adı-dadı məşhur idi. Şəkiyə kənardan gələnə Saqqaloğlu Kərimin çörəyilə Xoruzoğlu Yusifin bişirdiyi pitini yeyib, üstündən də bir stəkan pürrəngi çayı Yahya kişinin halvası ilə içmədinsə, deməli Şəkiyə getməmisən - deyərdilər.

Qobu məhəlləsindən sonra məşhur **"Dəmirçi bulağı"** (antropo hidronim) tərəfə, **"İmam Əfəndilər məhəlləsi"** gəlir ki, bu da Yuxarı Başın 3-cü rayonuna düşür. Eyni zamanda bütöv Yuxarı Başa əsas giriş yolu Dəmirçi bulağı ilə üzbəüz artıq keçmiş zamana nisbətən çox daralmış kiçik fərş küçədir. Bu küçəyə də yaşlı sakinlər Qala yolu deyirlər. Qalanın şimal qapısının tini ilə başlayan bu yolun altından ensiz tunel keçir. Tunelin başlanğıcı sarayaltı cəbbəxanadan başlayır. Qala yolunda tuneldən yanlara ayrılan dar qollar da var ki, həm tunelə hava girişi üçün, həm də görünür qaçışa gizli ehtiyac duyularsa, müxtəlif istiqamətlərə yönəlmək üçün nəzərdə tutulub. Deyilənə görə, həmin tunellər də İsmayıl bəyin yurd yerinə düşüb. Həmin yurdda yaşayanlar ot çalımı vaxtı o qolları görüb, ağzını qapayıblar.

Bu yol 30-cu ildə çökmüşdü. Cərroların Cəmil dayının dediyinə görə, adi çay daşı ilə hörülmüş tuneli biz onda görmüşdük. Onun qurtaracağı da Qullar məhəlləsinin başlanğıcında deputat Fatmanın evinin yanındakı Mallı qayaya çıxır. Belə də deyilir ki, həmin tunelin qurtaracaq yeri "Gələrsən-Görərsən" qalasındadır.

Tunelin olmağına əslində heç şübhə də yoxdur. Əslində bu cür ehtiyat tarix boyu hakimiyyətdə olan xanlıqların inşa etdikləri qalaların çoxuna xasdır. Bu ehtiyat düşmən hücumu zamanı fövqəladə vəziyyətlər üçün düşünülmüşdür.

Əgər hansısa bir maneçilik, icazə verilməmək yoxdursa, yaxşı olar ki, Azərbaycan Milli EA-nın Arxeologiya və



Etnoqrafiya Institutunun Şəki bölməsi bu faktların tam təsdiqi üçün çalışsın. Çünki biz bunları xalqdan eşidirik.

**"DƏMİRÇİ BULAĞI"** (antropo hidronim) – haqqında danışdığımız əsas yolun baş hissəsində adı məşhur bulaq yerləşir. Dəmirçi bulağı yerləşən ərazi indiki kimi yaşayış evlərinin sıx əhatəsində deyildi. Yaşlıların eşitdiklərinə görə, həmin ərazi böyük məhəllə bazarı idi. Bulağın sırası boyu dəmirçi dükanları, nalbənd və sərrac dükanları vardı. Deyilənlərə görə, elə bulağı da onlar çəkdiriblər. Bəlkə də onlar çəkdirməyib, sadəcə olaraq dəmirçi dükanları sırasında yerləşdiyi üçün o cür adlanıb. Bulağın ağac növü, bükülüb-burulmuş qırmızı mis lüləsi 60-cı illərə qədər dururdu. Hazırda isə adi dəmir lülədən axır, ətrafı isə ağ əhəng daşı və qırmızı kərpicdən işlənilmişdir. Ağ daşın üzərinə kiril, latın və ərəb əlifbasında Dəmirçi bulağı sözləri yazılmışdır. Belə də demək olar ki, türkdilli Dəmirçilər tayfasının adı bu toponimdə əks olunur. Həyətyanı bir sahə-dəmirçi Allahverdinin həyəti **"Qapanxana"** adlanır ki, hələ də yaşlılar o həyəti o cür adla tanıyırlar. Görünür həmin yer məhəllə bazarının taxıl, dən satılan hissəsi olub.

Bir qədər yuxarıda- küçəyə düşən hissə **"Səhləb doqqaz"** adlanır. Görünür, həmin yerdə bazarın səhləb çayxanası yerləşib. Çünki əsrin əvvəllərinə qədər Şəkidə səhləb çayxanaları mövcud olub (lüğəti olaraq səələb-sələb, bəzən də səhləb yazılır).

Səhləb - Azərbaycanın şimal-qərb rayonları əhalisi içərisində geniş yayılmış içki növü olub. Adətən onu payızın son aylarından may ayınadək içirlər. May ayında isə dağlardan yenidən yığmağa başlayırlar. Çay kimi isti halda içilir. Sinə məlhəmi hesab olunur. Lətif tamlı, ətirli olan bu nişastalı içkini səhər naharı edəndə südlə bişirib içirlər. Soyuqdəymənin, sinə ağrısının, boğaz tutulmalarının ağrısının, öskürmənin dərmanıdır.

Vaxtilə rus bazarlarında baldan hazırlanan içkiyə bitki qatqıları əlavə edib sbiten içkisi satdıqları kimi, bizim bazarlarda da samovar təkin odluğu olan mis səhləb çaydanlarında

səhləb dəmlənib satılırdı. Sənətkarlar çaydana odluğu ona görə əlavə edərdilər ki, içinə bir-iki köz atıb çaydandakı səhləbi isti saxlamaq mümkün olsun. Çünki səhləb soyuyanda qatılaşır və daha içməli olmur.

Çox təəssüf ki, şəhərdə indi belə səhləb çayxanaları da, çaydanları da yoxdur. Tək-tək adamlar gedib, onun kök yumrularını dağdan mövsüm ərzində toplayır, qurudub, döyüləndən sonra suya, südə qatıb içirlər.

Heç şübhəsiz ki, bu bitkini tanıyan, kəramətini bilib toplayan həvəskarlar onun toplanması, artırılması, dəmlənib satılması və ya qurudulub, toz halına salınıb satılması işini də genişləndirsələr bu zamanımız üçün gərəkli bir iş olar. İndi xəstəliklərin baş alıb getdiyi, iqtisadi vəziyyətin zəif bir vaxtında bu özü həm qazancdı, həm də öz bacarığımız dairəsində millətə köməkdi.

**"GÖZƏTÇİ BÜRCÜ"** (toponim) – dağlıq ərazidə yaşayan əhali üçün dağ hələ qədimdən həm maddi, həm də mənəvi dayaq olmuşdur. Zamanına görə, elin şad və bəd günləri dağ başında yandırılan tonqallarla xəbərdar olunardı.

Xanlığa yaxın olan Qafqaz dağ silsilələrinin uca nöqtələrində müxtəlif məsafələrdə şəhərə girəcək və çıxacaq aydın göründüyü üçün 3 yerdə gözətçi xəbərdarlıq bürcləri qurulmuşdur. Yerli camaatın dediyinə görə, hər 3 bürcün qalıqları o zirvələrdə durur. Dağın yaşıl dona bürünmədiyi vaxt onları görmək də olur.

**"BİTLİCƏ TƏPƏSİ"** (oronim) – bu təpəlik də dağın yaxasındadır. Otlaq yer olsa da, mal-qaraya pişpişə və bit kimi xırda bitki tikanları yapışdığı üçün bu ad verilir.

**"ÇATQAL DƏRƏSİ"** (zoooronim) – adı çox hallanan, camaatın yaxşı tanıdığı, gözəl havaya və mənzərəyə malik bir yerdir. Adının məna açımı da ondadır ki, elə çatandan sonra orada qalmaq istəyirsən.

**"DƏRƏ-BAĞÇA"** (orotoponim) – hündür, təpəli bir yerdə, selin-suyun iki tərəfdən də dərin arx, yarğanlar açdığı



bir yerdə, ortada mənzərəli bir bağatlıqdır. Bu hündür mənzərəli sahədə 4-5 evdən ibarət ailə yaşayır.

**"DAŞ MƏDƏN"** (toponim) – elə Dərə-bağça tərəfdə olan bu yer lap qədimdən sal daşların çapıldığı yer olub. Ustakar daşyonanlar şəyirdlərilə birgə qayadan sal daşları qoparıb səbətli ulaqlarla, atlı-öküzlü arabalarla daşıtdırardılar. Deyilənlərə görə Şəkinin qədim binalarının çoxunun tikintisində bu mədənin daşı işlənib.

Daş mədənin ən məşhur ustakarı Daşçı Alı olub. Onun 40 ədəd növbə ilə yükləyib işlətdiyi ulaqları olub. Daşçı Alının ölümü də elə o mədəndə olub. Çapdığı iri sal daşın altında qalıb dünyasını dəyişib.

**"XƏLİFƏZADƏLƏR"** (patronim) --Dəmirçi bulağının böyründə sol tərəfdə zəncirlə haşiyələnmiş qara dəmir dayaqların xüsusi görkəm verdiyi kiçik yaraşıqlı yol qapısı var. Qapıdan içəridə də şərqlə-qərbin sintezilə yaradılmış abad bir ev var. Kiçik qapının üst hissəsində bir iri, taqqulbabı olan ata-baba qapısı var. Bu, ümumilikdə Xəlifəzadələr soyuna məxsus yurddur. 3 qardaşa məxsus bu yurdda həm ata-babadan qalma ev, həm də yeni tikilmiş ev var. Yuxarı Baş əhli bu soya yaxşı bələddir. Onlara məhəllənin fəxr edilməli soyu təkin baxırlar.

Bu nəsildə Xəlifə adının ilk daşıyıcısı onların babası Mustafa olmuşdur. Mustafa adil adamlardan biri olub. Ancaq adilliyilə yanaşı, bu ixtiyar kəsdə böyük ağsaqqallıq nüfuzu vardır. Mütərəqqi fikirli, gözəl söz-söhbət yiyəsi, məhəllənin hər bir dərd-sərinə yarayan adam olduğu üçün camaat ona Xəlifə adı qoymuşdur. Bu adın da saray titulu olduğunu bilirik. Xəlifə Mustafa özü də, oğlu Müzəffər də xırda tacir olublar. Lakin tarixdə Şahsevən türk qəbiləsinin Xəlfəli tirəsi olduğu da məlumdur. Belə də təxmin etmək olar ki, soyun adı məhz bu faktla bağlı olsun.

Müzəffərin həyat yoldaşı Şəkinin məşhur, iri tacirlərindən olan Düyüçü Cəfərin qızı Əzizə xanım olub. Əzizə xanım məşhur heykəltəraş Fuad Əbdürrəhmanovun və memar Rasim

Əbdürrəhmanovun bibisi olub. Bu xanım ərəb-fars dillərini yaxşı bilən, kiril və latın əlifbası ilə gözəl yazıb-oxuyan, Azərbaycan mətbəxinin, xüsusən də Şəkiyə məxsus biş-düşlərin mahir ustası olub. Onun mərhum gəlini Sənubər Qara qızı Xəlifəzadə qaynanası Əzizə xanım kimi milli mətbəxin, süfrə mədəniyyətinin və kökdən gəlinə dəyərlərimizin gözəl bilicisi idi.

Əzizə xanımın oğlu, tanınmış kulinar Hacı Cabir Xəlifəzadənin dediyi kimi, anası və xanımı öz mətbəxinin rəssamı olan dəyərli xanımlar idi. Onların bu qabiliyyəti Hacı Cabirin sənət yönümündə cəmləşdi. Azərbaycan Dövlət Universitetinin İqtisadiyyat fakütləsini qurtaran C.Xəlifəzadə uzun illər Bakı restoranlar və kafelər trestində çalışmışdır. Sonra isə Nəsimi rayonu İctimai İaşə Trestinin "Kulinariya kombinatına" rəhbərlik etmişdir. Milli mətbəx və məişət mədəniyyətimizi daim öyrənib araşdıran C.Xəlifəzadə Azərbaycan kulinariyasının ən mükəmməl bilcilərindən, dünya üzrə gözəl təbliğatçılarından biridir. Dünyanın iri ölkələrinin hamısında onun hazırladığı Azərbaycan süfrəsinin ətrafında əyləşən neçə-neçə millətin nümayəndələri milli mətbəximizin zənginliyinə heyran qalmışlar.

Hacı Cabir Xəlifəzadənin illər uzunu davam edən bu fəaliyyəti müxtəlif təltiflərlə yanaşı, 1981-ci ildə Xalqlar Dostluğu, 1986-cı ildə Qırmızı Əmək Bayrağı ordenləri, 1989-cu ildə isə "Əmək veteranı" medalı ilə təltif edilib.

Şəkililər Xəlifəzadələr soyunun bu övladını həm də adlı xeyriyyəçi kimi də tanıyırlar. Yuxarı Başa giriş hissəsində olan körpünün təmiri, 8 saylı uşaq bağçası, Şəki uşaq evi və 1 saylı məktəbi himayəsinə götürən millətsevər Hacı vaxtaşırı onlara qayğı göstərir. O, Şəki kitabxanalarına bir neçə kitablar toplusu da vermişdir. Şəki Diyarşünaslıq Muzeyində öz hesabına təşkil etdiyi "Azərbaycan xalqının mətbəx mədəniyyəti və qonaqpərvərliyi" adlı şöbə və özünəməxsus 60 ədəd eksponatı bağışlaması onun elinin yaxşı övladı adını bir daha təsdiqlədi.

C.Xəlifəzadə "Azərbaycan mətbəxinin sirləri", "Azərbaycanın sərinləşdirici içkiləri", "Yemək aləmi və sağlamlıq", "Avropada Azərbaycan süfrəsi", "Şərq və Qərb şirniyyatları" kitablarının müəllifidir. Hacı Cabir həmçinin Azərbaycanın Xalq rəssamı, iki dəfə SSRİ Dövlət Mükafatı Laureatı, SSRİ Rəssamlıq Akademiyasının müxbir üzvü, dahi sənətkar-heykəltaraş F.Əbdürrəhmanova həsr olunmuş kitabın təşəbbüskarı, texniki dəstəyi və maliyyə yardımçısı, ön söz müəllifi olmuşdur.



Xəlifəzadələr soyunun digər oğlu Çingiz Xəlifəzadə isə Azərbaycan Neft Akademiyasında kafedra müdiri, g.m.e.d., respublikanın Əməkdar geoloqudur. Onun çoxsaylı məqalə və əsərləri ilə yanaşı "Ayın sirri" kitabı da çox məşhurdur.

Ramiz Xəlifəzadə isə Şəkidə tibb avadanlıqları üzrə tanınmış texnik, bacarıqlı mütəxəssisdir.

Xəlifəzadələr soyundan bir qədər yuxarıda "**Dərə-bağça**" deyilən çox görümlü, baxımlı hündür təpəlik var. Bu təpəlik həm də gözəl bağatlıqdır. İllər boyu gələn sel-su bu təpənin hər iki tərəfindən dərin yarğanlar açdığı üçün xalq tərəfindən Dərəbağça adlandırılmışdır. Həmin bu mənzərəli yerdə isə 6-7 ailənin evi var. Ailələr də əsasən Xalisəqarızadələr soyuna məxsusdu.

**"XALİSƏQARIZADƏLƏR"** (patronim) – kökləri XVII-XVIII əsrə gedib çıxan bu qədim, ziyalı soy nəinki Şəkidə, Azərbaycanda, bir vaxtlar Şərq dini mərkəzlərində də məşhur olub. Nəslin bugünkü varislərindən Molla Əsmayə xala ilə oğlu Faruq, gəlini Bəsti, yaxın qohumları Sümayə müəllimə, Mahir müəllim və Arzu həkimlə görüşlərimiz axtarış istiqamətini dəyişdirdi. Yuxarı Başın Qalaüstü hissəsi "Dərəbağça" deyilən yerdə olan ata-baba mülkünə, nəslin ikinci eyni adda olan Nurməhəmməd Əfəndinin sonradan tikilən evinə getdik. Mülkün ənənəvi memarlıq baxımından gözəlliklərinə heyranlıqla tamaşa etdik. Sorğulardan, səmimi söhbətlərdən bizə çox şey aydınlaşsa da, qaneedici dərəcədə cavabı ala bilmirdik. Bilənlərindən Səidə və Əbdülkərim İmanzadələr, Məhparə həkim, Yasin-Səbri müəllim, Fərhad bəy və b. dünyalarını dəyişmiş, bildiklərini bolşevik-sovet xofu ilə qəbir

evinə aparmışlar. Səidə xanımın oğlu Mübarizin isə uzun müddətə xaricdə olduğunu öyrəndik. Haqq işimizə xeyli kömək Azərbaycan Milli Elmlər Akademiyasının M.Füzuli adına Əlyazmalar İnstitutunun Ərəb dili şöbəsinin müdiri, filologiya elmləri namizədi Kamandar Şərifov tərəfindən oldu. Əlyazmalar İnstitununda saxlanan Əbdülqəni Nuxəvinin zəngin kitabxanasının qalanlarından mənbə kimi istifadə edərək o, "Əbdülqəni Nuxəvi Xalisəqarızadə" kitabını yazıb (85). Soyun varislərinə və Kamandar Şərifova minnətdarlıqla, onların dediklərinə istinad edərək, Siz oxuculara qürur hissi doğuracaq bilgilər verəcəyik.

Ə.Nuxəvi el arasında "İmam Əfəndilər", elm aləmində Xalisəqarızadələr adı ilə məşhur olan soyu barədə belə məlumat vermişdir: "Babam Molla Pirməhəmməd Şəki xanı Hacı Çələbinin nəslindən olan Həbibə xanımla evlənmiş, onların 5 oğlan- Ağa Məhəmməd bəy, Hacı Kəmaləddin Məhəmməd Əfəndi, Abdulla, Feyzulla, Hacı Əbdülhəlim və Şərifə, Zeynəb adlı qız övladları olmuşdur". Ə.Nuxəvinin atası Kəmaləddin Məhəmməd Əfəndi 2 dəfə evlənmişdir. Birinci dəfə Şəki xanlarının soyundan olan Şeyx Əli bəyin və Hacı Əlican bəyin nəsillərinə mənsub olan Tuba adlı qızla həyat qurmuşdur. Şeyx Əli bəy 1755-ci ilədək Şəkidə 12 il hökmranlıq etmiş Hacı Çələbi xanın əmisidir. Kəmaləddin Məhəmməd Əfəndinin Tuba xanımdan 3 oğlu- Əbdülvəhab, Əbdülssəlam və Əbdülqadir, Dürrətünnisə, ikinci həyat yoldaşı Əbdülqadirin qızı Bəyim ağadan isə daha 2 oğlu Əbdülqəni və Əbdülcəlil olmuşdur.

Övladlarına ilk təhsili Kəmaləddin Əfəndi özü vermişdir. Onlardan Əbdülqəni öz zirəkliyi, möhkəm yaddaşı və elmə həvəsi ilə fərqlənmişdir. Məhz bunun və atasının böyük əməyi, biliyi sayəsində Əbdülqəni gənc yaşlarından ərəb, fars, türk dillərini mükəmməl öyrənmişdir. Kəmaləddin Əfəndi bilirdi ki, xalqımızın klassik irsini və onunla sıxı surətdə əlaqədə olan



Şərq elm və ədəbiyyatını öyrənmək, dövrün qabaqcıl ziyalısı olmaq üçün həmin dilləri bilmək lazımdır.

Ə.Nuxəvi təhsilini həmçinin XIX ərsdə Şəkidə fəaliyyət göstərən milli məktəb və mədrəsələrdə almışdır. Həmin vaxtlar Şəkidə 32-yə qədər mədrəsələr fəaliyyət göstərirdi. Bunlardan əsas maarif ocaqları Abdulla Əfəndi Axundzadə, Sədrəddin bəy Nuxəvi və Əlican bəy Nuxəvinin mədrəsələri olmuşdur.

Ə.Nuxəvi Şəkinin Dabbaqxana məhəlləsindəki **AĞ MƏSCİDİN** (indiki Aşağı Cümə Məscid-Mədrəsəsi) nəzdindəki mədrəsədə, Qışlaq və Göynükdəki müəllimləri Məhəmməd Əfəndinin oğlu Əhməd Əfəndi, Hacı Məhəmməd Əfəndidən məntiq elmindən ayrıca təlim almışdır. Atasının yaxın dostu və sevimli Abdulla Əfəndi Axundzadə Əbdülqəniyə Şərq klassiklərinin əsərlərini tədris etməklə yanaşı, xəttatlıq sənətini də öyrətmək üçün uzun müddət ayrıca evdə məşğul olmuşdur.

Kamandar Şərifov Şəki sakini Baxşəli Əfəndidən aldığı məlumata görə, elm öyrənməkdən yorulmayan Ə.Nuxəvi təhsilini Türkiyədə də davam etdirmişdir. Baxşəli Əfəndi bu məlumatı onun öz əli ilə yazdığı əlyazmalarından birində oxuduğunu təkidlə demişdir. Ə.Nuxəvinin bibisi Şərifə xanım XVIII əsr türk şair və yazıçısı İbrahim Həqqinin soyundan olan Yusif Əfəndinin nəvəsi Hacı Abdulla Əfəndiyə ərə getmişdir. Bu qohumluq əlaqəsinə görə də həmin fikri təsdiq etmək olar. Həm də alim özü "Farisi təkəllüm risaləsi" əsərində 1835-1836-cı illərdə, bir də 1839-cu illər ərzində iki dəfə İranda və İstanbulda olduğunu yazmışdır.

Ə.Nuxəvi mədrəsədə dərs deməklə, pedoqoji-elmi yaradıcılığı ilə yanaşı, Şəki vilayətinin baş qazisi vəzifəsində işləmişdir. Bütün bunlar haqqında lap dolğun məlumat almaq istəyənlər K.Şərifovun "Əbdülqəni Nuxəvi Xalisəqarızadə" kitabını əldə edib oxuya bilərlər.

Nəslin Xalisəqarızadə soyuna gəldikdə isə Xalisə Hacı Bayram qızı dövrünün ziyalı, dərin elmli, şair təbli xanımlarından olmuşdur. O, övladlarının və nəvələrinin, yaxın əqrə-

balalarının oxuyub təhsil alması üçün bütün var-dövlətini əsirgəməmiş, hər cür qayğı göstərmişdir. Odur ki, nəslin varisləri bu uzaqgörən dəyərli xanımın ismini özlərinə soy adı kimi götürmüşlər.

Əsası elə Xalisə xanımın özü tərəfindən qoyulan, övladları, nəvələri, xüsusən də Əbdülqəni Nuxəvi tərəfindən zənginləşən kitabxana yalnız onlar üçün deyil, bütöv Azərbaycan vilayətinin ziyalılarına xidmət etmişdir. 1872-1873-cü illərdə böyük alim Yaxın Şərq ölkələrinə səyahətdə olarkən dükan və bazarlardan əski çap kitabları və əlyazmalar alıb gətirmişdir. Bunu onun həmin kitabların titul vərəqlərində etdiyi qeydlərdən bilmək olur. Gündüzlər dərs deyib, gecələr yazıb mütaliə etməkdən usanmayan alim deyirdi:

Elmi insanlar üçün nur gördüm,
Buludsuz parıldayan günəş işığı kimi.
Günəş nuru hər gün batır,
Elmin nuru daim yanır.

Böyük alimin ziyasından nur alanlardan biri də görkəmli maarifçi, demokrat yazıçı, folklorşünas Rəşid bəy Əfəndiyev olmuşdur. Rəşid bəy həmçinin Ə.Nuxəvinin oğlu, dövrünün tanınmış ziyalısı Abdulla Xalisəqarızadədən də təlim almışdır. A.Xalisəqarızadənin nəvəsi, Əlyazmalar İnstitutunun əməkdaşı olmuş Əbdülkərim İmanzadə babasının atası Nurməhəmməd Əfəndiyə danışdığı bir əhvalatı Kamandar Şərifova söyləmişdir. Həmin bu əhvalat indi Şəkidə bir qədər təhrif olunmuş şəkildə danışılır. Əslində isə belədir: "Atam Nurməhəmməd Şərq dilləri və ədəbiyyatı sahəsində təhsilini atası Abdulla Əfəndi Xalisəqarızadədən almışdır. Bir gün Nurməhəmməd babası Əbdülqəni Nuxəvi Xalisəqarızadənin yaratmış olduğu kitabxanada atası Abdulla Əfəndidən təhsil alarkən, fasilədə böyük və qədim bir əlyazmasını gözdən keçirməyə başlayır. Bu zaman Abdulla Əfəndi öz oğluna yaxınlaşaraq deyir ki, oğlum, bu əlyazma kitabı kitabxanamızda həm yeganə qədim nüsxədir, həm də xalqımızın ən qiymətli bir yazılı abidəsidir. Gələcəkdə onu sən göz bəbəyi kimi qorumalısan, çünki bu kitab bizim həm tariximiz, həm də ədəbiyyatımızdır. Onu ehtiyac olmadan vərəqləmək lazım deyildir. Sən bu kitabı ancaq mükəmməl təhsil aldıqdan sonra oxuyub düzgün dərk edə bilərsən. Digər tərəfdən, bu əlyazmasını bütün varlığınla qorumalısan. Bir dəfə bu əlyazmanı burada aparmağa çox ciddi-cəhd göstərilmişdir. Şəkiyə gəlmiş bir əcnəbi həmin əlyazmanı özü ilə aparmağa çox çalışmışdırsa da, onun bütün səyləri baş tutmamışdır. Bu hadisə atamın söylədiyinə görə belə olmuşdur: "1859-cu ildə Şəkiyə gəlmiş fransız yazıçısı Aleksandr Düma Şəkidə qaldığı müddət ərzində atam Əbdülqəni Əfəndi ilə bir neçə dəfə görüşmüşdür. İlk görüşdən sonra bizim kitabxanaya baxmaq üçün atamdan icazə istəmiş və o da buna razılıq vermişdir. A.Düma bizim kitabxananın zənginliyindən heyrətə gəlmiş və bir gün onunla yaxından tanış olmuşdur. Atam, Əbdülqəni Əfəndi bir sıra Azərbaycan və Şərq klassikləri, onların kitabxanamızda olan əlyazmaları haqqında A.Dümaya geniş məlumat vermişdir. Görüşün sonunda o, rəngarəng naxışlarla bəzədilmiş, gözəl miniatürləri olan bir neçə nəfis əlyazmasını gətirib, stolun üstünə qoyur və bu kitabların ona satılmasını xahiş edir. Bax, bu əlyazma da həmin kitabların arasında olur. Atam onun xahişini rədd edərək bildirir ki, bu kitabxana xalqın elm ocağıdır, buradan heç bir kitab satılmır. Əgər bu kitablar sizə müəyyən bir əsər yazmaq, yaxud oxumaq üçün lazımdırsa, gəlib burada məşğul ola bilərsiniz. A.Düma bu kitabları sahibindən heç bir pula ala bilməyəcəyini görüb, Şəki tacirlərinə müraciət edir. Şəkinin nüfuzlu tacirləri kitabların bütün məsuliyyətini öz üzərlərinə götürərək, öz dillərindən Ə.Nuxəviyə təsdiqlənmiş rəsmi sənəd verirlər ki, həmin əlyazmaları istifadə edildikdən sonra sahibinə qaytarılacaqdır. Lakin Ə.Nuxəvi həmin əlyazmanın A.Dümaya verilməsinə qəti etiraz edərək bildirmişdir ki, bu kitab yeganə olmaqla bərabər elə bir abidədir ki, onun bu kitabxanadan kənara çıxarılması qeyri-mümkündür. Aleksandr

Dümanın apardığı digər əlyazmalar isə bir daha geri qayıtmamışdır. Beləliklə də həmin əlyazma kitabı atamın səyi sayəsində kitabxanada qalmışdır.

Əbdülkərim İmanzadə deyirdi ki, atam Nurməhəmmədin söylədiyinə görə, A.Dümanın apara bilmədiyi böyük əlyazmasına **"QORQUDUN KİTABI"** deyərlərmiş. Qonağın apardığı digər kitabların isə hansı əsərlər olduğunu unutmuşam. Həmin əlyazmalar məlum olmasa da, onlar Fransa əlyazma xəzinələrinin birində, yaxud yazıçının arxivində mühafizə olunur. Onun apara bilmədiyi kitab isə yəqin ki, "Kitabi-Dədə Qorqud"un əlyazması olmuşdur. Lakin təəssüflər olsun ki, bu əlyazması hələ bizə gəlib çatmamış və onun haqqında heç bir məlumat əldə edə bilməmişik".

Əbdülkərim İmanzadənin verdiyi digər məlumata görə, XX əsrin ilk onilliklərində ədəbiyyatımızın fədailərindən Salman Mümtaz, Vəli Xuluflu, Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü Əzəl Dəmirçizadə Əbdülqəni Nuxəvinin kitabxanasından çoxlu əlyazmalar aparmışlar. 1920-ci ildən müstəqil Azərbaycan Demokratik Cümhuriyyəti devrilərək, bolşeviklər hakimiyyəti ələ keçirdikdən sonra xalqımızın qabaqcıl ziyalılarına, vətənpərvər övladlarına qarşı yönəldilmiş repressiyalarla yanaşı, mədəniyyətimizə qarşı da dəhşətli hücumlar olmuşdur. Ə.Nuxəvinin zəngin kitabxanası da bu hücumdan qurtara bilmir. Üzdə olan kitabların əsas hissəsi yandırılıb məhv edilmişdir. Varislərdən Yasin Səbri Abdullayevin, Molla Əsmayənin Əlyazmalar İnstitutuna verdiyi kitablar isə mal damının divarlarına hörgü edilmiş, sonradan çıxarılmışdır. Bəlkə də S.Mümtazın, V.Xuluflunun məhv edilən arxivinin çox hissəsi elə Nuxəvi kitabxanasına məxsus imiş?

1937-ci ilin qara yeli Xalisəqarızadələr soyunun nəinki mənəvi xəzinəsini, canlı ziyalılarını da məhv etmişdir. Nurməhəmməd Əfəndi, Əhməd Əfəndi, Tacəddin Əfəndi, Nurəddin, Əbdürrəhman və Cəmaləddin İmamzadələri pantürkist, panislamist adıyla güllələdilər. Tacəddin Əfəndi Azərbaycanın tanınmış tarixçi pedoqoqu, ictimai xadimi, qadın hərəkatının öndəri olan Səidə İmanzadənin atasıdır. Əhməd Əfəndi isə Şəkinin çox sevilən və tanınan infeksion xəstəlikləri həkimi mərhum Məhparə xanımın atasıdır. Əhməd Əfəndi türmədə olarkən Quranı elə oxuyurdu ki, diqqəti çox cəlb edirdi. Orada işləyən bir zabitin tatar milliyyətindən olan arvadı onu evinə qonaq aparardı. Evində 1-2 saatlığa avazla Quran oxudardı. Belə pak bir dindarın yenidən türməyə qaytarılmağına tatar qadın çox heyifislənib ağlayardı. Əhməd Əfəndi türmədə ona verilən bütün əzablara dözərək heç nəyi boynuna almayıb. İradəsini qıra bilməyən allahsızlar mömin ixtiyarı güllə ilə susdurublar.

Bu soy barədə toplayıb, yazdığımız demək olar ki, əslində onların layiq olduqlarının çox az bir hissədir. Bakıdan, Moskvadan, Amerikadan, daha haralardan onun qanadlarını arayıb axtarmaq gərəkdir ki, görək ata-babalarından nə eşidiblər, nə bilirlər? Hansı arxivlərə, hansı fondlara müraciət etmək lazımdır ki, məlumatları genişləndirək. K.Şərifovun yazdığına görə, S.İmanzadə iki nəfis tərtibatlı əlyazma kitabı Sankt-Peterburqun "Ermitaj" muzeyinə vermişdir. Alimin əlyazmalarından Dağıstanda, Sankt-Peterburqun Saltıkov-Şedrin adına kitabxanasında, Türkiyə kitabxanalarında çoxlu nüsxələr saxlandığı müəyyən edilmişdir.

Azərbaycanın ziyalı elitasının tanınmış simaları- mərhum Cövdət Hacıyev, İmruz Əfəndiyeva, Təhminə, Taleh, Mübariz İmamzadələr (hər üçü şərqşünasdırlar), Səltənət, Əkrəm, Hikmət Şəkinskilər bu soyun varisləridirlər. Həmin Şəkinskilər Nurməhəmməd Əfəndinin qızı Əfşan xanımın övladlarıdırlar. Əfşan xanım Azərbaycanın tanınmış dövlət xadimi Məhəmmədəminin Şəkinskinin həyat yoldaşı olub.

Gözəl satira və yumor ustası, dramaturq Sabit Rəhmanın soyu, Muşdu və Nəsib bəy Fərzəlibəyovlar (tanınmış rejissor Mərahim Fərzəlibəyovun ata-babaları), Alcanbəylər və b. bu soya qohum olmuşlar. Şəkidə bu soyla qohum olmağı hər kəs özünə şərəf bilirdi. Nəinki qohum olmağı, hətta o küçədən

keçəndə belə nalayiq, hündür səslə danışmağı xoşlamazdılar ki, bəs bura İmam Əfəndilər yaşayan məhəllədir.

Dərə-bağçada İmam Əfəndilərin mülkü qabağında vaxtilə onların əzəli soyu tərəfindən tikilmiş məscid var idi. Adı da elə İmam Əfəndi məscidi idi. Sovet dönəmində dağılan məscidin hissələri bərpa edilib, hazırda orada 5 saylı bağça yerləşdirilib. Bu həmin məscid olub ki, yuxarıda təsvir etdiyimiz Şeyx Şamilin naibi, Dağıstanın igidi adlanan Hacı Murad Qalada ruslar tərəfindən əsir saxlanarkən yaxın olduğu üçün namazını burada qılardı.

İmam Əfəndilərə məxsus ata-baba evinin bütövlüyü-tamlığı sanki həmin o məscidlə bahəm idi. Həyətdəki böyük mülkün çox hissəsi dağılıb yoxa çıxmış, təkcə üçdən bir hissəsi qalmışdır. Onun da ətrafı müasir şüşəbəndlərlə əhatə olunmuşdur. Salamat qalan 2 mərtəbəli evi gəzdikcə görürük ki, Şərq memarlıq üslubuna məxsus bir çox ənənələr bu binanın inşasında nəzərə alınıb. Taxçalı, siyirməli, buxarılı böyük zal, yataq otağı və yataq otağı içində taxça qapılı, axarı çölə olan gecə qüsulu otağı, sonra da hər iki otağa giriş qapısı olan yenə taxçalı, xəfəngli, çıraqdanlı, dolablı, hündür pilləli dalan olduğu təkin durur.

Həyətin aşağı hissəsində yola yaxın yerdə **Nurməhəmməd Əfəndinin** ayrıca tikdirdiyi kürsülü, 4 otaqlı mülk isə demək olar ki, olduğu kimi durur. Çöl divarlarının kərpic işləmələri, otağın içərisindəki taxça, dolab, yük yerləri, şüşəbəndindəki şir başlıqlı tutqaclar, ev içi hamamı adamı heyran edir. Hazırda evi satın alan Yuxarı Baş sakinlərindən biri müəyyən artırmalar etsə də, evin əzəli özünəməxsusluğuna toxunmur.

Qeyd edək ki, haqqında danışdığımız bu soyun qəbiristanlığı ayrıca olaraq özünəməxsusdur. Adı da elə İmam Əfəndi qəbiristanlığıdır. Qəbiristanlıq onların özlərinə qohum olan, məhəllənin günçıxan hissəsində dağ yaxasında Fərhad bəyin evinin yaxınlığındadır. İmam Əfəndinin özünün qəbri qohum-qonşu və tanıyanların ziyarətgah yeridir.



Danışırlar ki, kim isə məhəllə əhlindən biri əhd edib ki, onun qəbri üzərində gözəl bir qəbirüstü tikili yaratsın. Yaradıb, səhər də gəlib görüb ki, bəs o tikili dağılıb. Əhali də belə qəbul edib ki, görünür, halalına olmayıb deyə, İmam Əfəndinin ruhu qəbul etməyib.

Belə bir əhvalat da başına gələn adamın özü tərəfindən danışıldı ki, Bakıdan Şəkiyə gələn günü dedim ki, bəs İmam Əfəndinin qəbrini uşaqlarla birgə gedib ziyarət etmək istəyirəm. Evdən dedilər bu gün qalsın, sabah gedərik. Lakin mən dediyim gün getməyi lazım bildim. Günəşli, açıq səmalı bir yay vaxtı qəbiristanlığın qapısını açmaq istəyəndə çox gur selləmə yağış yağdı. Mən bu selləmənin birdən-birə tökülməyindən çaşıb, bilmədim ki, gətirdiyim uşaqların hansını tutum. Tələm-tələsik palçığa batmış, islanmış halda el yoluna çıxdıq. Maşınla şəhərə düşdükcə yağış yağmadığını gördük. Gördüklərim əvvəl yuxu təkin gəlsə də, sonra başa düşdüm ki, evdəki kiçik narazılığa görə İmam Əfəndi onun ziyarətini qəbul etməyib.

Bir əhvalatı da Nurməhəmməd Əfəndinin (İmam Əfəndinin) özünün tikdirdiyi evində yaşayan qadın belə danışdı. 13 yaşlı oğlumuz birdəncə xəstələnib yatdı. Çox bihal yatan uşaq oyanıb dedi ki, ana, məni İmam Əfəndi babanın qəbrinin ziyarətinə apar.

Yarıtəşviş, yarı tərəddüdlə uşağı birtəhər qəbir ziyarətgahına apardıq. Qəbir üstündə dualarımızı oxuduq, əl açıb Allahdan diləyimizi etdik. Evə qayıdanda uşaqda dirçəlmə əlamətləri gördük. Uşaq yatağına yox, çörək tabağına tərəf getdi. Çörəyi əlinə alıb, yeyə-yeyə oynamağa yollandı. Allahın qüdrətinə də, İman-Quran yiyələrinin kəramətinə də şükürlər etdik. Fikirləşdik ki, biz evin iznini, halallığını İmam Əfəndidən gec aldığımıza görə başımıza belə iş gəldi.

Qələmə aldığımız bütün bu olmuşlar yəqin ki, təbiət, relyef, iqlim, tibbi yönümlü hadisələrdir. Ancaq əhali inamı və ehtiramı bizi bunları qələmə almağı vadar etdi.

Bu soydan olan bir varis 70-ci illərdə müəllimim olmuş, bilgisinə, gözəl danışığına heyranlıqla qulaq asdığım, sussa belə gözəl siması, mənalı gözləri danışan Yasin-Səbri Abdullayevin sağlığında nəsli, özü barədə suallarımı niyə cavabsız qoyduğu indi mənə aydın oldu. Qəbrin nurla dolsun, Səbri müəllim! Kökdən, tarixdən bixəbər naşı suallarımla könlünüzü ağrıtmışam ki!... Əmi nəvələrinizin söylədikləri bir dərdiniz də mənə əyan oldu.

Yasin-Səbri Leninqradda fizika-astronomiya üzrə Tədqiqat İnstitutunda çalışanda elmi işi təzadlı şəkildə pozulmuş, özünün isə sinirləri xeyli vaxt xəstə olmuşdur. Beləcə sevdiyi elmdən uzaqlaşan Yasin-Səbri doğma yurda qayıtmış, bizim kimi xələflərindən bixəbər, sovet ideologiyası ilə böyüyüb, oxuyan şagirdlərə fizika-riyyaziyyatdan dərs deyib, adicə müəllimliyini etmiş, dərd-ələmlə dünyasını dəyişmişdir.

Onun 2 oğul övladlarından biri Asim Abdullayev fizika-riyaziyyat elmləri doktoru, Vafiq isə fizika-riyaziyyat müəllimidir.

**"ƏFƏNDİLƏR"** (patronim) –Şəkidə bu adlı soylar çox olsa da tanınıb, aranmaqda heç vaxt çətinlik olmayıb. Çünki hərəsinin öz məhəlləsi ilə yanaşı tanınma işarətləri də camaata bəlli olub. Dəmirçi bulağı yaxınlığında Məmməd bəy Əfəndiyevin özü və ailəsi haqqında toplaya bildiyimiz qeydləri yazmaq tanıyıb bilənlərdə xoş xatirə yaradar.

M. Əfəndiyev Peterburqda təhsil alıb. Qurtardıqdan sonra bir müddət ailəsi ilə birgə Aşqabadda yaşayıb. O, qədim əlyazmalar və kitablar toplamaqla məşğul olub. Onun həyat yoldaşı Ümmü xanım quranı gözəl bilirdi. Uşaqlarından Tofiq və Əlihüseyn də ərəbi, farsı, türkü və rus dillərini gözəl bilirdilər.

Əlihüseyn Əfəndiyevin böyük qardaşı Tofiq bəy Tiflisdə qulluqda işləyərkən onun yanında qalıb ibtidai təhsilini orada almışdır. Çox təəssüf ki, bu ziyalı soyundan hamının "Mirzə" deyə müraciət etdikləri Əfəndiyevdən təkcə əhatəli məlumatlar



toplaya bildik. Ucu şiş, uzun, xüsusi məhəbbətlə bəslədiyi bığlarına görə ona "Bığ Əlihüseyn" də deyərdilər.

İbtidai təhsildən sonra Ə.Əfəndiyev Şəkidə ali-ibtidai məktəbi bitirmişdir. Əmək fəaliyyətinə 1917-ci ildə teleqrafçı kimi başlamışdır. 1928-ci ildən Həmkarlar İttifaqı Komitəsində, Azərbaycan İpək İdarəsi sistemində mühasib olmuş, şəhər İcraiyyə komitəsinin statistika şöbəsinin müdiri vəzifəsində çalışmışdır.

1928-1930-cu illərdə Ə. Əfəndiyev Leninqrad Kommunal Akademiyasında oxumuşdur. Qurtardıqdan sonra Şəki Kommunal Təsərrüfat şöbəsinin müdiri, Su idarəsinin müdiri, Nijdə fındıq zavodunun direktoru, Naxçıvanda Xalq Kommunal Təsərrüfatı komissarı və başqa rəhbər vəzifələrdə işləmişdir.

1938-ci ildən Ə.Əfəndiyev pedoqoji fəaliyyətdə olmuşdur. Əvvəl Pedoqoji Texnikumda, bir çox ümumtəhsil məktəblərində 1960-cı ilədək müəllim və müdirlik etmişdir. Onun xidmətləri və pedoqoji fəaliyyətləri lazımınca qiymətləndirilmiş, medallarla təltif olunmuşdur.

Əlihüseyn müəllimin ailə üzvlərinin hamısı rus dilini yaxşı bildikləri üçün övladları orta məktəbin rusdilli bölməsini oxumuşlar. Qızı Rübabə və Hicran həkim, Tangiz rus dili müəllimi olmuşlar. Nəhayət isə həm ibtidai sinif müəllimi, həm də tibb bacısıdır. Şəkidə çox adlı həkim kimi tanınan mərhum Rübabə xanımın qızı Aelita Əhmədova indi respublikada tanınmış ginekoloq həkimdir. O, "Ana və Uşaqların Mühafizəsi" İnstitutunda çalışır. Mərhum Hicran həkimin Tamerlan adlı oğlu isə Politexnik İnstitutunun rus bölməsini bitirmişdir. Öz qabiliyyəti hesabına poliqlot olmuş, 7 dil bilirdi. İri, dünyəvi bir ticarət şəbəkəsinin prezidenti idi. 55 yaşında qəfil, müəmmalı vəfatı oldu. Hazırda özü kimi qabiliyyətli qızı Ceyran Əfəndiyeva onun Dubaydakı şirkətini işlədir.

Ə.Əfəndiyevin oğlu Səhhət Ziya mühəndisdir. Yeri gəlmişkən qeyd edək ki, Səhhət Ziya orta təhsilinin axırıncı illərini 3 saylı məktəbdə qurtarıb. Kamal attestatı alması münasibə-

tilə atası özünün zəngin kitabxanasından 750 seçmə kitabı məktəbə hədiyyə vermişdir. Ə.Əfəndiyevin zəngin kitabxanasının ən nadir hissəsini özü oxuduğu Leninqrad Kommunal Akademiyasının kitabxanasına aparıblar. Onun belə sərvəti olduğunu bilən tələbə yoldaşları öz razılığı ilə bu işi təşkil ediblər. Ə. Əlihüseyn sonradan bu kitabların Azərbaycandan getməsinə peşman olmuşdur.

Əlihüseyn müəllimin uşaqlarının anası Ədalət Mustafa qızı "Körpə Ələkbər"in nəvəsidir. Ələkbər kişi çox ucaboy, enlikürək, yaraşıqlı olduğu üçün Şəki baməzələri ona Körpə demişlər. Körpə Ələkbərin qızı, Əttar Əbdülsalamın (ətirli şeylər, ədviyyat satan adam) gəlini Kərimə xanım çox ənənə gündən, Quran bilən, məclislər yaraşığı olan ağbirçək idi. Əlihüseyn müəllim qaynanası olan bu ağırtaxta xatuna çox böyük hörmət ilə yanaşardı. Əlihüseyn Əfəndiyev 1970-ci ildə dünyasını dəyişmiş, şəhərin **ÇÖL QƏBİRİSTANLIĞINDA** qızı Rübabə həkimlə yanaşı dəfn edilmişdir.

**"ƏYYUBOVLAR"–"ÇUSTÇULAR"** (patronim) – öncə qeyd edək ki, İmam Əfəndilərin qonşuluğunda olan bu soy onlarla qohum olub. Çox savadlı, alicənab, xanım-xatun Arzu həkim özü kimi xatun bir ananın- Sümayə xanımın oğlu əməkdar müəllim, çox dəyərli bir şəxsiyyət olan Mahir müəllimin həyat yoldaşıdır.

Ziyalı bir nəsil olan bu dəyərli şəxsiyyətlərdən məşhur coğrafiyaçı, iqlimşünas alim mərhum Əsgər Əyyubovu respublika ictimaiyyəti çox yaxşı tanıyır.

Bu nəslin ata-babaları Cabbar qardaşları Musa, Heydər dövrlərinin çox bacarıqlı, insaflı, tanınmış sənətkarları olublar. Çay qırağı ticarət dükanları sırasında, indiki yataqxananın yerində Abid kişinin parça dükanının yanında onların çust dükanı var idi.

Sənətkar kötüyü ortada, alətləri də kötükətrafı qayış asılqanlarda yığılardı ki, işlətdikcə alıb-qoymaq asan olsun. Ustaların şəyirdləri də vardı. Çustçu Heydərin oğlu yox idi,



oğul həsrətində idi. Bir gün dükana xəbər gəlir ki, bəs oğlun olub. Sevindiyindən yanındakı şəyirdlərə ötkəm səslə deyir ki, "durun, dağılışın, ə. Daha özgə minnətindən qurtardux". Elə bil ki, təzə dünyaya gələn oğul onun üçün indi şəyirdlik edəsiydi.

Çustçu Cabbarın oğlu mərhum Ələkbər Əyyubov hüquqşünas olub. Əvvəl müəllim, daha sonra prokurorluqda əməliyyat müvəkkili olmuşdur. 1976-cı ildə Qoxmuq-İnçə yolunda maşın qəzasında ciddi zədə almış, 1979-cu ildə dünyasını dəyişmişdir.

Əyyubov Əsgər Cabbar oğlu isə coğrafiya elmləri doktoru, professor, Respublika Dövlət mükafatı laureatı olmuşdur. Mərhum həmçinin sovet dönəmində SSRİ Coğrafiya Cəmiyyətinin F.P.Litke adına qızıl medalının laureatı, respublika Elmlər Akademiyası Coğrafiya İnstitutunun şöbə müdiri vəzifəsində çalışmışdır.

Aspirantura təhsilini Moskvada alan Ə.Əyyubov insan biometeoroligiyası və Azərbaycanın kurort, müalicə əhəmiyyətli yerlərinin tədqiqinə həsr edilmiş namizədlik dissertasiyasını müdafiə etmişdir. Sonrakı doktorluq dissertasiyasını ümumi iqlimşünaslıq, sel hadisələri, aqrometeorologiya məsələlərinə həsr etmişdir. O, həm də Azərbaycanın aqroiqlim atlasının yaradıcısıdır.

Anlayan beyin, duyan ürək çox yükləndiyi üçün də çox dözmür. Uca tanrıdan bu böyük şəxsiyyət üçün qəni-qəni rəhmətlər diləyirik.

Fikrət Əyyubov – kənd təsərrüfatı elmləri doktoru, keçmiş SSRİ Baş Kosmik tədqiqatlar Elm-İstehsalat Birliyinin şöbə müdiri olub. "Günəş-85 " tədqiqat eksperimental Beynəlxalq işə rəhbərlik edib.

Natiq Əyyubov isə rəssamdır. Humanist, bəşəri ideyalarla yaşayan rəssam həm də dünyada türk-soy birliyinin, qardaşlığının carçısıdır. Türkiyənin keçmiş prezidenti S. Dəmirəlin uşaqları qucaqlayıb gülən halda tablosunu yaradıb. S.Dəmirəlin çox xoşuna gəldiyi üçün müəlliflə maraqlanıb, onu Türkiyəyə

özünün qonağı təkin də dəvət edib. 15 gün Türkiyədə qonaq qalan rəssam gözəl təəssüratla qayıdıb. Rəssam N. Əyyubov həm də karikatüraçıdır. Oğlu Vüqar da özünün davamçısıdır.

Mahir Əyyubov - şəhər 20 saylı məktəbin fizika müəllimidir. O, 2002-ci ildə Prezident fərmanına görə Respublikanın Əməkdar müəllimi adını almışdır. Həyatı boyu halallığı əsas tutan, böyüyün sözünü və özünü baş bilən, sadə təbiətli, ali mədəniyyətli, yüksək savadlı bir ziyalıdır."Xalqıma müəllim kimi daha çox lazımam" deyib çox yüksək vəzifələrdən imtina edən Mahir müəllim onu tanıyanların hamısının hörmətlisi və sevimlisidir.

Hələ kompüter texnikası Şəkidə olmayanda indiki təhsil muzeyinin direktoru Əlimirzə Əhmədov Maarif nazirinin müavini işləyəndə onun dərslərində iştirak edib, çox bəyəndiyi üçün, istedadlı müəllim olduğunu dönə-dönə qeyd edərək onun fizika kabinetinə yapon kompüteri hədiyyə etmişdir.

Arzu Əyyubova (Mahir müəllimin həyat yoldaşı, mərhum Məhparə həkimin qızı) da həmçinin dərin savadlı, gözəl şəxsiyyət olan uşaq həkimidir. Ona bələd olan müəllimlərindən, Bakıda yaşayan ziyalı, alim qohumlarından çoxu deyir ki, "gəl Bakıya, o cür savadlısan, elmi iş götür işlə". El-obasına bağlı Arzu həkimin cavabı belə olub: "Elndə söz demək istəyənlər onsuz da çoxdu. İstəsən, elə ucqar əyalətdə də gərəkliyinlə adi həkim təkin özünü təsdiq etmək olar".

Sabir Əyyubov – ali təhsilli tarix müəllimi olub. İndi işlədiyi kəndlərin (Əlyar, Aydınbulaq, Bideyiz) çoxunda onun adı tanıyan yaşlılar tərəfindən hörmətlə çəkilir. Mərhum yaşlı vaxtında ömrünün sonunacan I saylı məktəbdə dərs hissə müdiri işləyib.

Bu soydan Cabbar Əyyubovun digər qardaşı Bilal Əyyubov hərbçi olub. O, inqilabdan qabaq Peterburqda oxuyub. Onun Şimali Qafqazda və Soçidə çox böyük mülkü olub. Şəkinin Mərkəzi küçəsindəki köhnə poçt adıyla tanınan mülk



də ona məxsus olub. Onun oğul nəvəsi Cəmaləddin Əyyubov və oğlanları Azərbaycanın tanınmış zərgərləridir.

**"ALCANBƏYOVLAR"** (patronim) – Yuxarı Başın bu adlı-sanlı soyunun əzəli Ağası bəylə başlanır. Ağası bəyin adı indi də Yuxarı Baş yaşlılarının dilində hörmət və rəhmətlə çəkilir. O, savab bir iş görərək Xan yaylağına yaxın Söyüdlü qaynamasından çox dərində yerləşdirilmiş dulus boruları vasitəsilə Qullar məhəlləsinin başlanğıcınacan (indiki I saylı məktəbə qədər. Bu məktəb binası həmin soya məxsusdur) su xətti gətirmişdir.

Həmin su xəttindən camaat məhəllələrə, evlərə də su çəkdirmişdir. Ağası bəyin ölümündən sonra bu işin fasiləsiz aparıcısı oğlu Alcan bəy olduğu üçün hazırda bulaq onun adıyla bağlıdır.

Yuxarıda qeyd etdiyimiz kimi, soyun ulu babası Ağası bəyin övladı olmayıb. Qohumlarından Məhəmmədi övladlığa götürüb. Dediklərinə görə, Sultan titulu ona çarın özü tərəfindən verilib. Onlar çar xəzinəsinə ödənci vaxtında, layiqlə verər, gedəndə də çara qiymətli hədiyyələr aparardılar.

Soltan Məhəmməd bəyin arvadı Ümmüsələmə xanım olub. Şəkidə vəba xəstəliyi yayılanda onsuz da çölə-bayıra çıxmayan bu qadın qulluqçu-qaravaşlara evin ən xırda dəlmə-deşiklərini belə pambıqla doldurtmuşdur. Ancaq vəbaya tutulub birinci ölənlərdən biri elə o özü oldu.

Alcanbəylərin evində 12 gədə, 7 arvad qulluqçusu olub. Onların bəzilərinin evlənib, ərə getməsinə də kömək olublar. Bu soydan olan davamçılardan Bəhram bəy Sovet hökumətinin ilkinliyində Respublika Maliyyə Nazirliyində baş mühasib işləyib.

Mustafa bəy isə hərbi məktəbi bitirib Şəki uyezdinin inzibati şöbəsinin rəhbəri, Bakı şəhər 3-cü milis şöbəsinin rəhbəri, 1928-ci ildə isə Mərdəkan rayon İcraiyyə Komitəsinin sədri olur. Sonra isə Tiflisə işləməyə göndərilib. 1930-cu ildə Şəki üsyanı zamanı ələ keçən, günahlı olan-olmayan çox adamı

...tutub güllələdilər. Alcanbəyovlar nəslindən olan Mustafa bəy, Bəhram bəy, Rüstəm bəy və köməkçilərindən Kərim bəy müxtəlif şəhərlərdə həbs edilib, Şəkiyə Qalaya gətirilir. Tutulanlar yarı Xoçik təpəliyi qəbiristanlığında, yarı da erməni qəbiristanlığı tərəfdə güllələnir. Qalanın həyətində də güllələnənlərin sayı çox olur.

Nəsildən tutulan adamların qadınlarını, uşaqlarını evindən bayıra atıb, var-dövlətin talayırlar. Bayıra atılan 4 uşaqdan böyüyünün 7-8 yaşı, ən kiçiyi isə 2 aylıq körpə olub.

Bu nəslin Azərbaycanda tanınmış bir ziyalısı- Fuad Mustafa oğlu İsmayılov (prof., tibb elmləri doktoru, ATU-nun professoru, Türkmənistanın Əməkdar həkimi, Böyük Vətən müharibəsi veteranı) özünün "Mübarizələrdə keçən həyatım" avtobioqrafik kitabında bir qədər 30-cu il vəziyyətindən yazmışdır. Alcanbəyovlar soyunun, xüsusən də özünün repressiya dövrü əzablarını, həyat yolunda dözdüyü məşəqqətləri gözəl qələmə almışdır.

Alcanbəyovlar soyunun bu qara günündə çoxlarında olduğu kimi, onların da qohum-əqrabaları, tanışları hökumətin qorxusundan onlardan üz döndərir, kömək edə bilmirdilər. Lakin onların arasında az da olsa xeyirxahlar tapılıb, gizlincə "Xalq düşməni" damğası vurulan bu insanlara kömək əli uzadanı olub.

Bu nəslin 14 yaşında olan qeyrətli, bacarıqlı qızı Qönçə xanım özündən kiçiklərin bir neçəsinə dayaq durur. 8 illik təhsilini bitirib, kitabxanaya işə düzəlir. Nəticədə yavaş-yavaş hərəsi bir istiqamətdə oxuyub, savad-sənət yiyələri oldular. Xüsusən də Fuad öz dözümlüyü, bacarığı ilə seçilirdi.

Qönçə xanım onlara qohumluqları olan Qazıyevlər soyuna- Abdulla Qazıyevə ərə gedir. Artıq tanınmış həkim olan Qönçə xanım ərə getdiyi yerdə də Fuada kömək edir, onun da gözəl bir həkim kimi yetişməyinə dayaq olur.



Q.Qazıyeva dünyasını 1992-ci ildə dəyişmişdir. Onun oğlu Rauf Neft Akademiyasının müəllimi, Fərid isə ticarət biznesilə məşğuldur.

3-cü rayonda sadə bir ailə də yaşayır. Əyyubovlar soyu ilə üzbəüz mantyor Şakir Bəkir oğlu Mustafayevin ailəsidir. Bu ailənin 1975-ci il təvəllüdlü Rəna adlı bir qızı ilə Yuxarı Baş əhli fəxr edir. O, 2 saylı orta məktəbi qurtaran kimi ADU-nun fizika fakültəsinə müvəffəqiyyətlə imtahan verib qəbul olunur. Təhsilinin ilk ilini əla qiymətlərlə başa vuran Rəna eyni adlı ixtisas üzrə Ankara Universitetinə yenidən imtahan verib fizik kimi təhsilini başa vurur. Aspiranturanı oxuyur, alimlik dərəcəsini alır. Türk vətəndaşı professor Abbas Kənan Osmanoğlu bu qabiliyyətli qızın elmdən uzaqlaşmasını istəmir. Onun elmə həvəsinə, zəhmətkeşliyinə vurğun olub, onunla ailə qurur. Hazırda bu xoşbəxt ailənin Osmanfat adlı bir oğulları da var. Rəna xanım indi 2-ci bir universiteti tibb təhsili üzrə oxuyur. Biz də bu bacarıqlı həmyerlimizlə fəxr edir, ona müvəffəq və xoş həyat arzulayırıq.

3-cü rayonun lap sonunda Daş mədəni yaxınlığında bir **"Əcəmlər"** soyu da var (ərəb olmayanlara ərəblər **"əcəmlər"** deyiblər. İrana da Əcəm deyiblər). Yuxarı Başın köklü sakinlərindəndir. Onlar sadə, lakin sayca çox olan nəsildir. Elə Əcəm adı tayfa adıdır ki, bu nəsil onu daşıyır. Bu soydan təkcə dağçı Rəcəbin 90 nəvə-nəticəsi olub. Digər qardaşı dağçı Şaban ömür boyu köç-külfətinə sığındığı dağın nemətlərilə baxıb böyüdüb. Ona görə də dağ onun üçün həmişə müqəddəs olub.

**"QƏBİRİSTANLIQLAR"** (nekronim) – Yuxar Başın 3-cü rayonu hissəsində Qullar və Qəriblər qəbiristanlığı yerləşir.

Qəbiristanlıqlar insanlar üçün haqq dərgahında olan ulularının ruhları qarşısında ehtiram yeri təkin tanınıb. Dirilərinə qoyduqları hörmət kimi əziz ölülərinə lazımi hörmət qoyurlar. Ruhlarını əziz tutaraq qaynayan qazanlarının qırağında adlarına duz salınıb, yanar ocağın yanında adları çəkilib, rəhmət oxunub, kultsal günlərdə dini ayinlərini icra ediblər. Ümumiyyətlə, yerli əhali dağ yaxasına sığındıqları

üçün çox yerdə ölülərini də dağa əmanət ediblər. Ona görə də çox vaxt çalışıblar ki, ölüləri də sel-su ağzından kənarda, tapınaq yeri olan dağlarda uyusunlar. Bu səbəbdəndir ki, Şəkidə qəbiristanlıqların çoxu dağ yaxasındadır.

**"QULLAR QƏBIRISTANLIĞI"** (nekronim) – bu Yuxarı Baş məhəlləsinə çox yaxın olan Qullar məhəlləsi camaatının qəbiristanlığı olduğu üçün belə adlanır.

**"QƏRİBLƏR QƏBIRISTANLIĞI"** (nekronim) – deyilənlərə görə istər çar Nikolayın vaxtı, istərsə də bolşevik-sovet hökuməti dövründə Qalada ölən əsirlərin çoxu orada dəfn edildiyi üçün bu ad verilib.

**"GİLƏHLİ MƏHƏLLƏSİ"** (toponim) – xalq arasında bu məhəllənin Giləhli və Güləhli kimi 2 deyim forması mövcuddur. Giləhli adının işlədilməsi əhali arasında çoxluq təşkil edir.

Azərbaycan xalqının soykökünün və təşəkkül tapmasının öyrənilməsində çalışan həmyerli alimimiz Mahmud İsmayılov özünün "Azərbaycan xalqının yaranması" kitabında (Azərnəşr, Bakı, 1995, s. 32) yazır: "Qədim qaynaqlarda albanlardan şimalda məskun olan daha iki **ALBAN SOYUNUN**- Qellərlə Leqlərin adları çəkilir. Qellər Xəzər sahilində, bu sahilin dağlara dirəndiyi yerlərdə məskun idilər. Qellər təkcə həmin ərazidə deyil, Xəzər dənizinin cənub-qərbində də yaşayırdılar. Leqlər isə daha şimalda, qellərdən yuxarıda, Samur çayı axarının dağlıq hissəsində məskun idilər. Qeyd edək ki, Şəkidə leqlər məhəlləsi var.

Təşəkkül tariximizi araşdırıb çox gözəl nəticələrə gələn digər araşdırıcı alim Qiyasəddin Qeybullayev "Azərbaycan türklərinin təşəkkülü tarixi" kitabında (səh.44) yazır: "Strabon göstərir ki, Atropatenada Xəzərin cənub-qərbində Midiya dağlarında albanların bir hissəsi olan kaduslar, amardlar, utilər və kellər (indiki giləklərin əcdadları) yaşayırlar" (53).

Göründüyü kimi, tarixin erkən dövrlərindən üzü bəri gələn Giləhli adının dolğun sübutu var. Bir qədər yaxın tarixdə



yaranan Güləhli adının isə başqa bir sübutu var. Biz yaşlı sakinlərin dilindən Güləhli, Xan Gülüstanı məhəlləsi sözlərini eşidirdik. Lakin bu çoxluq təşkil etmirdi. Şəki İnventarlaşdırma bürosunun 20-30-cu illərdə olan məhəllələrə bölünmə sənədləri içində Gülüstan məhəlləsi sözlərinə rast gəldik.

**Xan Gülüstanı məhəlləsi**. Zaman keçdikcə dövran, quruluş, yad millətin hegemonluğu "Xan" sözünü dildən, kağızdan çıxarmış, "Gülüstan" sözü isə yaddaşlarda yaşamışdır. Yalnız tək-tək məlumatı çox olan qocaların dilində Gülüstan sözü qalmışdır.

Güllərin ilahəsi sayılan qızılgülün özünün də qədimdən də qədim yaşı var. Hind alimləri onun azı 35 milyon il yaşı olduğunu deyiblər. Arxeoloji qazıntılarda bitkinin daşlaşmış qalıqları tapılmışdır. Tarixdən üzü bəri gözəllik, məhəbbət, sədaqət, sülh, əhval-ruhiyyə rəmzi təkin tanınan qızılgül saray bəzəmələrində, sənətkarların əl işlərində, şairlərin vəsflərində sevgi duyğu və hisslərinin anlamında əsas olmuşdur.

Bu baxımdan 1762-ci ildə Şəki hakimi Hüseyn Xan Müştaq tərəfindən tikilən əzəmətli Şəki Xan Sarayının divar rəsmlərində qızılgül təsvirləri əbədiləşdirilib. Hüseyn Xan Müştaq qurub-yaradan, gözəl zövqlü, incə düşüncəyə qadir, şerin, sənətin vurğunu bir insan olmuşdur.

Üzü qibləyə tikilən əsrarəngiz sarayın dörd bir tərəfində qızılgül bağları saldırmış, ətrafı cənnətə döndərmişdir. Xanın yüzlərlə meşələrə nəzarət edənlərilə yanaşı, elə yüzlərlə də qızılgül yetişdirənləri vardı.

Xanın sevimli qızılgül yetişdirilən gülüstanlarından ən böyüyü saraya yaxın yerdə Qurcanaçayın sol yarğanı üstdə yerləşən qədim məhəllədə-Güləhlidə salınmışdır. Gül yetişdirənlərin özləri də bu məhəllədə yaşayıb yaradardılar.Ona görə də buraya həmin zamanlardan Güləhli və ya Xan Gülüstanı məhəlləsi də deyərdilər.

Xan onların ibadəti üçün də həmin məhəllədə məscid tikdirmişdir. Məhəllənin "dərə məhlə" adlanan hissəsində yer-

ləşən bu məscid Qurcanaçay uçurumunun kənarında XVIII əsrin əvvəllərində tikilmişdir. İndi onun minarəsi durur. Şəki-Zaqatala bölgəsində vaxtilə ən hündür minarə hesab olunurdu.

Giləhli yaşlılarının dilindən artıq rəvayətə bənzər iki hadisə də eşitdik.

Hüseyn Xan Müştağın xəzinəsində ipək saplarla toxunmuş qızılgül təsvirli gözəl ipək xalısı varmış. Qışın oğlan çağında bağlarda güllər solub, təbiətin rəngləri kasıblaşan vaxtlar xan bu güllü ipək xalının qabağında daha çox dayanarmış. Xalının ara sahəsində və güllərində ustalıqla toxunmuş əlvan qızılgüllər xanın şair təbiətinə ilham verərmiş. Döşəkli-saçaqlı mütəkkəli yer taxtında qış uzunu dirsəklərinin altına qoymağa gül yastıqları olardı. Qurudulmuş gül ləçəklərindən doldurulmuş ətir saçan yastıqçalar hər il təzələnərdi.

Yazın güllü-bülbüllü çağında qızılgüllərdən mey-gülab, gülsuyu çəkimi həmişə xanın marağında olardı. Onlara xüsusi həvəs göstərərdi. Həmin vaxtlar gülüstanda daha çox olub, yaz küləyinin yaydığı qızılgül ətrini duymağı xoşlardı. Gülçü əhlin istək və arzularını, ehtiyaclarını ödəməyə çalışardı.

İndi də bu məhəllədə və ümumiyyətlə Şəkidə hamının həyətində qızılgül topaları vardır. Xüsusən də qadınlar güllüyün olmasına ciddi fikir verirdilər. Həyətində ətirli qızılgül olmayana birtəhər baxırlar ki, bəyəm bu adamın qızılgüldən, gülsuyu və gülabdan xəbəri yoxdu?

Yaz aylarında evlərin pəncərələrində üzü günəşə sarı darboğaz kitabi, qıfvarı, çanaqvari şəffaf şüşələrdə ağ və qırmızı rəngli ətirli su ilə dolu qablar görünür. Üzü günvurana doğru qoyulan, 40 gün günəş şüaları altında "dəyib-yetişən" bu abi-cövhərlər bir sıra sərinləşdirici dadlı içkilərə və yeməklərə gözəl tam verən məlhəm hesab olunur.

Xalq arasında belə bir deyim də var ki, zaman-zaman ərazinin yaşayış binaları, ümumiyyətlə tikintilər əsasən gil torpaqdan yaradılmış çiy və bişmiş kərpiclərdən olduğu üçün Giləhli sözü yaranıb.



Giləhli məhəlləsi indi də milli ənənələrin qoruyucusu olan məhəllələrdəndir. Hər bir məhəllənin olduğu kimi, buranın da öz məscid-mədrəsəsi, dəyirmanı, adlı-sanlı soyları olmuşdur. Onların çoxunun da varisləri bu gün yaşayırlar.

Məşhur Mustafa bəyin bağatlığı, Taclıq şəfa suyu, Vəzirxan təpəliyi, İsitmə bulağı bu ərazinin payına düşüb.

**"TACLIQ"** (toponim) – bu məşhur bulaq öz adını Xan dövrünün ilkinliklərindən qazanıb. Belə ki, öz-özünə qaynayan səfalı çeşmənin ətrafı istirahət məqsədilə daha da gözəlləşdirilib, ətrafına xan çinarları əkilmişdir. Həmin çinarların da alt qol-qanadları kəsilib, ağacın yuxarı hissəsi tac şəkilli saxlanmışdır. Həmin tacşəkilli çinarlar 7 ədəd idi, ikisi qalıb. Çinarların arxasında isə 9 ədəd tut ağacları əkilmişdi. Onların da sayı azalıb. 30—40-cı illərə qədər bulağın hər iki tərəfində sal daşlardan kirəclə işlənmiş pilləkənlər vardı. Pilləkənlərdən çıxandan sonra 200 $m^2$ çəmənlik sahə vardı. Çeşmədən 30-40 m yuxarıda balaca, şəffaf sulu göl vardı. Suyun ayağı dərəyə axırdı. Qalada olan qarnizon əsgərləri 1941-1944-cü illər ərzində ora daha çox gedib-gəlirdilər. Elə o zaman bulağın pilləkənləri dağıdılmışdır. İndi Taclıq bulağı ətrafına gedib dincəlirlər, ətraf gözəlliklərdən zövq alırlar. Qoruq bölgəsində bir çox həyətlərdə Taclıq bulağından su xətti çəkdirənlər də var.

**"MUSTAFA BƏYİN BAĞATLIĞI"** (antropo adonim) – Mustafa bəyin bağı və ya bağatlığı adı şəkililərin dilində fəxrlə səslənir. Dağ yaxasında yerləşən bu məkanı Mustafa bəy adlı ortabab bir ziyalı uzaqgörənliklə yaratmışdı. Bağın içində çiy kərpicdən kürsülü ənənəvi Şəki evi tikdirmişdi. Onu da deyək ki, hərtərəfli ziyalı olan Mustafa bəy bu bağatlığı salanda məhəllə sakinlərinin razılığını almışdır. Dağ yaxası çeşmələrdən birinin - Qaratoyuq bulağından həmin bağa su çəkdirmişdir.

Mustafa bəy Əlibəyov mütərəqqi fikirli, Peterburq təhsilli, rəiyyət tərəfdarı, mürvətli insan olub. O, rus əsarətinin əleyhdarı, müstəqilliyin qızğın tərəfdarıydı. Bu münasibətini açıq-aşkar bildirirdi. Həmin o bağ evində (digər evi isə Motor

aralığında olub) tez-tez mütərəqqi fikirli adamlarla gizli yığıncaqlar keçirirdi. Bir dəfə də Qadınlar klubunda rus əsarəti əleyhinə çıxış edərkən, satqınlar lazımi yerə tezcə xəbər çatdırırlar. Siyasi dustaq kimi 8 il Sibirdə həbs cəzasını çəkib, sonra qayıdıb gəlib.

Tanınmış hüquqşünas, xeyriyyəçi, ictimai xadim Mustafa bəy Əlibəyov Azərbaycanda ilk qadın dərgisi olan "İşıq" jurnalının naşiri, xanımı ömür-gün yoldaşı, tatar qızı Xədicə xanım isə redaktoru olmuşdur. Mustafa bəy Əlibəyov həm də "Nicat" Xeyriyyə Cəmiyyətinin fəallarından olub.

Bu yazdıqlarımız Mustafa bəy kimi mütərəqqi ziyalının həyatından, ailəsindən çox az şeydir. Çox təəssüf ki, onun qızı, Azərbaycanın tanınmış alimi, professor, respublikanın Əməkdar iqtisadçısı fəxri adını almış, Şərəf nişanı ordeni və müxtəlif medallara layiq görülmüş Əruziyə xanım Əlibəyovanı biz sağlığında görüb, müəyyən məlumatlar ala bilmədik.

Mustafa bəyin həmin bağatlığı yaxın keçmişdə, yəni sovet dönəmində qızı tərəfindən Şəki İpək Kombinatına satılmışdır. 600 manat həcmində pula satılan həmin bağatlığı iri ipək müəssisəsi uzun müddət fəhlələrin övladları üçün "Səadət" pioner düşərgəsi kimi istifadə etmişdir. İndi isə çox-çox təəssüf ki, hansısa şəxs tərəfindən fərdi, mövsümi kababxana kimi fəaliyyətdədir. Mustafa bəy sağ olsaydı, yəqin ki, o belə fəaliyyətə razı olmazdı, cibi üçün işləməzdi. Əksinə, həmin gözəl məkana gedib çıxmaq üçün camaatdan ötrü Qurcana çayın üzərindən möhkəm bir körpü tikdirərdi.

Şəhərimizin tanınmış ziyalılarından, ağsaqqal Abuzər müəllim bizə rəhmətlik Mustafa bəy haqqında aşağıdakıları söyləmişdi. 1937-ci ildə Azərbaycan Konstitusiya layihəsinin yerlərdə müzakirəsi zamanı Nuxada keçirilən müzakirədə iştirak edən Mustafa bəy belə bir təklif irəli sürür ki, SSRİ Konstitusiyasında belə bir maddə var ki, müttəfiq respublikalar istədikləri vaxtda SSRİ-nin tərkibindən çıxa bilərlər. Gəlin biz İttifaqın tərkibindən çıxıb, müstəqilliyimizə səs verək.



Yığıncaq qurtardıqdan sonra, camaat dağılışanda, Mustafa bəy faytona yaxınlaşmaq istəyəndə üç nəfər ona yaxınlaşıb, onu faytona yox, qara maşına mindirirlər. O gedən bir də gəlmir.

**"VƏZİRXAN TƏPƏLİYİ"** (oronim) – Şəki əhlinə çox doğma olan qədim bir yerdir. Vaxtı ilə Şəki xanlarından hansınınsa başına tac elə bu mənzərəli təpəlikdə təntənə ilə qoyulmuşdur. Ağızdan-ağıza əsrlər uzunu gəlib çatan, rəvayətləşən bu hadisəni həmişə fəxrlə danışırlar. Camaatın dediyinə görə, indi də uşaqlar orada oynayanda xırda sikkələr tapırlar.Görünür bura tarixin qədim çağlarından xəbər verən bir kurqandır.

Vəzirxan təpəliyi çox böyük qaya üstündə, dağ yaxasında yerləşən, çəmənli, ağaclı sahə olub. Uzun illər keçdikcə, qayaların aşınma süxurları tökülüb, bir qədər nahamvar görkəm alıb. Ətrafında olan meyvə ağacları əvvəlki kimi çoxluq təşkil etmir.

Vaxtı ilə 3 saylı zavodun sahibkarı Ter-Geverkovun (Derjavekovun – Dərgahyanın) inqilabdan qabaq kontor işçisi olmuş, ömrünün son illərində isə musiqi məktəbində (Qalada yerləşən zaman) zəng çalan işləmiş, Bazarbaşı məhəlləsinin sakini mərhum İdris dayı informatorumuz olan Həsənov Məmməd Rəsul oğluna belə söyləmişdir:

"Mayovka" bayramında (dünya zəhmətkeşlərinin həmrəylik günündə- 1 May) sahibkar zavodun fəhlələrinə bayram süfrəsi, konserti təşkil edərdi. Belə bayramları camaat həmişə Karvansara həyətində, Vəzirxan təpəliyində keçirməyi xoşlayardı.

Həmin bayramların biri yenə də Vəzirxan təpəliyində keçirilirdi. Tədbirdə "Rahab" muğamının mahir, əvəzedilməz ifaçısı Şəkili Ələsgər tarzən Əhməd bəy Tahirovun, kamança çalan erməni Musesin müşayiətilə oxuyurdu. O boyda millətdən səs-səmir çıxmırdı, ləzzətlə qulaq asırdıq. O, zəngulələri vurduqca uçub gələn bir bülbül onun başına fır-fır fırlanmağa başladı. Biz, dinləyənlərin çoxu, bunu görürdük. Bülbül sanki özünün qəlbyandıran avazını insan dilindən

eşidirdi. Bunu hiss edib görən Ələsgər zəngulәsini daha da heyrətedici səviyyədə vurdu. Bir anın içində yaxındakı ağaca qonan bülbül qəfildəncə yenidən uçub özünü Ələsgərin qulağı dibində olan qavala bərk çırpdı. Böyük xanəndənin ayaqları altına qəlbi alovlu bülbülün cəsədi düşdü.

Bu heyrətləndirici hadisə onsuz da zəngulələrdən qəhərlənmiş dinləyicilərin kimini ağlatdı, kimini heyrətə saldı, kimi əlləri göydə dodaqaltı Tanrı ilə səsləşdi. Bu möcüzəyə bənzər hadisə yaxın vaxtlarda dünyasını dəyişən qocaların qürurla danışdığı xatiratlardan idi. Həmin vaxtdan şənlik keçirilən yerə **"Bülbülatılan, Bülbülatan"**, camaata da bəzən **"Bülbülatanlar"** deyirlər.

Yaşlılar bu adı dedikcə, onlardan soruşub maraqlanan olduqca, mütləq şəkili Ələsgərlə bağlı həmin maraqlı hadisəni, müxtəlif xatirələri danışar, onun apardığı şingamlı toylardan söhbət açırlar. Unudulmaz "Rahab" ustadını cavan yaddaşlara əbədi həkk edirlər.

**"İSİTMƏ BULAĞI"** (hidronim) – adı və dadı ilə tanınan bu dağ yaxası çeşməsi Vəzirxan təpəliyindən bir qədər kənarda yerləşir. Təbiətin bəxş etdiyi bu çeşmə qışda isti, yayda sərin olur. Vaxtı ilə şəhərdə isitmə (malyariya) xəstəliyi yayılan vaxt loğmanlar camaata bu çeşmənin suyunda yuyunub, içməyi məsləhət biliblər. Deyilənlərə görə, həmin vaxtlar çox adam bu suyun kəramətilə xəstəlikdən yaxa qurtara bilib. Bulağa ad elə həmin vaxtlardan verilib. İndi də camaat həmin bulağın suyundan faydalanır.

**"HEYVALI DƏRƏ"** (fitooronim) – Taclıq, Qaratoyuq bulağından xeyli qabaqda dağ yaxasında olan mənzərəli, heyva ağacları, şabalıdı və çöl donuzu olan bir dərədir. Orada təzəlikcə yeni çeşmə qaynayıb. Bu çeşmənin suyu dərə boyu axıb Qurcanaçayına tökülür. Bir dəyirmanı işlədə biləcək içməli, duru, misilsiz su havayı axıb gedir. Həmin suyu qaynamadan dağın yaxası ilə borular vasitəsilə məhəllələrə, yaxud Yuxarı Başın su anbarına vermək olar. Ona heç bir motor lazım deyil, öz axınının sürətilə gəlib çıxa bilər. Sadəcə diqqət lazımdır.

Bu olmuşu gözlərilə görən Güləhli məhəlləsinin yaşlı sakini Rəsul müəllim yana-yana danışdı. El loğmanı olan Rəsul müəllim dağlarda, xüsusən də Xan yaylağı və onun ətrafında bitən dağ zəfəranından, ağ nərgizdən, onun və səhləbin kök yumrularının nə qədər faydalı olduğundan, camaatın marağının azlığından yana-yana danışdı.

**"GİLƏHLİ MƏSCİDİ"** (ekklezionim) – məhəllənin "dərə məhlə" adlanan hissəsində Qurcanaçayın sol yarğanı üstə tikilib. Qeyd etdiyimiz kimi, XVIII əsrin əvvəllərində Şəki xanı Hüseyn Xan Müştaq tərəfindən tikdirilmişdir. Məscid tikilən zamandan ta ki 1930-cu illərə qədər dərə məhlə adlanan hissədə çoxlu yaşayış evləri olan məskən olmuşdur. Qurcanaçayın illər uzunu güclü sel-suları tədricən ətrafı yuyub aparmış, evlərin çoxunu dağıtmışdır. Hətta camaatın dediyinə görə, həmin dərə məhəllədə yaşı bilinməyən qəbiristanlıq da vardı. Sel-sular dağıtdıqca, camaat qəbirlərdən çıxan sür-sümükləri yığıb qaydası ilə yenidən Yuxarı qəbiristanlıqda dəfn etmişlər.

Həmin dərə məhlədə yerləşən Güləhli məscidi demək olar ki, indi yarğanın yaxınlığındadır. Üç əsrdir ki, məhəllənin başı üzərində əzəmətlə ucalan minarə sanki özündən sonra sıralanan məhəllə evlərini "əmin-arxayın" edir ki, mən hər birinizi qoruyacam.

Vaxtı ilə məscid kimi fəaliyyətdə olan ev sovet dövründə bağça olmuş, sonralar isə şəxsi yaşayış evinə çevrilmişdir. Minarə də hazırda hasara alınmış həmin həyətin bir küncündədir.

Məscid həm də vaxtı ilə məhəllə mədrəsəsi idi. Uşaqlar əlifbanı, Quranı öyrənərdilər. Məhəllənin ən zəngin bəylərindən olan Hacı Hüseyn bəy Quranın xətmi, mədrəsəni bitirib, imtahan verilən günü mütləq orada olardı. Ən yaxşı sayılıb-seçilənlərə hədiyyə, pul mükafatı verərdi. Mədrəsənin müəllimi Güləhli məhəlləsinin "çay məhlə" adlanan hissə-

sindən, Dəyirmançılar soyundan olan Hacı Məhəmməd Əfəndi idi. O, dini təhsilini Türkiyədə almışdır.

Hacı Məhəmməd Əfəndi böyük nüfuz yiyəsi olan Hacı Hüseyn bəyin bu iltifatından həmişə məmnun olardı. Ondan ağız dolusu danışardı.

Giləhli məscidinin yerli materiallardan gilli-samanlı kərpic və çay daşlarından Şəkiyə məxsus ənənəvi üsullarla tikilib-bəzədilməsi bu tarixi abidənin qiymətini çox artırır. Bu abidənin memarlıq üslubundan Şəkiyə aid iki kitabda (Salamzadə Ə.R., Məmmədzadə K.M. "Şəkinin memarlıq abidələri" və Salamzadə Ə.R., İsmayılov M.Ə., Məmmədzadə K.M. - "Şəki") ətraflı məlumat verildiyi üçün təkrarlığa ehtiyac duymadıq. Sadəcə arzu edirik ki, memarlıq abidəsi yenidən öz funksiyasını yerinə yetirsin. Məhəllə camaatı əvvəlki təkin azan səsilə birgə yatıb-dursun, elə də çalışsın. Xüsusən də yeniyetmə cavanlar böyük Quranın kəramətini erkən yaşdan duyub anlasınlar.

Giləhli məhəlləsinin adlı soyları, onların tanınmış övladları günü bu gün də doğulduqları, böyüyüb pərvazlandıqları məkana şöhrət gətirirlər.

**"HACI HÜSEYN BƏYLƏR** (patronim) **VƏ ONLARIN MALİKANƏLƏRİ"** – hazırda uşaq xəstəxanası kimi fəaliyyət göstərən, hər bir şəkilinin "Dəmətdıx" deyə tanıdığı gözəl mülklərin sahibi Hacı İsmayıl bəy, oğlu Hacı Hüseyn bəy, onun oğlu Məmmədəli bəy olublar. Hacı İsmayıl bəyin sağlığında çarizmin hökmranlığına xidmət edən pristav və məmurlar evlərin bir hissəsinin müsəlman ab-havasını korladı. Oğlu Hacı Hüseyn bəyin zamanında qan rəngli hökumət ağlı və bacarığı ilə atadan qalan varın üstünə dövlət gətirən, Allahı və onun bəndələrini sevən kamil bir şəxsiyyəti quldur-kulak adıyla gedər-gəlməzlik etdilər. Mülkünü müsadirə edib, oğlu Məmmədəli bəyi iki körpəsi və xanımı ilə birgə bayıra atdılar.

Bir müddət qohumları Hacı bəygildə sığınacaq tapan Məmmədəli bəy və Səkinə xanım qonşu Səmədovlar soyundan



övladı olmayan qardaşın evini pul ilə aldılar. Səkinə xanım Həsənbəylər soyundan olan Həsən bəyin qızı Ballı xanımın qızıdır. Səkinə xanımın gəlini Tamara müəllimə qaynanasından eşitdiyi bir xatiratı da bizə söylədi: "Mən əlimdə yanar çıraq və ətirli çörəklə bu evə qədəm basanda bəs eşitdim ki, rus-alman müharibəsi qurtardı. Hökumətdən nə qədər yanıqlı olsam da, 45-ci ilin 9 mayı günü eşitdiyim bu xəbər məni bir az da fərəhləndirdi. Övladlarım Tərlanı və Məmmədi burada böyütdüm, qızım Almaz dünyaya gəldi. Təzə evimiz mənə gözəl xatiratlar vermiş doğma mülkümüzə çox yaxın idi. Bəzən saatlarla pəncərə önündə dayanıb o mülkə, içərisində və zəngin həyətində gəzən yadlara çox baxırdım. Gözəl milli geyimdə də, avropasayağı şlyapalı, yelpikli, sarafanlı paltarlarda, dabanlı çəkmələrdə faytondan qapı ağzında, gözəl balkonumuzun altında o qədər fərəhlə minib-düşərdim ki... Məmmədəli bəy həmişə özünü tox tutmağa çalışırdı. Amma çəkdiyini çəkirdi ...

Övladlarımızı böyütdük. Babaları Hüseyn bəyin familiyasını çətinliklərə baxmayaraq fəxrlə, qədirbilənliklə daşıdılar. Tərlan və Məmməd Hüseynbəyov qardaşları Bakıda ali təhsillərini başa vurub, doğma yurdlarında müəllim kimi fəaliyyətə başladılar. Tərlan müəllim ingilis dilinin, Məmməd müəllim fizika-riyaziyyat elminin incəliklərini şagirdlərə tədris etdilər. Həmişə təmənnasız, qəlb yanğısı ilə, candan-ciyərdən şagirdlərə dərs keçib, sevimli insana çevrildilər. Onların zəngin fəaliyyətindən Almaz Qeysər qızı adlı bir ziyalı xanım özünün "Mənəviyyatımızın memarları" kitabında ətraflı bəhs etmişdir.

Bacıları Almaz Hüseynbəyova da fizika-riyaziyyat sahəsində çalışan, tanınmış alimlərimizdən biri oldu. Dövlət Universitetində, Pedoqoji Universitetdə müəllimlik etmişdir. 26 elmi məqalənin müəllifi, çox saylı konfransların iştirakçısıdır. 1965-ci ildə bir aylıq Polşa Respublikasında elmi məzuniyyətdə olmuş, elmi məruzələrlə çıxış etmişdir. İki nəfər elmlər namizədi yetişdirmişdir. Əmək veteranıdır.

Adı, soyadı həmişə fəxarətli olan Hüseynbəyovlar soyunun bu günkü varəsələri də əsil-nəcabətinə uyğun, onun adına ləkə gətirməyən övladlardır.

**"XƏLFƏLƏR"** (patronim) – bu soydan olan Məmmədəli Əfəndi Xəlifəzadəni Şəkinin 50-60-cı illərdən ali təhsil alan ziyalı təbəqəsi daha yaxşı tanıyır. Azərbaycan Sənaye İnstitutunun müəllimi, elmlər namizədi Məmmədəli Əfəndi ömrü boyu türkçülük qayəsinin qoruyucusu olmuşdur. Vaxtilə Şəki Müsavat firqəsinin ilk sədri olmuş Məmmədəli Əfəndi təhsilini Sovet quruluşundan qabaq Türkiyədə almışdır. Elə təhsil aldığı illərdən yenicə yaranmağa başlayan, hələ rişə halında olan siyasi cəmiyyətlərin yığıncaqlarında iştirak etmək üçün onlara qoşulmuşdur. Bu vaxtlar Türkiyədə tez-tez eşitdiyi və sonralar Müsavat Firqəsinin proqram müqəddiməsinə çevrilən **"Türk millətindənəm, islam hümmətindənəm, qərb mədəniyyətindənəm"** sözləri onun ruhunu oxşamış, beyninə ömürlük həkk olunmuşdur. "Türk-Əzəm" firqəsinin fəal üzvü olan bu mütərəqqi fikirli şəxs Şəkiyə hərtərəfli biliyə malik kamil pedaqoq, həm də görkəmli təbliğatçı kimi püxtələşərək qayıtmışdır.

1916-1917-ci illərdə o, dəfələrlə Zəyzid-Küngüt, Göynük qəzasına gedib, müxtəlif yığıncaq və məclislərdə mahir natiq olduğunu göstərmişdir.

Xəlifəzadə öz prinsipləri uğrunda çalışan bir adam idi. O, bir çoxlarının Müsavat ancaq bəylərin, kübar nəsillərin, ziyalıların firqəsidir - fikrinə qarşı çıxırdı. Firqənin daha güclü olması üçün mütərəqqi fikirli sənətkarlar, tacirlər, fəhlələr, hətta rəncbərlər də bizimlə bir olmalıdır - fikrini irəli yürüdürdü. Məmmədəli Əfəndi "Türk-Əzəm" firqəsilə Müsavatın birləşdiyi andan Şəkidə ən görkəmli siyasi xadimlərdən biri olmuşdur.

Çalışdığı "Zəhmət-əmək" məktəbinin (keçmiş 5 saylı məktəb-lap qədimdə Molla məktəbi) pedaqoqlarının böyük əksəriyyəti Xəlifəzadənin yürütdüyü fikirləri fabriklərdə, ictimai yerlərdə, məclislərdə təbliğ edirdilər.



İstiqlalın qələbəsindən sonra Məmmədəli Əfəndi daha qızğın mübarizəyə girişir. Gah Gəncədə, gah Bakıda Məmməd Əmin Rəsulzadə ilə görüşən bu mübariz, açıq fikirli insan ordumuzun olmaması üzündən gənc demokratik respublikanın hansı çətinliklərlə uz-uzə dayanacağı barədə onun dediklərini Şəki müsavatçılarına çatdırırdı.

İstiqlalın qələbəsinin bir illik yubileyi günü - 1919-cu il mayın 28-də Şəkidə 1000 nəfərlik süvari dəstə yaradılmışdır. Və bu dəstədən 400 könüllü Zəngəzur mahalına erməni daşnaklarına qarşı döyüşə getmişdir.

1920-ci ilin aprelində XI Qırmızı ordu Şəki-Zaqatala bölgəsində qanlı qırğın törətdikdən sonra M.Xəlifəzadə iki il qaçaq kimi həyat sürmüş, dağlarda gizlənmişdir. Lakin 1925-ci ilin dekabr ayında tutulub qazamata salındı. Yüksək biliyə, bir neçə dildə təmiz danışmaq qabiliyyətinə malik olduğu üçün həbsdən azad edilmişdir. 1926-cı ildə üzə çıxmış Məmmədəli Əfəndi Azərbaycan Maarif Komissarlığında çalışmış, ömrünün sonunadək Azərbaycan Sənaye İnstitutunda (Neft və Kimya İnstitutu) rus dili kafedrasının müdiri olmuşdur. 1959-cu ildə dünyasını dəyişən Məmmədəli Əfəndi ölüncə o inamını itirmədi ki, qırmızı hökumətin ömrü uzun ola bilməz, gec-tez bu quruluş öz içindəncə çürüməyə başlayacaq.

Bu bilgilərlə bizi tanış etdiyi üçün şəhərimizin ziyalısı,millidəyərlərimizin təşəbbüskeşi olan Bəhram müəllim Lütvəli oğlunun və Xəlifəzadənin qohumu Ənvər Feyzullayevə çox minnətdarıq.

Tanınmış musiqişünas alim, həmyerlimiz, hazırda Rusiyada çalışan Faiq Çələbi bir maraqlı hadisəni bizə danışdı. O, bunu mərhum ziyalımız Baxşəli Əfəndinin dilindən yazıya almışdır. Ona da Məmmədəli Əfəndi söyləmişdir.

Böyük xanəndə Şəkili Ələsgər ömrünün qürub çağını yaşayanda ona ən çox qayğı göstərən, zəhmətini çəkən Məmmədəli Xəlifəzadə olmuşdur. Ayaqları da xəstə olan ustadı Məmmədəli Əfəndi hər gün gəzməyə çıxarırdı. Vaxtlı-vaxtında

onu hamama, dəlləyə aparırdı. Bir gün də gəzməyə gedəndə İsmailiyyə binasından (Akademiyanın Rəyasət Heyətinin binası) musiqi səsi eşidildi. Qulaq asmağa başladıq. Bir vaxt gördüm ki, Ələsgər üzünü yana tutub, əlini bığlarına, gözlərinə çəkir. Diqqətlə baxıb gördüm ki, gözlərinin yaşını silir. Bir söz deyə bilmədi. Maddım-maddım üzünə baxdım. O da mənə baxdı və bircə bunu dedi:- Şəkili Ələsgər oxuyur...

Bu kiçik hadisə böyük sənətkarın ömrünün qürub çağındakı kövrək duyğulardan xəbər verir. Bu hadisə böyük sənətkarın ölümündən bir il öncə olmuşdur. Gənc qızlarının ölümü ustadın xəstə qəddini bir qədər də əymişdir. 1929-cu il aprelin I-də böyük sənətkar dünyasını dəyişmiş, Bakıda qızları dəfn olunan yerdə Çəmbərəkənd qəbiristanlığında torpağa tapşırılmışdır. Məmmədəli Əfəndi onun yas mərasimini adına, özünə layiq keçirilməsi üçün əlindən gələni etmişdir. Bu kiçik hadisə Məmmədəli Əfəndinin eyni zamanda böyük insanlığı haqqında tam təsəvvür yaradır. Ona qəni-qəni rəhmətlər!

Məmmədəli Əfəndinin bacısı oğlu Ənvər Süleyman oğlu Feyzullayevlə söhbət zamanı həyətdəki hovuzun kənarında onun dayısı üçün iki ədəd büst düzəltdirdiyini gördük. Dayısının ruhuna böyük məhəbbət bəsləyən Ənvər dayı onlardan birini dayısının Güləhli qəbiristanlığında dəfn edildiyi yerdə qoymaq, digərini isə öz həyətində saxlamaq niyyətində olduğunu söylədi. Hələlik qəbiristanlığa ona görə aparmıram ki, hələ də düşüncəsi zəif olan nadinc uşaqlar çoxdu, büstün ağız-burnunu qopararlar. Qoy bir az da milli düşüncə tərzimiz cavanlarda, uşaqlarda möhkəmlənsin, sonra baxarıq. Bir də ki, mən artıq hər səhər duranda bu büstləri görməyə gözüm alışıb, onunla "salamlaşır, məsləhətləşir, dərdləşirəm". Mən dayımı nədənsə ölmüş hesab etmirəm. Onunla həmişə fəxr etmişəm. Dayımın ailəsi olsa da, övladı olmayıb, qardaşlarından biri Zahidin də övladı olmayıb. Vahid də Sovet hökuməti gələndə elə o vaxtdan Türkiyəyə keçdi. Başqa məlumatı yoxdu. Məmmədəli Əfəndinin çox zəngin kitabxanası vardı. Onun



yaxın tanışı, həmyerlimiz, dilçi-alim Əzəl Dəmirçizadə ən yaxşılarını seçib aparmışdı. Bir hissəsini də Əbdürrəhim Məmmədov seçib pul ilə Əlyazmalar İnstitutuna satmışdı. Üç şkaf kitabı da mən əziz xatirə kimi illər uzunu qoruyub saxlayıram.

**"AYAXYALINLAR SOYU"** (patronim) -Ziyalısı çox olan bu nəsil Giləhli məhəlləsinin sayınlı-seçimlilərindədir. Onların ulu babaları Hacı Qafar uzaqgörən, bacarıqlı, şöhrətli tacirlərdən biri idi. Nəvələri nəslin yaşlılarından eşitdiklərinə görə Hacı Qafarın 2 mərtəbəli axarlı-baxarlı mülkü daim qonaqlı-qaralı olub. Hazırda 150 il yaşı olan mülk bu gün də ənənəvi memarlıq baxımından qiymətlidir. Lakin çox təəssüf ki, mülkün bir hissəsi sökülmüşdür.

Atlı qövüm olan türksoya məxsus kökdən gəlmə bir gözəl duyğu Hacı Qafarda çox güclü idi. Belə ki, onun mindiyi ata böyük hörməti, istəyi vardı. Bir bəyzadə kimi saxladığı ata kişmiş və qara arpa yedirərdi. Hətta bu istək o dərəcədə olmuşdur ki, ata minəndə çəkmələrini çıxarıb xurcuna qoyardı ki, burnu, dabanı atın böyürlərinə toxunub ağrıtmasın. Onun ata olan bu istəyi, nəvazişi özü də hiss etmədən ona və ailəsinə " Ayaxyalinlar" ləqəbini gətirmişdir.

Hacı Qafar dəfələrlə Həccə getmiş, axırıncı gedişdə orada vəfat edib, dəfn olunmuşdur. Onun Əbdülcabbar, Yusif və İbrahim adlı oğlanları, Səltənət adlı qızı olub. Oğlanları atası kimi tacir olub. Bircə İbrahim Türkiyədə hərbi təhsil alıb, o da Sovet hakimiyyətinin gəldiyini bilib, tacirliklə məşğul olub. İbrahimin həyat yoldaşı qonşu Qədimbəyovlar soyundan Əbdürrəhman bəyin (Fuad Əbdürrəhmanovun ana babası) qızı Surə xanım idi. Bu izdivacdan onların Əkrəm, Firəngiz, Hacı və Ülkər adlı övladları dünyaya gəlib. Əkrəm Rəhimov texnika elmləri namizədidir, hazırda Politexnik Universitetində işləyir. Mərhum Hacı Rəhimov isə 1954-cü ildə MDU-nun aspiranturasında oxuyarkən liftdə baş verən bədbəxt hadisə nəticəsində vəfat edib. Mərhum H. Rəhimov akademik M.V.Keldışın

çox sevimli və ümid bəslədiyi aspirantlardan biri idi. Mərhum Firəngiz Abbasova APİ-də 1960-cı ildən 1992-ci ilədək fars dilindən dərs deyib. Ülkər Hüseynova isə Bakıda 132 saylı məktəbi gümüş medalla qurtardıqdan sonra ADU-nun jurnalistika fakultəsini 1960-cı ildə bitirib. Ülkər xanım uzun illərdir ki, "Elm və həyat" jurnalının əməkdaşıdır. Hazırda özünün məqalələr silsiləsindən ibarət "Elm və həyatın işığında" kitabını çapa verib, digər "Ana bətnindəki uşaq şəxsiyyətdir" kitabı üzərində işləyir.

Ülkər xanımın həyat yoldaşı hamımızın yaxşı tanıdığı Respublikanın Əməkdar Jurnalisti, M.Ə.Rəsulzadə adına BDU-nun professoru Şirməmməd Ağamməd oğlu Hüseynovdur. Ş. Hüseynov Şəkinin Gəncəli məhəlləsindən at alqı-satqı işi ilə məşğul olan Dəllal Hüseynin soyundandır. Anası isə Axund Fərəcullah Pişnamazzədənin bacısı qızı olub.

Bu soy barədə bizə ilkin məlumatları verən Sabit Əbdülcabbar oğlu Rəhimov və xanımı Azərbaycanın sənaye sahəsində uzun illər işləyən ilk mühəndis kadrlardan olub. Övladlarını pərvazlandıran bu iki savadlı, səmimi, xoş təsir bağışlayan qocalar ata-baba yurdunda yaşayırlar.

**"SƏMƏDOVLAR"** (patronim) – Giləhli məhəlləsinin tən ortasında gözəl, yaraşıqlı tikilişilə diqqəti cəlb edən 3 mərtəbəli bina var. Uzun illərin baxımsızlığı evin damının yararsız hala düşməyinə səbəb olub. Vaxt var idi həmin ev "Xozeyn Həmidin" evi kimi tanıdılırdı, indi isə "boş ev", "üstü dağılan" ev adıyla tanınır. Zamanın müxtəlif səmt küləkləri bu evin calı-cəlalına, əzəmətinə də xələl gətirdi.

Topladığımız damla-damla məlumatlara görə, Səmədov Həmid ata-babasından qalan bu mülkün varı üstünə var gətirən oğullardan olub. Onun Ağdaşda pambıq məntəqəsi var idi. Atası kimi xam ipək alqı-satqısı ilə də məşğul olub. Məhəllənin yaşlı qadınlarının dediyinə görə, indi də onların balkonaltı torpağını, anbarın torpağını qazsan xam ipəyin çürüntüsü çıxar. Xam ipək təbii və möhkəm olduğu üçün çox gec çürüyür.



Xozeyin Həmidin Sədər xanımla izdivacından Şirəli, Əbdüləli, Niyazi, Lütvəli və Şahid adlı oğulları olub. Onlar çox erkən vaxtlardan Şəkidən uzaqlaşıblar.

Şirəli Həmid oğlu k.t.e.doktoru olub.

Əbdüləli ali təhsilini Özbəkistanda alıb, Bakıda çörək zavodunun direktoru, Sumqayıtda alüminium zavodunun partiya komitəsi katibi, sonra isə direktoru vəzifəsində işləmişdir. Lütvəli və Şahid də alüminium zavodunda işləmişlər.

Səmədov Niyazi isə b.e.d., professor, Azərb.EA-nın müxbir üzvü.olmuşdur. Zoologiya İnstitutunun "Entimologiya" laboratoriyasının müdiri vəzifəsində çalışıb.

N.H.Səmədov 1989-cu ildə dünyasını dəyişmişdir.

70-ci illərdə evin Əbdüləli oğlu dövlət tərəfindən Şəhər maarif şöbəsinə satılmış (10 min manat dəyərilə) evi, yenidən pulu qaytarmaqla maarifdən geri almış, özünün və bacısı oğlu Süleymanın adına sənədləşdirmişdir. Özü də, bacısı da, dünyalarını dəyişdi, yerdə qalan gənc vərəsələr isə evə sahibliyi can yanğısıyla etmədilər.

60-cı illərdə ev bağça kimi fəaliyyət göstərəndə evin xanımı Sədər hələ sağ idi. Bağçada işləyən qonşu Həqiqətin dediyinə görə onun bir-birindən gözəl xalıları var idi ki, heç gücü də çatmırdı ki, çırpıb-təmizləsin. Biz onları təmizləyirdik. O da kip-kip, yorğan-döşək sayağı yük yerinə qatlayıb yığırdı.

**"HACIYEVLƏR"** (patronim) – (Hacı Osmanlar) – **"BALÇILAR"**- adını çəkdiyimiz bu soyu çox vaxt məşhur bəstəkarımız Cövdət Hacıyevin əmisi oğlu məşhur həkim Məmməd Hacıyevin də adıyla tanıyırlar.

Hacıyevlər soyuna məxsus ikimərtəbəli, böyük şüşəbəndli (əvvəlcə eyvan olub) çoxotaqlı bina 1885-ci ildə tikilmişdir. Ənənəvi Şəki qaydaları ilə tikilmiş bu bina indən belə də çox uzunömürlü ola bilər.

Mülkün təməli evin qızı və xanımı olan Şəfiqənin atası Hacı Osman tərəfindən qoyulub, tikilmişdir. Onun qardaşları

Cəbrayıl və İsmayıl da həmin binada yaşayırdılar. Hacı Osman qızı Şəfiqəni qardaşı oğlu Qasıma öz evində ərə verib. Qasım da, Məhəmməd də öz ali təhsillərini Krımda alıblar. Hər iki qardaş oradan tanınmış şəxslərin qızlarına evlənib. Məhəmməd Əminə bikəni, Qasım Tənzilə bikəni gətirib. Bu da həmin ərəfəydi ki, başıbəlalı Krım tatarlarını hökumət oradan deportasiya edirdi.Qasımın Tənzilə bikədən övladı olmadığı üçün əmisi qızı Şəfiqəni sonradan almışdır.

Məhəmməd Hacıyevin Əminədən Fövzi oğlu, Rəna və Fəhimə adlı qızları olmuşdur. Mərhum Fövzi endokrinoloq (zob üzrə), Fəhimə stamotoloq, mərhum Rəna isə rus dili müəllimi idilər. Mərhum Fövzi həkimin oğlu Cahangir Hacıyev isə Bakıda məsul vəzifədə çalışır.

Qasım kənd təsərrüfatı mütəxəssisi olduğu üçün arıçılığa çox meyilli idi. Onun arıçılığa aid rus dilində olan kitabları günü bu gün də arıçılıqla məşğul olan oğlu mühəndis Əhməd-Rişad tərəfindən qorunub saxlanır. O da atası kimi arıçılıqla məşğuldur. Balçı Qasım yaşlı vaxtlarında Oxud kolxozunda mühasib işləyib. Balçı Qasımın qızları Roza və Tamara da ziyalı xanımlar olub.

Hacıyev Əhməd – Cövdət İsmayıl oğlu isə üç il Azərbaycan Dövlət Konservatoriyasında oxuyandan sonra təhsilinin ardını 1941-ci ildən 1947-ci ilə qədər Moskva Konservatoriyasında davam etdirmişdir. Xalqımız onu milli simfoniyamızın yaradıcılarından biri kimi tanıyır. O, 7 simfoniya yazmışdır. C.Hacıyevin Azərbaycan musiqi mədəniyyətinin inkişafında və təbliğindəki xidmətləri yüksək qiymətləndirilmişdir. Sovet dönəminin orden, medalları ilə yanaşı o, müstəqil Azərbaycanın da ən ali mükafatına – Şöhrət ordeninə layiq görülmüşdür.

Azərbaycan Dövlət Konservatoriyasında uzun illər dərs deyən, rektor olan C.Hacıyev 2002-ci ildə dünyasını dəyişmişdir.



C.Hacıyevin qızı Nərmin Amerikada yaşayır. Xanımı, tanınmış incəsənət xadimi Əminə Dilbazi ömrünün ixtiyar çağlarını yaşayır.

Cövdət Hacıyevin xanımı tək şəkililərin yox, bütün Azərbaycan xalqının çox sevdiyi, sənətinə pərəstiş etdiyi incəsənət xadimidir. Dünya şöhrətli rəqqasə, baletmeyster və pedaqoq olan Əminə Dilbazi rəqqasəlik fəaliyyətinə 1935-ci ildən başlamışdır. Azərbaycanın bütün bölgələrinə xas olan qədim milli rəqslərin gözəl bilicisi və ifaçısı olan bu xanım dünyanın hər yerində incəsənətimizin bu növünü təbliğ etmişdir.

Fəaliyyətinin ən məhsuldar dövrü sovet quruluşu zamanında olan Əminə xanım Azərbaycanın bütün bölgələrini birbəbir gəzərək qədim rəqs elementlərini öyrənmiş, onların itib-sıradan çıxmaması üçün böyük zəhmət çəkmişdir. Onun oynadığı "İnnabı", "Turacı", "Tərəkəmə", "Vağzalı", "Mirzəyi", "Naz eləmə" rəqsləri məhz bu qəbildəndir.

Ağbirçək əməkdaşımız, sənətşünaslıq elmləri namizədi, əməkdar memar Nərgiz Saleh qızının söylədiyinə görə, Bakıdan Şəkiyə gələrkən Əminə xanımın əri Cövdət Hacıyevlə yol yoldaşı olmuşdur. Hərtərəfli, intellektual söhbətləri zamanı Cövdət Hacıyev deyib ki, Əminə xanım fəaliyyətinin erkən vaxtlarında çox sevdiyi Şəki rəqslərinin elementlərindən geniş istifadə etmişdir. O, həmişə Şəki rəqslərinin zənginliyinə heyran olmuş və çox şey görüb-götürmüşdür.

Şəkinin məşhur zorxana rəqsi (şəkililər bu rəqsə çox vaxt "zopı-zopı", "zincir toxmaq" deyirlər) kişi rəqsi olsa da, Əminə xanım onu çox yüksək qiymətləndirərdi. Xüsusən də bu oyun da şəkililərin qədimdən üzü bəri saxladıqları bir ənənəsini daha çox dəyərləndirərdi. Belə ki, Şəkidə zorxana güləşi zamanı rəqibin kürəyini yerə vurmağa icazə verilmirdi. Bu güləşçinin mənliyinə xələl gətirərdi. Buna görə də kim ki, öz rəqibini başı üstünə qaldırıb fırladaraq yerə qoyurdu, o, qalib sayılırdı. Bu cür ləyaqətli güləş çox zaman zarafat və gülüşlərlə zəngin olur

və belə sonluqla da qurtarardı. Çox variantlı Şəki zorxanasından bu bir elementdir.

Əminə Dilbazi rəqslərini milli elementlərlə zənginləşdirərək Azərbaycanın məhz çinarboylu şümal qızlarından ibarət məşhur "Çinar" rəqs ansamblını yaratdı. Bu ansambl o zamanlar mövcud olan Rusiyanın məşhur "Bereza" ansamblından heç də geri qalmırdı. Biri Azərbaycanın Xan çinarını, digəri isə rus ağcaqayınını özlərinə rəmz seçmişlər.

Dünyanın adlı-sanlı konsert salonlarında çıxış edən "Çinar" ansamblı uzun illər Azərbaycana şöhrət gətirdi. Moskvada 1957-ci ildə tələbə və gənclərin 6-cı Ümumdünya festivalında qızıl medala layiq görülmüşdü.

Əminə xanım həmçinin Azərbaycan Dövlət Filarmoniyasında "Sevinc" qızlar ansamblını da yaratmışdır.

O, həmçinin Şimali Osetiyanın "Alan" rəqs ansamblı və Çeçen-inquş Dövlət Milli Ansamblında bir çox rəqslərin quruluşunu vermişdir. Böyük sənətkarımız Ü.Hacıbəyovun musiqi komediyalarında "O olmasın, bu olsun", "Arşın mal alan", "Leyli və Məcnun" operasında rəqslərin quruluşunu vermişdir. Ə.Dilbazinin repertuarında rus, Ukrayna, özbək, ərəb rəqsləri də olmuşdur. Dövlətimiz qədirbilənliklə onun zəhmətini qiymətləndirmiş, Xalq artisti kimi fəxri ada layiq görmüş, Şərəf nişanı ordeni, medallarla təltif etmişdir. Əminə xanım ömrünün ixtiyar çağında yaşamağına baxmayaraq, yenə də Dövlət Filarmoniyası Mahnı və rəqs ansamblında və Bakı Xoreoqrafiya Məktəbində pedoqoji fəaliyyətini davam etdirir.

C.Hacıyevin bacısı Sürayya Hacıyeva 1928-ci ildə Azərbaycan Dövlət Universitetinin tibb fakultəsini qurtarıb. Bir il Şəkidə işlədikdən sonra 1929-cu ildə Azərbaycan Ana və Uşaqları Mühafizə İnstitutunda statistika şöbəsinə müdir təyin olunub və həmin İnstitutda direktorluğa qədər yüksəlib. Bakı şəhərində raxit xəstəliyinin yayılmasından namizədlik dissertasiyası müdafiə edən S.Hacıyeva doktorluq dissertasiyasını isə isti iqlim şəraitində uşaqlarda dizinteriya xəstəliyinin öyrənilməsinə həsr etmişdir. O, 1963-1970-ci illərdə Azərbaycan Tibb İnstitutunun pediatriya kafedrasına rəhbərlik etmişdir. S.Hacıyeva respublikanın Əməkdar həkimi adına layiq görülmüş, Şərəf ordeni, medallarla təltif olunmuşdur. Təqaüddə olan vaxtlarını Sürəyya Hacıyeva Moskvada yaşamışdır. Onun əri Mustafa Əfəndizadə Azərbaycanın görkəmli tibb alimlərindən biri olmuşdur. M.Əfəndizadə artıq oxuculara yaxından tanış olan məşhur Xalisəqarızadələr soyundandır.

Onların oğlu Cahangir Əfəndizadə tarix elmləri namizədidir, bir vaxtlar Moskvadakı Dekabristlər muzeyinin direktoru olmuşdur. Hazırda atası ilə Kanadada yaşayır. Sürəyya xanım Moskvada dəfn edilmişdir.

Bu soyun Ənvər adlı bir oğlu 37-ci ilin repressiya qurbanı olub. Arxangelsk vilayətində sürgündə olarkən Şura adlı rusla evlənib. Qeyri-dəqiq məlumata görə, onların uşaqlarından biri Tver quberniyasında rayon qəzetinin redaktorudur.

Hacıyev Məmməd Cəbrayıl oğlu (1885-1955) 1916-cı ildə Odessa Universitetinin tibb fakültəsini qurtarmışdır. 10 il Kerç şəhərində xəstəxananın baş həkimi işləmişdir. Sonra isə ömrünün sonuna kimi Şəki şəhəri rayonlararası Mərkəzi Xəstəxananın baş həkimi olmuşdur. O, Azərbaycanın "əməkdar həkimi", "əmək qəhrəmanı" kimi fəxri adlara layiq görülmüşdür. Hazırda Şəki şəhər xəstəxanası onun adını daşıyır. Giriş qapısı qabağında fədakar həkimin fəxri yarımbüstü də qoyulmuşdur.

**"HACIALPAŞALAR"** (patronim) – bu nəsil Hacıyevlər soyu ilə qonşudurlar. Güləhli məhəlləsinin ziyalı soyudur. Ulu babaları Hacı Alı Paşa məşhur çuxa tikən ustakar adam olub. Onun tikdiyi çuxanın sifarişləri və satış yeri təkcə Şəki və Azərbaycanın şəhərləri yox, həm də Tiflis, Türkiyə, İran olub. Hacı Alı Paşa bu əziyyətilə imkan yiyəsi olub, xüsusi çuxa sexi açmışdır. Sexin sahibi olmuş, çoxlu usta və şəyirdləri dolandırmışdır. Özündən sonra oğlu Məhəmməd bu işi davam

etdirmişdir. Güləhli məhəlləsinin Çay məhlə deyilən hissədə onların sexi yerləşirdi.

Məhəmmədin övladları və nəvələri quruluş dəyişdiyindən bu sənəti davam etdirməmiş, ali təhsilli mütəxəssis olmuşlar.

Oğlu Şirəli müəllim 20-30-cu illərin öndər müəllimlərindən biri olub. 1 saylı məktəb Hacı Hüseyin bəyin mülkündə yerləşəndə ("dom otdıxda") Şirəli müəllim məktəbin müdiri olub. Əli və Həmid isə ali təhsilli mühəndisdirlər.

Şirəli müəllimin oğlu Oktay ingilis dili müəllimi, qızları Xoşbəxt Layihə İnstitutunda mühəndis-konstruktor, Maral Tikinti Nazirliyinin əməkdaşı, Səltənət isə həkimdir. Digər oğlu İlham t.e.n., Politexnik İnstitutunun müəllimidir. Məmməd isə sürücüdür.

**"NAĞIBƏYOVLAR VƏ QƏDİMBƏYOVLAR"** (patronim) – Giləhli məhəlləsində yaşayan, həm də yaxın qohum olan iri nəsillərdəndir. Bu soydan təəssübkeş varislərinin köməyi ilə xeyli dəyərli məlumatlar topladıq. Tiflisdə və Gəncədə (Yelizavetpolda) təsdiq olunan bəzi sənədlər də əldə edə bildik.

Nağıbəyovlar soyunun ulu babası Əbdürrəhman Ağa Nağıbəyov çox imkanlı şəxs idi. Onun Həbibə xanım adlı 1 qızı, 2 oğlu olub. Onlardan Məmmədtağı tacir, Hacıbala bəy isə həkim idi. Haqqında danışdığımız "Ayaxyalınlar" soyundan Hacı Qafarın qızı Səltənət xanım onun ikinci həyat yoldaşı idi. Səltənət xanım özü də birinci ərindən olan Minaxanım adlı qızı ilə ona ərə gəlmişdi.

Professor Ş.Hüseynov "Şəkili Hacıbala bəyin vəsiyyəti" adlı məqaləsini yerli qəzetdə (28 avqust 1992-ci il sayında) çap etdirmişdir. Məqalədə deyilir: "Hacıbala bəy" əvvəl rus-müsəlman məktəbində oxumuş, sonra tibbi təhsil almışdır. O, Qafqazın müxtəlif şəhərlərində, bir müddət isə İranda işləmişdir. Onun Rusiya, İran və bir sıra xarici banklarda xeyli pulu, həmçinin mülkləri var idi. Qohumlarından başqa varisi olmayan, səhhəti zəif olan Hacıbala bəy Piyatiqorsk şəhərinə müalicəyə getmişdir. Elə orada onun notarial ruhi vəsiyyəti şahidlərin iştirakı ilə 1916-cı il iyunun 3-də rəsmi şəkildə tərtib və təsdiq edilmişdir. Vəsiyyətdə varidatının müəyyən hissəsini qohumlarına ayırmış, bir hissəsini isə xalq üçün xeyriyyə məqsədi ilə ayrılmasına sərəncam vermişdir. Belə ki, özünün doğma Giləhli məhəlləsi məscidinə 3 min manat, məhəllə qəbiristanlığının abadlaşdırılmasına, yolunun təmiri və mühafizəsinə, həmçinin babaları Hacıağı bəyin adına olan bulağın saxlanmasına 6 min manat ayırmışdır.

Maarif və mədəniyyətin, milli tərəqqinin fədailərindən olan Hacıbala bəy kapitalının böyük bir qismini bütün Azərbaycan üçün fəaliyyət göstərən M.Ə.Rəsulzadənin başçılıq etdiyi "Nicat" Xeyriyyə Cəmiyyətinə vəsiyyət edirdi. Həm də göstərirdi ki, onun verdiyi vəsait ibtidai, orta və ali məktəblərdə yetim və imkansız müsəlman balalarının təqaüdünə xərclənsin. Rəhmətini sağlığında qazanan Hacıbala bəyin bu vətənpərvərliyi, əsl ziyalı əqidəsi, uzaqgörənliyi hər nəsil üçün ibrət götürülməli nümunədir.

Hacıbala bəyin Həbibə adlı bacısı qonşu Qədimbəyovlar soyundan olan Əbdürəhman bəyin xanımı olub. Əbdürəhman bəy rus, türk, fars dillərində danışmağı bacaran, milli dəyərləri, tarixi gözəl bilən, dövrünün mütərəqqi fikirli bir adamı idi. Bəy Nuru Paşa ilə yaxın münasibətdə olub. 1905-ci ildə türk ordusu tərəfində Şəkinin Səbətli kəndində olan erməni-müsəlman davasının fəal iştirakçısı olub.

Saydığımız səbəblərə görə 1914-cü ildə hansısa bir ölüm günahını süni şəkildə onun adına yazaraq həbs edirlər. Tiflisdəki həbsi dövründə o, özünün sahibi olduğu torpaq, əkin, meşə, kanal, dəyirman və s. malikanələri ilə birlikdə dövlət (Tiflisdə yerləşən) məhkəmə palatasının təsdiq etdiyi sənədə əsasən qardaşları Hacı bəyin, Hacıağa bəyin adına keçirir (görünür, həbsdən qurtarmaq ümidi az imiş).

Biz varislərin - Qətibə müəlliməni, qardaşı oğlu Cavidin köməyi ilə həmin sənədləri əldə etdik. Bu sənəddə olan bir

özəllik də bizim diqqətimizi cəlb etdi. Bəy özünəməxsus sahələri göstərdikcə, qonşuluğunda olan digər yerlərin də kimə məxsusluğunu adbaad dəqiq göstərmişdir. Əbdürəhman bəyi həbsdən bacısı Dələmə xanımın əri Hacı Cəlil Ağa qurtarmışdır. Biz Hacı Cəlil Ağadan (Qozdağarlardan) məlumat verəndə onun qaynı Əbdürəhman bəydən ötrü Tiflisə gedib, yaxşı sonluqla qayıtdığını yazmışdıq.

Əbdürəhman bəyin birinci xanımı Həbibədən 6 qızı və 1 oğlu olub. Bəy oğul evladından ötrü ikinci xanımla evlənir. Lakin tanrının köməkliyi ilə elə bir iş olur ki, Həbibə xanımla bəyin ikinci xanımı eyni gündə ana olurlar. Həbibə xanım 6 qızdan sonra 1 oğlu, təzə xanımın isə 1 qızı olur. Oğlunun doğulması münasibətilə bəy mamaça Tık-tık Səyyarəyə ( təzə çıxan dabanlı ayaqqabı geyindiyi üçün) 5 imperial qızıl pul verir. Bütün ailə Əliosman adlı bu oğlan, uşağını çox sevirdi. Bəy isə uzun müddət həsrətində olduğu oğul balasını gözündən kənara qoymurdur. Hətta tez-tez getdiyi ova da balaca Əliosmanı aparırdı (şəkildə göründüyü kimi). Ata da, ana da Əliosmanı hərtərəfli ziyalı kimi görmək istəyirdi. Lakin oğlanın yeniyetmə yaşlarında valideynləri vəfat edir. Əliosman bacısının himayəsində yaşayır.

Əbdürrəhim bəyin qardaşı Qədim bəy Qədimbəyli də dövrünün ziyalılarından olmuşdur. O, 37-ci ildə Aşqabad şəhərində namizədlik dissertasiyası müdafiəsini qurtarıb qayıdanda təyyarəyə minərkən vəfat edib. Qədim bəyin 3 oğlu - Qədim, Mustafa, Abdulla Qədimbəyovlar da ali təhsilli ziyalılar olub. Məhz bu səbəbdən onlar anaları ilə birgə sürgün əzabını çəkiblər. Sürgündən qayıtdıqdan sonra Qədim Qədim bəy oğlu Politexnik İnstitutunda dosent, Mustafa müəllim Tibb İnstitutunda işləmişlər. Onlar dünyalarını dəyişmişlər. Abdulla müəllim isə APİ-də dərs deyir.

Əbdürrəhim bəyin Böyükxanım adlı qızı görkəmli heykəltəraşımız mərhum Fuad Əbdürrəhmanovun anası olub. Ə.Fuadın bacısı Fəridə xanım məşhur memar Salamzadələr soyuna ərə



getmişdir. Repressiya qurbanı olub. Qızı tanınmış memar-arxitektor Avrora (Güzidə) Salamzadə bu baxımdan çox əziyyətlər çəkib. Mərhum dünyasını bu yaxınlarda dəyişib. Bəyin digər qızı Səfurə xanım isə İsmayıl bəy Qutqaşınlı soyuna ərə gedib. Ruqiyyə xanım həkimdir. Böyük şairimiz S.Vurğunun qardaşı mərhum Mehdixan Vəkilovun həyat yoldaşıdır. Ruqiyyə xanım hazırda ömrünün ixtiyar çağlarını yaşayır.

Əbdürrəhman bəyin oğlu Əliosman mərhum ata-anasının arzuladığı kimi elmə-təhsilə böyük həvəs hissi ilə yaşayırdı. Həyatı haqqında maraqlanıb bildiyi Mirzə Kazım bəyə olan məhəbbəti onu Kazan Universitetinə gətirir. Oranın "Fizika-riyaziyyat" fakültəsində təhsil alır. Qurtardıqdan sonra bir müddət Kazanda müəllimlik edir, çox qabiliyyətli pedoqoq kimi tanınır. Ona "Zərbəçi Müəllim" fəxri adı verilir.

Elmə olan sonsuz marağı onu daha bir ali məktəbə- Orta Asiyaya-Daşkənd Dövlət Universitetinə aparır. Oranın kimya fakültəsinə qəbul olunur. Yüksək və hərtərəfli ixtisaslı mütəxəssis kimi Azərbaycana qayıdır. Bir müddət Neft Akademiyasında müəllim işləyir. Doğma yurdu Şəkidə onun tərəqqisi üçün daha çox lazım olduğunu düşünən böyük qəlb yiyəsi, vətənpərvər insan Əliosman Qədimov İpək Kombinatında işləməyə başlamışdır. 1950-ci ildən isə sırf müəllimlik fəaliyyətini davam etdirmişdir. Şəki Pedaqoji Məktəbində, 8 saylı rus məktəbində səmərəli təlim-tərbiyə formalarından, üsullarından istifadə edərək nüfuzlu müəllim adına bir daha nail oldu. Çox təəssüf ki, ömrünün 51-ci ilində həyatla vidalaşan bu böyük insanın çox istəkləri yarımçıq qaldı.

Onun xatirəsini əziz tutan sevimli övladları Qətibə və Eldəniz ataları kimi müəllim olmağa çalışırlar. Xüsusən də 2 saylı məktəbin müəlliməsi olan Qətibə xanımın nüfuzlu pedoqoq olduğunu çoxları qeyd etdi. Fizik olmağına baxmayaraq, ədəbiyyat və tariximizin gözəl də bilicisidir.Oğlu Eldəniz müəllim atasının çox sevdiyi qədim arıçılıq sənəti ilə də məşğuldur.

Əliosman müəllimin uşaqlarının anası təcrübəli tibb bacısı Dilbər xanım Gəncəli məhəlləsinin Kərbəlayi Nəbilər soyundandır. Onun bacısı mərhum Cəvahir Rzaqulu qızı Abbasova Şəki-Zaqatala bölgəsi üzrə baş nevropatoloq idi. C.Abbasova Şəki Tibb Məktəbini və ATİ-ni qurtardıqdan sonra 1942-1946-cı ilə qədər orduda xidmət etmişdir. Gənc həkim kimi Şimali Qafqaz və Uzaq Şərqi Sibirdə tibb-sanitar batalyonlarında, hərbi səhra qospitallarında cərrah kimi fəaliyyət göstərmişdir. Müharibədən sonra Şəki təcili yardım stansiyasında, şəhər poliklinikasında baş həkim olmuş, 1967-1988-ci illərdə Şəki Birləşmiş xəstəxanasının Əsəb xəstəlikləri şöbəsinə rəhbərlik etmişdir. Həmin şöbənin təşkilatçısı da elə Cəvahir xanım olmuşdur. Mərhum Cəvahir xanım fəaliyyəti dövründə Qırmızı Əmək Bayrağı, Vətən Müharibəsi ordenləri, 13 medalla təltif edilmişdir.

Əbdürrəhman bəyin qardaşı Hacı bəyin mülkü şəhərin "Motor aralığı" deyilən iç məhəlləsindədir. Mülk olduqca əzəmətli, ənənəvi görkəmdədir. Çoxsaylı otaqları olan mülkün bir neçə gözünün (iri zalların) iç tamamlanma işləri sovetləşmə dövründən bu günəcən yarımçıq qaldı. Çünki olub qalan varidat dövlət tərəfindən mənisınsənildi. 1919-cu ildə mülkdə bolşevik əsgərləri yerləşdirilmişdir.

Hacı bəyin qızı Minaxanım Qədimbəyova Şəkidə hamının gözəl insan, qabiliyyətli pedoqoq kimi tanıdığı Seyfullah Hüseynova (Seyfi müəllim) ərə gedir. Çoxuşaqlı ailə elə Hacı bəyin mülkündə yaşayır. Seyfi müəllim əvvəl Pedoqoji Texnikumda, 10 saylı məktəbdə, sonra Bakı məktəblərinin birində direktor olub. Onu da tutlıatut dövründə ziyalılığına, milli ruhuna görə Bakıda iki il türmədə saxlayırlar. Xoşbəxtlikdən bu xalq müəllimi 2 ildən sonra bəraət alıb, salamat qala bilir. Sonralar Seyfi müəllim pedoqoq kimi dövrünün çox təltifləri ilə yanaşı, adlı Lenin ordeninə də layiq görülmüşdür. Seyfi müəllim 1966-cı ildə dünyasını dəyişmişdir. Onun övladlarının hamısı ali təhsillidir. Rus dilində təhsil alan oğlu



Akif həkim xalq arasında yaxşı tanınan dermatoloq-vineroloqdur. 1974-cü ildən Şəki Dəri-Zöhrəvi dispanserində şöbə müdiri, indi isə müdir müavini işləyir. Müalicə vasitələrində qədim xalq təbabəti üsullarından istifadə edir. Bu sahə üzrə onun 1974-cü ildə "Tibb" jurnalında, 1976-cı ildə Moskvanın "Vestnik dermotoloqii i vineroloqii" dərgisində, respublikanın "Üzbə-üz" qəzetinin 3-9 fevral 2003 sayında, "Məqam" qəzetinin 3-9 noyabr 1999 sayında, "Şəki" qəzetinin müxtəlif sayında məqsədyönlü məqalələri çap olunub. Həkimin vaxtaşırı sadə xalqın anladığı dildə yazdığı təbliğati materialları evlərdə qəzetlərdən kəsib kitabça halına salanların sayı çoxdur. Onlar həmişə yerli qəzetdə onun məqalələrini axtarırlar. Akif həkimin müasir texnikanı gözəl bilən oğlu Rəfael həmçinin mobil telefonların təmiri işilə məşğuldur.

**"NADİR PƏHLƏVANLAR SOYU"** (patronim)- Nadir Əbdülhüseyn oğlu Vahabov dağ havasından, çeşmə sularından, ləziz Şəki təamlarından faydalanıb ətə-qana dolan, sümüyü bərkiyən bir el igidi olub. Böyüyün, kiçiyin yerini bilən, sözünün, hərəkətinin yiyəsi olan, elinə yarayan, qabağından yeməyən, basdığın kəsməyən bu cüssəli pəhləvanın işıqlı xatirəsi çoxlarının yaddaşında yaşayır.

Ab-havamızın korlanmayan, din-imanımızın çapılmayan, var-karımızın talanmayan, doğma dilimizin, yazımızın çalpaşıq düşməyən zamanının birində belə xəbər çıxır: - Gəncəbasar elindən Şəki elinə bəs özünə güvənən bir pəhləvan gəlib ki, hünəri olanınız varsa qabağıma çıxsın. Yoxsa, bu yekə tabağı qızıl ilə doldurun çıxım gedim.

Nadirə xəbər gətirirlər ki, harda qalmısan, kənardan gəlib sinəsinə döyənin biri bizdən bac istəyir. Yetiş dadımıza, göstər hünərini ona...

Gəlmə pəhləvan dizlərinə güzgü, dirsəklərinə qırmızı lent bağlayıb, bədəninə yağ sürtüb parıltılı və sürüşkən etmişdi ki, xofu olsun, qabağındakının gözünün odunu alsın. Nadirin eyninə də deyildi. Qabağındakının düz gözlərinin içinə baxıb,

ondakı şəkk-şübhəni də duyur. Pəhləvanın yanındakı yançıya əl verib görüşən Nadir pəhləvan onun əlini elə sıxdı ki, yançı payını alıb, gəlmə pəhləvanı duyuq salmaq istədi, əlvermə desin. Artıq gec idi. Nadir pəhləvan gözqırpımı bir fəndlə onu bir götürümə başı üzərinə qaldırdı, dövrə vurub yerə qoydu. Sonra bir də götürüb başı üzərinə qaldırdı və camaata dedi: onu dərədən çaya atım, yoxsa buraxım, getsin. Camaat yer-yerdən deyir ki, burax getsin elinə, ailəsinə, çaya atmağın nə xeyri. Nətəri olsa onun da gözləyənləri var. Qoy gedib gəldiyi yerdə danışsın ki, bəs papaq altda belə oğullar varmış.

Nadir pəhləvanla bağlı ikinci bir əhvalat da həmin soyun vərəsələrindən biri olan Rəsul müəllim belə söylədi: Nadirin cavan, subay bacısı qəfil rəhmətə getmişdi. Yuyulub, kəfənlənmiş meyit cənazəyə qoyuldu. Qapıdan çıxmamış selləmə yağış töküldü. Sanki təbiət də bu cavanın ölümünə hönkürlədi. Meyit namazı qılınan, cəsəd dini qaydalarımıza görə həmən qapıdan çıxarılıb gor evinə, torpağa tapşırlanmalıdı.

Camaat da, molla da hamısı tələm-tələsik evlərə doluşdular. Nadir pəhləvan qəzəblənib soruşur ki, bəyəm siz bilmirsiniz ki, cənazə haqq yerinə gedib çatmalıdır?.

Gur yağışda cənazəni qoltuğuna vurub, qapıdan çıxır. Dərddən qeyzlənib daha da qüvvəyə gələn Nadir pəhləvan Qurcana çayın selləməsindən cənazəni başı üzərinə qaldırıb keçirir. Onu torpağa qaydası ilə tapşırıb gəlir. Evdəkilər deyir ki, ay Nadir, bəs belə də olmazdı axı? Nadir pəhləvan cavab verir ki, Siz dərdə şərik olmağa gəlmisiz, yasa gələnin niyyəti bundan artıq olmaz. İndi durun, çıxın gedin.

Nadir pəhləvanın Çay məhləsi tərəfdə Vəzirxan təpəliyinə yaxın yerdə gözəl bir bağatlığı varmış. Bütün meyvə ağacları ilə yanaşı, onun 20 ağac da qozu vardı. Qoz ağaclarının da hərəsi bir növdə idi. Nadirin həmin bağatlığı söylənilənə görə Şəki bölgəsinə aid meyvə növlərinin açıq səma altında olan muzeyi kimi idi. Özünün Güləhli məhəlləsi camaatına bu bağatlıqdan pay-pürüşü də həmişə yer-yerində



olardı. Onun səxavəti də vardı. Həm səxavətinə görə, həm də onun qorxusundan bağatlığına heç oğul-uşaq da girməzdi.

Nadir pəhləvan 8 otaqlı, çox da böyük olmayan, içi dolu olan evi var idi. Gözəl-gözəl xalıları vardı. Onun iki göz tamaşa edəsi ipək xalısı var idi. Nadir 2 pud (32 kq) quyruğu alıb evdəkilərə verər ki, əridib küpələrə qaydası ilə doldursunlar. Ehtiyatsizlıq edənlər evdə tez alışıb yanan yağa diqqətsiz olmuş, yanğından ev-eşiyin çox hissəsi yanmışdır. Çiçək kimi xalılar, gözəl yorğan-döşəklər külə dönmüşdü.

İndiki yurd sonradan bərpa olunmuş yurddur ki, o da əvvəlkinə tay ola bilməzdi.

Nadir pəhləvanın iki oğlu - Vahab və İsmayıl Peterburq gimnaziyasını oxuyub, gəlmişlər. Gözəl xarici görkəmi, gözəl danışığı, tərbiyəsi və biliyi olan Vahab çox bəxtsiz olur. Eşidilib söylənilənə görə paxılları çox olub, onun yeməyinə zəhər qatıb öldürüblər.

İsmayıl Vahabov isə Şəkidə uzun müddət Hüseyn Qazi Əfəndi, Hacı Mabud Əfəndi ilə çiyin-çiyinə müəllimlik edib.

Digər oğlu Zəkəriyyə isə ipəkçi fəhlə olub. Sonradan dəmirçilik sənətini öyrənib.

Hazırda yurdda yaşayan nəvə-nəticələridir.

Rəsul müəllim Şəkinin kəndlərində 25 il rus dili müəllimi işləyib. Ondan da qabaq 21 il ipəkçi fəhlə olub, dəmirçilik edib. Onun oğlanları Məmmədəli, Xalıq və Rəhman da sənətkardırlar. Söhbət zamanı görüb tanıdığımız oğlu Məmmədəli dəmirçidir. Sanki ulu babası Nadir pəhləvan qollarının qüvvətini ona əmanət edib gedib. Bu sadə dəmirçi oğlanın gözəl də intellektual səviyyəsi var. Millətə, yurda məxsus tarixi olayları tarixi sırası ilə gözəl bilir, milli dəyərləri yüksək tutur. Öz sənəti dəmirçiliyə aid metal naxışkarlığından, döymə işindən də elə heyranlıq və həvəslə danışır ki, qabağındakının rəğbətini qazanır. O, istər öz sənəti üzrə, istərsə də digər sahələrdə itib gedənlərin araşdırılıb axtarılmasını, mümkün olanının qaytarılmasının elə arzusundadır ki?· Baxıb sevinməyə bilmirsən ki,

nə yaxşı belə cavanlarımız var ki, pul, var-dövlət çoxluğu istəyində yox, milli dəyərlərin zənginliyi, yaşaması arzusundadırlar.

Rəsul müəllim təqaüddə olub, işsiz-gücsüz dayanan yaşlılardan deyil. Bağçasının səliqə-səhmanı ilə hər cür qaydası ilə məşğul olur. Həvəsində olub öyrəndiyi xalq təbabətilə də lap yaxından məşğuldu. Bacarığını da elindən əsirgəmir. Yaz ağzı, payız vaxtı dağın-dərənin gül-çiçəyindən yığar, dəstə bağlayıb ehtiyatını görər. Dağda olan dadlı-tamlı çeşmələrin hər birinin yerini də, əhəmiyyətini də gözəl bilir. Havayı axanlarına çox heyfsilənir. Xan yaylağının yabanı zəfəranını, səhləb kök yumrularını, yabanı soğanını, "Gələrsən-Görərsən" qalası ətrafındakı müalicəvi ağ nərgizin soğanaqlarını elə tərifləyir ki: heyfsilənib düşünürsən ki, ilin-günün bu zamanında niyə bizim camaat bu təbiət nemətlərindən yerli-yerində, bol-boluna istifadə edə bilmir?

Gün o gün olsun ki, Çində, Bolqarıstanda olduğu kimi bizdə, məhz bizim bu qədim Şəkidə bu yönümdə müstəqil bir mərkəz yaransın. El loğmanları, alim və həkimlər bu mərkəzin aparıcıları olsunlar.

**"MƏHƏMMƏD ƏFƏNDİNİN"**– Mustafa Əfəndinin övladları (patronim) - Giləhli məhəlləsinin minarəsi ilə üzbəüz evdə "injiner Mustafa" adıyla tanınan, ziyalı, ixtiyar yaşlı, balaca və sifətcə çox yapışıqlı, ağ saçlı bir şəxs yaşayır. Bu adam Ç.İldırım adına Politexnik İnstitutunun ilk buraxılış məzunlarından olub. Şəkidə mühəndis kadrların çox az olduğu bir vaxtın mütəxəssisidir. Bölgə üzrə su mühəndisi işləyən Mustafa Məmmədov Mir Həsən oğlu ömrünün işgüzar hissəsini at üstündə keçirmişdir. Həmin vaxtlar maşının çox az olduğu zaman idi, iş məsuliyyətinin dəmir kimi möhkəm olan vaxtları idi.

Mustafa Məmmədovun söylədiyinə görə, 90-cı illərin əvvəllərində tanınmış tarixçi-etnoqraf, albanşünas alimimiz Məşədi xanım Nemətova bizim evin qonağı oldu. Babamız



Mustafa Əfəndinin ziyarətgahı Yuxarı Başın birinci rayonunda came məscidində yerləşir. Alim xanım onun başdaşındakı ərəbcə yazılmış sözləri oxumuş (biz onu Yuxarı Baş məhəlləsi haqqında yazıda vermişik), onu ata-baba tərəfini müəyyən qədər araşdırıb bizi də onunla tanış etdi.

Mustafa Əfəndinin 12 oğlu, iki qızı olmuşdur. Oğlanlarından ancaq 7 nəfərinin adı bizim yaddaşımızdadır: Mir Musa, Mir Niyaz, Mir Knyaz, Mir Şakir, Mir Həmzə, Mir Həsən, Mir Rövşən.

Mir Rövşən Əfəndiyev 1893-cü ildə Şəkidə açılan yeni milli məktəbdə rus dili müəllimi işləmişdir. Bu məktəbdə yeni üsulda dərs deyilir, ana dili isə gizli tədris olunurdu. Sonralar bu məktəbdə şagird qəbulu azalmışdır. 1906-cı ildən məktəb təzədən camaatın idarəsinə keçmişdir. Giləhli məhəlləsinin adlı ziyalısı Məmmədəli Xəlifəzadənin "Təzə həyat" qəzetinin 1907-ci il 5 avqust sayında yazdıqlarından: "Bu gün 24 iyulda Şəkinin birinci milli məktəbinə cammat tərəfindən müəllim təyin olunduq. Həmin gündən etibarən məktəbə şagird qəbul edirik. Balaları avam adətlərdən tərk etdirib, mədəni adətlərə sövq edəcəyik... Burada ikinci müəllim Haşım Məmmədzadə, rus dili müəllimi Mir Rövşən Əfəndiyev idi".

İnjiner Mustafanın dediyinə görə, əmisi Mir Rövşən sonralar Bakıya köçmüş, rus dili müəllimi işləmiş, nəhayət bədnam repressiyanın qurbanı olmuşdur.

Mustafa Əfəndinin Mir Həmzə oğlu da özü kimi ruhani-alim olmuş, 1917-1920-ci illərdə Tiflisdə yaşamış, orada vəfat etmişdir.

Məşədi xanım Nemətovanın mülahizələrindən nəvəsi üçün də, bizim üçün də maraqlı faktlar oldu.

Mustafa Əfəndinin atasının adı Məhəmməd Əfəndidir. Şəkidə "Məhəmməd Əfəndi piri" adıyla məşhur ziyarətgahımız var. Həmin ziyarətgah Kiş çayı selindən bir neçə dəfə dağıldığı üçün orada yazılı daş sənəd qalmamışdır.

Həmin ziyarət ətrafında Nuxa küçəsi ərazisinə qədər evlərin yaşlı sakinlərinin dediyinə görə biz bu ev-eşiyi tikəndə bünövrə qazımları vaxtı çoxlu kəllə-əl-ayaq sümükləri çıxırdı. Ata-babalarından bu ərazidə olan selləmə xatiratlarını eşidənlər deyirdilər ki, seldən sonra lilin, suyun içində nə qədər baş, əl-ayaq sümükləri görürdük. Yığıb təzədən torpağa basdırdıqlarımız da olub, itib-batanlar da. Xeyli sonralar çöl qala divarlarına yaxın həmin ziyarətgah – qəbiristanlığın ətrafı hasara alınıb.

M.Nemətova həmin ziyarətgahı Mustafa Əfəndinin atasının adıyla bağlı olduğunu ehtimal edir.

Onun dediyinə görə, Məhəmməd Əfəndinin izi gedib Oxud pirinə də çıxır. Oxud pirindəki başdaşılarının birində "Molla Məhəmməd Əfəndinin oğlu Molla Ömər Əfəndi" sözləri yazılıb.

Abidənin tarix yazılmış hissəsi xarab olduğu üçün oxumaq mümkün olmayıb. Lakin onun abidəsinin bədii tərtibatına, kitabə xəttinə görə ətrafdakı hicri 1181 (1767-1768) -ci il tarixli abidələrlə müqayisədə müəyyən oxşarlıq var. Bu oxşarlıq abidələri eyni dövrə, müddətə aid etməyə imkan verir. Elə bu aidiyyətə görə demək mümkündü ki, Məhəmməd Əfəndi pirində dəfn olunan alim Mustafa Əfəndinin atası, Oxud pirində dəfn olunan Ömər Əfəndi həmin nəslin adamıdır. Məhəmməd Əfəndi adının bir neçə dəfə təkrar qoyulduğu və bu adı daşıyan şəxslərin alimlik dərəcəsinə çatdıqlarını güman etmək olar.

Məşədi xanım Nemətovanın qeydlərinə görə ("Azərbaycan pirləri" kitabı, səh. 78, Bakı, Azərnəşr-1992, camelərdə dəfn olunmuş alimlər ailəsində belə hallara Qax rayonunda rast gəlib, təsadüf etmişik. Bunları kitabələrə əsasən müəyyənləşdirmək mümkün olub.

**"ZƏRGƏR HACI KƏRİM ƏBDÜL MƏNƏF UŞAĞI"** (patronim) – Giləhli məhəlləsinin sayınlı-seçimli soylarından biridir. Əbdül Mənəf adlı tacirin Vahab və Hacı Kərim adlı



oğulları olub. Vahab tacir, Hacı Kərim isə zərgərliyi öyrənib. Deyilənlərə görə, onların ulu babaları da zərgər Hacı Süleyman adında çox tanınmış bir sənətkar idi. Çox təəssüf ki, hələlik təsdiq üçün ətraflı məlumat almağa heç bir istinad nöqtəsi tapa bilmədik.

Zərgər Hacı Kərimə məxsus qədim Şəki evi indi də Giləhli məhəlləsinin başlanğıc hissəsində hündür bir yerdədir. İndi də o ev salamatdır. Evi şəkili halvaçı Kamalın Bakıda hansısa İnstitutda dərs deyən oğlu alıb. Almağı əcəb! Kaş ki, o evin özünəməxsus interyerini saxlaya bilə! Həmin özəlliklər təmir işində sıradan çıxmaya!

Bu evin M.F.Axundov, Salman Mümtaz kimi adlı qonaqları olub.

M.F.Axundov zərgər Hacı Kərimlə yaxın olub. Soyun vərəsələrindən biri Məmməd Həsənov anasından eşitdiyinə görə, onun qaynanası da belə bir hadisə danışmışdır. M.F.Axundovun "Molla İbrahimxəlil kimyagər" əsərindəki əhvalat doğrudan da olmuş hadisədir. O, Hacı Kərimin evində gördüyünü öz əsərində canlandırmışdır. Belə ki, həmin dövrün zərgərlərində kimyagərlik də bir dəb imiş. Bəzən zərgərlər qızıl "ixtirası" edərək, civəni butələrdə qaynadar və ona cürbəcür üzvi maddələr qataraq təcrübə edərdilər. "Misi qızıla çevirən" bu kimya "iksirinin" də küllü-aləmə sədası düşərdi. Zərgər Hacı Kərim də belə bir işlə məşğul olanda dostu M.F.Axundov onu görmüşdür. Dramaturq hadisəni dolğunlaşdıraraq öz ideyasını, demək istədiyi sözünü, fikrini aydınlaşdırıb, qələmə almışdır.

Adətən ədiblər həyati simalardan, olmuş əhvalatlardan həmişə istifadə etmişlər. Onlar bəzən həmin baş simaların adlarını, həqiqi hadisələrin yerini dəyişir, bəzən də dəyişmədən əsərlərini yaradırlar.

M.F.Axundov da bu üsuldan istifadə etmişdir. Doğma yurda gələndə dost-tanışlara, yaxınlıqdakı məhəllələrə daha çox baş çəkərdi. Sadə camaatın da arasında ünsiyyətdə olub,

dərd-sərlərini dinlərdi, müəyyən məsləhət və köməkliklərini edərdi.

Zərgər Hacı Kərimin Hacı Mustafa, Hacı Məmməd, Hacı Rəsul adlı oğlanları olub.

Hacı Mustafanın da Seyid Əhməd, Əbdül Kərim və İsmayıl adlı oğulları olub. İsmayıla el arasında "Şafiyə İsmayıl", əqrəbalar arasında isə "Ağadayı" deyərdilər. Onun 9 uşağından 2 oğlu salamat qalıb, qalanları isə uşaq ikən ölüblər.

Oğlanlarından biri Bəxtiyar Mustafayev 1946-cı ildə əvvəl Şəkidə raykom katibi, Ağdamda rayispolkom sədri, Şəkidə torpaq şöbə müdiri, kənd təsərrüfatı texnikumunun midiri işləyib. 1963-cü ildə pensiyaya çıxıb.

Nuru Mustafayev Maarif şöbə müdiri, sonra isə Qax rayonunda əvvəl ikinci, sonra isə 1951-ci ilə qədər birinci katib işlədi.

Seyid Əhmədin isə Mustafa, Məndux, Soltan, Qara adlı 4 oğlu, Səidə və Sənubər adlı 2 qızı olub. Sənubər fizika-riyaziyyat elmləri doktoru, professor Rüstəm Sultanovun həyat yoldaşı olub. Çingiz Sultansoy da onların (Bakı mətbuat klubunun müdiri) oğludur.

Məndux uzun illər daxili işlər orqanında işləyib.

Mustafa Seyid Əhməd oğlu də ali təhsildən sonra əmisi oğlu Nuru Mustafayevlə birgə hökumət tərəfindən İrana göndərilib, orada işləyiblər. Onlar oradan Ağa dayıya (Şafiyə İsmayıla) müntəzəm olaraq dövrü mətbuat göndərirdilər. Ağa dayı ərəb və fars dillərini gözəl bilirdi.

Mustafa Seyid Əhməd oğlu hökumət tərəfindən geri qaytarılandan sonra NKVD-də işləyib. 37-ci illərin tutha-tutunda neçə haqsızlıqların şahidi olurdusa, evə çox vaxt gərgin, təlaşlı gələrdi. Yeyib-içməz, otaqda var-gəl edə-edə "heç allah götürməsin, heç allah götürməsin, götürməyəcək də!" - deyib pıçıldayardı. Soruşanda da heş nə deməzdi. Yeri gəlmişkən bununla bağlı bir faktı da demək istəyirik. "Azərbaycan gəncləri" qəzetinin 1982-1983-cü illərdəki nömrələrinin birin-



də mərhum yazıçımız Mirzə İbrahimovun belə bir məqaləsi çap olunmuşdur: "50-ci illərin əvvəllərində bir payız axşamı gecə saat 1-2 radələrində Səməd Vurğunun həyat yoldaşı Xavər xanım təşvişlə bizə zəng elədi ki, bəs Səməd evə gəlməyib, sizdə deyil ki? Mən çox narahat oldumsa da, bunu büruzə vermədim və dedim ki, haradadırsa yəqin ki, bir azdan gələr. Gecə saat 3-ə yaxın Səməd çox yorğun, əzgin görkəmdə bizə gəldi. Çox həyəcanlı idi, rəngi divar kimi ağarmışdı. Gözlərini yumub xeyli sakit oturduqdan sonra aramla danışmağa başladı. Olduğu yerin adını deməyə ehtiyat etdiyindən "ora" çağırmışdılar dedi. 6-7 saat erməni millətindən olan polkovnik məni çox ciddi mənəvi sarsıntılarla sorğu-suala tutdu, sonra çölə çıxdı. Həmin arada mayor geyimində olan ucaboylu bir cavan qrafindəki suyu dəyişmək bəhanəsilə içəri girib, əyilib mənim qulağıma pıçıldadı ki, "möhkəm dur, heç nəyi boynuna alma" deyib çıxdı. Mən elə bil ki, yuxudan ayıldım. Ona qədər öz-özümə qərarlaşdırmışdım ki, həmin polkovnik gəlsə, nə desə boynuma alasıyam. Ancaq polkovnik gələndə mən onun bütün dediklərinə etiraz edib, heç nəyi boynuma almadım. Bundan sonra o məni buraxdı".

Həmin mayor geyimində olan cavan NKVD zindanlarında olmazın dəhşətləri görüb müşahidə edən Mustafa Seyid Əhməd oğlu Mustafayev olmuşdur. Bir mühüm məqamı da hörmətli oxucularımıza xatırlatmaq istəyirik ki, əməkdaşı olduğumuz Şəki Regional Elmi Mərkəzin yaradılmasında və onun genişlənib bugünkü səviyyəyə çatmasında şəxsiyyətinə dərin hörmət və ehtiram bəslədiyimiz Mustafa müəllimin müstəsna xidmətləri olmuşdur.

Mustafa Seyid Əhməd oğlu ömrünün son illərini Akademiyada şöbə müdiri vəzifəsində işləyərək başa vurmuşdur. Daha doğrusu, tarixin çox-çox olmuşlarından, qəzavü-qədərindən salamat çıxan bu ixtiyar yaşlı ağsaqqal sərsəm bir sürücünün qurbanı olmuşdur. Səhər tezdən öz evindən hava almaq

üçün dəniz kənarına çıxarkən qocanı diqqətsiz və bacarıqsız bir cavan vurub keçmişdir. Səbəbkar cəzasını almışdır.

Mustafa Seyid Əhməd oğlunun yaddaşı və qəlbi çox-çox məxfi, tarixi olmuşlarla doluydu. Buna baxmayaraq çox da şən, zarafatcıl və həyatsevər adam idi. Allah ona qəni-qəni rəhmət eləsin, qəbri nurla dolsun.

Hacı Rəsul isə "Süleyman" təxəllüsü ilə qəzəl-qəsidələr yazardı. Ədəbiyyatımızın yanar qəlbli tədqiqatçısı, folklorumuzun yorulmaz toplayıcısı mərhum Salman Mümtaz Hacı Rəsul ilə yaxın dost idi. Salman Mümtaz 1924-cü ildə 2 dəfə bu evdən iki böyük furqona ağzınacan qiymətli kitablar və əlyazmalar doldurub aparmışdır. Dostu Hacı Rəsul Süleyman onları S.Mümtaza verəndə pul almamışdır. Deyilənlərə görə, ürəyi çox-çox narahat olmuşdur ki, onlar it-bata düşəcəkdir. Narahatçılığı əbəs deyilmiş. Çox-çox heyiflər olsun ki, fədakar tədqiqatçının min bir əzab-əziyyətlə, xərc-xəraclə yığdığı xəzinə İvan və Vartanların birgə məkrli siyasətinin, iç manqurtlarımızın üzündən tarmar oldu...

Əbdül Kərim dərzi olub. Öz zamanının dəbində olan paltarların tikilişinin ustakarı imiş. Oğlanları Hüseyn, Məmməd və Əziz olmuşlar.

Hüseyn 1 oğul iki qız atası olub. Oğlu Əbdüləli 46-cı ildə Moskvada oxuyub, orada qalıb, rus qızı ilə evlənib, övladı olmayıb. SSRİ Dövlət Plan Komitəsində şöbə müdiri işləyib. Elə Moskvada da vəfat edib.

Hüseynin qızlarından biri hüquqşünas olub, Azərbaycan prokurorluğunda işləyib.

Əziz isə hərbi həkim olub. Həyat yoldaşı Zivər xanım Bakılı qızı olub. O, təyinatla Şəkidə musiqi məktəbində işləyib, sonra 1 saylı musiqi məktəbinin müdiri olub.

Azərbaycan cazının ustası, qeyri-adi fitri istedada malik cazmen Vaqif Mustafazadə Əziz oğlu onların övladı olub. Dünyasını vaxtsız tərk edən böyük şəxsiyyət həmin Giləhli məhəlləsində, zərgər Hacı Kərimdən qalma tarixi evdə anadan



olub. Uşaqlıq çağları burada keçib. Vərəsələrdən Məmməd Mustafayevin dediyinə görə, yaxın vaxtlarda həmin evdən köhnə avadanlıqların içərisində Vaqifgilin adına olan müharibə vaxtının çörək talonu tapılmışdır. Çox heyif ki, biz onu gərəksiz bir şey təkin atdıq. Bu məlumat bizə "Şərikli çörək" filmindəki personaj, filmin qəhrəmanı Vaqifin itib, sonradan tapılan çörək talonu süjetini xatırladır.

Vaqif Mustafazadənin atası Əziz həkim də hamı kimi müharibəyə aparılır. O, 1952-ci ilə qədər Leninqrad hərbi dairəsində qospitalda işləyib. Yalnız 53-cü ildə Bakıya qayıda bilib. Onun sonuncu iş yeri Qaraşəhərdə sanitariya-epidemoloji stansiyasının müdirliyində çalışdığı zaman olub. 1967-ci ildə Əliş Ləmbəranskinin otağında müşavirə zamanı yüksək qan təzyiqindən beyninə qansızma nəticəsində vəfat edib.

Hacı Məmmədin Həsən və Səlmə adlı övladları olub. Həsən təkəlduz ustası olub, cavan ölüb. Ondan yadigar qalan 100 yaşlı bir tikmənin şəklini çəkdik. Gözəl naxışları, sapların rənginin solmaması, təravətli qalması bizi heyran etdi.

Həsənin özünün Məmməd, Rəsul, Saleh və Əminəxatun adlı övladları olub. Məmməd çox cavan ölüb. Rəsul 1929-cu ildə Müəllimlər seminariyasını qurtarıb. 36-cı ilə qədər Qışlaq 11 saylı məktəbdə işləyib. Giləhli məhəlləsindən Qışlağa piyada gedib gəlməkdən ayaqları xəstələndi, sonra şəhərdə mühasib işlədi.

Əminəxatun şəhərdə Ağa Rəsul adlı mülkədara ərə getmişdi. Sovet hökuməti gələndə onun evini 2 dəfə müsadirə etdi, birinci dəfə 120 kq, ikinci dəfə 80 kq qızıl aparılıb. Ətraf kəndlər, çayqırağı dəyirmanların çoxu onun ixtiyarındaymış.

Belə yerdə deyərlərmiş kim qazana, kim yeyə. Ağa Rəsul və onun kimi bir çoxları bu ağırlıqda qızılların yarısını xalqın güzəranı naminə xərcləsə idi daha savab olardı. Hansısa məktəb, fabrik, xəstəxana açsaydı, hansısa kasıba dayaq durub oxutsaydı, daha ünlü, rəhməti daha çox olardı.

Əldə etdiyimiz məlumatların bu nəsil haqqında hamısı olduğunu deyə bilmərik. Ancaq son məlumatlarımız bu oldu ki, zərgər Hacı Kərimin evinin yaxınlığında ayrıca evi olan Şafiyə İsmayılın evi ləzgilərə satılıb. Biz evi kənardan seyr etdik. Eyvanın taxta oymaları olduğu təkin dururdu.

Zərgər Hacı Kərimin evi isə bağlı olduğundan eşitdiyimiz taxçalı-noğuldanlı otağı görə bilmədik. Dabanlı qapıları, onun taxtadan olan petlə və həlqələrinə baxa bilmədik. Çox istərdik ki, onu alan adam bu özəllikləri olduğu təkin saxlasın.

**"ŞƏBƏKƏÇİLƏR"** (patronim)– Şəkidə bu ailəni belə adlandırırlar. Ata və oğul hər ikisi bu sənətin aparıcılarıdır. Ata tanınmış ustad Əşrəf Yahya oğlu Rəsulov dünyasını dəyişdikdən sonra sənətin davamçısı, aparıcısı, məsuliyyət daşıyıcısı oğlu Tofiq Rəsulov oldu.

Bu adlı sənətkarların iş emalatxanası Qalanın içində, Xan sarayının tinində yerləşir. Başqa yerdə emalatxananın yerləşdiyini ağla gətirmək də mümkün deyil. Çünki mərhum ustad ata da, oğul da hər ikisi tanıyandan Xan sarayının məftunu oldular. Məftunluğun da çarəsi odur ki, heyranı olduğunu hər gün görəsən. Sağ ikən atanın da etirafı hazırda oğulunku ilə eyni olub. Hər gündəlik şəbəkələrin düzümünə, kiçik taxta parçaları və şüşələrin yaratdığı sehrli aləmə göz gəzdirdikcə yeni rəng, çalar tapardı. Və bundan ilhamlanıb neçə addımlıqda yerləşən emalatxanada oxşar möcüzələr yaradardılar.

Mərhum ustad Əşrəf Rəsulov "məni bu gen dünyaya Xan sarayı tanıdıb" deyir. Belə deməyə də haqqı var. 1958-ci ildə istedadlı memar Niyazi Rzayev Xan sarayının ilk bərpa layihəsi işinə Ə.Rəsulovu da cəlb etmişdi. Həmin vaxtlar az zəhmət çəkilmədi. Şəbəkələri yerli-yerində düzüb-qoşandan, təzələrini düzəldəndən sonra usta Əşrəf sehrkar saraydan ayrıla bilmədi. Saray eyvanının yuxarı hissəsindəki stalaktidlərin (həndəsi oyma fiqurların) müqərnəslərin – (sallamaların) boş gözlərini müxtəlif ölçülü güzgülərlə bəzəyib əvvəlki görünüşünə qaytardı. Sonra sarayın tavanını da keçmişdə olduğu kimi güzgü ilə bəzədi,



oyma işləri gördü. Tavanın bəzəklərinin eynisilə döşəməsinin də xalısı olduğunu eşitmişdi. Tavandakı naxışların xalı surətini gözləri önünə gətirib həmişə heyfsilənərdi. Allah bilir hansı muzeyin qiymətli eksponatına çevrilib.

Ə.Rəsulovun əllərinin, təxəyyülünün qabiliyyəti təkcə Xan sarayında deyil, şəhər diyarşünaslıq muzeyində, Şəkixanovların evində, Cümə məscidinin bəzək işlərində göründü. Kamil dülgərliyi, rəssamlıq qabiliyyəti, memar təxəyyülü, yaradıcılıq fantaziyası onun uğurlarının sayını artırdı. Bakıdakı xalça muzeyində, məscid binalarında, Moskvanın "Bakı" restoranında, Sank-Peterburqda etnoqrafiya muzeyində onun tərtibat işləri, hazırladığı şəbəkələr yüksək qiymətləndirildi.

Bakının tarix muzeyində gördüyü yeganə bir rəhlə diqqətini cəlb edir. Niyə təkcə olsun? Niyə bizim muzeyimizdə, evlərimizdə olmasın? Mən onu yaradaram. Sözünə əməl də etdi. Ömrü min ili ötə bilən rəhlələr yaratdı. Hər birinə də özünün sənətkarlıq möhürünü vurdu. Həmin rəhlələr Amerikaya, İngiltərəyə, Fransaya, Almaniyaya, İsveçə, Türkiyəyə, İrana və s. ölkələrə yayılıb. Şəhərimizə gələn hər qonaq turist özü üçün onu qiymətli hədiyyə təkin alıb aparıb.

Şərq sənətkarlığının, mədəniyyətinin gözəl incisidir rəhlə. Kitaba hörmətdir. Bu mənanı daşıyan rəhlə kitabın yerə, diz üstə qoyulmasını, itib batmamasını, səliqəsini, həm də gözün qoruyuculuğunu təmin edir. Bir taxtanın içindən ayrılıb 4 qıça ayrılan rəhlə dünyanın hansı yerində olsa Şərqi xatırladır, ustadını şöhrətləndirir.

Mərhum ustad əllərinin zəhmətilə əbədi şöhrətini qazandı, hökumət tərəfindən də sağlığında 1989-cu ilin may ayında Azərbaycan Əməkdar rəssamı fəxri adına layiq görüldü.

Ustad atadan dərs alan, sənətə sonsuz həvəsi olan oğlu Tofiqin də ilk addımları Şəkidə olan xüsusi elmi bərpa istehsalat emalatxanasından başladı. İlk uğurunu 1980-cı ildə Bakıda açılan respublika sərgisində qazandı. Burada onun 3 şəbəkə işi göstərildi və mütəxəssislər tərəfindən yüksək qiymətə layiq

görüldü. Həmin şəbəkələr Bakı xalça muzeyinin daimi eksponatı oldu.

T.Rəsulov 80-cı illərdə sənət dostu Soltan İsmayılovla, atası ilə birgə Moskvadakı "Bakı" restoranının daha geniş tərtibatına, Rostov şəhərindəki "Azərbaycan" mağazasının bəzədilməsində dəvətlə iştirak edib.

Moskvada keçirilən sərgidə "Bədii özfaliyyət yaradıcılığına Ümumittifaq baxışının laureatı" medalına layiq görülmüşdür.

Yaşadığı doğma şəhərin tarix və mədəniyyət abidələrinin bərpasında payı olan sənətkar Rəssamlar İttifaqının üzvü olur.

İndi onun çoxlu həvəskar şagirdləri var. Atası kimi Tofiq də istəyir ki, qədim el sənətinin gözəlliyi qoruna, yaşadıla, ona təzə rəng, təzə nəfəs verilə. Belə ustalar indi öyrənməyə gələn həvəskarların içindən çıxmalıdır. Çünki Şəkini şəbəkəsiz təsəvvür etmək çətindir. Bir də ki, Şəkidən başqa Azərbaycanın digər yerlərində sənət kimi heç bir yerdə onunla məşğul olmurlar.

**"ABBASLAR SOYU"** (patronim) – öncə qeyd edim ki, baba adıyla adlanan bu soyun adamları şəhərin ən gözəl coğrafi bir mövqeyində yaşayırlar. Sadə, zəhmətkeş adamlardır.

Hazırda Giləhli məhəlləsində yaşayış evləri minarənin ətrafınacandır. Məhəllədə ondan sonra evlər yox, Qurcana çayıdır. Qeyd etdiyimiz kimi, vaxtilə çaya yaxın yerdə çoxlu evlər vardı. Camaat həmin yerə dərə məhlənin evləri deyirdilər. Sel-su zaman-zaman oradakı evləri dağıdıb aparandan sonra həmin hissədə yaşayış olmadı.

Haqqında danışdığımız Abbaslar soyu isə Qurcana çayın dağ yaxası sahilində binə salıblar. Həmin sahildən də məşhur Şəki ziyalısı, milli təəssübkeşliyi ilə, düzgün, uzaqgörən siyasi baxışlarıyla tanının Mustafa bəy Əlibəylinin bağatlığına yol başlanır. Həmin yerdən də olduqca gözəl dağ yaxası mənzərələri başlayır.

Diqqəti cəlb edən, insanda qəribə bir maraq yaradan odur ki, həmin ərazidə Abbaslar soyundan başqa kimsə yaşamır. 2-3 evdən ibarət bu soyu dağ və Qurcana çayı məhəllədən, şəhər



əhalisindən tam ayrı olduğunu qabarıq göstərir. Onlar öz dolanışıqlarında da sığındıqları dağdan xeyli bəhrələnirlər. Odununu, meyvə və giləmeyvəsini yığdıqca Tanrıya da, Dağa da minnətdar olurlar. Şabalıdı, əzgili, əzgilin turşusu, zoğalın mürəbbəsi, qurusu, turşusu, tutması, alçanın qurusu, turşusu və s. yedikləri və satdıqları təbiət nemətləridir.

Deyilənlərə görə Abbaslardan olan Vahid dayı ölənəcən Mustafa bəyin bağatlığının gözətçisi olub. Dağı da, o üzlü, bu üzlü meşəsini də beş barmağı kimi tanıyardı. Abbasların soyundan olan Anaxanım nənə ömrü boyu Dərə hamamından və Giləhli məhəlləsindən kənar yer görməyib. Hamama gələndən-gələnə eltisi və gəlinlərilə boxçasın yığar, çayın qırağı ilə, Vəzirxan təpəliyinin altından çay məhləyə, ordan da körpü ilə dərə məhləyə keçib, həmin Dərə hamamına (Məmmədnəbi hamamına) gedərdi. Eyni yolu da qayıdardı.

**"MİSGƏR HACI CƏLİL"** (antroponim) – Giləhli məhəlləsinin adlı misgərlərindən olub. Yaradıb-qurduğu da, yaşatdığı ailəsi də, qazandığı ad-sanı da bu sənətin sayəsində olub. Misgər dükanı və emalatxanası da yaşadığı evin həyətinin bir küncündə olub. Çox təəssüf ki, onların izi qalmayıb. Hazırda evdə yaşayan gəlini Həqiqət Yusifovanın bizə göstərdiyi mis dolçaların naxışlarının gözəlliyini, ölçü-biçisinin nə qədər səlis olduğunu görəndə onun işinin ustakarı olduğu duyulur.

Gəlininin eşitdiyinə görə, o cürə sənətkar misgər körüyündən, çəkicindən uzaqlaşmazdı, onu Sovet hökumətinin qoyduğu naloq uzaqlaşdırdı, uzaqlaşdığı üçün tez də dünyasını dəyişdi.

**"BAZARBAŞI" – "QULLAR MƏHƏLLƏSİ"** (patro-oykonim) – Yenə də qoruq bölgəsində yerləşən bu qədim məhəllələr indiki bölgüyə əsasən sıra sayı ilə 5-ci rayona düşür. Yalnız Bazarbaşı məhəlləsinin başlanğıc hissəsi 7-ci rayonun payına düşür.

Məhəllə bölgü adlarında 5-ci rayon Vidadi, Rəcəb Əfəndiyev, Allahyar Əhmədov adına küçələri əhatə edir.

Qoruq bölgəsinin bu paleotoponimlərinin etimoloji açımı elə bir çətinlik yaratmır. Elmi mənbələrdə olan məlumatlara görə Qullar qədim türkdilli bulqarların, peçeneqlərin və qıpçaqların tərkibində olmuş "Kul" tayfasının adındandır (Azərbaycan toponimləri - Ensiklopedik lüğət, səh. 174). Azərbaycanın bir çox qədim məkanlarında bu adla bağlı kənd və məhəllələr var. Zəngəzurun və Qazağın Qulkənd adlı kəndləri, Dərbəndin və Zaqatalanın Qullar kəndi, Qubanın Qulqat məhəlləsi də bu tayfanın adını yaşadır.

Bazarbaşı adlı məhəllələr də Azərbaycanın qədim, qalalı və karvansaralı şəhərlərinin çoxunda var. Bazardüzü, Bazarbaşı, Qalabazarı adı ticarətin, sənətkarlığın yaranışı ilə yaşıddır.

Şəkinin orta əsr dövrlərindən indiki 5,7 və 11-ci rayon ərazisi əhatəliyində, yəni Qalanın qabağından başlamış Xan məscidinədək ərazidə böyük bazar olub. Bazar Qala divarlarının və vaxtilə beşlik təşkil edən karvansaraların əhatəsində olub. Həmin bazara zamanında bir ad da – Daşlı bazar adı da qoyulmuşdur. Məkanı ilə bərabər bazarın necəliyinin də adı bu günümüzə gəlib çatmışdır. Şəhərin çox yağıntılı bir bölgədə olduğunu bilən əhali bazarın yeri palçıq olmasın deyə onu xırda çay daşları ilə örtüklü etmişlər. Yuxarıda qeyd olunduğu kimi, Daşlı bazar həmin o bazardır ki, məşhur fransız yazıçısı və səyyahı A.Düma 1859-cu ildə Qafqaza səyahəti zamanı zənginliyinə çox heyran olmuşdur. Bu bazardan aldığı ucuz və gözəl iki yəhəri yazıçı çox dəyərləndirmişdir.

Qullar məhəlləsi tarix boyu özünün Daş mədən adlı məkanı ilə çox tanınmışdır. Dağ yaxasında yerləşən bu yerdən iri sal daş parçaları qoparılır, bölünür, cilalanır, tikinti işlərində istifadə olunurmuş. Şəkinin qədim binalarının çoxunun tikilişində Daş mədənin çapılmış daşları hörgülənmişdir.



Qullar məhəlləsinin özündən Daş mədəndə Daşçı Alı adlı bir daşyonan, qayadan daş çapan bir usta çalışırdı. Bu usta özünün sənət bacarığı ilə çox məşhur idi. Onun çoxlu şəyirdləri, səbətli daş daşıyan ulaqları olub. 40 işçi ulaqların 20-ni istirahət etdirər, 20-ni isə işlədərdi. Növbə ilə onları müəyyən saatlarda dəyişdirərdi.

Çətin sənətin ustakarı olan Daşçı Alının ölümü də iş başında olub. Mərhumun ehtiyatsızlığı üzündənmi, yaxud çapdığı qaya parçasının tərkibindənmi, yerləşməyindənmi-nədənsə qaya uçub altında qalmışdır. Əlləri çöldə qalıb ölən ustanın cəsədini şəyirdləri çox çətinliklə çıxarmışlar. Görünür nəsə bu da bir qismət imiş.

Daş mədənin ətrafında da çoxlu kirəc quyuları olub. Həmin quyuların çoxu hazırda yaşayış evlərinin həyətlərinə düşüb. Çoxu danışır ki, quyunu illər ərzində çox çətinliklə doldurduq, dolmaq bilmir ki, tonlarla su tök hara gedir, necə gedir heç bilinmir.

Zamanında ən gərəkli tikinti materialı olan kirəc quyularını sənətinin bütün incəliklərini gözəl bilən kənkanlar qazardı. Qazılan quyular da özəlliyini əsrlər uzunu saxlayardı. İndi elə kənkanların ancaq adları qalıb.

Daş mədənin yaxınlığında Mallı qaya adlı bir təpəlik var. Ətraf məhəllə camaatının mal-qarası bu təpəliyə sürülər, alçaq dağın yaxasında otlayardı. Bu səbəbdən Mallı qaya zootoponimi yaranmışdır.

Mallı qayada bir quyu var. Həmin quyu Xan sarayından olan yeraltı tunelin-gizli yolun bir qoludur. Bu barədə biz Yuxarı Baş məhəlləsi haqqında danışdıqda qeyd etmişik. Bunu məhəllənin yaşlı adamlarının hamısı bilir. Uşaqlar da yaşlı adamlardan eşitdiyi bir düzgünü də tez-tez oxuyurlar. Qoyun-keçi otaran uşaqlar artıq yarı dolmuş quyunun ağzına yaxınlaşıb, belə soruşurlar:

Mallı qaya,
Malın var?

Quyudan əks səda gələrdi:

- Var – var.
- Su içməyə canın var?
- Var – var.
- Mənə verməyə varın var?
- Var – var.

Onlarda belə təxmini fikir var ki, Xana məxsus hər bir yerdə hansısa varidat ilişib qalmalıdır. Nə isə tapıb, bilib vara-pula nail olmaq olar.

Qullar məhəlləsinin adlı Hacıları, onların yaraşıqlı, ənənəvi Şəkiyə məxsus 2 mərtəbəli, 3 mərtəbəli evləri olub. Məhəllənin hazırda sərrast duran belə evlərindən biri məşhur sahibkar Məmmədsadıq Əliyevə aid olub. M.Əliyev özü zatən Qullar məhəlləsindəndir. Vaxt olub ki, öz ağlı, qabiliyyəti və savadı ilə dövlətli bir adama çevrilən sahibkar ailəsi böyüyüb, çoxaldığı üçün bir qədər qabaqda indiki 7-ci rayonda Bazarbaşı məhəlləsində ev tikib. Hazırda həmin ev müəyyən dəyişikliyə məruz qalsa da, bir çox özünəməxsusluğu durur. Həmin möhtəşəm binada indi Şəki Pedoqoji Texnikumu yerləşir. M.Əliyev Qullar məhəlləsindəki ata-baba evini isə ticarət işlərində özünün yaxın köməkçisi olan Hacı Hüseyn oğlu Usuba verib. Usub Hacının mallarını kənar şəhərlərə aparan olub. O deyəndə ki, Hacı bəs mən bu evin pulunu verə bilmərəm. Deyib ki, Usub illər uzunu yaşadıqca az-az pul ayır yığ, toparlananda verərsən. Hazırda həmin evdə Usubun törəmələri, varisləri yaşayırlar.

Məhəllənin Hacı İsmayıl adlı bir taciri də sayımlı-seçimli olub. Bu məhəllədə onun iki evi olub. Birinin altında 1-ci mərtəbəsində ipək emalı üçün Qans dəzgahı olub. Bu karxananın yuxarı mərtəbədə yaşayanlara narahatlığı olduğu üçün bir qədər kənarda 2 mərtəbəli bir ev də tikdirir. Birinci evdə hazırda şəhərə məxsus 6 saylı bağça yerləşir. 2-ci evdə isə Hacı İsmayılın öz nəvə-nəticələri, varisləri yaşayır. Bu soya həm də nənə adıyla Sənəmlər də deyilir.



Bu soydan Məmmədov Niymət Əhmədiyə oğlu adlı biri çox istedadlı olub. Bütün simli alətlərdə çala bilirdi. Ərəb-türk musiqilərini də simli alətlərdə gözəl çalırdı. Şəhərə ərəb-türk mənşəli qonaqlar gələndə onu çalmağa aparardılar. Əhsən Dadaşov, Səid Rüstəmov, Məmmədov Niymətin tar çalmağına qulaq asıb onu çox bəyənmişdilər. Onu Bakıya dəvət edib, aparmışdılar. Bu istedad yiyəsinin çox pis bir şakəri - spirtli içkiyə meyilli olmağı səhhətinə ziyan gətirir. Paytaxtda bir ad-sanın yiyəsi ola bilmir. O bir müddət Şəki Musiqi Texnikumunda müəllim işləyir. Musiqi alətini almaq və kökləmək istəyənlər ona müraciət edərdilər. Çox-çox təəssüf ki, özü öz səhhətinə zorən balta çalan şəxslərdən oldu və dünyasını tez dəyişdi.

**"ƏMBƏBƏLƏR"** (patronim) də Qullar məhəlləsinin tanınmış soylarındandır. Bu soydan olan 80 yaşlı qəssab Şaban Əhməd oğlu Lətifov ilə çox maraqlı söhbətimiz oldu.

Onun dediyinə görə, adını bilmədiyi ulu babaları da, bildiyi ata-babaları da hamısı qəssab olub. Babası Lətif, atası Əhməd, əmiləri Qasım, Məşədi İsmayıl, Abbas özü və oğlu bu sənətin aparıcıları olduğuna görə onları qəssablar sülaləsi də adlandırmaq olar.

Şaban dayının dediyinə görə, anası Xədicə 14 uşaq dünyaya gətirib, onlara ləyaqət və fədakarlıqla analıq edib. Özü də hamısı bircə-bircə ana südü yeyib böyüyüblər. Anam fəxrlə deyərdi ki, onların hamısı doyunca halal ana südü əmən balalardı. Ana südü əmib, buğda ununun quyruq yağında bişən püfü (buğda ununun sıyığı) ilə böyüyüb.

Sovet hökuməti də ona qəhrəman ana adı vermişdir. Bu qəhrəman ananın övladlarının 14-ü də ana südü ilə qidalandığına görə məhlə camaatı onları Əmən-bəbələr-balalar-Əmbəbələr də adlandırmışlar. Əmbəbələr soyunun digər üzvünün (Rahilə Zeynalova 70 yaş, evdar) dediyinə görə bu nəsildə çox qardaş və Əmizadələr olduğu üçün onlara Əmi-balaları deyiblər. Söz dildə assimilyasiya olunub. Əmbəbələr

şəklinə düşüb, qulağa xoş, çox uyarlı hər iki fikir aydın açımlı olduğu üçün qeyd etməyi lazım bildik.

Şaban dayının dağ havası udub, babanın əlindən çıxan təamlı əti yeyib böyüyən nəvələrindən biri Alxasov Məmməd Asim oğlu Karate idman növünün Okinava- qoqyü-ryü bölməsilə məşğuldur. Kiçik yaşlı məktəbli Məmməd (4-cü sinif şagirdi) çəki və yaş dairəsinə görə müvəffəqiyyətlər qazanıb. O, 2002-ci ilin 14-15 oktyabr tarixində Milli Olimpiya Komitəsinin 10 illiyinə həsr olunmuş V milli açıq Respublika çempionatında 1-ci yerə layiq görülür.

2002-ci ilin 15 dekabr tarixində Milli qəhrəman Cavanşir İzzət oğlu Rəhimovun xatirəsinə həsr olmuş yarışda 1-ci yerə çıxır. 2003-cü ilin yanvar ayının 26-da karatenin həmin növünün yoxlama yarışında birincilik qazanır. 2003-cü ilin 17 mayında Prezident H.Əliyevin 80 illik yubileyi şərəfinə həsr olunmuş yarışda 1-ci yeri tutur.

Göründüyü kimi balaca idmançı gələcəkdə öz şəhərinin, məhəlləsinin, ailəsinin fəxr etməli oğlu olacağına əsas verir.

Bu məhəllədə **"PULLU QULUNUN NƏSLİ"** (antroponim) – adıyla tanınan bir soy da var. Nəslin özündən öncə "Pullu Qulunun evi" adıyla məşhur olan çox gözəl bir mülk mövcuddur.

Bu mülk Azərbaycan memarlığının nadir incilərindəndir. Bir əsr əvvəl rənglənmiş möhkəm divarlar öz təravətini itirməmişdir. İkinci mərtəbədə yerləşən baş otağın gəclə işlənmiş güzgülü buxarısı öz gözəlliyilə çox əzəmətlidir. Buxarının şəkli ASE-nın cildində verilmişdir (II cild, səh.370).

XIX əsr abidəsi olan bu buxarını usta Abbas tikmişdir. 1906-cı ildən inşası başa çatan bina vərəsələr tərəfindən də çox qayğı və səliqə ilə qorunub saxlanılır.

Pullu Qulu qonşu Qax rayonunda tacirliklə məşğul olub. O, özü Qax rayonundan olduğu üçün dükanları da burada idi. Pullu Qulu həm də gözəl dərziliyi bacarırdı. O, Şəkidən tacir Bəşir Tahirovun qızı ilə evlənmişdir. Soyları barədə bizə məlumat verən Pullu Qulunun qızları Əlanur və Mahinur Bəşirova bacıları Şəkidə maarif sahəsində çalışan öndər qadınlardan olub. Onların anasının əmisi oğlanları Əhməd bəy Tahirov, Məmməd Qasım Tahirov dövrlərinin tanınmış ziyalıları idilər. Təəssüf ki, Əhməd bəyin oğlu Çingiz Tahirovla sıx əlaqə saxlaya bilmədik. Hacıhüseyn bəylər soyunun gəlini olan (artıq təqaüdçüdür) bacısı Tamara müəllimədən isə tam əhatəli məlumat toplaya bilmədik. Əldə etdiyimiz bilgilər isə belədir.



Əhməd bəy Tahirov Şəkidə məşhur tarçalan sənətkarlardan olub. Uşaq vaxtlarından tarın ecazkar sirlərinə yiyələnmiş, bilmədiklərini isə vaxtilə Şəkidə tanınmış tarçalanlardan biri olan dostu Samovar oğlu Çələbidən öyrənmişdir. O, gənclik illərində böyük xanəndə Ələsgər Abdullayevi, Cabbar Qaryağdi oğlunu, Seyid Şuşinskini məharətlə müşayiət etmişdir. O, həmçinin özü kimi istedadlı kamança çalan Nurəddin Bədəlovla (Bədəlovlar soyundan olan bu gözəl sənətkar barədə lazımi məlumat toplumuz başa çatmadığı üçün onu ikinci kitaba nəzərdə tutmuşuq) birlikdə Yunis Qarabağlı, Veyis Hacıyev, Şəmsəddin Abdullayev, Hacıbala Əhmədov və digər xanəndələri şənliklərdə muşayiət etmişdir. Şəki Pedoqoji məktəbində tar ixtisası üzrə dərs deyən Ə.Tahirov bir neçə rəqs və rənglər də bəstələmişdir. Bunlardan "Üç barmaq", "Müşki", "Şəki", rəqslərini göstərmək olar. Bu yaxın vaxtlara qədər toylarda köhnə kişilər "Əhməd bəy segahı çal, feyziyab olaq" deyib, sifariş verərdilər. Onun tarda özünəməxsus segahı vardı.

Musiqimizin təbliğində və gənc musiqiçilərin yetişdirilməsində xidmətlərinə görə 1955-ci ildə Azərbaycanın Əməkdar müəllimi adını almışdır. Ustad sənətkar 1958-ci ildə 86 yaşında vəfat etmişdir.

Ələnur və Mahinur müəllimə bizə 1800-cü ilin axırlarında Türkiyədə təhsil alan, dövrünün tanınmış ziyalılarından olan Əbdül Məbud Əfəndinin analarının doğma dayısı olduğunu dedilər. Pullu Qulunun oğlu Əhmədiyyə Bəşirov dövrünün güclü fizika-riyaziyyat müəllimlərindən biri idi. 10 saylı mək-

təbdə çalışan Ə.Bəşirov II Dünya müharibəsində həlak olub. Özü də cəbhədə ikən vuruşduğu hərbi hissədə işlədilən silaha yenilik yaratmışdır. Onun bu ixtirası cəbhəyə böyük kömək olmuşdur. Lakin bacılar ixtiranın nə cür və dəqiq sənədləşdirildiyi barədə məlumat verə bilmədilər. Əmisi oğlu Hacıbaba Bəşirov isə sovet dövrünün ilk vaxtlarında çıxan "Nuxa fəhləsi" qəzetinin 1-ci redaktoru olub.

Pullu Qulunun kiçik qızı Tamilla xanım hamının yaxşı tanıdığı Fransada YUNESKO-nun Azərbaycan üzrə əməkdaşı olmuş Ramiz Abutalıbovun həyat yoldaşıdır. Şəki qadınlarının yaxşı tanıdıqları, hər üçü həkim olan Saniyyə, İqlimə, İsmət Əfəndiyeva bacıları Əlanur müəlliminin xalası qızlarıdır. Bacılardan ancaq İsmət həkim yaşayır və təqaüdçüdür.

Ümumiyyətlə bu soyla qohum olan iri, tanınmış nəsillər çoxdur.

Qullar məhəlləsində "Dağdağanlar" adlı hissə var. Bu fitonim adından bəlli olduğu kimi ağac adıyla bağlıdır. Dağdağana vəhşi ağac da deyirlər. Dağ yaxası olan bu məhəllədə dağdağanlar çoxdu. Camaat onları kəsmir, əksinə müqəddəs ağaclardan hesab edirlər. Ata babalarımızdan üzü bəri insanlar toxunulmaz sayılan bu ağacın budaqlarını kəsib qəddəyir, yonur, xırda muncuqlar düzəldib saxladıqları heyvanların say-seçməsini gözü dəyimli olanlardan qorumaq üçün boyunboğazlarından, buynuzlarından asardılar. Bu ənənə itməyib, indi də yaşayır. Nəinki heyvanların, körpə yaraşıqlı uşaqların üst paltarlarından sancaqla taxıb asırlar. Gözəl tikili evin də müəyyən hissəsindən üzərliklə bərabər dağdağan da asırlar.

Dağdağan dərin, möhkəm və mükəmməl kök sisteminə malik olduğu üçün həm də gözəl torpaqqoruyucudur. Quraqlıq, çılpaq, daş-kəsəkli hissələrdə bitdiyi üçün əvəzedilməzdir.

Yeri gəlmişkən qeyd edək ki, Şəkinin Babaratma kəndində (Babayi-Rütəb) olan ziyarətgah sahəsində onlarla dağdağan ağacları var. Onlara da həm yerləşdiyi yerə görə, həm də ağaclara olan inama görə toxunulmur.



**"BAYDUNLU ADLI HISSƏ"** (patronim) – də bu məhəlləyə aiddir. Məhəllənin ayaq hissəsindən fərş yolun diktəpəlik yeri var. Bu məhəllədə dədə-babadan faytonun şıdırğı işlədiyi yer olub. Həmişə də təpə kimi yerə çatanda ləngiyər, asta-asta, çətinliklə qalxardı. Qış vaxtı bəzən oracan gəlib dayanacaq edərdi. Camaat da oranı faytonlu görməyə adət etdiyindən ora faytonlu yer deyərdilər. Vaxt ötdükcə faytonlu sözü dildə "baydunlu" təkin qalmışdır. Baydunlu toponiminin bəydili Oğuz tayfasının adının əks sədası olduğunu da ehtimal etmək mümkündür.

**"MUŞDU BƏY VƏ NƏSIB BƏY FƏRZƏLIBƏYOVLAR"** (patronim) – Qullar və Bazarbaşı məhəllələrinin sonluğunun kəsişdiyi hissədə adlı-sanlı soylar çoxdur. Fərzəlibəyovlar da onlardan biridir. Öncə qeyd edim ki, işlədiyimiz müddət ərzində təəssüflәndiyimiz, iç göynərtisi yaradan bir faktla daim rastlaşırdıq. Bizdə 7 arxa dönənini tanıyan kəslər, soylar olduqca azdı. Öz əsil-nəcabəti barədə bizə məlumat verən Nəsib bəy oğlu Şarid Fərzəlibəyov da babası Muşdu bəydən o tərəfə keçə bilmədi.

Muşdu bəyin adı əslində sənədlə Mustafa bəydir. Nədənsə uşaqlıqdan deyilən əzizləmə adı ömrü boyu onunla bərabər yaşamışdır.

Mustafa bəy Abbas oğlu Fərzəlibəyov öz dövrünün tanınmış ziyalısı, sanballı bəyzadəsi, gözəl şəxsiyyətlərindən biri olub. Çar hakimiyyəti zamanı o Peterburqda ali təhsil alıb, elinə qayıdandan sonra Şəkidə hakim işləyib. Sovet hökuməti qurulan vaxtdan ta ki 30-cu ilə qədər Notarial (qeydiyyat) kontorunun rəisi olub.

Çar imperiyasının rəsmi məlumat təqvimində Muşdu bəyin adı, vəzifəsi yaşadığı yer haqda məlumat verilmişdir. Belə təqdimat yalnız mötəbər xadimlərə məxsus olardı.

Muşdu bəy təkcə savadlı ziyalı yox, həm də bir sıra peşələrin sənətkarı idi. Boş vaxtlarında dülgərlik edərdi. Onun evinə nadir hallarda hansısa usta gələrdi, çox az hallarda da evə

avadanlıq alınardı. Çünki hər bir avadanlığı özü düzəldər, özü qurub-yaradar, evin hər cür rahatlığını öz əlindən çıxarmağa çalışardı. Əməksevər, insaflı, dini gözəl bilən, xeyirxah bir şəxsiyyət idi.

Onun ata-babasından qalma, tabeliyində olan kənd torpaqlarından məhsul yığımı vaxtı arabalarla çoxlu kənd təsərrüfatı məhsulları, meyvələr gətirilərdi. Muşdu bəy lazım olan qədər götürüb, qalanını isə geri qaytarardı. Özü də rəncbərlərə dönə-dönə deyərdi ki, belə çox gətirməyin, mən o torpaqları Sizlərə təmənnasız icarəyə vermişəm. Elə də nəfsi tox adam idi.

Muşdu bəy çəkinmədən sovet hökuməti əleyhinə vuruşan məşhur qaçaqlarla görüşər, müəyyən məsləhətlər verər, bacardığı köməyi əsirgəməzdi. Tezliklə adı bəlli hökumət Muşdu bəyin də evini yağmaladı. Bütün var-dövlətini yığıb apardılar. Muşdu bəy bunları ancaq acı gülüşlə, dərin bir sükutla seyr etmişdi. Ancaq evinin alt mərtəbəsindəki bir böyük otaq zəngin kitabxanası kəl arabalarına yüklənəndə onun gözlərindən acı göz yaşları tökülürdü.

Muşdu bəy rus siyasətini dərindən bildiyindən, millətin başına gələn faciələri uzaqgörənliklə dərk etdiyindən ürəyi tab gətirmədi, dünyasını dəyişdi. Qəbri məşhur Xoçik qəbiristanlığındadır.

Muşdu bəyin oğlu Nəsib bəy də çox adlı və hörmətli şəxsiyyət olub. Kiçik yaşlarından mədrəsə təhsili alıb, sonra Nuxa Pedoqoji texnikumunu bitirib. Bakıda Pedoqoji İnstitutda oxuyub, ancaq təhsilini başa vura bilməyib. Ailənin əsas yükü onun boynunda olduğundan, müharibə başlandığından təhsili yarımçıq qalıb.

Nəsib bəy çox istedadlı olub. O, hələ uşaq ikən ana babası Məhəmməd Seyidin yanında saatsazlığı öyrənmişdi. Saatsaz Məhəmməd Seyid 11 yaşlı nəvəsinin onun yanında sadəcə müşahidə ilə öyrənib, təkbaşına saat söküb, təmizləyib, təmir edib, yığmağını görəndən sonra ona inandı və icazə verdi ki,



onunla birlikdə çalışsın. Oğlu Şaridin dediyinə görə o müasir texnikaya bircə dəfə baxardı. Tez anlayıb, lazımi istiqaməti düzgün təyin edərdi. O, bənnalıq və dülgərliyi kökündən bilirdi.

Nəsib bəyin gözündə müəyyən qədər zəiflik olsa da, mümkün qədər çox şey öyrənmək istəyirdi və mükəmməl də öyrənirdi.

Müharibədən əvvəl Şəkidə diş texniki çox az idi. Bir milliyyətcə yəhudi olan texnik Kasner, bir də Ustagülülərin soyundan olan həkim Zahid Gülüzadə idi. Qonşu məhəllədə yaşayan Zahid həkim bir gün Nəsib bəyə deyər ki, bəs sən çox şeyi bilən, qabiliyyətli, asan mənimsəyən adamsan. Ehtiyac olduğu halda niyə diş texnikliyini öyrənmirsən?

Onlar bu barədə ətraflı söhbətdən sonra belə razılğa gəlirlər ki, Zahid həkim onu texnik Kasnerin yanına aparsın. Desin ki, qohumumdu, uzaq kənddən gəlib, çox avam və qorxaqdı. Bəs sən allah, çox yavaş-yavaş, ehtiyatla onun bəzi dişlərinə bax, müalicə et!

Belə də edirlər. Nəsib bəy, "avam və qorxaq" kəndli adıyla gəlib, Kasnerdən bir neçə gün ərzində çox şey öyrənir. Zahid həkim də müəyyən köməklikləri edir. Özü də öz marağı ilə elmi ədəbiyyatlar oxuyur, çətinliklə onları tapır, toplayır. Müəyyən müddətdən sonra şəhərdə ehtiyacı ödəyə bilən, xəstələri razı sala bilən, gördüyü işdən də heç zaman heç bir şikayət eşitməyən diş həkimi olur. Öyrənmək qabiliyyəti, dəqiq iş görümü, xalq təbabətindən və populyar ədəbiyyatdan istifadə onu mahir sənətkar kimi məşhurlaşdırmışdı. Bir müddət o, öz qazancı ilə köhnə məhkəmənin binasının alt mərtəbəsində bir otağı alıb, onu elə özünün zövqü və qabiliyyətilə diş texniki və çəkimi, müalicəsi kabinetinə çevirdi. Yenə də müraciət edənlər və razı qalanlar, heç vaxt şikayət etməyən etibarlı müştərilər, xəstələr gəlirdi.

Lakin bu həyatdı. Hər cür səhifəsi var. İnsanı istəyən və istəməyənlər də, paxıllıq edib, gözü götürməyənləri də olur. Necə deyərlər "yuxarılara" tez-tez anonim yazılar, şikayətlər

gedir ki, bəs qoymayın oxumamış bir həkim peyda olub, sovet hökumətinə ziyan vurur və s.

Yazılıb göndərilmələr öz nəticəsini verir. Moskvadan xüsusi yoxlanış üçün məsuliyyətli, vəzifəli kadr göndərilir, qəfildən sadə geyimdə kabinetə gəlir. Çox diqqətlə Nəsib bəyin işinə, avadanlığının təmizliyinə nəzarət edir. Nümayəndə ancaq gördüklərindən heyrətə gəlmişdi. Özü də mütəxəssis olduğu üçün hər şeyi əlüstü təyin edə də bilmişdi. Uzaq bir əyalətdə, bu səliqədə, bu texnikada, bu qədər dəqiq gigiyena qaydalarına əməl edən bir diş mütəxəssisinin olduğu onu çaşdırmışdı. Belə bir mütəxəssisdən də şikayət edərlər? Bu şəhərin də, onun əhalisinin də xoşbəxtliyidir ki, onların belə bir mütəxəssisi var. O, dönə-dönə Nəsib bəyin əlini sıxıb, minnətdarlığını bildirib, bacardığı köməyi ondan əsirgəməyəcəyini deyib. Onu da qeyd edib ki, bəs mən 3 kapitalist ölkəsində, 2 böyük sosialist ölkəsində olmuşam, belə səliqədə, gigiyenik qaydada və qabiliyyətdə mütəxəssis görməmişəm. Bir də bu adamdan şikayət-filan yazılsa, həmin adamı tapıb cəzalandıracaq. Elə o vaxtdan həmin xoşagəlməzliyə son qoyuldu. Camaat müraciətində oldu, Nəsib bəy də xidmətində. Elə indinin özündə də yaşlı adamlardan öz dişlərini göstərib deyənlər var ki, rəhmətlik Nəsib bəy düzəldən dişdi, məni girləyir.

Nəsib bəyin 41-ci il müharibəsinə gedişi bir növ qərəzli olub. Yerli Hərbi komissarlıq onun qabiliyyətinə bələd, camaat üçün gərəkli şəxs, gözünün də müəyyən qədər zəif olduğunu bilirdi. Həmin vaxtlar Nəsib bəy həm də 2 saylı məktəbdə direktor vəzifəsində işləyirdi. Hərbi komissara müəyyən təsirlərlə onun cəbhəyə tez göndərilməyinə nail olurlar. Ailənin dolanışığı və bütün ağırlığı onun çiynində idi. Gedəndə narahat idi ki, bəs anam, bacı-qardaşlarım necə olacaq.

Getməzdən qabaq o kiçik qardaşı Kamilə xüsusi tapşırıq verir: "Mən gedirəm, evin kişisi indi sənsən. Diqqətlə qulaq as. Bu pulu al, 120 manat verib, elə şəhərdəki ermənilərdən hər dəfə 4L çaxır al. 4L çaxırı da bu qayda ilə təzədən emal et,



ondan 1L araq çıxacaq. Həmin arağı da elə ermənilərin özlərinə 1500 manata sat. Evi dolandır, Allah kərimdi".

Qardaşı o dediyi kimi də edib, ailəni yaşadır. Nəsib bəy də cəbhəyə yollanır. Ön xəttə göndərilməzdən qabaq təlim batalyonuna düşür. Komandanlıq çağırışçılardan hansı sənətin-savadın yiyəsi olduğunu soruşur. Kustar sənətlərin hansının adını çəkirsə, Nəsib bəy "mən" deyib qabağa çıxır. Komandir müəyyən qədər şübhə ilə yanaşıb, dediklərindən nə göstərə bilərsən? – deyə soruşur. Nəsib bəy təsdiq edir və müəyyən sənət alətləri istəyir. Əl altında heç nə yoxdur deyirlər. Batalyonun da ən adi vedrə və qazana, çox-çox məişət xırdalıqlarına da ehtiyacı vardı. Nəsib bəy bütün qabiliyyətini işə salır. Xırda dəmir parçalarından, əyilmiş rels dəmirlərindən əlinə keçən hər bir kiçik hissədən istifadə edib batalyonun zəruri ehtiyaclarını ödəyir. Az bir vaxtda çox hörmətli bir adama çevrilir. Komandir hazırlıq hissəsindən ön xəttə, cəbhəyə adamları göndərdikcə Nəsib bəyi ləngidir, buraxmır. Rus dilində də yaxşı danışa bilən, qızıl əlləri olan Nəsib bəyə komandanlıq yaxşılıq edir. Səni kim göndəribsə, çox səhv edib. Sənin kimi qızıl əlləri olan adam bizim cavan hökumətimizə hələ çox lazım olacaq deyib, müəyyən sənədlə geri qaytarılır. Belə yerdə deyiblər ki, bəndə çalışmaqla deyil, allah zavaldan qoruyana bəndə heç nə edə bilməz. Nəsib bəy allah verən ömür payını yenə də elinə, xalqına xidmətdə keçirdi.

Həmyerlimiz, xalq şairi B.Vahabzadə Nəsib bəyə öz kitablarından birini hədiyyə edərkən belə bir avtoqraf yazmışdır: -"Azəri qəlbli, alman tərbiyəli Nəsib bəyə".

Oğlu Şaridin dediyinə görə, atasının bişirdiyi pitiyə, paxlavaya söz ola bilməzdi.

Nəsib bəyin oğlanları da özü kimi qabiliyyətlidirlər. Biz onların evində Şaridin öz əlindən çıxan taxta oymaları gördük. O, həm də atası kimi, gözəl diş texnikidir. Ata-baba evini də çox böyük qayğı ilə qoruyur.

Nəsib bəyin digər oğlu mərhum Varid* haqqında da məlumat çox maraqlıdır.

Varid Nəsib bəy oğlu Azərbaycan Sənaye İnstitutunu müvəffəqiyyətlə bitirmiş, yüksək ixtisaslı mühəndis-elektrik ixtisasına yiyələnmişdir. O, ömrünün sonuna qədər Bakı Elektrik lampaları zavodunda şöbə rəisi vəzifəsində çalışmışdır. Varid həm də gözəl musiqiçi, ixtiraçı, memar, konstruktor, səmərələşdirici, bədii metal işləmə ustası, taxta oyma ustası, rəssam və bir sıra ensiklopedik biliyə malik insan, vətəndaş idi.

Etnoqrafik bilgilərdən, oxuduğu kitablardan Varid bilirdi ki, tut ağacı musiqi alətləri üçün davamlı, dəyərli, yaxşı səs çıxımı üçün gözəl materialdı. Özü də həmin materialı qurumuş tut ağacından kəsib götürürlər. Çünki tutu qurumamış kəsmək günah hesab olunur.

Varid qarşısına məqsəd qoydu ki, qalın səsli (bas tar) tar aləti düzəltsin. Bizim musiqi alətləri içərisində qalın səsli tar yoxdur. Azərbaycan milli orkestrində geniş diapazon yaratmaq üçün bu çox əhəmiyyətli ola bilər. Qarşısına qoyduğu məqsədi yerinə yetirir. Onu bir neçə variantda düzəldib, nəticədə çox gözəl və ecazkar bas tar əldə edir.

O, bu tarı yaratdıqda Azərbaycan Dövlət Konservatoriyasının rəhbərliyi, kafedra müdirləri, bəstəkarlar, o cümlədən Cövdət Hacıyev, Süleyman Ələsgərov, Cahangir Cahangirov və başqaları ilə məsləhətləşmiş, aləti onlara nümayiş etdirmişdir. Tarzənlərimiz muğamlarımızı və xalq mahnılarımızı bu alətdə ifa etmişlər.

Azərbaycan xalq musiqi ansamblının bədii rəhbəri, görkəmli musiqiçi, tarzən Əhməd Bakıxanov Dövlət Xalq Çalğı Alətləri ansamblına bas tarı daxil etmişdir. Uzun müddət alət ansamblın tərkibində səslənmiş, yüksək qiymətləndirilmiş, ölkəmizdə və xaricdə çox dinlənilmişdir. Bu səbəbdən o Azərbaycan İxtiraçılar və Səmərələşdirici Təkliflər Cəmiyyətinin diplomunu və müəlliflik şəhadətnaməsini almışdır.



Hazırda tarın əsli bizim Şəki İncəsənət və tətbiqi sənətlər muzeyinin daimi eksponatıdır.

Erkən dünyasını dəyişən Varid onu tanıyanların yaddaşında həmişə yaşar bir simadır. Yaşasaydı nələr yaratmazdı?! Allah rəhmət eləsin!

Nəsib bəyin Fərzəli bəy adlı digər qardaşı barədə məlumatımız az oldu. Təkcə bu məlumatları toplaya bildik ki, Fərzəli bəy Fərzəlibəyov Şəkidə radio stansiyasının ilk rəhbəri olub. Tanınmış rejissor Mərahim Fərzəlibəyov da onun oğludur. Əgər biz onunla əlaqə yarada bilsək, məlumatımız bir qədər də zənginləşər.

**"SARIPAPAQ KƏRIMUŞAQLARI VƏ YA PAPAQÇILAR"** (ktematonim) – papaqçılıq kimi qədim bir el sənətini yaşadan bu nəsil nəinki binə tutduqları məhəllədə, bütöv şəhərdə, qonşu rayonlarda da yaxşı tanınırlar. Nəslin ulu babası Azax dayı, oğlu Kərim, nəvəsi İsmayıl, Əbdülkərim, nəticəsi Qurbanəli, kötükcəsi Aqil də bu sənətin aparıcıları olublar.

Hazırda usta Qurbanəli və oğlu Aqil nəsil ənənəsini davam etdirirlər.

Qurbanəli dayı artıq yarım əsrdən çoxdur ki, ata-baba yolu ilə gedir. Dörd çeşiddə-daqqa, çərkəzi papaq, çatma papaq və qulaqlı papaq tikərək həmişə sifarişçilərini razı salır. Onun hazırladığı məhsullar təkcə Şəkidə deyil, Ağdaş, İsmayıllı, Zaqatala, Qəbələ, Balakən, Qax, Oğuz, Bərdə rayonlarında da şöhrət qazanıb. Yetirmələrindən Ağdaş rayonunda Zeynəddin kəndində Oruc, Zaqatala şəhərində Əli bu peşənin biliciləri kimi tanınırlar.

Qurban dayı işlədiyi müddətdə həmişə öhdəsinə düşən planı artıqlaması ilə yerinə yetirib. Ona görə də bir çox orden və medalları var. Əmək veteranıdır. Gözəl, keyfiyyətli və uzunömürlü papaq sifariş etmək istəyənlər üzünü usta Qurbanəli və oğlu Aqilə tərəf tuturlar.

Aqilin də ata-baba sənətinə olan həvəsi aydın göstərir ki, papaqçılığa, onun sirlərinə dərindən yiyələnəcək, el sənətinin

itib-batmasına imkan verməyəcək. Nəslin də, peşənin də şərəfini ucaldacaqdır.

Usta Qurbanəli dayının atası İsmayıl Kərim oğlu 1896-cı ildə anadan olub. O, Cürcüstanda Qori seminariyasında II kursu bitirəndən sonra davam etdirə bilmədi. Ailədə ona ehtiyac duyulduğu üçün geriyə dönüb ailəsinə dayaq durur. Bir müddət hansısa (dəqiq söylənilmədi) dövlət işində çalışanda təftiş işinə göndərilir. Abdulla Qazıyevlə birgə apardığı bu işdə onlar çox çətinlik çəkirlər. Qanundan kənar işi də, kiminsə evini yıxmaq işini də xisləti qəbul etmir. Həmin vaxtdan o ata-baba sənətində işləməyə üstünlük verir və 1926-cı ildən papaqçılıq edib. Dünyasını 1950-ci ildə dəyişib.

Papaqçı İsmayılın atası sarı rəngli qaragül dərisindən papaq geyinməyi çox xoşladığı üçün adına "Sarıpapaq Kərim" deyilib. Öz zamanında ona börkçü İsmayıl da deyiblər. Papaq mənasında işlədilən börk sözü artıq arxaikləşdiyi üçün işlənmir.

Qurbanəli dayı isə orta ixtisas təhsilli olsa da (kənd təsərrüfatı texnikumunu oxuyub), 12-13 yaşlarından atasının yanında papaqçılıq sənətini öyrənməyə başlayıb.

Bu soy haqqında yazanda Qurbanəli dayının anası Surə xanımın atası və əmisi haqqında da danışmaq lazımdır.

Atası Əkbər ağa və əmisi Əsgər ağa zamanının tanınmış ziyalıları, adlı şəxsiyyətləri olub. Əvvəlcə Qoridə, sonra isə Rusiyada təhsil alan qardaşlar həm də ipək işilə məşğul idilər. Tacir Ağamusanın bu oğlanlarının Peterburq, Novqorod, Kazan, Kislovodsk, Tibilisi, Təbriz, Trabzon, İqdır şəhərlərilə sıx ticarət əlaqələri var idi. Onlar İtaliya və Fransaya ticarət işilə bağlı gedib-gəlirdilər. İndiki ipək kombinatının yerində qardaşların ata-babadan qalma ipək karxanası var idi. Onların bir niyyəti də o idi ki, karxanalarını İtaliya və Fransada olduğu kimi iri ipək fabrikinə çevirsinlər. Ərəb-fars, türk, rus, fransız dillərini də öz ana dillərilə bərabər bilən, qabiliyyət və dünyagörüşləri böyük olan qardaşların buna imkanları da var idi. Niyyətlərini həyata keçirmək istəyi ərəfəsində zaman



dəyişildi, "zati-cır" və "zati-cındır" hökumət quruldu. Karxana onların əlindən alınıb hökumətin ixtiyarına keçirildi. Əkbər ağa repressiya qurbanı oldu. O, həmyerlimiz Əhməd Əfəndi ilə birgə (Məhparə həkimin atası) sürgündə olub. Hər ikisinin sürgündə əzablı ölümündən sonra bəraət kağızı gəlib. Əkbər ağanın başqa ölkəyə getmək imkanı da var idi. Onu istəyənlər ona çox məsləhət bildilər, lakin o, canı qədər sevdiyi elindən ayrıla bilmir.

Əsgər ağa isə müəyyən müddətə qonşu Cürcüstana keçib Telavidə yaşayır. Gözdən yayınıb gizlənə bildiyi üçün yaşaya bilir. Gürcüstanda olduğu müddətdə o, sevdiyi ipəkçilik işindən ayrılmır, Telavidə kiçik bir ipək fabriki yaradır. Qurbanəli dayının dediyinə görə, görkəmi və avadanlıqları təkmilləşdirilən həmin fabrik indi də işləyir.

Tutlhatutun qara yelindən qurtaran Əsgər ağa 1954-cü ildə Bakıda maşın qəzasına düşür, xeyli xəstə yatır, 1955-ci ildə dünyasını dəyişir. Öz karxanalarını işlətdikləri vaxt onun ətrafında Əsgər ağa gözəl bağ-bağatlıq yaratmışdı. Saldığı bağatlıq əslən yuxarıbaşlı olan Dodulu Musa ağanın da bağatlığına yaxın idi. O da ruhən Əsgər ağaya yaxın bir adam idi. Bir-birinə qonşu olan bağların zənginləşməsi üçün həmişə məsləhətləşər aparar, biri digərinə kömək olardı. Hər iki bağın alınmalığı da çox idi. Həmin yerlərə zamanında "Bağbanlar" adı verilmiş, o ad indi də yaşayır.

Əsgər ağa getdiyi çox yerdən alma növləri gətirər, özü də calaq vurar, bağçıları ilə bərabər bağın qayğısına qalardı. Əsgər ağa tutu çox sevdiyindən alma bağına bir tərəfdən şah tut, bedana tut (toxumsuz), qonur tut (şirəsi çox), xar tut da saldırmışdır. O, yayda qurudulmuş tutu xidmətçilərinə üyütdürüb payızda, qışda buğda ununa qatışdırıb çörək bişitdirərdi. Çörəyi də evinin (evi Ağvanlar məhəlləsində olub) quzey hissəsində tavandan asılan sallanmac asılqandan hörmə səbətdə saxladardı. Çörək belə şəraitdə, hörmə səbətdə uzun vaxt təzə və yumşaq qalardı. Üyüdülmüş tut qurusu da çörəyin şirin, ətirli

və uzun müddət yumşaq qalmağına kömək olardı. Həm də belə çörək qış vaxtında zəngin kalorili tut qurusu üyüdülmüşünə görə daha xeyirli olurdu. Bir də ki, o cür zəngin bir ağanın çörəyi tavandan sallanmacda başı üzərində saxlaması nə qədər məsud və təqdir olası bir iş imiş?!

Doğrudur, bu hardasa ənənəvi bir el adətidir. Çörəyi gözünün, başının üstündə saxlayan xalq da, buna riayət edən zəngin bir bəy də nə qədər güclü bir mənəviyyat yiyəsi imiş!

Əsgər ağa əkdirdiyi xar tutun yarpaqlarından körpə vaxtı dolma da bükdürər, qatıq doğramacına da göyərtilərlə birgə tökdürərdi. Faydasını bilirmiş.

Qeyd edək ki, hər iki ağanın bağatlığının meyvələrindən məhəllə camaatına da səxavətlə paylanardı.

Bağın sorağı axarlı-baxarlı vaxtlarında çox yerlərə yayılmışdı. Bağın bağbanları "bu bağın bərəkəti haqqı" deyib and içərdilər. Murad diləyən cavanlar, uşağı olmayan və ya gec olan gəlinlər "dilək ağacı" deyib, alyanaq-gülyanaq meyvə ağaclarına parça qırıqları bağlayıb, meyvəsindən tutiyə təkin dərib aparardılar.

Həmişə də alma bağının ilk nübarını bağban əliylə dərib məhəllənin ən tərbiyəli, işgüzar, qabiliyyətli, gözəl qızına verərdilər. Almaya layiq olan qızın adı da, özü də məhəllədə urvatdı-hörmətdi olardı.

Beləsinin elçisi də vaxtında və yaxşı yerdən olardı. Məhəllə qızları da həmişə çalışardı ki, bir-birindən yaxşı olsun, gələn ilin nübarı da onun adına gəlsin.

Vaxt gəldi, dövran dəyişdi, hökumət də, quruluş da dəyişdi. Gör-götürü olmayanlar, əsli-zatı alilikdən uzaqlar, elin adətini-ənənəsini, yerin-yurdun qaydasını, istəyini bilməyənlər hökumət oldular. Gələn quruluş da adına görə iş gördü, ad qoydu.

Cəh-cəhli, pəh-pəhli alma bağları seyrəldi, qulluq edənləri haqsızlıq gördülər, həvəsdən düşdülər. Sahibləri bir ucdan "kulak" eyləyib gedər-gəlməzə yolladılar. Bu haqsızlıqdan təbiət də qəzəblənib, zaman-zaman selini-suyunu daşdırdı, bağ-bağatı xarabazara döndərdi.



Bu bağların qalıqları da müharibə vaxtı çoxunun dadına çatdı. Oğul-uşaq müharibə aclığını bu bağın son qalıqlarının meyvəsilə dəf edərdilər. İndi də yaşlılardan o yerlərin almaları, şirin meyvələri olmasaydı, acından ölmüşdük-deyib xatırlayanlar var.

Müharibədən sonra da kəndlərdən, gəlmələrdən, Dağıstan əhlindən çox axın oldu. Həmin bağ yerləri kor-koranə paylandı. Selin-suyun ağzından qurtaran bir para ağaclar da kombinatın yeni tikililərinin sahəsinə, ev tikənlərin birinin o birilə sərhəd yerinə, bünövrə, qapı yerinə düşdü deyə, balta ağzına tuş gəldi.

Deyirlər hələ də o yerlərdə ev tikənlərin çoxu tez-tez yuxularında, ən çox da alma yetişən vaxtı üstü dolu alma ağacları görürlər. İstəyirlər ki, əllərini uzadıb dərsinlər, dərə bilmirlər, əlləri çatmır, uzaqlaşır. Ola bilsin ki, həmin alma ağaclarının ruhu küskündür. O yaranış və cənnət meyvəsidir. Onları cərgələrlə 40 ədəd-40 ədəd, 7 ədəd-7ədəd əkən bağbanlar rəqəm sayının müqəddəsliyinə də, almanın əzizliyinə də hörmət edərdilər. Yetişən vaxtı onu qoruyardılar ki, yerə düşən meyvəsi də xarab olmasın. Altına quru ot tökərdilər ki, düşən alma tap olmasın, əzilməsin.

Əsgər ağanın gözəl xəttatlıq qabiliyyəti olduğunu da Qurbanəli dayı danışdı. Onun bir dənə sədri düyüsünün üstünə "Qürfallahı" yazmağı hələ də çox yerdə danışılır. Baramanın köynəyindən mahud parça üzərinə ərəb dəst-xəttilə "Yasin" surəsinin yazılışı (bənd olunaraq) indi də oğlu İlhamın evində saxlanılır. İxtisasca mühəndis olan İlham Sumqayıtda yaşayır, pensiyaçıdır.

Əsgər ağanın 4 oğlu, 2 qızı olub. Oğlanlarından Muxtar Politexnik İnstitutunda müəllim olub, t.e.n. dosent, dünyasını dəyişib.

Məhəmməd də mühəndis olub. 41-ci ilin müharibəsində həlak olub.

Musa adlı oğlu isə gözəl cərrah-həkim idi. O, Mustafa Topçubaşovla birgə işləyirdi, onun sağ əli idi. 47-ci ildə sevdiyi qızı anası ona vermədiyinə görə əvvəl qızı, sonra isə özünü öldürmüşdü. Bu faciəli hadisəyə zamanında M.C.Bağırov da reaksiya verib, qızın həkim anasını işdən çıxmaqla cəzalandırmışdır.

Əsgər ağanın bir qızı Mədinə və oğlu İlham indi çox yaşlıdırlar. Mədinə qızı ilə Bakıda yaşayır, pensiyaçı pedaqoqdur.

Əgər biz Papaqçılar soyunu varaq-varaq yazırıqsa, Qurbanəli dayının doğmaca bibisindən Mədinə xala və onun oğlu əfsanəvi həkim Vəhyəddin Səlimovdan danışmamaq çox böyük qəbahət ola bilər.

Mədinə xanımın əri sövdəgər Salman çox yaraşıqlı, hündürboylu, enlikürək bir kişi olub. O, qonşu rayonlarda, xüsusən Zaqatalanın Zeynəddin, Almalı kəndlərində ticarətlə məşğul olub. Yaraşıq verdiyi bu bəndəsinə tanrı naxış qisməti verməyib. Vəhyəddin oğlu uşaq ikən, Salman oğlu dünyaya gəlməmişdən ata Salman qəfildən vəfat edib. Uşaqlar dayıları papaqçı İsmayılın himayəsində böyüyüblər. Lakin müharibə boy-buxunca, yaraşıqca atalarına çəkən bu iki qardaşı çox keşməkeşlərdən keçirdi. Salman qəhrəmancasına həlak oldu. Vəhyəddininsə talc burulğanlarına diqqət verək.

1941-ci ildə Azərbaycan Tibb İnstitutunun müalicə-profilaktika fakültəsini bitirən gənc həkim elə həkimliyinə hərbi xidmətdə başlayır. Alay həkimi kimi uzun müddət işləyə bilmir. Müharibə başlayır. Bu işini 42-ci ilədək apara bilmir. Əsirlik həyatında 42-ci ildən 44-cü ilədək Polşada, Almaniyada, Fransada hərbi əsirlərin qospitalında cərrah işləyir. Əsirlikdən qaçıb, 44-45-ci illərdə Fransada Lüpi şəhərində partizan dəstələrinə qoşulmuşdur.

Sonralar 45-47-ci illərdə Fransadakı SSRİ vətəndaşları üçün qospitalın rəisi, ixtisaslaşdırılmış düşərgədə həkim-cərrah işləmişdir.



Müharibə qurtardıqdan sonra V.Səlimovun doğma Şəkiyə qayıtması çox dolanbac yollardan keçmiş, maneələrlə dolu olmuşdur. "Əsir" ləkəsi vurub, onu doğma xalqına, elinə qovuşub, xidmət etməyinə mane olurdular. 47-ci ildən 55-ci ilədək onu müxtəlif yerlərdə sürgün həyatı keçirtməyə məcbur etdilər. Məqsəd bir idi. Belə qeyri-adi istedad yiyələrinin qıranını qırdılar, qalanlarını isə həyatdan bezdirmək istəyirdilər. Onları öz xalqına yaxın buraxmayıb, millətinin gələcəyi naminə çalışmağa qoymurdular.

Dağ vüqarlı eloğlumuzun vətənə gəlişi çox çətin oldu. O, iki il Tacikistan SSR-nin Leninabad vilayətindəki Proletarsk şəhərində, 6 il Arxangelsk vilayətinin Plitseyski şəhər xəstəxanasınnda, bir neçə vaxt isə Kiyev və Moskva şəhərində həkim-cərrah kimi çalışmışdır.

14 illik həsrətdən sonra 1955-ci ildə V.Səlimov doğma elinə, oğullarının həsrətlisi anasına, qohum-əqrabasına qovuşdu. Özü ilə birgə gətirdiyi Tatyana Andreyevna Braginanı anası Mədinə xalaya gəlini təkin təqdim etdi. Anaya çətin də olsa qəbul etməliydi. Onu Vəhyəddin gətirmişdi. Özü də oğlu salamat gəlmişdi. Ananı qəm qarışıq sevinc bürümüşdü. Onun qəlbi dilini-dinini bildiyi el qızından gəlin istəyirdi, qəmi bundan idi. Sevinci ondan idi ki, Salmandan ağlayan gözü Vəhyəddindən gülmüşdü.

Vəhyəddin həkim Şəki Mərkəzi xəstəxanasından, fəaliyyətə başladı. Cərrahiyyə şöbəsinin müdiri, sonra isə rayonlararası baş cərrah olan "əfsanəvi həkimin" 51 il ərzində bıçağı dəyən hər bir xəstə sağaldı, "öldü" sözü olmadı. Bıçağından əzrayıl qorxan həkim haqqında olmuş hadisə-rəvayətlər danışıldı, şöhrəti günəş şüaları tək yayıldı. Haqqında şerlər yazıldı, hiss-həyəcanlı minnətdarlıq məktubları çap olundu. Onu Allah vergili adam kimi tanıdılar. Səs-səda, nəticələr dövlət tərəfindən də qiymətləndirildi. Dəfələrlə Səhiyyə Nazirliyinin fəxri fərmanına, "səhiyyə əlaçısı" döş nişanına, Qırmızı Əmək Bayrağı ordeni və medallarla mükafatlandırılıb.

Yaşamaq ümidini itirmiş neçələrinə həyat bağışlayıb, ölüm kəndirini cərrah bıçağı ilə kəsən əllər yiyəsi 1992-ci il avqustun 2-də dünyasını dəyişir. Şəki və ətraf rayonlar, mərhumu tanıyıb qiymətləndirən hər bir ailə ona uzun müddət yas saxladı. Çünki o elə, el də ona bağlı idi. El loğmanının övladları da onun adına, şərəfinə layiq böyüdülər.

Oğlu Səlim Səlimov tex. elm. nam., hazırda Təfəkkür Universitetinin prorektorudur.

Böyük qızı Elmira Bakı 1 saylı Klinik xəstəxanasında şöbə müdiridir.

Kiçik qızı Rəna Bakıda 141 saylı orta məktəbdə kimya müəllimidir.

Ümumiyyətlə, bu soyun fəxr etməli övladları hər zaman mövcud olub. Əkbər ağanın özündən nə qədər qürurla danışırıqsa, eləcə də onun qızı, nəvəsi və nəticələri barədə də ürək dolusu danışmaq istəyirsən. İndi nəinki Şəkidə, respublikada və ondan kənarlarda belə Əkbər ağanın varisləri həkimlər ailəsi təkin tanınırlar.

Əkbər ağanın 1923-cü ildə anadan olmuş qızı Yaqut xanım Məmmədova milli Urologiya elmimizdə yeni cığır açıb, təməl qoyan mütəxəssislərdən olub. 10 illik gərgin zəhmətlə, hər ilin yay məzuniyyət dövrünü şəhərbə-şəhər gəzməklə Azərbaycanda uşaq böyrək xəstəliklərinə aid ilk tədqiqat əsərini yaratdı. Bu müddət ərzində özü ilə həmsənəd olan əri Bakı Tibb Texnikumunun direktoru Ələfsər Hüseyn oğlu Quliyev də Yaqut xanıma işində və ailədə çox böyük dayaq oldu.

Həmin müddətdə (1960-cı illərdə) Respublikada uşaq nevralgiyası ilə ciddi məşğul olan klinika və mütəxəssislər demək olar ki, yox idi. Leninqrad Pediatriya İnstitutunun kafedra müdiri A.A.Valentinovun köməyi, professor M.C.Cavadzadənin Bakıya qayıtması Yaqut xanıma çalışdığı təzə sahədə, bütövlükdə Azərbaycan urologiyasının inkişafında yeni mərhələnin başlanmasına səbəb oldu. İlk qadın uroloq kimi Respublika Klinik Uroloji müalicəxanasında uşaq şöbəsinin müdiri işləmişdir. Şəxsiyyəti və qabiliyyəti ilə fəxr etdiyimiz professor Yaqut Əkbər qızı 1978-ci ildə dünyasını dəyişmişdir.



Onun elmin bu sahəsində işləyən oğlu Rauf həkim daha çox uğurlar qazandı. Müasir dünyanın texniki imkanları, yeni kəşfləri Rauf həkimin qabiliyyətinin üstünlüklərini üzə çıxarmağa kömək oldu.

R.Ə.Quliyev 1986-cı ildə Leninqrad Pediatriya Tibb İnstitutunda akademik Q.A.Bairovun uşaqlarda irinli septik xəstəliklərin müalicəsində ultrasəs kavitasiyasının tətbiqi məsələlərinə həsr olunmuş namizədlik dissertasiyası müdafiə etmişdir. 1987-ci ildən Azərbaycan Tibb İnstitutunun cərrahiyyə kafedrasında dosent vəzifəsində çalışıb. Bu dövrdə onun elmi tədqiqatı istiqamətində müxtəlif məqalələri nəşr olunmuş, ombanın anadangəlmə çıxığının müalicəsi üçün şina patentləşdirilmişdir.

R.Ə.Quliyev 1992-ci ildə akademik V.K.Qostişevin rəhbərliyi altında şəkərli diabet xəstələrində irinli-septik xəstəliklərin müalicəsi məsələlərinə həsr olunmuş doktorluq dissertasiyası müdafiə etmişdir.

Respublikada ilk dəfə qanın intrakorporal ultrabənövşəyi şüalandırılmasını (1987), lazer-skalpeli (1988) və irinli boşluqların sorbsiya lavajını (1990) tətbiq etmişdir.

Peritonitin İNTERNET-də konsultasiyalı təhlili ilə müalicəsi zamanı qarın boşluğunun teplovizion ON-LİNE müşahidəsini (1998) işləyib hazırlamışdır.

R.Ə.Quliyev Ə.Əliyev adına Azərbaycan Dövlət Həkimləri Təkmilləşdirmə İnstitutunun Cərrahiyyə kafedrasının professorudur. 2002-ci ildən o, Azərbaycan Dövlət Neft Şirkətinin baş cərrahıdır. Neftçilər Mərkəzi xəstəxanasında Cərrahiyyə bölməsinə rəhbərlik edir.

Professor Vətənin tibb elmini yaxın və uzaq ölkələrdəki qurultay, simpozium və konfranslarında dəfələrlə təmsil etmişdir. O, "Ultrasəs Tibbi Beynəlxalq Assosiasiyasının", "Avropa Cərrahiyyə Assosiasiyasının", "Moskva Cərrahlar Cəmiyyətinin", "*Lasers in Medical Sciense*" (London) jurnalının redak-

siya heyətinin üzvü, "*MedWeb,*" Beynəlxalq Tibb İnternet jurnalının da üzvüdür.

Xanımı- Səmədova Elvina Zahid qızı həkim-anesteziloqdur. Oğlu, Anar Quliyev cərrah və proqramçı ixtisasları üzrə iki ali məktəb bitirmişdir. Qızı, Lalə Quliyeva Azərbaycan Tibb Universitetinin tələbəsidir.

**"HACI CƏLILLƏR"** (patronim) – haqqında danışacağımız bu soy da Şəkidə öz sanballı, böyük nüfuzu ilə tanınan çox hörmətli nəsillərdən biridir. Bu nəslə **"Qozdağarlar"** da deyirlər. Bu, Hacı Cəlildən qabağa onun ata-babalarına deyilib. H.Cəlilin qız nəvəsi Niymət Məhəmməd oğlu Əhmədovun açıqlamasına görə, ulu babasından öz babası Hacı Cəlilə də, dayıları Ağa Həsənə, Mabud ağaya da savadlı, uzaqgörən, tədbirli, hər bir çətin, müşkül məsələdə ağıllı nəticə çıxarıb vəziyyətdən çıxmağı bacardıqlarına görə, var-dövlətlərini məhz bu səbəbdən əldə etdiklərinə görə onlara bu adı veriblər. İçi dolu və ləzzətli, qiymətli olduğuna görə qoz da belə dəyərləndirilir. Şəkidə də başı qiymətli adamın düşüncəli qafasını elə özlərinin ləziz təamı qozla bir dəyərləndirib, yüksək qiymət verirlər.

Hacı Cəlil kişi çox qabiliyyətli ticarətçi olub. O, Rusiyadan taxta-şalban gətirdər, oradakı müttəfiqinə də buradan ona lazım olan mallardan aldığı dəyərdə göndərərdi. Daha indiki taxta-şalban alverçilərinin çoxu kimi meşələrimizin anasını ağlatmazdı.

H.Cəlilin taxta-şalban yükünü bir dəfə sel gəlib aparır. Fəhlələr deyirlər ki, bəs ay ağa, sənin mallarını su başıaşağı aparıb, görən də götürür. H.Cəlil deyir ki, ehtiyacları var aparırlar. Göz qabağında olanları yığın, götürənlərin də halal xoşu olsun.

H.Cəlil tabeliyində olan kəndlərin də camaatına çox insaflı olub. Yetişən məhsuldan rəncbərlərin ailəsinə elə pay ayırardı ki, gələn məhsulacan onların ehtiyacı olmasın.



H.Cəlilin mülkü alt-üst 14 göz olub. Mülk ənənəvi xalq memarlığı üsulu ilə, bütün ata-baba qaydaları nəzərə alınmaqla tikilib. Bütün otaqların da hər birində ayrı-ayrılıqda üst-üstə salınmış 12 ədəd xalısı olub. Evin qızı Füruzə xanımın övladına söylədiyinə görə çoxlu sayda da ipək xalçaları olub.

İldə bir dəfə evin təmizlənməsi üçün H.Cəlil tabeliyində olan kəndlərdən qadınlar göndərərdi. Onlar təmizlik işlərini qurtaranda H.Cəlil onların illik taxıl payını, ərləri rəncbərdirsə, onların da payını iki qat edərdi. Qadınlara həmçinin pal-paltarın, paltarlıq parçanın, ayaqqabı və corabları, şala tutmuş qədər təzəsini alıb verərdi.

H.Cəlilin iki qızı və iki oğlu var idi. Oğlanları Mabud ağa da, Ağa Həsən də hər ikisi Peterburqda ali təhsil alıblar. Mabud ağa Peterburq Universitetində çox adlı tələbə olub. Heyranedici savadı, ali tərbiyəsi, gözəl insanlığı, göyçək siması, boy-buxunu onu hamının diqqət mərkəzində saxlayardı.

Mabud ağa birinci kursda təhsil alarkən yuxarı kursların dərs proqramlarını oxuyub, mənimsəyirdi. Fitri istedadı ilə tanınan Mabud ağanı Peterburqda çar Nikolayın baş bankının müdiri vəzifəsinə qoyurlar. Özünün iqtisadi biliyi ilə, işgüzarlığı, saflığı ilə bankın işini qibtəedici dərəcədə gözəl aparırdı. Başını o zamanlar kompüter təkin işlədən Mabud ağanın beyni tezliklə psixoloji yorğunluğa tablamır, əsəbləri zəifləməyə başlayır. Səhhətində olan nasazlığı hiss edən Mabud ağa hər şeyi qoyub, qəfilcə Vətənə dönür. Peterburqdan onun ardınca xəbərdarlıq məktubları, teleqramlar gəlir. Artıq xəstə olduğu halda məktublar yazır, yazdırır, ancaq xeyri olmur. Ondan əl çəkmirlər. Mabud ağa məcbur olub, məktub, teleqram yolu ilə bankın işlərinə kömək edir. İnanmadıqları üçün Peterburqdan gəlib yoxlayırlar. Görürlər ki, həqiqətən Mabud ağa yataqdadır, onlara köməyi də xəstə vəziyyətdə edirmiş.

Az müddətdən sonra Mabud ağa rəhmətə gedir. Onun dəfninə Peterburqdan çoxlu adamlar gəlir. Hətta onlar belə bir təklif də edirlər ki, mərhumun bədənini siz dəfn edin, başını biz

aparaq. Bu təklifi edənlərə astaca başa salırlar ki, onun atası sizi buradan Peterburqa qədər piyada qovar. Bu sözü təkrar etməyin. Mərhumla belə rəftar bizim adətlərimizə uyğun gəlmir.

Ağa Həsən təhsilini bitirəndən sonra atası onun üçün Şəkiyə mətbəə avadanlıqları (19-cu əsrin axırı-20-ci əsrin əvvəllərində) gətirdir. Ağa Həsən işləməyə başlayır. Sovet hökuməti gələn kimi uzaqgörənliklə sakitcə mətbəəni hökumətə təhvil verir. Savadı olduğuna və bir neçə dil bildiyinə görə təzə hökumət onu şəhərə böyük qoymaq istəyir. O, etiraz edir. Hökumət işçisi kimi mətbəəni işlətmək arzusunda olduğunu deyir. Lakin onu bu işdə çox qoymurlar. Onu zorən bölgə üzrə NKVD-nin rəisi qoyurlar. Bu işin xüsusiyyətini bildiyinə görə etiraz edir ki, mən heç kimi tuta bilmərəm. Yenə də onun etirazına məhəl qoyulmur. 30-cu ilin çevriliş üsyanı vaxtı o evdən heç bir gün də bayıra çıxmır. Gəlib onu evdən zorla aparırlar. Hərtərəfli savada, düşüncəyə, milli şüura malik ziyalı bir şəxsiyyəti təbiidir ki, siyasəti bəlli hökumət sağ qoymazdı. Ağa Həsən o gedən getdi.

Hacı Cəlil ağanın Baxşı adlı bir bacısı da vardı. Adına "goburnat Baxşı" deyərdilər. Bu qadından danışıldıqca istər-istəməz bəşər tarixinin nisbətən az öyrənilmiş mərhələlərindən olan madərşahlıq-qadın hakimiyyəti dövrünün qadınları- amazonları düşünməyə bilmirsən. Dahi Nizami Gəncəvi "İsgəndərnamə" əsərində isə onları amazon yox, "hərum", yurdlarının adını Bərdə qoymuşdur (qadınların hakim olduğu ölkəni yunanlar amazon adlandırırdılar). Və o burada qeyd etmişdir ki, yurd-ölkə mənasında Bərdə keçmişdə Hərum adlanmışdır. Qadın hakimiyyətinin də Dərbənd dənizindən İsfahanadək, təxminən Azərbaycan xalqının təşəkkül tapdığı böyük ərazini əhatə etdiyini göstərir. Elə onun yaratdığı Nüşabə, Məhin Banu, Şirin surətləri Azərbaycanda ana-madərşahlıq cəmiyyətinin nümayəndələri olan qadınlardır.

Goburnat Baxşı böyük bir ölkənin idarəedicisi deyildi. Qardaşı Hacı Cəlil ağa dolanışığının daha da yaxşı olması



naminə ixtiyarında olan kəndlərdən bir neçəsinin idarə edilməsini, məhsul əkininə, yığımına nəzarətin ixtiyarını da, qazancın götürülməyini də ona həvalə etmişdi.

Baxşı da Baxşı olub. Boy-buxunlu, cüssəli, yar-yaraşıqlı, çox zabitəli, qorxmaz, tədbirli, 100 ağciyər kişiyə dəyən qadın imiş. Uçar quşu gözündən vura bilən sərrast atıcılığı varmış. Kəhər atın belinə minib, beş atılan aynalını da çiyninə aşıranda deyərdin bəs, Nəbinin Həcəridi ki, durub. Dövrünün qaçaq-quldurları da ona yaxın durmayıb. Gözündə heç nəyin qorxusu olmayan Baxşı gecələr ay işığında kənddən şəhərə gələrdi. Özü də , atı da yolda istidən təntiməzdi. Çox az hallarda gündüzlər şəhərə gələrdi. Çünki məhsul yığımı vaxtı həm iş çox olurdu, həm də hava isti olurdu. Belə qorxmazlığına, mərdanəliyinə, görkəminə, tək əllə gözəl, sərrast atıcılığına, axşamacan da at belində olduğuna görə adına Goburnat Baxşı deyərdilər.

Hacı Cəlil ağa Baxşının da bir oğlu Məcid bəyi öz oğlu Ağa Həsənlə birgə Peterburqda oxutdurmuşdur. Oğlu kimi bu bədbəxt cavan da biliyindən yarımadı. 37-ci ilin qara yeli onun da həyatına son qoydu.

Hacı Cəlil ağanın 1900-cu il təvəllüdlü qızı Füruzə xanım 80 yaşında vəfat edib. O da çox xanım-xatun, hökümlü, ərəbi-farsı gözəl bilən, Quranı kamil öyrənən, ləyaqətli bir şəxsiyyət olub. O, ölüncə yaxın qohum-əqrəbalarının, qonşularının baş məsləhətçisi, ağbirçəyi olub. Bu bəyzadə xanımın həmişə yeyib-içdiyi ləziz müsəlmani xörəklər olub. Az da olsa, heç vaxt bir mövsümün yeməyini o biri fəslin yeməyinə qatmazdı.

Füruzə xanım, ata evinin oğlanları vəfat etdiyinə görə, yurdun işığın yandıran yeganə varis olmuşdur.

Füruzə xanım 41-ci ilin müharibəsinə qədər çölə-bayıra çıxanda sırf milli geyimdə və bəzəkdə çıxmışdır. O məhəllədə və ya qonşu məhəllələrdə toya, gəlin görməsinə gedəndə üzünü görməmiş, lavada və köynəyindən sallanan qızıl onluqların, midaxılların zərif cingiltisindən bilirdilər ki, gələn odur. Hamı özünü yığışdırar, oturmağa yeri hazırlanardı. Yasda Quran

oxuyana da xəbərdarlıq edərdilər. Füruzə xanım burdadı, səhv oxumayasan, diqqətli ol!

Füruzə xanımın atası Hacı Cəlil sovet hökumətinin toz-tozanaqlı gəlişinə, bəyzadələrə edilən zülmlərdən agah olduğuna görə onların üzlərini görmədən ötən əsrin 20-ci ilində ürəyi partlayıb öldü. Onun ölümündən sonra Ağa Həsən tutuldu və mülkü yağmalanıb, müsadirə edildi. 31-ci ildən sənədlə 2 dəfə müsadirə olunan mülkün çox kiçik bir guşəsində yaşayan Füruzə xanım illər uzunu Moskvaya yazıb. Nəhayətdə ata evini müharibədən qabaq Kalininin göstərişilə geri qaytara bilib.

Füruzə xanımın oğlu Niymət Əhmədov söyləyirdi ki, anam evimizin müsadirəsindən belə danışırdı: "Şişpapaqlı, əyin-başları çirkli, qoxulu, çəkmələri cırıq, gözlərindən aclıq yağan silahlılar idi. Üstlərində gələn də özləri kimiydi. Acgözlüklə hər otaqda olan 12 xalını, yük yerlərindəki, divarlardakı xalıları bir-birinə ilişgələnib, boru kimi bükülmüş namazlıq, hədiyyəlik ipək xalçaları, yorğan-döşəkləri, mebelləri, künc-bucaq, aşkarda nə var hamısını yığıb apardılar. Yaxşı ki, əvvəlcədən özüm həyətin barı dəliklərinin dərinliklərinə gizlədə biləcəyim qədər qızıl qaşıq və çəngəllər, bəzəklər qoymuşdum. Sizləri elə onları xırda-xırda kəsib-doğrayıb, toz eləyib, aparıb zərgərlərə satıb böyütmüşəm. Müharibə vaxtı biz aclıq görməmişik. Yadımdadır 46-cı ildən 54-cü ilə qədər də əhalinin vəziyyəti pis olub. Anam həmişə günötrə məhəllə cavanlarını yığıb süfrə açardı. Birdən süfrəyə 15-20 çörək qoyardı. Dadlı-tamlı yeməkləri yeyən cavanlar dua-alqışlarla çıxardılar. Anam da "canınıza nuş olsun" deyib, həmişə mehribanlıqla yola salar, növbəti gün nə istədiklərini soruşardı. Onlar çıxandan sonra da deyərdi: "Qırıb tökdülər hamısını, indi bu cavan pöhrələrin üzünə baxırıq. Bunlarnan artıb çoxalasıyıq".

Füruzə xanım çətinliklə saxladığı ata mülkünü imkan olduğu halda tək öz adına qeyd etdirmədi. Nəfsi tox, tamahkar deyildi, haqq-ədalət tərəfdarıydı. Evi atasının 3 övladı- qardaşı Ağa Həsənin (onun öldü-qaldı xəbərini bilmirdi, tutub aparmışdılar. Mərhum o gedən getdi) və bacısı Səltənətin və özünün adına yazdırdı. Qonşu diş həkimi, həm şəhər sovetinin sədri Qasım Hacı Məmməd oğlu həmişə hər işdə onunla məsləhətləşərdi. O deyəndə ki, bu ev sənin üçün tam halaldı, illərlə yazdın, geri çəkilmədin, evi qaytara bildin. Gəl adına yazaq, bu iş qurtarsın. Füruzə xanım isə özü dediyini etdi: "Başımızın üstə Allah görür mənim atamın 3 övladı var, Ağa Həsəni də öldüyə çıxa bilmirəm. O cür cavanəzənin öldüsünə inanmıram".

Çox təəssüflər olsun ki, bu cür soya məxsus binanın müəyyən hissəsi sonralar Füruzə xanımın bacısı Səltənət və oğlu tərəfindən tamamilə kənar, yad adamlara satıldı. Füruzə xanım isə həmişə bu haqda düşünür və çox kədərli fikirlərə dalırdı.

Füruzə xanım həmişə həzin səslə, gözəl Quran oxuyardı. O, dini təhsilini məhəllənin gözəl bilici xanımı, evinin birini mədrəsə kimi saxlayan Molla Tutudan almışdı. Hər ay ərzində 30 cüz oxuyardı. Sovet məktəbində oxuyan nəvələrini də dizinin dibində oturdardı ki, qulaqları alışsın, böyüyüncə Quranın nə olduğunu bilsinlər. Füruzə xanım həm də gözəl lavada tikmək ustası idi. Çaşquru, lavadanı, araxçını sevə-sevə tikib, körpə olanda nəvələrinə geyindirərdi. Gəlinə deyərdi ki, qızım, müsəlmanı geyim həm rahat, həm də sağlamlıqdır. Yundan, ipəkdən olan bu geyimləri unutmayın.

Ata evinin həyətində bir vaxtlar 2 hissəsi kənar adamlara satılmamışdan qabaq gözəl meyvəlik olub. 27 ağac növbənöv ata-baba armudları, 19 ağac indi olmayan alma növləri, 12 ağac müxtəlif çeşidli əncir, atbaş heyva, Qəzvin alçası var idi. Füruzə xanım heç vaxt bu meyvələri tək yeməzdi. Məhəllə camaatının da qab-qab xüsusi payı olardı.

Oğlu Niymət Əhmədovun söylədiyinə görə, uşaq idim. Şəhərdə olan alman əsirləri yoldan dəstə ilə malını oxuya-oxuya gedərdilər. Anam meyvə vaxtı qapı ağzına çıxıb mənimlə birgə onları işarəylə çağırardıq. Onlardan həmişə hər dəfə də müxtəlif

adamlar 2 nəfər ayrılar, salam verərdilər. Anam yenə də əl işarəsilə meyvələri göstərərdi. Əsirlərdən də həmişə gələn iki nəfərdən biri qapı ağzında sakitcə dayanar, o biri isə əlindəki torbaya, ya da köynəyinin ətəyinə, ciblərinə, qoltuğuna ağacın üstündən yox, altına tökülmüşlərini yığıb gedərdi. Mən uşaq olsam da həmişə mənə xoş gələrdi ki, biz dəvət edəndə gələn əsirlər əvvəlcə ehtiramla salam verir, ikisi birdən qapıdan acgözlüklə dürtülmür, biri sakitcə yol qapısında gözləyir, digəri isə ədəblə içəri girib, heç başını yuxarıya, meyvə ağaclarına tərəf qaldırmadan, altındanca əli, cibi, qoltuğu tutunca yığıb ehtiram edərək də çıxardılar. Anam həmişə deyərdi ki, "vallah nətəri də olsa, habı millətdə əsilzadəlik var".

Yeri gəlmişkən, bu fikirlə bağlı bir haşiyə də çıxaq. Niymət Əhmədov deyir ki, 52-ci ildə oxuduğum kitablardan yadımda qalıb.

Osmanlı türkünün günbatandan, gündoğana qədər at çapıb, qılınc oynadan vaxtlarında Kral Almaniyasına da hücum edirlər. Gözə görünəni, müqavimət göstərəni qırırlar, dağıdırlar. Vəziyyəti gərgin görən Kral adamlarından biri çığırır: Bəs edin, dayanın, Siz Allah, dayanın. Sağ-solu biçən türk əsgərləri Allah sözünü eşidən təkin əl saxlayırlar. Başçı tez əsgərlərə əmr verir ki, əl saxlayın, atdan düşün, sökülənləri tikməyə başlayırıq. Xəbər gedib Krala çatır, bəs Allahın adını çəkməklə onlar savaşdan əl saxladılar, sökülənləri tikməyə başladılar. Bu nə qəribə, nə qeyri-adi, heyranedici xalqdır.

Vaxt keçir, Kral yaxşılığın əvəzi olaraq özünün yeganə qızını boynuna qırmızı bağlayıb Sultana Qurban bayramında hədiyyə göndərir. Sultan gələnləri böyük hörmət və izzətlə qarşılayır. Mətləbi biləndən sonra əl altından Krala oğlu üçün (yəqin ki, Yeniçəri Əli üçün) elçilər göndərir ki, qızının oğlum üçün xanımı olmağına icazə verərmi?

Bu dərəcədə iltifat və hörmətdən heyran qalan Kral məmnunluqla razı olur. Həmin vaxtdan almanlarla türkün bu günəcən olan qədim dostluğunun təməli qoyulur.



Niymət Əhmədov iki hadisə də danışdı. Şəhərimizdə dülgər Niymət adlı birilə o dostdur. Həmin Niymətin danışdığına görə müharibədə əsirlikdən qaçıb, partizanlara qoşulub. Deyir ki, mən özüm də almanlarla türkün yaxınlığın bilirdim, eşitmişdim ki, onların bel kəmərlərində "Allah bizimlədir" sözləri var, ancaq görməmişdim. Berlində küçə döyüşləri vaxtı mən həyatımı təhlükəyə qoyub, sürünə-sürünə ölən almanlardan üçünün kəmərini açdım və o sözləri görüb, oxuyub, inandım.

N.Əhmədov bir də onu danışdı ki, 1999-cu ildə karvansaraya gələn turistlərin içində çoxlu yaşlı almanlar da vardı. Biz də yay vaxtı karvansaraya yaxın yerdə-Bazarbaşının giməsində oturmuşduq. Tərcüməçi də, onlar da bizə yaxınlaşıb dedilər ki, bəs biz vaxtı ilə burada əsirlikdə olmuşuq. Qaldığımız yerləri bir daha görmək istəyirik, ancaq unutmuşuq. Mən onlara dedim ki, gedək mən Sizə göstərim ki, Sizin qaldığınız yerlər hara olub.

Mən onlara Qalanın qabağındakı 2 mərtəbəli özləri tikib, özləri qalan yaraşıqlı, səliqəli, biçimli binanı göstərdim. Qalanın içindəki indiki muzey binasını, Dolçalar məhəlləsindəki 2 mərtəbəli indi iranlılar oturan binanı göstərdim tanıdılar. Kövrəlib ağlayanlar da oldu. Onlar dedilər ki, biz burada olanda Şəki camaatı bizə xeyli kömək edib. Biz onlardan razı getdik. Onlar bir hadisəni də danışdılar ki, bəs dağdan ağ torpaq qazıb aparan bir qadın uçan qayanın altında qalmışdı. Onun cəsədini biz çıxardıq, adamlarına verdik. Biz hamımız onlar söyləyən hadisəni təsdiq etdik ki, bəli belə hadisə olub, indi də camaatın yadındadır. Onlar bizdən çox səmimi ayrıldılar.

N.Əhmədov deyir ki, çoxları kimi mən də alman mədəniyyətinin, səliqəsinin heyranıyam.

Bakının Primorski qəsəbəsində Qaradağ sement zavodunun vaxtilə almanlar (əsirlər) tikən turbaları da var, ondan sonra tikilən də var. Almanlar tikən turbaların yaxınlığındakı binalara da, orada dayanan maşınların da üstünə sement tozu tökülmür, amma di gəl ki, bizimkilər tikən turbaların yaxın-

lığında maşın da saxlamaq olmur, binalara da kül kimi sement ələnir. Alman dəqiqliyi burada da özünü göstərir.

Hacı Cəlil ağanın xarakteri, sambalhğı ilə bağlı söz-söhbətlər çoxdu.

Yaxınlıqdakı Xan məscidi mədrəsəsinin uşaqlarının illik kitab-dəftəri, qələmi və əyin başlarını Ramazan bayramında təzə-təzə alıb verərdi. Hamballar bayram süfrəsi üçün bazarlığı gətirib verərdi.

Hacı Cəlil ağa ilə qonşu Hacı Süleyman bəyin (Sədullah həkimin babası) arasında narazılıq olur. Belə ki, H.Cəlil ağa H.Süleyman bəyin alt məhlədəki qohumunun həyətyanı sahəsindən pul verib yol üçün yer alır. Həmin yolu da camaat üçün açdırır ki, yayın istisində, qışın soyuğunda qonşu məhəlləyə keçmək üçün uzaq yolu hərlənib getməsinlər. H.Cəlilin açdırdığı həmin el yolu aşağı məhəllələrin çoxuna keçid üçün çox əlverişli olur. H.Süleyman onun qohumuna "dəydiyi" üçün H.Cəlillə aralarında mənasız bir küskünlük baş verir.

Vaxt gəlir H.Süleyman evində qonaqlıq edir. Cümlə simsar bəyləri qonaqlığa çağırır, qonşuluqdan Hacı Cəlil ağanı isə dəvət etmir. İşi belə qəliz görən H.Cəlil ağa qonaqlar gəlməmişdən qabaq gedib H.Süleymanın evində stol başında oturur. Qonaqlıq olur, hamı dağılışandan sonra gəldiyi kimi də gecdən-gec, tək-tənha evinə qayıdır. H.Süleyman anlamır ki, qonşusu niyə belə etdi. Məcbur olur ondan soruşur ki, Hacı, bu nə gəliş, nə gediş oldu? H.Cəlil özünəməxsus müdrikliklə deyir ki, ay Hacı Seleyman, burda anlamiyəsi nə var ki? Biz də bir adımızın yiyəsiyik, axı! Qonşu ola-ola niyə artıq-əskik adamlar bilsin ki, bizim aramızda mənasız küskünlük var. Sən özün anladığın kimi iş gördün, mən özüm anladığım kimi. İndi çək-çevir elə görək hansı düzdü?

H.Süleyman səhvini başa düşüb, H.Cəlilin evinə gəlib ondan dönə-dönə üzr istəyir.

Bir ibrətamiz hadisəni də atasından eşidən Fïruzə xanım oğluna danışıb: H.Cəlil ilə Hacı Məmmədsadıq Əliyev çox



yaxın olublar. İndiki müəllimlər evi, ona bitişik digər otaqlar H.M.Əliyevin kontoru-mühasibatlığı olub. Kontorda xam ipək tayları ilə bərabər ağzı çirmələnmiş kisələrdə 5-lik, 10-luq türk lirələri, imperialı olurdu. (imperial 6 yarım və 7 yarım da olurdu).

Pul xırdaladanların da çoxu banka yox çox vaxt onun kontoruna gələrdilər. Həmin binanın üstündə də o zamandan rus əlifbası ilə "Potent Possii" sözləri həkk olunmuş mis lövhə durur.

Şəhərin bu iki adlı Hacıları vaxtaşırı bu kontorda görüşər, məsləhətləşər, dünya söhbəti edərdilər. Belə günlərin birində çox sadə geyimli bir adam başını içəri salıb, Hacı, olar Sizə bayırda iki kəlmə sözüm var. Hacı da özünün birilyant qaşla, qara minalarla bəzədilmiş əsasını da əlinə alıb bayıra çıxır. Sadə adam qoltuğundan bükülünü açıb, təzə çarıqları ona verir ki, bəs Hacı mən bunu Sizə nəzir demişəm, qəbul etsəz, çox sevinərəm.

Hacı hörmətlə çarıqları götürüb "Allah qəbul etsin" deyir. İçəriyə gəlib, nəziri ehtiramla bir tərəfə qoyur və mənə deyir ki, sağ olsun, allahın müsəlman bəndəsi mənə nəzir edib, allah qəbul etsin. Mən də öz növbəmdə "allah qəbul etsin" dedim. Və biz yenə söhbətimizə başladıq. Aradan bir saat keçdi. Hacı Məmmədsadıq Əliyev söhbət edərkən ətrafa diqqətlə baxırdı. Əl edib kimisə çağırdı. İçəri girən adama dedi ki, al gey görək ayağına gəlir. Öküz gönündəndir, çox qabiliyyətlə tikilib. Geyinən adam dedi ki, Hacı lap ayağımadır. Hacı "çox gözəl" deyib cibindən bir qızıl onluq da çıxardıb verir ki, bunu da Daşlı bazarda xərclik et. Verilənləri qəbul edən adam dualarla qapıdan çıxır. Hacı belə Hacıydı.

Belə Hacılar Allahdan sonra camaatın sığındığı, güvəndiyi kəslər idi. Belə Hacılar Şəkidə çox idi. Ona görə də Şəkiyə "Hacı dayılar" deyərdilər. Bir neçə, bəzi abırsız, lətifəyəbənzər hırıltı yaradan düzməcələri qoşub "Hacı dayının gülüşü", "Hacı dayılar demişkən" deyib, anlamadan ad batıran yerlilərə də, kənardan deyiləni yenə də anlamadan, bilmədən, dişiynən çeynəyən başqaları da bilsinlər ki, Şəki belə Hacılara görə Hacı

dayılar yurdu adlanıb. Belə Hacıların gülüşü də, satirası da çox sanballı, ağır çəkili düşündürən və anladan gülüş olub. Bunları M.F.Axundov, S.Rəhman, Rəşidbəy Əfəndiyev, H.Ziya da qələmlərilə sübut edib.

Hacı Cəlil ağanın qabiliyyətilə bağlı bir söhbət də yaddaşlarda yaxşı qalıb.

Özünün xanımı Dələmə xanımın qardaşı Əbdürrəhman ağanı (haqqında Giləhli məhəlləsindən yazanda bəhs etmişdik) kim isə adam ölümündə günahlandırır. Onu həbs edirlər. Dələmə xanım çox ağlayıb, sızlayır. Hacı Cəlil qaynını bu dolaşıq işdən qaytaracağına söz verir.

Hacı Cəlil ağa xəz-kürəcə kürkünü geyinib, Tiflisə gedir. Ərəbi-farsı bilsə də, rus dilini bilsə də yazmağı bacarmırdı. Çar Nikolayın qanun məcəlləsini gözəl bilirdi. Tiflisdən dil bilən, yazmağı bacaran adam tutur. Vəkil kimi öz adını yazdırır. İşi alıb, oxutdurub tanış olur. Hərtərəfli düşünüb-daşınıb ağır cəza altında olan adamı - qaynını qurtara bilir. Ona şər atıldığını sübut edir.

**"HACI MƏMMƏDLƏR"** (patronim) - **"ZƏRGƏR İSMAYIL SOYU"**. Bu soy da Qullar – Bazarbaşı məhəllələri əhatəsindədir. Sarıpapaq Kərimuşağı, Nəsib bəy Fərzəlibəyovlar, Hacı Cəlillər soyu ilə dalan qonşusudurlar.

3 mərtəbəli, gözəgəlimli, ənənəvi bir mülkün bu günkü yaşayanları-sakinləri Hacı Məmmədin öz soyu və qac ayrımlarıdır. Hacı Məmməd tacir olub. Əsasən də qızıl alqı-satqısı işilə məşğulmuş. Çox bacarıqlı, tacirlik işinin incəliklərini gözəl bilən Hacı Məmmədin Bakıda Qız qalasının yaxınlığında zinət əşyaları-zərgər dükanı, İçərişəhərdə isə evi varmış. Eyni zamanda onun Tiflisdə də Şeytanbazarda zərgər dükanı, həm də evi olub.

H.Məmmədin 2 arvaddan 4 oğlu olub. 3 oğlu – Mahmud, Kərim, İsmayıl birincidən, Qasım adlı oğlu isə ikinci qadındandır.

Diş həkimi Qasım eyni zamanda Sovet dövründə şəhər İcariyyə Komitəsinin sədri vəzifəsində də çalışıb. H.Məmməd



vəfat edəndən sonra (sovet hökuməti qurulmamışdan qabaq) 2-ci qadını özünün əvvəlki yaşayış yeri Qışlağa təzədən ərə gedir. Tanınmış Zurnaçı Ələfsər həmin qadının 2-ci dəfə qurduğu ailəsindən-izdivacdan olan oğludur. Yasəmən adlı həmin qadın əri Hacı Məmməd öləndən sonra onun evindən, danışılana görə, yaxşıca varidatla gedib. Bu söhbətləri bizə danışan evin gəlini (Afərdə Təmraz qızı Hacıyeva, 1936-cı il) qaynatası zərgər İsmayıldan eşitdiyinə görə pul dəyişiləndə evin çardağından 4 kisə Nikolayın palazqulaq 100-lükləri çıxıb. Hamısı da batıb.

Hacı Məmmədin İsmayıl adlı oğlu da onun işinin davamçısı olduğu üçün adına "zərgər İsmayıl" deyiblər. İsmayıl eyni zamanda gözəl də dərzi olub.

İsmayıl bir müddət atasının işini davam etdirir. Lakin Sovet hökuməti bu soyun da varidatını müsadirə etdikdən sonra o, qızıl tacirliyi işindən əl çəkib, dərziliklə məşğul olur. İsmayılın övladı Aydına danışdığına görə, tuthatut vaxtları idi. Qışın qarlı-şaxtalı vaxtında hökumət maşını bizim dalanla Qalaya tərəf qalxırdı. Maşın yolun dikindən qalxa bilmir, buzda sürüşürdü. Səsə eşidib bilənlər də qapıya çıxmışdı. Yumru eynəyindən və furaşkasından içəridəkinin Mir Cəfər Bağırov olduğunu bildim. Tez gedib evdən xalça-palaz gətirib maşının təkərləri altına atdım. Maşın buzlaqdan qalxa bildi. Səhəri xəbər çatdı ki, eynəkli mənimlə maraqlanıb. Hökumət adamlarını göndərdi. Onlar da varidatı müsadirə etdilər, özümüzə isə dəymədilər. Evin alt mərtəbəsində bir müddət uşaq bağçası edib, üst mərtəbəni bizə verdilər.

A.Hacıyeva qaynatasının dərziliyindən danışırdı ki, o tikən paltarın, xüsusən şalvarın özü cırılardı, ütü qatı getməzdi, düyməsi sökülməzdi. Özü də heç vaxt yerdə oturmazdı ki, şalvarın səliqəsi pozulur. Yerdə oturulan məclisə çox vaxt getməzdi ki, bir boşqab xörək yeyib səliqəni poza bilmərəm.

**"HACI MUSA"** (patronim) – Qozdağarların və Nəbibəyovlar soyunun əhatəsində olan mülkün bir üzü qədim dağ yolu **"Arx üstünə"**, digər üzü isə tarixi yol olan **"İpək**

**doqqaza"** tərəf əzəmətli bir malikanədir. Yaşı və onu əhatə edən hasarın tarixi ev sahibəsinin qaynatasından eşitdiyinə görə 3 əsrə yaxındır. Evin sahibəsi Nərgiz Səfərova adlı ali təhsilli, tariximizə və mədəniyyətimizə bağlı bir xanımdır. Evdə müəyyən səliqəni yaradanda o çalışıb ki, tarixi özəlliklərə xələl gəlməsin. Lakin indiki vəziyyət, zəlzələ hadisəsi böyük mülkə xeyli zərər vurub. Çardağı və tavanı uçmaq təhlükəsindədir. Böyük zal otağın baş tərəfindəki çox əzəmətli, qəlbi guşə gətirən güzgülü, gəc işləməli zəngin naxışlı buxarıya baxmaqdan doymaq olmur. Belə buxarı artıq Şəki malikanələrinin çox az mənzillərində qalıb. Bu mülkün eyvanının taxta oyma işləmələrinə heyranlıqla, həyacanla baxırsan. Bir şeyə çox təssüfləndik ki, mülkün əzəli sahiblərinin soyundan olan Şamil babanı sağlığında danışdırmaq imkanını əldə edə bilmədik. Bu əzəmətli malikənənin elə özü kimi də maraqlı soyu vardı.

**"QARNEYLƏR"** (patronim) – bu soyun adı ilk baxışda anlamsız, çətin görünür. İzahını biləndə həm qəlbimiz fərəhləndi, həm kədərləndi. Bu, sadə "Qarı nənənin nəvələri" sözlərinin dəyişən formasıdır. Ata-anası vəfat etmiş, bir-birindən fərqli, 6 uşağa yiyə duran ağbirçək bir nənənin fədakarlığından yaranan addır. Həmin Tükəzban Cumay qızı adlı nənəyə sanki o yetimlərə görə Tanrı 120 il ömür vermişdir. Böyüklü-kiçikli uşaqlar "Bapba nənə" deyə-deyə onun əllərinin, ürəyinin istisi ilə böyüyüb, yaşadılar.

Bu soydan olan gənc idmançı Tehran İsmayılovdan qürurla danışmaq istəyirik. 1988-ci il təvəllüdlü bu yeniyetmə şəhər üzrə idman məktəbində karatenin "Şo-ta-kan" növü ilə məşğul olur. İlkin nailiyyətləri diplom, fəxri fərmanlar, qiymətli hədiyyələr olub. Onun məşğul olduğu karatenin bu növünün 6 aydan bir xüsusi normalardan ibarət imtahan ödənişləri var. Yəni, ağ kəmər, sarı, narıncı, yaşıl, açıq göy, tünd göy, açıq qəhvəyi, qəhvəyi və nəhayətdə ən yüksək dərəcə- qara kəmər almaq kimi zirvəyə çatmaq normaları var. Tehran indi qəhvəyi kəmər rütbəsini almışdır. O bu rütbənin vəsiqəsini Azərbaycan



İdman Komitəsinin karatenin Şo-ta-kan-do Federasiyasının prezidenti, qara kəmər ustası, 2 dəfə Yaponiyada keçirilən çempionatda dünya çempionu olmuş Elçin Mehdizadədən almışdır. E.Mehdizadə Tehranla fəxr etdiyini, ona güvəndiyini dəfələrlə demişdir.

Tehran İsmayılovun hələlik son nailiyyətləri 2000-ci ildə Azərbaycan çempionu titulu üzrə yarışda 1-ci yerə çıxaraq qızıl medalla təltif olunmasıdır. 2-ci qızıl medalı isə 2002-ci ildə yenə Azərbaycan çempionatı uğrunda yarışda özündən 4 yaş kiçik olan, ikiqat çempion Anar Məmmədovla döyüşdə qalib gələrək qazanmışdır. Gənc idmançı həmçinin idmanın tenis, volefol növləri üzrə yarışlarda iştirak edib, fəxri fərmanlar qazanmışdır. Onun indiki arzusu Yaponiyada keçiriləcək yarışda qalib gəlib, qara kəmər ustası olmaqdır. O, bu qələbəyə ümidlidir. Çünki arxasında daim ona dayaq olan valideynləri, Azad Hüseynov və Qoşqar Əliyev kimi məşqçiləri var.

**"PETLƏR"** (patronim) – Bazarbaşının tanınmış soylarındandır. Yol qırağında, indiki 3 saylı zavoda demək olar ki, bitişik olan bu bina çox cəlbedicidir. Bir əsrdən çox yaşı olan ikimərtəbəli, küçəyə baxan 2 balkonu olan daş və kərpic işləmələrdən, gəclə işlənmiş bu binaya baxmamış keçmək olmur. Hazırda evdə yaşayan varislərin öz nənələrindən eşitdiklərinə görə, sovet dövründən qabaq bu evin Səhnə adlı gəlininin Ənvər adlı əri cavan ikən vəfat edir. 2 oğlan uşağı ilə tək qalan gənc qadın uşaqları övladı olmayan qaynının öhdəsinə verib, yenidən ərə gedir.

Kişi xeylağının himayəsində yaşayan uşaqlar lazımi qayğı görmürdülər. Həmin vaxtlar Şəkidə yaşayan bir rus qadın əminin razılığı ilə uşaqlara qəyyumluq edir. Bir müddətdən sonra həmin qadın onları götürüb Peterburqa gedir. Orada uşaqları sənət məktəbinə qoyur, dil öyrədir. Uşaqlar əvvəlki mühitlərindən, güzəranlarından xeyli yaxşı şəraitdə böyüyürlər. Qasım və Abbasqulu adlı bu gənclər vətənə dönürlər. Hər ikisi də ticarətlə məşğul olurlar. Onlar tez-tez Rusiyaya gedib mal

gətirirlər. Rus dilini bilən, rus xarakterinə yaxın olan bu qardaşların Peterburqa tez-tez gedişlərinə görə yerli Şəki əhli onlara "Peterlər"-"Petlər" deyə ləqəb qoydular.

Pet Abbasqulu və Pet Qasım bayaq haqqında danışdığımız evi daha mükəmməl tikirlər. Yerli qızlarla ailə qururlar. Ancaq yenə də Rusiyaya gediş-gəlişlərinə ara vermirlər.

Qasım sonralar Krımda yaşamaq üçün ev də alır. Qasım ədəbiyyatı çox sevdiyi üçün Tolstoy yaradıcılığına da olduqca mərhəmanə yanaşardı. O, böyük rus yazıçısı ilə yaxınlıq da edərdi.

Qasımın iki oğlu olub- Əli və Şirəli Bayramovlar. Onlar hər ikisi də ali təhsillərini Rusiyada alıblar.

Abbasqulunun isə bir oğlu, bir qızı olub. Oğlu Möhsün 18 yaşında tif xəstəliyindən vəfat edib. Züleyxa isə Bakıda tibb məktəbini qurtarıb, adlı-sanlı mama-ginekoloq tibb bacısı olub. Züleyxa "Otaq eşiyi" məhəlləsində Mərgümüşlər soyuna ərə gedib. Əri Lütvüllah cavan ikən rəhmətə getdiyindən ər adamları tərəfindən onlara çatası çox şey əllərindən alınıb. Züleyxa da tək övladı Ənvəri götürüb atası evinə gəlib. Anası Ciyixanımın köməkliyilə uşağa baxıb böyüdüblər. Züleyxa öz işinə gedəndə evdən arxayın olurdu ki, diqqətli-qabiliyyətli anası uşağı da, ev işlərini də rahatlayacaq.

Züleyxa Şəkidə təcili yardım stansiyasında işləyib. Təcili yardıma sifariş edənlər onu tez-tez arzulayar və mama Züleyxa yox, Petinin qızı Züleyxanı göndərin deyərdilər. 80 yaşından yuxarı vaxtadək mama Züleyxa öz işində işləyib. Onda səliqə, işinə, xəstələrə qarşı böyük məhəbbət vardı. O vaxt Şəkidə bütün səhiyyə idarələrinə məxsus bir dənə "poltarotonka" maşını vardı. Yaşı 80-dan ötmüş bu nurani qoca xanımın qışın çovğununda, yayın istisində, payızın yağışında bütün Şəki kəndlərinə doğuşa köməyə getməyi indi də çoxlarının yadındadır. Sənətinin ustakarı və vurğunu olan bu xanım neçə-neçə qadının doğuşunu maşının kuzovunda, çətin anlarda tutub, özünü itirdiyi, əlindən xəta çıxdığı vaxtlar olmayıb. Neçə-neçə



qadınlar minnətdarlıq əlaməti olaraq qızlarına onun adını veriblər. Çox çətin, olumla-ölüm arası vəziyyətlərdən ananı da, uşağı da salamat qurtardığına görə neçə-neçə qadınların ərləri ondan pul-varidat səxavətini əsirgəməyiblər.

Deyilənlərə görə istər sovet dövründə, istərsə də ondan qabaq Şəkidə doğum evi açılana qədər şəhərin çox sayda qadınlarına "Petinin qızı Züleyxa" və mama Zəhra kömək etmişlər. Onlar öz dövrlərinin ən adlı, şöhrətli, əlindən xətası olmayan mamaları kimi tanınıblar. Çox-çox əfsuslar olsun ki, xalqımızın belə ağbirçəkləri- Mama Zəhralar, Züleyxa xalalar öləndən sonra tez unudulur, onlara əsrlərdən yadigar qalmış təcrübələri də birdəfəlik yaddan çıxır.

Züleyxa xalanın əzizlərinə danışdığı xatiratlara görə, uşaq vaxtı atası və əmisi onları da Rusiyaya aparardılar. Krımda olarkən o da çar Nikolayın qızları istirahət etdiyi yerdə tez-tez gəzintidə olmuşdur. Onlarla yaxından tanış olmasa da, tez-tez salamlaşardılar. Qızları mühafizə edənlər çox olurdu.

Züleyxa xala özü də sonralar tez-tez Rusiyaya gedib-gələrdi, alver də edərdi. Onlarda gördüyümüz bir şəkil bizi çox maraqlandırdı. Topa saqqal, səliqəli geyimli bir qədər elə L.Tolstoya bənzər adamın böyük yazıçının öz bacısının əri olduğunu (və ya qızının əri) dedilər. Adı İosif olan bu adam uzun müddət Şəkidə yaşayıb, ixtisasca aqronom olub. Çoxlu arı pətəkləri saxlayardı, özü də L.Tolstoy kimi ət yeməyən, yəni vegeterian idi. O tez-tez Züleyxa xalagilə əlində bal dolu banka ilə qonaq gələrdi. Züleyxanın anası Ciyixanım nənə ona Usubbəy deyərdi. Onun bişirdiyi xırda mərcili və yerli lobyalı plov İosifin çox xoşuna gələrdi. Onun şəkli indi də durur.

Züleyxa xalanın əmisi oğlanları Əli və Şirəli də Rusiyada təhsil alıb. Əli Sumqayıt kauçuk zavodunda baş mühəndis olub. Onun oğlu da indi kimyaçıdır. Şirəli isə Rusiyada Dənizçilik məktəbini oxuyub. Orada oxuyanda o professor Nikolski familiyalı birinin Şura adlı qızı ilə evlənib, Şəkiyə gətirib.

Şirəli Şəkidə tanınmış rus dili müəllimi olub. Onların bir qızı və Bayram adlı (onu Boris deyə çağırırdılar) bir oğlanları olub.

Qasımın Füruzə adlı qızı da olub. O can həkimidir. Füruzə qonşuluqda Lahıc Məmmədin (Dolçalar dalanında) qardaşı Səmədə ərə gedib. Onun qızları Rahilə və Reyhan da həkim ixtisasına yiyələniblər. Reyhan Tovuza ərə getdiyi üçün anası da onunla birgə yaşayır.

**"ƏLİYEVLƏR"** (patronim) – Hacı Məmmədsadıq Əliyev. Qullar məhəlləsindən yazanda qeyd etdik ki, Hacı Məmmədsadıq həmin məhəllədəki ata-baba yurdundan çıxıb, yaxınlıqdakı Bazarbaşı məhəlləsində mülk tikdirir. Hazırda həmin mülkdə Şəki Pedoqoji Texnikumu fəaliyyət göstərir.

H.M.Əliyev deyilənlərə görə sadə bir adamın (atasının kisəçi olduğunu deyənlər də var) oğludur. Atasını da 18 yaşında itirib. O, öz fərasət və qabiliyyəti sayəsində adlı, vicdanlı və mərhəmətli bir tacir olub. Bacı-qardaşlarına da yardım göstərib. Qardaşlarına ticarətin elmini və ilmini başa salıb öyrədib, işini bilən tacir səviyyəsinə qaldırıb. Özüylə birgə onları da elə səviyyəyə çatdırır ki, onların yaşayıb, fəaliyyət göstərdikləri evi Əliyev qardaşlarının ticarət evi adlandırırdılar. Dünyanın bir çox ölkələrilə, firmalarla ticarət əlaqələri də elə bu adla aparılırdı. Hər il Əliyev qardaşlarının evi öz gəlirindən rus çarına vergi verirmiş. Gəlirin məbləğinin müəyyənləşdirilməsi də ticarət evinin başçısı, həddən çox işgüzarlığı ilə tanınan Hacı Məmmədsadıq Əliyevin özünə etibar edilirdi. Dövlət tərəfindən onun gəlirinə nəzarət edilmirdi. İllik gəlir haqqında məlumat xüsusi jurnal və qəzetlərdə çap olunurdu. Əlbəttə, bu o vaxtlar ticarət aləmində Hacının böyük nüfuzu olduğunu sübut edirdi.

Yeri gəlmişkən, qeyd edək ki, Hacının kontoru karvansara tininə yaxın yerdə yerləşirdi. Hazırda həmin bina Müəllimlər evi kimi fəaliyyət göstərir. Binanın üzü çaya və dağa tərəf baxan hissəsində mis lövhə var. Onun üzərində "POTENT ROSSİYA" sözləri həkk olunub. Lövhə Hacı Məmmədsadıq



Əliyevin öz zamanında vurulandır. Zaman-zaman binanın üzərində duran həmin lövhə sanki ötüb-keçənlərə deyir ki, "laqeyd olmayın, baxın, maraqlanın, görün kimə məxsus olmuşam, nə zamandan, niyə bura həkk olunmuşam"...

Xalqını sevən, daim onun işıqlı gələcəyini düşünən, qəlbi və əqli Quran kəramətlərilə dolu olan Hacının xeyirxahlıqları haqqında çoxlu rəvayətləşmiş həqiqətlər var.

O, zamanında çox imkansız cavanlara tacirliyin sirlərini öyrətmiş, sonra onlar üçün müəyyən məbləğ pul ayırmışdır ki, özləri ticarət işini sərbəst aparsınlar.

XIX əsrin sonu XX əsrin əvvəllərində yeni məktəb və gimnaziyaların açılışı üçün heyfsilənmədən, sevinərək pul sərf etmişdir. Hacı müsəlman bayramlarında xeyli kasıb-kusubun siyahısını tutdurar, bayramdan I gün əvvəl axşamdan bütün ərzaqları onlara çatdırmağı nökərə tapşırardı. Nökərə onu da deyərdi ki, qapını döy içəri qoy. Çalış səni görməsinlər, kim göndərdiyini də bilməsinlər. Xeyirin hardan gəldiyini duyub bilənlər də olurdu, bilməyənlərsə göydən Allahın onlara pay göndərdiyini düşünərdi.

Hacı belə adam idi. Çalışırdı ki, Allahın buyurduğu kimi, sağ əlin verdiyini sol əl bilməsin. Çünki dünyada hər növ yaxşılıqlar Allahın və insasnlığın xatirinə edilir.

Belə də deyirlər ki, Hacı hansı uşağın başına sığal çəkirsə, kimə dayaq durursa o adamın həyatı ömrü boyu işıqlı, bəxti-naxışı üzdə olur. Onun bir kəlmə müdrik, sanballı sözü ilə çox-çox qan-qadalı davalar səngiyib. Deyilənlərə görə, Hacının Dəhnəli Əbdürrəhman adlı ev qoçusu da vardı. Yalan olmasın boy-buxunlu, iri gövdəli bu adamın enli bığlarının ucu qatlanmasaydı, bəlkə də yarım metrə olardı, qulaqlarından da xeyli kənara çıxıb gedərdi. Onun həyətdə qapı dibində gözətçi evciyi vardı. Hacını gəlib soruşan olanda gözətçi zəngin yoğun ipini dartardı. Hacı evdən çıxanda "ağa, səni görmək istəyən var" deyərdi. İzin verilsəydi, buraxardı. Bir gün də beləcə zəngi basır ki, bəs ay ağa, qoçu Azax gəlib. Hacı soruşur ki, Azax nə istəyir?

Əbdürrəhman da cavab verir ki, əskinas-kağız pul istəyir (həmin vaxtlar da kağız pul qızıl puldan üstün idi). Hacı Azağın hərəkətlərinə uyğun cavab verir ki, ona de ki, qapını səhv salıb. Getsin qonşu Hacı Zülfüqarovun evinə, o pulu mən qazanan kimi zəhmətlə qazanmır. O cür müftə pulu ona o verə bilər".

Dürüst cavabdan qəzəblənən Azax Hacının evini atəşə tutur. Bu zaman Hacının qonşu Gəncəli məhəlləsindən olan digər muzdlu qoçusu Kərbəlayi Məmmədlərdən Kərbəlayi Ələfsər əli silahlı özünü çatdırır. Öz dəstəsilə birgə tez yaxalayıb Hacının ayaqları altına salıb, üzr istədirlər.

Hacıdan çoxlarına pul və xeyir çatıb. Ancaq Azax gərək, Hacı kimi bir adamdan pul istəməyin düzgün üsulunu seçəydi. Çoxlarına bərk ayaqda yardımçı olan Hacı yəqin ki, onu boş qaytarmazdı. Bir də ki, Hacı Azağı yaxşı tanıyır, bilirdi ki, o, bir elə ehtiyacı olan adam deyil.

Hacı Məmmədsadıq Əliyevin dövrünün digər tanınmış şəxsiyyətləri olan Hacı Zeynalabdin Tağıyevlə, Musa Nağıyevlə, Şəmsi Əsədullayev ilə çox yaxın əlaqələri vardı, bir-birilərinə qonaq gedib-gələrdilər. Onlar vaxtaşırı görüşləri, məsləhətləşmələri həmişə zəruri bilər, bunu mütəmadi davam etdirərdilər.

Hacı Məmmədsadıq böyük qızı Tükəzban xanımı qonşu Dadanovlar soyundan Məşədi Xəlilə ərə verir. Bu Dadanovlar 5 qardaş olublar. Özləri də çox da imkanlı deyil, qoçu xislətli olduqlarına görə Hacı onlarla qohumluğa üstünlük verib. İndiki internat məktəb yerləşən həmin yaraşıqlı binaları tikdirir. Məşədi Xəlil daim Hacının köməyi, məsləhəti və uzaqgörənliyilə həmin binada tütün ixracı işinə baxır. Özü də, qardaşları da varlanıb, adlı bir sahibkar olurlar.

Bolşeviklər gələndə Dadanovlardan Məşədi Məhəmmədin varidatını müsadirə edirlər. Ancaq onun arvadı Zeynəb bir-iki gün qabaq cəld tərpənib, 7-8 kq qızılı beşikdə yatan körpə uşağın kövəndinin içində gizlədə bilib. Onun bu barədə xatiratlarını eşidənlər çox olub. " Uruslar hər yeri axtardılar,



əllərinə keçəni apardılar, hələ beşikdə uşağı da oxşadılar, ancaq qızıl tapa bilmədilər. Allah qismətimizdən çıxarmadı".

Gəncəli məhəlləsinin sakini Seyidcavadlar nəslindən olan Abid müəllim Abbasov məhəllənin Hacınəbilər soyundan olan mərhum Rza dayıdan eşitdiyi iki ibrətamiz söhbəti bizə maraqla danışdı. Qeyd edək ki, bu söhbəti mərhum Hacınəbi də öz atasından eşitmişdi.

Hacı Məmmədsadıq Əliyev adəti üzrə özünün mühasibatlığında oturarmış, qapını da həmişə olduğu kimi açıq qoyarmış. Dar ayaqda olanların çoxu bu açıq qapıdan girib, öz diləklərini bildirərmişlər. Belə günlərin birində çətinə düşən bir adam gəlib, ondan pul istəyir. Hacı əlini cibinə salıb, istənilən miqdar pulu verir, başını qaldırıb onun üzünə də baxmır. Bir müddətdən sonra borc alan gətirib, borcu qaytaranda da Hacı onun üzünə baxmadan, pulu saymadan alıb, daxıla atır. Bu borc alanı çox təəccübləndirir. Özünü saxlaya bilməyib soruşur ki, bəs möhtərəm Hacı, Siz pulu verəndə də, alanda da mənim üzümə baxmadınız? Mən bunu anlamadım. Hacı özünəməxsus təmkin və ağayanalıqla belə deyir ki, oğul, mən onu verəndə də, alanda da sənin üzünə baxsa idim, sənin sifətini yadda saxlasa idim, sən məni harda görsəydin utanıb, sıxılası idin ki, bəs borc almışam, qaytara bilmirəm.

Hacının bu müdrik cavabı sonralar çox ağızlardan eşidilib, nəhayət rəvayətləşmişdi.

Hacı Məmmədsadıq Əliyev özlərinin ticarət evinin qızğın fəaliyyəti zamanı Nəcəfi-Əşrəfdə Həzrət Əlinin məqbərəsi üstündəki bir cüt qızıl günbəzlərdən birini öz xərcilə düzəltdirib. Ancaq özü üçün vəsiyyət edib ki, onun qəbri fəqirin qəbrindən seçilməsin. Gəncəli məhəlləsinin Müridlər nəslindən olan Məmmədov Akif Səttarxan oğlu deyir ki, xalam Məmmədsadıq Əliyevin kiçik Hacı adlanan qardaşının xanımı olub. Onlar 6 qardaş olublar.

Həmin kiçik Hacının qızı Həyat da öz əmisi Hüseynin oğlu Ələsgərə ərə gedib. Ələsgər Əliyev qardaşlarının İranda

aparılan ticarət işinin cavabdehi, məsulu olub. Ərəbi, farsı çox mükəmməl bilirdi.

Fransada isə ticarət işinin məsul aparıcısı H.Məmmədsadıq Əliyevin Hüseyn adlı qardaşının oğlu Heydər olub. Heydər Avropa təhsilli olub, fransız, alman, rus dillərini gözəl bilirdi. Akif Səttarxan oğlunun öz doğmalarından eşitdiyinə görə Həyat və Heydərin bir-birinə məhəbbətləri olub. Lakin qədər-qismətlə o Heydərə yox, qardaşı Ələsgərə ərə gedib. Heydər də Fransada olarkən Azərbaycanda Sovet hakimiyyəti qurulub. Fransadakı iş birliyi, bank dövriyyəsində olan pulu, həmçinin də mövcud siyasi vəziyyət Heydəri qaytariağa qoymur. Görünür elə bu səbəbdən Həyat xanımı Ələsgərə veriblər. Yəqin Heydər də bir də bu səbəbdən qayıtmağı mənasız hesab edib. Fransız qızına evlənib Fransanın iş adamlarından biri olub. Ancaq deyilənlərə görə də, Heydər Bakıda yaşayan Həyat xanıma müəyyən müddət məktub yaza bilib. Həmçinin o, Moskvaya Fransız ticarət əlaqələri xəttilə məsul şəxs kimi bir neçə dəfə də gələ bilib.

İndi Həyat xanım da, oğlanları Hüseyn Əliyev (riy.e.n.) və Rauf da vəfat edib. Bəlkə Fransız işgüzarı olmuş Heydər də dünyasını dəyişib. Ancaq danışılan xatirələr isə yaşayır.

Şəkidə Sovet rejiminə, bolşevizm əleyhinə Müsavat hərəkatı güclənəndə, siyahılar tərtib olunub, hərəkatın üzvü kimi qol çəkdirəndə bir çox sahibkarlar, eləcə də Məmmədsadıq Əliyev də qol çəkmir.

O qol çəkməsə, ruhən, əməli yönümdə müsavatçı idi. O, uzaqgörənliklə bunu etmişdi. Necə deyərlər, məşhər ayağına çəkim vaxtı sovet çekistləri o siyahıda Əliyevin qolunu görmədikləri üçün var-dövlətini əlindən alsalar da özünə dəymirlər.

Ünlü şəxsiyyət olan Hacı Məmmədsadıq Əliyevdən bu yazdıqlarımız heç də hamısı deyil. Ona görə də arzulayırıq ki, onun həyat və fəaliyyəti haqqında tarixçi və iqtisadçılara elmi tədqiqat mövzuları, kurs və diplom işləri verilsin. Onun yaşadığı dövrün mətbuat və jurnallarından, digər arxiv materiallarından rus və fars dillərində çox faktlar tapmaq olar. Onun tacir kimi yetişməyinə dayaq olduğu adamların bugünkü vərəsələrini tapmaq olar. Xarici ticarət əlaqələri xəttini dəqiqləşdirmək olar.



Doğrudur, o özü vəsiyyətində təmtəraqlı qəbirüstü götürülməməyi demişdir. Ancaq Sona qəbiristanlığından onun qəbrini tapıb, bərpa etmək, tanındığı nişanə qoymaq gərəkdir. Rəhmətliyin adını əbədiləşdir və xatirəsinin daim yad edilməsi məqsədilə hazırda onun evində yerləşən Pedaqoji texnikumun qabaqcıl tələbələrinə verilməsi üçün Hacı Məmmədsadıq Əliyev adına təqaüd təsis etmək çox yerinə düşərdi. Yaşadığı evin qarşısında layiqli xatirə lövhəsinin asılması, onun adına fond açılması da bu görkəmli xeyirxah insanın xatirəsinə və Əliyevlər nəslinin törəmələrinə ən yaxşı hədiyyə olardı. Adına küçə verməklə yanaşı, Bazarbaşı məhəlləsi sakinlərinin "bulvar" adlandırdıqları Pyotr Babayev adına bağı gözəl, layiqli təmir elətdirib, orada onun büstünü qoydurmaq çoxlarının ürəyindən keçən arzudur. Pyotr Babayevin adını əbədiləşdirmək elə vacibdirsə, yaşadığı evin qarşısında hansı illərdə o evdə yaşamağı barədə xatirə lövhəsi vurmaqla da kifayətlənmək olar. Zənnimcə, Pedoqoji texnikuma Məmmədsadıq Əliyevin adının verilməsi vaxtı çatıb.

**"HƏSƏNBƏYLƏR"** (patronim) – Bu soy Bazarbaşı məhəlləsinin çox adlı, ulu babalarından üzü bəri əsil türk oğulları təkin tanınan təmizqanlı bir nəsildir. Ulu babalarından biri Sədrəddin bəy Xanlıq zamanında Hacı Çələbi xan nəslinin davamçılarından olan Məhəmmədhüseyn Xan Müştaqın vəziri olmuşdur. Sədrəddin bəy Məmmədhüseyn Xan Müştaqın Giləhli məhəlləsinin gül bağbanları, əhalisi üçün tikdirdiyi məscidin iş nəzarətçisi, aparıcısı olmuşdur. O, eyni zamanda hazırda qalıqları qalan tağlı Xanabad körpüsünün yaradıcısı və təşəbbüskarı olmuşdur. Bu məlumatları bizə nəslin bugünkü varisləri - geol. min. elm. nam. Hüseyn Mustafabəyli və Bəhram Lütvəli oğlu vermişdir.

Sədrəddin bəyin özünəməxsus torpaqları, Yemçilik ərazisində müəyyən hissə xüsusən də sahibi olduğu Aydınbulaq kəndi öz varislərindən nəvəsi Həsən bəydən Sovet hökuməti tərəfindən alınıb, milliləşdirilmişdir.

Həsən bəy Mustafabəy oğlu Sədrəddinbəyli özü də dövrünün çox hörmətli zəngin bəylərindən idi. O, şəhərdə öz pulu hesabına mədrəsələr tikdirmiş, şəhərin hər tərəfinə istiqamətlənən, Mərkəzə gəlib çıxınca 500 nöqtədə məhəllə bulaqları çəkilən Söyüdlü çeşməsindən saxsı (dulus) borularla su xətti çəkdirmişdir. İndi yaşlı sakinlər o böyük hörmət yiyəsi olan zati-ali şəxsiyyətin adını unutmur, "Həsənbəy bulağı" sözünü tez-tez işlədirlər (son illər həmin su xətti ümumşəhər su xəttinə birləşdirilib).

Həsən bəy müsavatçı oğlu Mürsəl bəyin qətlə yetirildiyini zənn etmiş (həmin vaxt başqası öldürülmüş, o öldürüləni öz oğlu bilmişdir), qorxu və həyəcandan sarılıq xəstəliyinə tutulmuş, vəfat etmişdir.

Mürsəl bəy Həsənbəy oğlu Sədrəddinbəyli Şəkinin ilk müsavatçılarından idi. O, 1913-cü ildə Şəki qəzasında yaradılan özəyin təşkilatçılarından biri, həm də qəza pristavı olmuşdur.

Həmişə xalqı birliyə, türkçülüyə, rus boyunduruğundan qurtarmaq üçün mübarizəyə səsləyən Mürsəl bəy Həsənbəy oğlu Atatürk rejimini, məşrutə inqilabını, türk liberal millətçiliyini təlqin edirdi. "Müsavat mənim canım, qanım, ruhumdur!" - deyirdi.

Mürsəl bəyin böyük qardaşları Xanbaba bəy Tiflisdə, Ağası bəy isə Gəncədə işləyirdilər. O, onlardan Müsavat birliyi haqqında hər cür məlumatı öyrənirdi. Özünün dostları və qohumları olan Məmmədəli Əfəndi Xəlifəzadəni, Veysəl bəy Müstafayevi və onun qardaşları Hətəm, Mustafa, Ziya və Rəşad bəyləri, qayınları Həmid ağa və Həsən ağanı da tez-tez bu barədə məlumatlandırırdı. Və onlar hər biri bölgədə Müsavatın ideoloqlarına, təbliğatçılarına çevrilmişdilər.



1914-cü ildə Şəkidən məşriqə (şərqə doğru) Küngüt-Zəyzid bəylərinin Müsavat firqəsinə cəlb edilməsi nəticəsində Oğuz (Vartaşen) kəndinədək yüzlərlə ziyalı Müsavatın hansı amala qulluq etdiyini anlamış, boyunduruqdan yaxa qurtarmaq məqamının yetişdiyini dərk etmişlər.

Mürsəl bəy öz çovuşları Əhmədağa Yusifbəyov və Çopur Zahidin köməyilə Şəki-Zaqatala bölgəsində Müsavat ideyalarını yayır, kübar və ziyalılar arasında geniş izahatlar aparırdı. O, çovuşlarını və Küngüt bəylərindən Muxtar, Nəsir, Şirəli adlı müsavatçıları özü ilə götürərək Zaqatala müsavatçılarının yanına getmiş, burada Türkiyədən gəlmiş Hüseyn Əfəndi və Bədrəddin Əfəndilə tanış olmuş, geri dönərkən onları da dəstək üçün Şəkiyə gətirmişdir.

Zaqatalada əhalinin etnik tərkibi çoxsaylı, müxtəlif olduğuna görə bolşevikpərəstlər, daşnaklar tüğyan edirdilər. Ona görə də Mürsəl bəy burada yaranan terrorun, sabotajın qarşısını almaq üçün güc tətbiq etməyi qardaşı Xanbaba bəylə Şəkiyə gəlmiş Fətəli xan Xoyludan rica etmişdir. Lakin istəyinə nail olmamışdır.

Mürsəl bəy qardaşlarından və yaxın qohumu qayını Fətəli xan Xoyludan Rusiyada hökm sürən anarxiya, özbaşınalıq, ağalıq və inflyasiya haqqında aldığı dəqiq məlumatları Göynük, Zəyzid və Zaqatala bölgəsinin müsavatçılarına çatdırırdı.

1917-ci ilin sonu 18-ci ilin əvvəllərində Mürsəl bəy gah Xanbaba bəy, gah Ağası bəy, gah da Fətəli xan Xoylu ilə dəfələrlə Zaqatala bölgəsinə getmiş, məclislərdə, yığıncaqlarda çıxış etmişdir.

Həmin vaxtlar Şəki ziyalılarının əksəriyyəti Müsavatın tərəfdarı olduğu üçün burada sabitlik, əmin-amanlıq digər bölgələrə nisbətən yaxşı idi. Müsavat hökuməti dövründə Azərbaycanda olan Nuru Paşanı Mürsəl bəy Şəkiyə dəvət etmiş və qardaşı Ağası bəyin köməyilə, Veysəl Mustafayevin təkidilə Nuru Paşa dəvəti qəbul etmişdir.

XI Qızıl Ordu hissələrinin qanlı qırğınından sonra bu cəlladlara qarşı tam bir il dağlara, meşələrə tərəf çəkilib vuruşan Mürsəl bəy imkan düşdükcə, Yuxarı Minarədə gizlənmiş, ordu əsgərlərinə divan tutmuşdur. 28-ci ildə həmin yerdən həbs olunub, Qazağıstana sürgün edilmişdir. Vəfatı da sürgündə olmuşdur.

Kiçik qardaşları Lütvəli, Ələkbər, Niyazi Mürsəl bəy haqqında danışarkən deyirlər ki, o, əsil vətənpərvər, millətin sevən türk oğludur. Hətta qardaşlarını Atatürkə də bənzədirdilər. Onlar ömürlərinin sonunadək hürriyyətə, istiqlala, türkçülüyə can atan və canını bu yolda qoyan mərhum əqrəbaları ilə, xüsusən də Mürsəl bəylə fəxr edirlər.

**"BAXŞƏLİ ƏFƏNDİ"** (antroponim) – bu ad Şəki ziyalılarına, xüsusən də yaşlı və orta yaşlı nəslin nümayəndələrinə çox yaxşı tanışdır. Çox-çox enişli-yoxuşlu həyat tərzi keçirən bu şəxsin özünəməxsus qəribəlikləri də vardı. Onu sevənlər çox idi, amma sevməyənləri də var idi. Sevməyənləri olsa da, rəhmətini sağlığında qazanan öndər şəxsiyyətlərdən olmuşdur. Doğma yurdun tarixi, mədəni, ictimai həyatında çox böyük rolu olmuşdur. Şəki Diyarşünaslıq Muzeyinin yaranışı onun adıyla bağlıdır. O, bu muzeyi alnının duz təriylə, ürəyinin vətən, yurd sevgisi oduyla yaratmışdır. Bu muzey onun üçün həmişə istisinə qızındığı od-ocaq idi.

Muzey eksponatları istər Rəşid bəy Əfəndiyevin ev muzeyində, istər indiki endokrinoloji xəstəxana binasında, istərsə də karvansarada yerləşdiriləndə Baxşəli Əfəndi çox vaxt həmin yerlərdə gecələyib, keşik də çəkərdi. Muzeyə isə pul verəni yox, marağı, istəyi olub baxmağa gələni içəri buraxmağa çalışardı. Özünəməxsus duyğu ilə bilərdi ki, dərin maraqla gələn kimdi, elə-belə vaxt itirməyə gələn kimdir.

Baxşəli Əfəndi gənc yaşlarında Parisdə tibb təhsili almaq üçün oxuyurdu. Hansı səbəbdənsə onu ailəsindən məktub yazıb geri çağırırlar. Qayıdandan sonra o Parisə bir daha dönə bilmir. Sonradan o, qardaşının yanına Tehran şəhərinə gəlir, burada bir



müddət məktəbdar işində çalışır. O, ərəb və fars dillərini gözəl bilirdi. Şimali Azərbaycana qayıdandan sonra o, qəza firqə komitəsinin və qəza maarif şöbəsinin müdiri də işləyib.

Baxşəli Əfəndi Cəfər Cabbarlı və onun ailəsilə bir qədər yaxın idilər. Doğmalarının və tanışlarının söylədiklərinə görə o, C.Cabbarlının həyat yoldaşı Sonanın bişirdiyi zəfəranlı küftə-bozbaşı çox yemiş, həmişə də yeri gəldikcə tərifləyərdi. C.Cabbarlı özünün məşhur "Ana" şerini Baxşəli Əfəndinin dilindən dinləməyi çox sevərdi.

Baxşəli Əfəndi sənətşünas, xalça bilicisi Lətif Kərimovla, köhnə mətbuat işçisi, jurnalist Qulam Məmmədli ilə də dost idi.

Qulam Məmmədli 60-cı illərdə Şəkiyə gələndə onunla görüşə gələn camaat ürəyəyatımlı danışığına görə bir də çıxış etməyi arzulayırlar. O isə cavabında deyir ki, "A, şəkili əzizlərim, məndən qabağa Sizə söz deyə biləcək, məndən də artıq, gərəkli danışa biləcək Baxşəli Əfəndiniz var. Onun qabağında mənim danışmağıma ehtiyacını duyular?! "

Bu sözlər Baxşəli Əfəndiyə qoyulan hörmət-izzətin nə qədər dərin olduğunu sübut edirdi.

Baxşəli Əfəndi müəyyən qədər gözəl xalça bilicisi də idi. Keyfiyyəti, texnologiyası ilə yanaşı o, xalça naxışlarını, onların rəmzi mənalarını, hansı naxışın, hansı növün hansı bölgəyə məxsusluğunu da bilirdi. Xalçaları gələcək üçün "oxunan məktub" adlandıran Baxşəli Əfəndini sənətşünas Lətif Kərimovla yaxınlaşdıran da bu bilgiləri idi.

Baxşəli Əfəndi (Axundov) 37-ci ilin repressiya adlı qara yelindən uzaq ola bilmədi. 37-ci ildə həbs olunub, 47-ci ildə qayıdan Baxşəli Əfəndinin sürgün həyatı əvvəlcə Volqa çayının sol sahillərində Jiquli dağının ətəklərində, sonra isə Krasnoyarsk vilayətində Vıteqra çayı sahillərində olub. Yüzlərlə dustaq kimi o da bir parça quru çörəyi, şor balığı, 1 parç suyu içib cəhənnəm əzabı ilə işləyib. Meşə qırımı, liman tikilisi, dəmiryol çəkilişi, kanal qazımı, daha nələr, hamısı bu əzablı işin sırasına daxil olub. Üfunətli, işıqsız, qışda soyuq,

yayda bürkülü barakların, çadırların içində o qədər bədbinləşib, ölümü gözü qabağına alan anları olub ki?!.. Amma yenə də bu anların içində "bəlkə" deyib, sağ qalıb, yaşamaq ümidini də itirməyib. Müəyyən qədər tibbi bilgisi, dərman bitkilərindən gözəl məlumatı onu o qədər də tibbi yardımı olmayan dustaqların səhiyyə məntəqəsində çalışmağına səbəb olub. Neçə-neçə dəyərli insanları orada bu qabiliyyətilə ölümün pəncəsindən xilas edib. Onun dustaq yoldaşı olmuş və bu həyatı özünün "Ümidim olmasaydı"... sənədli xatirə povestində yazıçı Cəfər Bağır çox gözəl təsvir etmişdir.

Cənublulara şimalda, şimallılara cənubda cəza çəkdirən rejimin amansızlığı, qırmızı prokurorların qeyri-insani rəftarları hər bir detalları ilə burada açıqlanmışdır.

Dönən dövranın əzabını çəkmiş, saysız-hesabsız ütülərdən salamat çıxmış Baxşəli Əfəndi bəraət alanda məmurlar ona deyir ki, bu əzabına görə indi hökumət sənə hansı yaxşılığı etməyini istərdin? Baxşəli Əfəndi deyir ki, "İtən cavanlığımın mənə qaytarmasını istərdim".

Baxşəli Əfəndi həmişə çox şeyin təhər-töhürünü, yol-yolağasını anlamaza incəliklə, eyhamla öyrədərdi, anladardı.

Qonşuluqda tez-tez həyat yoldaşını vurub incidən kor-kobud anlamazı bircə kəlmə ilə utandırıb, düz olmayan işdən çəkindirdi. Arvad döyənin hava-qavasının açıq vaxtında dedi ki, "ay qoçaq", sən o şillə vurduğun üzdən bir də öpəndə, üzünə tüpürmür bəs o el gözəli?.

Şəkidə orta ixtisas Musiqi texnikumunun, ibtidai musiqi məktəblərinin açılışı onun adıyla sıx bağlıdır.

Musiqi texnikumunda o xeyli müddət direktor işləyib. Qeyd edək ki, Şəkidə ilk simli alətlər orkestrini təşkil edən İbad müəllim bu yaradıcı işdə onunla həm yaxın dost və əməli silahdaş idi. Baxşəli Əfəndinin sürgün həyatının ilk illərində onun arxasınca ancaq İbad müəllim gedib, onunla görüşmüşdür.



Musiqi texnikumu Qala binasında yerləşəndə Baxşəli Əfəndi tez-tez gözəl muğam günləri keçirərdi. Bu yaddaqalan şənliyə də Şuşadan, Ağdamdan, Kəlbəcərdən musiqiçilər dəvət edərdi.

Baxşəli Əfəndi irili-xırdalı çox işlər, çox yaxşılıqlar edərdi. Bilirdi ki, ömür əmanətdi. Dərindən bildiyi Böyük Quranı arzu edənlərə cani-dildən öyrədərdi. Hamımızın yaxşı tanıdığı, hazırda bölgənin Qazisi olan Səlim Əfəndinin dini bilgi üzrə ilk müəllimi Baxşəli Əfəndi olub. Gözünün əməliyyat olunması, cisminin zəifliyi onun çox istəklərinin həyata keçməsinə imkan vermirdi. Bundan çox-çox heyifsilənən, itən illərini yanğı ilə xatırlayan ixtiyar yaşlı Baxşəli Əfəndi özünəməxsus şer dililə söylərdi:

Cavanlar gəldi dünyayə,
Qocaldım, heyf, pir oldum.
Yetişdi 70-ə yaşım,
Əcəb yerdə fəqir oldum.

Baxşəli Əfəndi 1985-ci ildə dünyasının dəyişib. Qəbri Sona qəbiristanlığındadır.

Baxşəli Əfəndinin həyat yoldaşı Axundova Məhruzə İlyas qızı zamanının ilk çadra atan qadınlarından olub. Şəhərdə darülfünunu oxuyub. O dövrün fəal qadınlarından olan Firuzə və Zəhra İmamverdiyeva ilə birgə Qadınlar Şurasında işləyib. Şəhərin bir neçə uşaq bağçalarında müəllimlik edib.

Baxşəli Əfəndinin qızı Diləfruz Axndova Şəkinin çox tanınmış adlı ziyalılarındandır. Ömrünün yarım əsrdən çox hissəsini pedoqoji fəaliyyətə həsr edən, Əməkdar müəllim kimi fəxri ada layiq görülən, böyükdən-kiçiyə hamının istək və ehtiramla yanaşdığı Diləfruz müəllimə hazırda təqaüddədir. Bu ağbirçək xanım-xatun qadınla yaxından tanışlığımız ömrümüzün ən işıqlı səhifələrindəndir desək yanılmarıq. Hər dəfə söhbət zamanı özünün həyat yolu tək ağappaq, ləkəsiz, səliqəli süfrəni açmağı, xanım-xatın nənələrimizə, analarımıza xas səliqə və zövqlə çay süfrəsini düzüb-qoşmağı, şirin dililə, məntiqlə bizə qədim mə-

hallələrdən, onların sakinlərindən danışmağı özü bir müəllimlik idi. Onun süfrə zəhməti çəkməyinə narahat olduqca nur yağan gülümsər çöhrəsilə, mehriban səsilə deyirdi: - Qızım, niyə narahat olursunuz, mən belə etməsəm, siz də, yaşıdlarınız da öyrənib, görüb-götürməz ki?!. Mən etməliyəm, siz öyrənməlisiniz.

Odur ki, hər bir kiçik sözü, hərəkəti müəllimlik olan bu ağbirçək xanımı bağrımıza basıb sonra ayrılırdıq. Ondan nümunəvi dərs alırdıq, ondan işimizin gedişatı üçün çox şey öyrənirdik.

1942-ci ildən Stalin adına Şəki Pedoqoji Məktəbini, sonra 2 illik qiyabi Müəllimlər Institutunu oxuyub. 1942-ci ilin mart ayında məcburi təyinatla Balakənin Tala kənd 1 saylı orta məktəbində əmək fəaliyyətinə başlayıb. Sonra Şəkinin Baş Zəyzid kəndində, şəhərin Qışlaq məktəbində, 10 saylı məktəbdə, beləcə gəlib bir vaxtlar özünün doğmaca babası Molla Kazımın məktəbində dayanıqlı təyinatla iş fəaliyyətinə başladı.

Bu həmin məktəb idi ki, savadsızlığın ləğvi zamanı Molla Kazım burada həm müdirlik, həm də müəllimlik edib. Əski əlifba ilə savadlanan çox yaşlılar Molla Kazımın tələbəsi olmuşdur. Onlar həmişə dövrünün adlı ziyalısı olan Molla Kazıma rəhmət oxuyardılar. Diləfruz müəllimənin ən yaxşı uğurları, şirin xatirələri həmin bu 5 saylı məktəblə bağlıdır. Buradakı 25 illik əmək fəaliyyətinə sanki babası Molla Kazımın ruhları duaçı, köməkçi olmuşdur (Qeyd edək ki, indi də gözəlliyilə diqqəti cəlb edən bu möhtəşəm bina sahibkar Məmmədsadıq Əliyevin tikdirdiyi özünəməxsus tütün karxanası olmuşdur).

Diləfruz Axundovanın çox məsuliyyət hissi ilə ürəkdən-candan şagirdlərə verdiyi ibtidai savad, təlim-tərbiyə zamanında dövlət tərəfindən qiymətləndirilmişdir. 66-cı ildən 87-ci ilə qədər məktəb partiya təşkilatının katibi işləyib. Ondan qabaq isə 10 il həmkarlar təşkilatının sədri olmuşdur. Öndər müəllimənin təltiflərinin müəyyən qismini sıralama ilə qeyd etməyi vacib bilirik. 1964-cü ildə "Qabaqcıl maarif xadimi" döş nişanı, 1970-ci ildə "Rəşadətli əməyə görə" medalı, 1971-



1976-cı illərdə fəxri fərmanlarla, 1982-ci ildə 5 saylı səkkizillik ümumtəhsil məktəbinin yaradılmasının 150 illiyi münasibətilə 30 sentyabrda "Əməkdar müəllim" fəxri adına layiq görülmüşdür. 1980 və 1997-ci illərdə "Əmək Veteranı" adını almışdır. 1987-ci il Azərbaycan müəllimlərinin VII qurultayının nümayəndəsi olmuşdur.

Ərinin vaxtsız vəfatından sonra 6 uşağa dəyanətlə, ləyaqətlə baxıb böyütmüşdür. Onun bu əziyyəti də dövlət tərəfindən "Qəhrəman ana" medalı ilə təltifləndirilmişdir. Hər birini ayrı-arılıqda savad-sənət yiyəsi edən bu Anaya övladları haqlı olaraq "həyatın minbir sınaqlarından çıxmış kişi xilqətli anamız" deyirlər.

Biz də bu müqəddəs Ananın qarşısında baş əyir, zəhmətkeş əllərindən öpür, indidən belə tanrı verən ömrü ağrı-acısız, sağlıqla yaşamağını, vətənindən, xalqından ürəyi şən, rahat olmağını arzulayırıq .

**"NƏBİBƏYOVLAR"** (patronim) – bu kübar, ziyalı nəsil nəinki yaşadıqları Qullar məhəlləsində, doğma şəhərləri Şəkidə, bütöv Azərbaycanda tanınan nəsil olub. Onlar rütbə və hər imkana malik bəy nəsilli hərbçilər təkin tanınmışlar.

Ata - Qasım bəy Nəbibəyov 1920-ci ilə qədər, uzun müddət podpolkovnik rütbəsində çar pristavı olmuşdur. Rusiyada mükəmməl təhsil alan Qasım bəy həm də İrandakı rus səfirliyində çalışmış, 1915-1917-ci illərdə isə Türkmənistanda məşhur general Kuropatkinin qərargahında Şərq dilləri üzrə tərcüməçi olmuşdur.

Qasım bəyin sonralar tacirlik fəaliyyəti də olub. Nəticəsi Murad Nəbibəyovun eşidib, söylədiyinə görə onun İranda, Türkmənistanda, Ərəbistanda da ipək fabrikləri olub. Həmin fabriklərə Şəkidən parça toxunmaq üçün xam ipək gedərdi. Qasım bəy 90-dan yuxarı yaşı olan vaxtlarında da çox gümrah və iti ağıla malik olub. Həmin yaşlarında o, Türkmənistana gedib-gələrdi. 1917-ci ildə bir növ özünü müdafiə məqsədilə at ilxılarını bolşeviklərə bağışlamışdır. Onun yaranışından

Müsavat hökumətinə rəğbəti və köməyi olmuşdur. Vəfatı da Müsavat hökumətinin süqutundan az sonra olmuşdur.

Qasım bəyin 5 oğlu olub. 4 oğlu- Vahid bəy (kapitan), Bəhram bəy (polkovnik), Hüseyn bəy (podpolkovnik), Zahid bəy (kapitan) hərbi rütbə daşımışdır. Bir oğlu Hidayət bəy isə Nuru paşa ilə Türkiyəyə gedib. Nuru paşanın qızı ilə evlənib, İstanbulda qalıb. Sonralar da əlaqə saxlamayıb.

Ümumiyyətlə, bu nüfuzlu Nəbibəyovlar nəslinin işıqlı səhifələri hərbçi-jurnalist Şəmistan Nəzirli tərəfindən "30-cu il Şəki üsyanı" və ya "Polkovnik Bəhrambəy Nəbibəyovun ömür yolundan səhifələr" (Azərbaycan qəzeti, №14 və 19, 2000-ci il) məqalələrində əhatəli yazılmışdır. Bizdə olan qeyri-rəsmi məlumata görə də müəllif bu mövzuya aid kitab üzərində də çalışır.

Təkrara yol verməmək üçün biz müəyyən faktları yenidən qeyd edəcək və nəslin bugünkü varislərindən eşidib yazdığımız məlumatları qeyd edəcəyik.

Nəbibəyovların hər birinin hərbi fəaliyyəti barədə Respublika Mərkəzi Dövlət Tarix Arxivində müəyyən qədər də olsa sənəd və məlumatlar saxlanılır. Varislərdən öyrəndiyimizə görə, Hüseyn bəy hərbçi olmağına baxmayaraq (o təhsilini Parisdə alıb), tarix, ədəbiyyat və etnoqrafiya ilə çox ciddi maraqlanardı. Eşitdiklərimizə görə onun bu səpgidə bir kitabı Polşada nəşr olunub. Kitabın nəşrinə köməyi özü türk, dini xristian olan bir karaim dostu etmişdir (hazırda da Polşada yaşayan yaşlı karaimlər var, onlar öz dillərini və köklərini unutmamışlar).

Hüseyn bəy 30-cu illərə qədər Şəki Pedoqoji Texnikumunda da dərs demişdir. Mərhum aktyorumuz, həmyerlimiz İsmayıl Osmanlı öz xatirələrində söyləmişdir ki, uşaq vaxtından tanıdığım Hüseyn bəy yaddaşımda çox işıqlı bir iz qoymuşdur. Onun sakit, mənalı çöhrəsi, gözəl geyimi, boy-buxunu və ahəstə, cəlbedici yerişi uşaq olmağıma baxmayaraq məni valeh edirdi. O, yol ilə gedəndə mən ehtiyatla onun arxasınca, ayaq izlərinin üstü ilə gedirdim ki, böyüyəndə ona oxşayım.



1931-ci ilin martında repressiya qurbanı olan 38 yaşlı Hüseyn bəyin ölmədiyini də bəzən qeyri-rəsmi məlumatlardan eşitmişdik. Onun Tacıkistanda yaşayıb, ailə qurduğunu da deyənlər vardı. Kaş ki, belə olaydı.

Qeyd edək ki, 1987-ci ildən Hüseyn bəyin bəraət kağızı da var. Ancaq bu kağızdan çox eşitdiyimiz həmin o yalan, ya doğru söz sanki bizə daha çox təsəlli idi.

Nəbibəyovlar soyundan yazarkən, onlardan biri Şəki üsyanının görkəmli simalarından olan, zamanında Şəki rayon hərbi komissarlığının səfərbərlik şöbəsinin rəisi Bəhram bəy Nəbibəyovdan bir qədər əhatəli yazmağı özümüzə borc bilirik. Qeyd etdiyimiz kimi, Şəmistan Nəzirli öz məqalələrini bu nəslə həsr etmişdir. Eyni zamanda həmyerlimiz tarixçi Həbibulla Manaflı da özünün "Şəki üsyanı" kitabında onun barəsində faktları olduğu kimi yazmağa çalışmışdır.

Bəhram bəy ilk təhsilini Kutaisi realnı məktəbində, 1904-cü ildən isə Peterburqdakı Konstantin Artilleriya Məktəbində davam etdirmişdir. Oranı isə birinci dərəcəli diplomla bitirmişdir. Birinci Dünya müharibəsinin iştirakçısı olan Bəhram bəy Nəbibəyov 1918-1920-ci illərdə məşhur sərkərdələrimiz Əliağa Şıxlinski və Səməd bəy Mehmandarovla Milli ordu quruculuğumuzun təməl daşını qoyanlardandır. Həmin illərdə də o, öz hərbçi qardaşları ilə birgə erməni daşnaklarına qarşı igidliklə vuruşmuşdur.

Bəhram bəyin varislərinin dediyinə görə, Şəki üsyanına başçılığı üsyanın iştirakçıları ondan dönə-dönə xahiş etmişlər. Bəhram bəy hərbçi olduğu üçün bilirdi ki, qüvvələr bərabər nisbətdə deyil, imkanlar da qeyri-qənaətbəxşdir. Ancaq o, vətənpərvər, millətsevər insan olduğu üçün mövcud quruluşun səlahiyyətli vəzifə sahiblərinin rüşvətxorluğu, səhərdən-axşamacan ağır zəhmətlə işləyib, zəhmət haqqı ala bilməyən rəiyyətin istismarı Bəhram bəyin qəlbində xalqa can yanğısını daha da artırırdı. Həm bu hiss, həm də qardaş Türkiyədən 18-ci

illərdə yenə kömək gələcəyinə əmin olduğu üçün üsyana rəhbərliyə qol qoyur, bütün inamı, varlığı ilə mübarizəyə atılır.

Fədakar mübarizə gedişatı ərəfəsində satqın, qorxaq, bolşevik əqidəli, millətinə xəyanətkar allahsızların köməyilə mövcud quruluş üsyanı amansızcasına yatırır. Türk qardaşlarının köməyi isə mübarizlərin qeyri-dəqiqliyindənmi, mümkünsüzlüyündənmi, yaxud movcud quruluşun iyrənc kəşfiyyatındanmı gecikib, mümkün olmur. Satqınların xəyanətkarlığı, silah çatışmazlığı, türklərlə birləşə bilməməklə yanaşı, üsyançıların çoxunun hərbi savadsızlığı da mübarizəyə xələl gətirirdi. Bəhram bəy Nəbibəyov özü isə 1930-cu ilin iyul ayında Şəkinin Bideyiz kəndinin yaxınlığındakı Buxdur dağında Beriya və Bağırovun üsyanı yatırmaq üçün göndərdikləri çeka cəlladları ilə döyüşdə qəhrəmancasına həlak oldu. Bu milli qəhrəmanımız gözəl arzularla yaşayırdı. O, bugünkü müstəqilliyimizin istəyilə canını fəda etdi. Kaş, imkanlı bir heykəltəraş olaydı, heç kimdən təmənna ummadan onun atlı heykəlini yaradıb, yaşadığı evin arxasındakı dağın ən hündür yerində ucaldaydı. Özü də onun emosionallığını, qorxu bilməz qartal baxışlarını, gözəl rəqs etməyi bacaran mütənasib cismini, boy-buxununu hamısını əks etdirəydi. Yolumuzda canından keçən igidin ruhu bizlər üçün duaçı olardı...

Nəbibəyovlar soyu Şəkinin çox adlı-sanlı nəsillərilə qohum olub. M.F. Axundovun əzizlərindən Mirzə Ələsgərin nəvəsi Reyhanə xanım Zahid Nəbibəyovun gəlini olub. Zahid bəyin oğlu Kərim bəy və Reyhanə xanımın oğlu Çingiz Nəbibəyov indi sağdır. Qohumlarının və tanışlarının dediyinə görə əgər əyninə böyük ədibimiz M.F.Axundovun hərbi paltarını geyinsə eynilə onun özünə oxşayar. Çingiz Nəbibəyovun atası Kərim bəy Moskvada yaşayıb işləmiş, sonralar isə İranda SSRİ-nin baş konsulu olub. Şəkixanovların gəlinlərindən biri Füruzə xanımla Nəbibəyovlardan Rüstəm müəllimin anası Hüseyn bəyin xanımı Göyçək xanım bacıdırlar. Füruzə xanımın oğlanları Cəmilxan Moskvada, Hacıxan İranda, Əlixan Şəkidə yaşamışlar. Əlixan Şəkinin tanınmış qəzetçilərindən olan jurnalist Salis Məmmədovun ("Şəkinin səsi" qəzetinin redaktoru) ana babası olmuşdur.



Nəbibəyovlar nəslinin bir nümayəndəsi də Şəki əhlinin çox sevib, hörmət etdiyi ziyalılardan biri- mərhum Rüstəm müəllim olub. Rüstəm müəllim Hüseyn bəyin oğludur. İrsə məxsus bəyzadə xüsusiyyət, iti zəka, şəxsiyyət kamilliyi, sənətinin ustadı kimi gözəl keyfiyyətlərin daşıyıcısı olan Rüstəm müəllim 3 ali məktəbi - Nuxa Dövlət Müəllimlər İnstitutu, M.F. Axundov adına Azərbaycan Pedoqoji Dillər İnstitutu və Azərbaycan Dövlət Pedoqoji İnstitutunu bitirmişdir. Şəkidə ən gözəl, hərtərəfli rus dili bilicisi, mütəxəssisi kimi tanınan ziyalı idi. O, çox məktəblərdə müəllimlik etmiş, ancaq 8 saylı orta məktəb və Şəki Pedaqoji Məktəbi ən çox müəllimlik etdiyi təhsil ocaqları olmuşdur. Rus dilinin hərtərəfli, əhatəli bilicisi kimi şəhərin rəsmi dairələri ona tez-tez müraciət edərdilər.

Müəllimlik, hərtərəfli ziyalılıq fəaliyyəti dövlət tərəfindən "Əməkdə fərqlənməyə görə" medalı, fəxri fərmanlar, "Əmək veteranı" adı ilə təltif olunmuşdu. Çox da yaşamadı. Doğma xələflərinin adını doğruldan vərəsə kimi, rəhmətini sağlığında qazanan insan təkin ömrünü başa vurdu.

Haqqında danışdığımız, XIX və XX əsrdə necə, hansı görkəmdə olduğunu, hansı adlı nəsillərin məskun olduğunu göstərdiyimiz Bazarbaşı-Qullar qarışıq məhəlləsinin zənginliyi çoxdur. Tacir xeyriyyəçi Hacı Məmmədsadıq Əliyevin mülkünə yaxın 3 mərtəbəli çox əzəmətli, inşaat mədəniyyətimizin və milli memarlığımızın bütün qaydaları əsasında tikilmiş bina **"ZÜLFÜQAROVLARIN"** (patronim) evi kimi tanınır. Hazırda bu ev kimsəsiz, baxımsız uşaqların sığındığı Uşaq evidir.

Göz oxşayan bu binanın ilkin sahibi Hacı Zülqədər Zülfüqarov adında bir tacir olub. Tacir kimi çox müxtəlif işlərləipək, tütün, ərzaq və s. alverilə məşğul olub. Belə də deyirlər ki, bəs xozeyin Əliyevin qonşuluqda tikdirdiyi iri mülkün bəhsəbəhsinə Hacı Zülfüqarov daha irisini və gözəlini tikdirməyi

qərara alır. Bolşeviklər gələndə çoxları kimi onu da müsadirə edirlər. Həmin ərəfədə Hacı Zülfüqarov fürsət tapıb anbarda olan şəkər taylarını dərin su quyusuna tökdürür. Əsgərlər əl-üzlərini yuyanda suyun şirinliyindən başa düşüb, ev sahibi Hacı Zülfüqarovu güllələyirlər. Sonralar evdə yaşayan onun oğlu Mehdiqulu əmi olub. Onun da oğlu Zülfüqar evin sənədlərini hazırlayıb ki, ata-baba mülkünü geri alsın, ancaq yetim uşaqlara rəhmi gəldiyindən fikrindən vaz keçib. Sonralar Bakıda yaşayan Zülfüqar əmi bu yaxında dünyasını dəyişib. Zülfüqarovların binasından altda enli bir döngə var. Döngənin başında elektrik transformatoru qurulub. Həmin transformator qoyulan yer ata-babadan "Hamam tiki" adlanır. Gənc nəsil bilməsə də, yaşlılar bu adı çox işlədir. 1950-ci illərin sonuna qədər burada Məşədi Əhməd hamamı adlı, Şərq stilində ti-kilmiş, dədə-baba kanalizasiya sisteminə qoşulmuş çox rahat, təmiz, bir məhəllə hamamı vardı. Məşədi Əhməd həm də hamama məxsus iç otaqların ikisini düzüb-qoşub özünə də etmişdi. Hamamı o özü tikməmişdi. Ancaq onun işlədilib, təmiz saxlanmağını çox gözəl təmin edirdi. Məhəllə camaatı öz hamamlarına öyrəşmişdi. Məşədi Əhmədin ölümündən sonra hamam baxımsız olub, yavaş-yavaş dağıdıldı.

Hamam tiki deyilən bu döngə get-gedə içərilərə doğru daralır, evlərarası cığır döngə formasını alır, dar-dolan-bacılqlardan keçib məhəllənin **"Dolçalar"** (ktematonim) adlı hissəsinə çıxır. Həmin çıxışa da "Daş pilləkən" deyilir. Çünki çıxışa yaxın döngə yenə də bir qədər enlənir. Gediş-gəliş rahatlığını təmin etmək üçün camaat lap dədə-babadan çapılmış iri daşlardan çox yastı pillələr düzəltmişlər. Ola bilsin buna görə belə adlanıb. Ola da bilər ki, bu pilləkənin çıxışı olan "Dolçalar" adlı məhəllə hissəsi məşhur, qədim Daşlı bazara çıxdığı üçün bu adı qazanıb.

"Dolçalar" adı isə Daş pilləkən döngəsində yaşayan Layış (lahıc) Məmmədin sənəti ilə bağlı verilib. Əslən Lahıcdan olan bu misgər yaratdığı mis qab-qacaqlardan, badya və dolçalardan



məhəllənin gediş-gəliş hissəsinə satlıq üçün çıxarardı. Bayaq haqqında danışdığımız Hamam tiki deyilən hissədə bir nəsil də var ki, onlara **"YEZİDLƏR"** (patronim) - deyirlər. Nəslin ata-babalarından hansısa Məhərrəmlik dini mərasim tamaşasında, şəbeh vaxtı Yezid rolunda çıxış etdiyi üçün bu ad verilmişdir. Hamam tikindən alt hissədə, zavoda yaxın evlərdən biri camaatın çox yaxın tanıyıb, sayımlı-seçimli bildiyi soylarından birisinin – **"KƏRBƏLAYİ SƏTTARIN"** (antroponim) nəs-lidir. Kərbəlayi Səttar evilə üzbəüz gündoğan hissədə özünəməxsus boyaq sexində boyaqçılıq işilə məşğul olub. İpək sapların, parçaların keyfiyyətli boyadılmasında o yaxşı tanınırdı. Bolşeviklər gələndə boyaqxanasını müsadirə edib, özünü də tuturlar. Lakin Kərbəlayi Səttar o qədər yaxşı adam kimi tanınırdı ki, camaat etiraz edir, hətta adam satan pislər də onun tərəfini saxlayıb buraxılmasını tələb edirlər. Hamıdan sorğu-sual edilir, xalqın iradəsinə görə o, azad edilir. Dövlətin himayəsinə keçən boyaqxanasında işçi kimi çalışır.

Kərbəlayi Səttarın özünəməxsus ləyaqətli insanlığı, san-balı hər zaman dəyişməz qalırdı. Onun böyüklüyü, ağsaqqallığı həmişə məhəllə camaatı üçün dayaq olub.

Müharibə vaxtı, aclıqda məhəllə dükanlarına çörək gələndə hər yerdə basırıq, əzilmə, haray-qışqırıq, xətalar olurdu. Onların məhəlləsində isə bu hadisələr baş vermirdi. O, dükanın qapısı ağzında dayanaraq cərgəyə düzülmüş qadınları 10 nəfər, kişiləri isə 5 nəfər içəri buraxardı. Məhəllədə onun yaratdığı bu qaydaya görə ac qalan olmazdı. Hətta məhəllənin Ələkbər adlı kəmağılını da çörəksiz qoymazdı ki, ac qalıb yolunu azmasın. Məhəllə camaatının xeyir-şərində ağsaqqallıq eləyərdi. Kasıb qonşusunun cavan, xəstə oğlu rəhmətə gedəndə Kərbəlayi Səttar səhər lap tezdən camaat yığılmamış ona 1000 manat pul verir ki, bəs uşağı yerdən urvatdı götür. İmkanın olsa verərsən, olmasa verməzsən, halal xoşun olsun. Onun belə yaxşı əməllərinə görə çox vaxt ona Xəlfə Səttar da deyərdilər.

Kərbəlayi Səttarın Müzəffər, Əli və Əhməd adlı oğlanları olub. Müzəffər boy-buxunlu, çox yaraşıqlı və igid olub. Atası boyaqxananın hazır mallarını onun ixtiyarına verib Tiflisə, qonşu rayonlara ticarət üçün göndərərdi. Qonşu sahibkar Hacı Məmmədsadıq Əliyev ona deyərdi ki, sən o cür cavan, yaraşıqlı oğlanın əlinə mal verib göndərirsən, ehtiyat eləmirsən ki, qaçaq-quldura rast gələr başına bir iş gələr. Kərbəlayi Səttar oğlunun igidliyinə bələd olduğu üçün arxayınca deyir ki, bütün qaçaqlar onu tanıyır, cürət etməzlər. Doğrudan da Müzəffər hansısa bir olayın qurbanı olub, cavan ölür.

Kərbəlayi Səttarın Əli adlı oğlu çox gözəl səsə malik idi. Müharibədən əvvəl onu Bakıdan gəlib səsinə görə aparmaq istəyirlər, lakin ailə razı olmur. Həmin zamanlarda oxuyanlara, artistə çox pis baxırdılar. Əlini müəyyən qərəzliklə yaşı düşmədiyi halda 41-ci ildə cəbhəyə göndərirlər. O da müharibədə həlak olur.

Əhməd adlı digər oğlu isə xasiyyətcə də, el arasında qazandığı hörmətə görə də atasına çox oxşayır. Atanın vardövləti olmağına baxmayaraq o heç vaxt atasından pul istəməzdi. Öz qabiliyyəti və zəhmətilə məhəllədə çayçılıq edir. Bir qədər pul əldə edəndən sonra öz həyətlərində hovuzun üstündə iri yeməkxana açır. Lakin onu da tezliklə müharibəyə göndərirlər. Müharibəyə gedəndə anası ona Kərbəladan gətirilən kiçik bir daş parçası verir ki, özündən uzaq qoyma. Sən yaralanacaqsan, oğul, amma öləsi deyilsən. Ananın dediyi kimi də olur. Əhməd döyüşlərdə Berlinə qədər gedib çıxa bilir. Müharibədən 16 adda orden və medallarla qayıdır. Gələndən sonra da özünün əvvəlki işi- çayçılıqla məşğul olur. Şəhərdə onu Əhməd kimi yox, "Çayçı Qara" adı ilə tanıyırlar.

Həmyerli jurnalistimiz Əbdül Qəni özünün "Berlinə gedən yol" kitabında onun cəbhə həyatını, qəhrəmanlıqlarını əhatəli işıqlandıraraq yazmışdır.

Çayçı Qaranın (Əhmədin) 6 oğlu olub. Onlardan Səftər Məsimov 25-30 yaşlarında olarkən öz tay-tuşları arasında



böyük nüfuz sahibi idi. Hələ 60-cı illərdə onun rəhbərliyi ilə bir qrup məhəllə cavanları Şəki Pedoqoji Texnikumu qarşısındakı kiçik meydançada Novruz bayramını çox təm-taraqla və ləyaqətlə keçirərdilər. Səftərin oğlu Azər Məsimov isə 4-5 dilin bilicisi olduğu üçün Bakıda tərcüməçi işləyir.

Əli Məsimov adlı oğlu respublikamızın tanınmış ziyalısı, siyasi iqtisad alimlərindəndir. Əli Məsimov da öz yaşıdları içərisində həmişə böyük nüfuz sahibi olmuşdur. O, məktəbi nümunəvi şagird kimi bitirmişdir. Bir dəfə də olsun dərslərinə qeyri-ciddi yanaşsın, tapşırığı yerinə yetirməsin, belə nöqsanlara yol verməzdi. 1989-cu ildən o Azərbaycanın müstəqilliyi uğrunda başlanan Xalq hərəkatına qoşulmuş və 1992-1993-cü illərdə Azərbaycanın İqtisadiyyat naziri və Baş Nazirin səlahiyyətlərinin icraçısı kimi çox məsul vəzifələrdə ləyaqətlə çalışmışdır.

Vaqif adlı oğlu isə Şəki Sanitar-Epidemioloji stansiyanın iqtisadçısıdır. Çayçı Qaranın digər övladları isə orta ixtisas təhsilli olublar. Ata-babalarının el arasında qazandıqları sanballı adlarına xələl gətirməmək üçün ləyaqətli, məsuliyyətli yaşam tərzinə əməl edirlər.

Bazarbaşı məhəlləsinin Qullar məhəlləsinə doğru uzanan dar-dolanbac yollarında çox sadə kiçik həyətli bir ev var. Dar küçəyə açılan qapısının üzərində bir xatirə lövhəsi vurulub. Böyük xanəndə **"ŞƏKİLİ ƏLƏSGƏR"** (antroponim) -- bu evdə 1866-cı ildə doğulub, yaşamışdır.

Hazırda bu nəslin davamçılarından olan, evin yiyəsi 60 yaşlı Rauf Hüseyn oğlu Abbasovdan öz nəslinə aid nə bildiklərini, nəslə kimlərin deyildiyini soruşduq. Dedi ki, nəslimizi **"QURUŞDARIN ABBASIN"** (patronim) –soyu adlandırırlar, mənasını isə bilmirəm. Öz kasıbçılığını çəkən Rauf dayıdan qohumu məşhur müğənni Ələsgər haqqında soruşsaq da, ancaq ümumi məlumutlara malik olduğunu bildirdi. Ömrünün 45 ilini muğam sənətinə həsr etmiş Ələsgər Abdullayev təkcə Azərbaycanda deyil, Orta Asiya respublikalarında, Gürcüstanda, Dağıstanda, İranda, Türkiyədə, Əfqa-

nıstanda və s. yerlərdə böyük şöhrət tapmış, Şərq musiqisinin bilicisi, ustad xanəndə idi.

Mərhum Baxşəli Əfəndinin söylədiyinə görə, görkəmli maarif xadimi Rəşid bəy Əfəndiyev Ələsgərin "Nəva" oxşamasını çox sevərdi. Deyərdi ki, bunu hər xanəndə oxuya bilmir. Əgər Rəşid bəy Ələsgər olan məclisə gələrdisə, sənətkar təklif gözləmədən "Nəva" dəstgahını başlayardı.

Şəhərin qədim Gəncəli məhəlləsinin sakini mərhum tarzən İbad Salmanov deyirdi: "Ələsgər "Orta-mahur" dəstgahının "Şikəsteyi-fars" şöbəsində iki qəzəl deyərdi. Ancaq dinləyicilər nəinki bundan yorulmaz, əksinə, istəyərdilər ki, bu oxumaq heç vaxt qurtarmasın. Çünki Ələsgər elə oxuyardı ki, el demişkən, elə bil yağdan tük çəkirsən. Səsinin gözəl guşələrinə, xallarına, xırdalıqlarına da ki, söz ola bilməzdi. Məclis onun oxumasından bihuş olurdu. Ona görə də zamanının musiqiçiləri deyirdi ki, Ələsgər "Orta Mahuru" oxuyarkən adamı öldürür, amma ölməyə qoymur.

Ustad sənətkar haqqında çox deyilib, çox yazılıb. Onun böyük şöhrəti olduğu kimi, böyük dərdləri də vardı. İki cavan qızının ölümü, oğul nəvəsinin xəstə olması ( o anadan olanda xanəndə dəvədən qurban kəsmiş, yastığı altına qızıl kisəsi qoymuşdu) onun belini bükən dərdlər olmuşdur. Onun çətin anlarında da Şəkili ziyalılar köməyinə çatmışdır, son məqamınacan layiq olduğu hörməti ona etmişlər.

1991-ci ilin sentyabr ayının 23-24-də qədirbilənlər tərəfindən Şəkidə böyük xanəndənin anadan olmasının (o, 1929-cu il aprelin 1-də Bakıda vəfat etmişdir) 125 illiyi münasibətilə Şəkili Ələsgər adına Respublika muğam festivalı keçirilmişdir. Tədbirin meydana çıxarılmasında xanəndənin adını daşıyan Şəki Musiqi Texnikumunun müəllim və tələbə heyətinin, həmyerli musiqişünasımız, hazırda Rusiyada (Sankt – Peterburq Pedoqoji İnstitutunun müəllimi) çalışan Faiq Çələbinin böyük əməyi olmuşdur.



Böyük xanəndənin adına deyilən hər bir xoş söz və əməl bizdə qürur hissi yaradır və onun unudulmazlığına haqq qazandırırıq.

**"GƏNCƏLİ MƏHƏLLƏSİ"** (miqrasion oykonim) – biz Şəki məhəllələrini təsvir etdikcə, onlardan birinin sonunu digər məhəllənin başlanğıcı olduğunu, birindən digərinə dar-dolanbac yollar, cığırlarla keçid olduğunu söyləmişdik. Artıq haqqında geniş məlumat verdiyimiz Giləhli məhəlləsinin sonluğu sayılan, Gəncəli məhəlləsinin başlanğıcı olan Çay məhləsindən danışmalıyıq. Tikilmiş evlərin sıxlığına görə də hər iki məhəllə arasında bağlılıq var. Bölgü üzrə isə Gəncəli məhəlləsi 8-ci rayon, M.F. Axundov küçəsidir. Bu dağ məhəlləsinin də özünəməxsus, müxtəlif dövrlərdə yaranmış toponimləri mövcuddur.

**"Müsəlla yeri"** (ekklezionim) (mərasimlərin həyata keçirildiyi yer)- dağın hündür alp çəmənliyində yerləşən bir sahəyə deyilir. Bu ad hazırda əməli fəaliyyəti baxımından öz əhəmiyyətini itirsə də, yaddaşlarda mənası yaşayır. Bu mərasimlər qədim türk mifoloji dünyabaxışı ilə sıx bağlıdır. Yayda yağış olmadıqda göydən yağış diləyi, Novruzda can isidən yaz günəşinə həsr edilmiş mərasimlər keçirilərdi. Günəşi təsvir edən gəlincik düzəldib, boynundan işıqlı, parlaq muncuqlar asar, nəğmələr oxuyardılar.

**"Su dərəsi"** (hidrooronim) – Gəncəli məhəlləsinə ata-babadan 3 cür su gəlir. Taclıq suyu, Hacı Həsən suyu, Çay suyu. Xan yaylağının ayağında Taclıq adlı qaynamanın suyu arx vasitəsilə məhəlləyə gəlirdi. Məhəllə ağsaqqalı 5-6 nəfər imkanlı qonşularla birgə pul qoyub, onu dulus borular vasitəsilə məhəllənin tən ortasınacan gətirməyi qərara alırlar. Həmin su gələn arx ayaqaltı olduğu üçün çox murdarlaşırmış. Belə ki, arx dağ yolu ilə Dağıstandan karvansaraya mal gətirən ləzgi qonşuların, yaxud buradan Dağıstana gedib-gələnlərin ayaqlayıb keçdiyi yolda yerləşirdi. Qərara alanlar işə başlayırlar. Çox çətin, təcrübəli kənkanların köməyilə görülən iş

düşünüldüyündən də xeyli çox xərc tələb edirdi. İşə qoşulanlar pulu qurtardıqca kənara çəkilirdilər. Hacı Həsən kişi isə işi başa çatdırmaq istəyində idi. İş Sulu dərə adlı hissəyə gəlib çatmış, o tək qalmışdı. Bundan başqa o, həmin Sulu dərədə təbii bir çeşmə də görmüş, suyun dadı çox xoşuna gəlmişdi. Onu xalis öz xərcilə həyətinə keçirmək fikri də var idi. Hacı Həsən kişi təklif etdiyi bu işdə tək qalandan sonra Taclıq suyunu su boruları ilə Kirəşxana deyilən hissəyə qədər gətirib çıxara bildi. Ondan sonra onun pulu təmiz qurtarır, qəm-qüssə içində qalır. Gəlinləri "Ağa" deyə müraciət etdikləri qayınatalarının bu qəm-qüssəsinin səbəbini qaynana vasitəsilə öyrənirlər. Ona çox böyük hörmətləri olduğu üçün özlərinə məxsus bütün qızıl bəzəklərini, bel kəmərlərini, cərgəgülləri və s. iri bir siniyə doldurub oğlan uşaqlarıyla qaynataya göndərirlər. Qaynanaya da deyirlər ki, ana, Ağaya çatdır ki, biz öz qızıllarımızı sidq-ürəklə veririk. De ki, işini başa çatdırsın. Hacı Həsən kişi doğma qızları təkin sevdiyi gəlinlərinə xeyir-dua edərək, əvvəlkindən də böyük həvəslə işə başlayır. 5 km-ə qədər məsafənin ardını davam etdirdi. Bu dəfə oğlu Süleyman bəy ona yardımçı oldu. Hacı Həsən kişi qocalıb, xəstəhal olduğu üçün işin əsas ağırlığı Süleyman bəyin üzərinə düşürdü.

Buna baxmayaraq, Hacı Həsən kişi Su dərəsində gördüyü çeşməni öz həyətinə də gətirir, I pay da Zəyzid yolunun ayağında camaat üçün, xüsusən də dağ yolu ilə Zəyziddən gələn yüklü kəndlilər üçün ehsan bulağı qoydurur. Camaat bu suya "Hacı Həsən suyu" deyirlər. 30-cu illərə qədər, hətta müharibədən sonra da bu bulağa bir qədər su gəlirdi.

Müharibədən sonra məhəllənin digər sakini Dadlı oğlu Şirəli bu bulağı təmir etdirib, kürəbəndlərini təmizlətdirmişdir. 50-60-cı illərdə "Hacı Həsən" bulağına su gəlirdi. Axundlar məhəlləsinə də həmin bulaqdan bir su xətti çəkilir. Ona da bir müddət su gəlir, sonra gəlmir. Bu söhbəti Süleyman bəyin özündən eşidən Müridlər nəslinin varisi Akif Səttarxan oğlu Məmmədov dedi ki, mən o rəhmətliklərdən eşitmişəm ki, bulaq



xəttinin qayğısına gərək daim qalasan. Baxdın, zəhmətini çəkdin, sənindi, baxmadın, itib-batacaq.

Bu gün mənim həyətimə də həmin Su dərəsi çeşməsinin suyu gəlir. Yaşlı olmağıma baxmayaraq mən həmin dərəyə gedir, kürəbəndlərə baxır, həyətimə gələn xəttin qayğısını çəkirəm. Öz övladlarıma da bunu təlqin edirəm ki, bu qorunub saxlanmalı sudur. Uzun illərin müşahidəsindən görürük ki, bu su dişlərə də yaxşı təsir edir. **"Çay məhlə"** (hidrooykonim) - Qurcanaçayın kənarı boyu yerləşən evlərə, həmin hissəyə deyilir. Bu məhəlləyə 8-ci rayon M.F.Axundov və 28 May küçələri daxildir.

**"MƏMMƏDNƏBİ HAMAMI"** (antropotoponim) – məhəllədə yerləşən bu hamam eyni adlı şəxsin adıyla bağlıdır. Vaxtilə hər məhəllənin öz dəyirmanı, məscidi, yanında bulağı, yaxınlığında isə hamamın tikilməsinin vacibliyi ənənəvi bir hal almışdır. Zamanında belə tikililərin inşası həm də ehsan, savab sayılırdı. Ona görə də belə tikiliyə qol qoyanlar "Tikdimki, izim qala" dəyərinə də əsaslanıb sidq-ürəkdən xərc çəkirmişlər.

**"KİRƏŞXANA"** (paleotoponim) – adından bəlli olduğu kimi, zamanın ən dəyərli tikinti materiallarından olan əhəng kirəş quyularında yandırılıb, emal olunardı. Şəkinin qədim evlərinin hamısı həmin materialdan işləndiyi üçün uzun-ömürlüdür. Zaman keçib, kirəci yeni-yeni tikinti materialları əvəz edib. Kirəşxana adı da, yeri də, onunla məşğul olanlar da yaddaşlarda qalıb.

**"ZƏYZID YOLU"** (dromonim) – vaxtilə çox işlək olan bir el yolunun adıdır. Ata-babadan şəhərə yaxın kənd olan Zəyzidin əhli dağ yolu ilə gəlib-gedərdilər. Yaşlıların dediyinə görə, 30-cu illərə qədər qatır və uzunqulaqlara yüklənən səbətlər, kisələri dolu zəyzidlilər çox vaxt Hacı Həsən bulağı ətrafında dincəlmək üçün dayanardılar. Məhəllə camaatı həmin hissəyə Zəyzid məhlə də deyərdilər. Onların Karvansara bazarına gətirdikləri mallardan da alardılar. Yellicə dağı və yaylası adlanan hissə, yenə adından bəlli olduğu kimi sıralanan gözəl

mənzərəli dağların birinə deyilir. Gözəl alp çəmənliyi olan bu dağın yay istirahəti üçün misilsiz imkanları var. Güllü təpə, Calğalıx (tut ağacları olan yer), Bulaqlıq, Hünüdərə, Taclı dərə bu dağlara aid yerlərdir. Bu hissələr yerli camaat, xüsusən də dağ döşündə yaşayan məhəllə sakinlərinin çoxunun yaxşı tanıdığı yerlərdir.

**"GÜLDƏSTƏ ZİYARƏTGAHI"** (ekklezionim) – iri cökə ağaclarının yerləşdiyi hissəyə deyilir. Camaat həmin hissəni müqəddəs yer kimi tanıyır, nəzir qoyur, dilək yaylıqları bağlayırlar. Əslində həmin hissə çox qədim zamanlardan qəbiristanlıq yeri olmuşdur. İndi də məhəllənin yuxarı hissəsində yaşayan yaşlı adamlar həmin yerə (hazırda burada 4 saylı məktəb və məhəllənin ən geniş küçəsi yerləşir) gedəndə "aşağı qəbiristanlığa gedirəm" deyirlər. Baxmayaraq ki, indi həmin qəbiristalıqdan əsər-əlamət qalmayıb.

Zaman-zamanı üstələdikcə məhəllənin əhalisi artmış, artıq tən ortada olan qəbiristanlıq yeri yavaş-yavaş binalarla zəbt edilmişdir. Yaşlıların dediyinə görə, bu yerdə təzə-təzə tikinti işləri aparıldıqca çoxlı insan sümükləri, bəzən də bir neçə mərtəbə olan qəbirlər çıxırdı. Camaatdan onları yığıb yuxarı "Sona qəbiristanlığı"nda (vəfat etmiş gənc qızın orada ilk dəfə dəfn edildiyi üçün bu ad verilmişdir) dəfn edənləri də, çayın içinə atanları da olurdu.

Həmin Güldəstə deyilən ziyarətgah da o qədim qəbirlərdən birinə aid olan yerdir. Hazırda məktəbin həyətyanı sahəsinin yuxarı hissəsini əhatə edir. Qadınlar burada eyniadlı nakam bir qızın dəfn edildiyini deyirlər.

**"HÜRRİYYƏT MEYDANI"** (aqronim) - isə əsrin əvvəllərində məhəllənin həmin məktəbin qabağından indiki Qaqarin parkına və körpüqulağına doğru yönələn hissəsinə deyilir. Məhəlləyə aid bütün ümumi yığıncaq və tədbirlər həmişədən bu hissədə keçirilir. Artıq arxaikləşmiş bu adı ancaq tək-tək yaşlılar bilir. İndikilər bura relyefinə görə **"TƏPƏ MƏHLƏ"** deyirlər.



**"KÖRPÜQULAĞI"** (dromonim) - məhəlləyə giriş üçün qoyulan qədim körpünün karvansara ilə üzbəüz hissəsinə deyilir. Qurcanaçay üzərindəki həmin körpünün tağı və çay arasındakı hissə həmişə qaranlıq olduğuna görə Qaranlıq da deyilir. Bu körpünün memarlıq xüsusiyyətləri və indiki vəziyyəti əməkdaşımız m.n. N.Əsgərovanın tədqiqatında öz əksini tapmışdır.

**"GÜLLÜQARI MƏSCİDİ"** (ekklezionim) - məhəllənin 19-cu əsrin ortalarında tikilən binasıdır. Şərq memarlıq ənənələri üslubunda tikilən bu məhəllə məscidi camaat tərəfindən həmişə qorunmuşdur. Dini mərasimlər zamanı qadınlar burada daha çox olurlar. Güllüqarı adlı bir nəfər də həmişə buranın qoruyucusu və orada yaşayan olduğuna görə bu ad verilmişdir. Məhəllənin adının etimoloji açımı çox aydındır. Məhəllə yaşlılarının ata-babalarından üzü bəri eşidib bildiklərinə, tarixi zaman olaylarına əsaslanıb gəldiyimiz qənaət belədir.

1139-cu ildə Şirvan bölgəsində, xüsusən də Gəncə və Şamaxıda çox dəhşətli zəlzələ baş vermiş, əhalinin çox az hissəsi salamat qalmışdır. Həmin vaxtlarda da Kəpəz dağı uçub Ağsu çayının qabağını kəsmiş, adı dillər əzbəri olan Göygöl yaranmışdır.

Elə həmin ərəfələrdə sağ qalanların yaxın əyalətlərə köçhaköçü də başlamış, köçməyənləri də olmuşdur. Şəkinin bu dağ məhəlləsində də gəlib yurd-yuva salanları olmuş, öz adət-ənənələrini qoruyaraq yaşamışlar. Gələnlərin arasında sənətkarlar da çox olmuşdur. Təsadüfi deyil ki, məhəllənin özündə bu gün də şamaxılıların, şirvanlıların evi, adıyla tanınan mülkləri var. Belə də deyilir ki, Şah İsmayıl Xətai dövründən gəncəlilərin, şamaxılıların nəinki Şəkidə, Azərbaycanın çox yerlərində məskunlaşdırılması da olmuşdur.

Çay məhəlləsi bir də o məhəllədir ki, onun tən ortasında böyük ədibimiz, materialist-filosof, ictimai xadim, realist Azərbaycan dramaturgiyasının banisi Mirzə Fətəli Axundovun doğulduğu ev yerləşir. Bu ev sırf Şəki memarlıq ənənəsilə tikilən, yığcam, iki otaqlı kürsülü, zirzəmili evdir. Eyni həyətdə

M.F.Axundovun əmizadələrinə, onların nəvə-nəticələrinə məxsus, çiy kərpicdən tikilmiş 2 mərtəbəli, zirzəmili digər ev də var.

M.F.Axundovun doğulduğu ev muzey kimi fəaliyyət göstərdiyi halda, bu ev demək olar ki, 50-ci illərin sonundan bağlı qalmış, varislər Bakı şəhərinə köçmüşlər. İlin müəyyən vaxtlarında qısa müddətə gələn vaxtları da, gəlməyən vaxtları da olub.

M.F.Axundovun ev muzeyinin iç interyeri, avadanlıqları o qədər gözəl, cəlbedici və doğmadır ki, adam burada dönə-dönə olmağı arzulayır. Taxça və rəflərə, yük yerlərinə yığılmış ata-baba əşyalarının ənənəvi düzülüş qaydaları insanın qəlbini isidir.

Muzeyin işçi qızları şikayət edəndə ki, bəs buraya çox az hallarda qonaq gətirilir, çox təəssüfləndik. Özündə şəhərə məxsus çox ənənəvi qaydaları saxlayan bu ev əlaqədar kəslərin diqqətindən kənardadır. Şəki Xan sarayının yaxınlığında olan bu muzeyi turist marşrutuna salmaq belə çətindir?

Sıra dağlar, xüsusən Xan yaylağı bu muzeyin həyətindən o qədər gözəl görünür ki, bu hər kəs üçün heyranedici mənzərə ola bilər. Muzeyətrafı evlərin çoxunun 1,2 əsrə qədər, bəzən də çox yaşı var. Çay daşlarından, çiy kərpicdən tikilmiş, bişmiş kərpicdən hörmə naxışları, taxta oyma bəzəkləri olan evlər məhəllənin əzəli simasını yaşadır. Belə evlərdən biri də Azərbaycanın tanınıb sevilən bəstəkarı, xalq artisti, Şöhrət ordenli, əsərləri dünyanın adlı konsert salonlarında ifa olunan, bir çox beynəlxalq müsabiqələrin iştirakçısı, bəzən də sədri olmuş Xəyyam Mirzəzadənin ana tərəfdən babası evidir. Qonşuların və indiki ev sahiblərinin dediyinə görə, bəstəkar hər il gəlib baba yurduna və qohumlarına baş çəkir.

Bu məhəllədən danışdıqda öz zamanının böyük şəxsiyyəti Axund **"FƏRƏCULLAH PİŞNAMAZZADƏ"**dən (antroponim) əhatəli məlumat verməliyik.

Öncə qeyd edim ki, bu parlaq şəxsiyyət barədə, nəslin davamçılarından olan nəvə Qəzənfər Əlioğlu özünün "Talelər düşüncələr, duyğular" kitabında Şeyx Fərəcullah Pişnamazzadə haqqında qürurla yazmışdır.



Həmçinin şəhərimizin tanınmış ziyalılarından olmuş, Azərbaycan Yazıçılar Birliyi Şəki Bölgə filialının məsul katibi, mərhum Teymur Xəlilov da özünün yarımçıq qalmış "Şəki qaçaqları" bədii-tarixi əsərində Axund Fərəcullahın həyat və fəaliyyətindən bəhs etmişdir. Yerli qəzetdə əsərdən hissə-hissə verildiyindən bilirik ki, mərhum jurnalistimiz Axundun şəxsi keyfiyyətlərini və məramını, rus əsarətinə qarşı vuruşan qaçaqların haqq işini böyük məhəbbətlə təsvir etmişdir. Ağlı kəsəndən ata-anasından onlar haqqında xoş xatirələr eşitmişdir. Axundun böyük qardaşı Axund Cabbarın bir qızı Firuzə xanım Teymur Xəlilovun atası Abuzər Həşim oğlunun, digəri isə əmisi Əliheydərin həyat yoldaşı olmuşdur. Əslində əsərin sonluğu da sxematik qeydlərlə yazılmış, sadəcə tam dolğunluğu ilə qurtarmamışdır. Teymur Xəlilovun bacanağı, Bakının İçərişəhər məhəlləsinin məşhur "Ağşalvarlılar" soyundan olan, uzun illər ali məktəb müəllimi olmuş, ata-baba sənəti olan zərgərliyi gözəl bilən Ağa Tağı müəllim onun əsərinə mərhumun ailəsilə birgə qədirbilənliklə yanaşaraq, kitab halında çapına nail olacağını deyir. Biz ona inanırıq. Çünki adlı soydan olan Ağa Tağı müəllim o adamdır ki, Sovet quruluşundan dönə-dönə əzab çəkmiş məşhur messenant, milyonçu Hacı Zeynalabdin Tağıyevin yeganə varisi, ixtiyar yaşında köməksiz olan Sara xanımın 70-ci illərdə yeganə dayağı idi. Mövcud quruluşa ikrah edib, inamı olmayan, gününü yalnız evdə keçirən, Peterburq təhsilli Sara xanım atasına qarşı sürülən ittihamla heç vaxt barışmamışdır. Atası haqqında yazdığı dəyərli əsəri torba şəkilli kisədə boynundan asıb sinəsində gəzdirərdi. Qorxardı ki, onu evdə hansısa bir yerə qoysa əli hər künc-bucağa işləyən rejim onu da yandırıb məhv edər. Qapını da heç açmazdı, yalnız Ağa Tağı müəllimə açar, onu da azca aralayıb zəncirbəndi çıxarmadan xüsusi işarəylə əmin olandan sonra (barmağını ilgə tək qatlayar, ağa Tağı müəllim də eyni qayda ilə barmağını ilgəli edib onun barmağına keçirəndə duyardı ki, gələn onun canına yanandır) qapını onun üzünə açıb, tez də bağlardı.

Kinoşünas Ayaz Salayev dəfələrlə bu qapının önünə gəlmiş, onu haylamış, telefonla məqsədini demişdir ki, Sara xanım, o yazdıqlarınızı mənə verin, atanızdan film çəkəcəyik, ancaq nail ola bilməmişdir. Bunu yalnız Sara xanımın hər qayğısını çəkən Ağa Tağı müəllim alıb ona vermişdir. Onunla heç bir qohumluq ilişgiləri olmayan Ağa Tağı müəllim böyük şəxsiyyətin varisinə göstərdiyi qayğını, son mənzilə yola salanda da etdiyi fədakarlığı heç bir yerin, kəsin tapşırığı olmadan, öz ürəyinin, qürurunun təəssübkeşliyilə etmişdir. Ömür-gün yoldaşı, şəkili qızı Rəhimə xanım da bu xislətdə adamdır. Bəzən gecənin bir vədəsində Sara xanım zəng vurardı ki, bəs könlümə bu yemək düşüb, heç daralmadan durub hazırlayıb göndərərdi. Biz isə bunları qeyd etməyə bilmərik.

Hər cür rəhmətə, hörmətə, diqqətə layiq, müqəddəslərə xas olan dərəcədə mülayim, bəşəri xilqət olan Axund Fərəcullah Pişnamazzadə 1870-ci ilin mart ayının 21-də Şəkidə doğulmuşdur. Babası Molla Məhəmməd, atası Molla Zeynalabdin, böyük qardaşı Axund Cabbar da evdə onun təhsililə məşğul olmuşdular. Axund Cabbar görürdü ki, qardaşı Fərəcullah elmə, islama böyük maraq göstərir. Zehinli, istedadlı və zəhmətkeşdir. Ona görə də Fərəcullahı 15 yaşında olarkən İrana və Səudiyyə Ərəbistanına oxumağa göndərmişdilər. O, təhsil illərində Quranı, İlahiyyatı, İslam tarixini, ərəb və fars dillərini mükəmməl öyrənmişdi. Şərq klassik ədəbiyyatı və dünya siyasəti barədə geniş məlumata yiyələnmişdi. Təhsilini başa vuran kimi Şəkiyə qayıdıb, din xadimi kimi fəaliyyətə başlamışdı.

Qardaşı Molla Cabbar Axund vəfat edəndən sonra şəhərin baş axundu olmuşdur. Hazırda Yuxarı Karvansara ilə yanbayan yerləşən böyük, görkəmli məscidin əsası onun ata və babası tərəfindən qoyulmuşdur. Onların qəbri də elə məscidin həyətindədir.

Axund Fərəcullah yeni böyük vəzifədə yetkin din alimi və ictimai xadim kimi coşqun fəaliyyət göstərmişdir. İndiki 4 saylı məktəbin, bir neçə məhəllə məscidlərinin tikintisinin



təşəbbüskarı və yardımçısı olmuşdur. O, öz hesabına ibtidai qız məktəbi açdırmış, bu yeni təhsil ocağına ilk növbədə özünün və qardaşlarının qızlarını göndərmişdir ki, digər valideynlər də ruhlanıb qız övladlarını təhsilə cəlb etsinlər. Şəhər Xeyriyyə Cəmyyəti yaradıb, şəhərin imkanlı tacir və sahibkarlarını da buraya yönəltmişdir. Həmin illərdə dövrünün ən aktual nəşri olan "Molla Nəsrəddin" jurnalının yaşamasına çox maddi kömək etmişdir.

Xan yaylağının ətəyindən qaynaqlanan Taclıq çeşməsinə həmişə qayğıyla yanaşmış, lazım olan hissələrə su xətti çəkilməsinə yardımçı olmuşdur. Məhərrəmlik mərasimində zəncir vurmağı, qıfıl salmağı, qan tökməyi qadağan etmişdir. Şiə və sünnü təriqətli insanlar arasında möhkəm birlik yaranmasına güclü təsir göstərmişdir. Bu faktla bağlı olmuş bir hadisə əfsanəvi şəkildə indi də dillərdə dolaşmaqdadır. 1910-1911-ci illərdə Şəkidə sünnü-şiə təriqətli adamlar arasında kiçik narazılıqlar, hadisələr başlayanda Axund Fərəcullah Nurməhəmməd Əfəndilə (haqqında geniş məlumat verdiyimiz məşhur Xalisəqarızadələr soyundan) məsciddə camaat qabağına çıxaraq "Böyük dinimizi belə təxribatlar içində zibilləməyin" demişdir. Sonra öz əmmaməsini Nurməhəmməd Əfəndinin, onunkunu isə öz başına qoyaraq, bundan sonra şiələr xeyir-şər üçün Nurməhəmməd əfəndinin, sünnülər isə mən axundun yanına gələcəklər demişlər.

Axund Fərəcullah Pişnamazzadənin ruhani böyüklüyü, uzaqgörənliyi bu əsassız qovğaya birdəfəlik son qoymuşdur.

O, böyük əqidəli türkçü idi. Türkiyə ilə daim sıx əlaqə saxlayırdı. 1918-ci ildə azərbaycanlıları erməni hücumlarından qorumaq üçün Nuxaya daxil olan Türkiyə ordu hissələrinin və onun başçısı Nuru Paşanı təntənəli qarşılamışdı. Bu münasibətlə Narınqala içərisində - Xan sarayının həyətində böyük mitinq keçirmişdir. Ümumiyyətlə, Axund dini bir, dili bir olan Türkiyənin böyük təbliğatçısı, rus çarizminin isə qatı düşməni idi. Belə gur mitinqlərdə də, məscidlərdə də, digər ictimai

yerlərdə də çar üsul-idarəsini ifşa edirdi. Bununla yanaşı o, mütərəqqi rus ziyalıları ilə əlaqə saxlayırdı. Tolstoyla məktublaşırdı. Onlar elə məktubla da islam və xristian dinlərinə aid bir çox məsələləri müzakirə edirdilər.

Sovet hakimiyyətinin ilk illərinin tutlıatutunda Axund Pişnamazzadə şəhər inqilab komitəsinə, oradan da güllələnmək üçün xüsusi şöbəyə aparılmışdır. Şöbənin rəisi Fyodr Konstantinoviç Qonkin onunla ətraflı söhbət etmişdi. Aydınca duymuşdu ki, Axund Pişnamazzadə adi molla deyil, çox hazırlıqlı alim, təşəbbüskar, ictimai xadim və parlaq şəxsiyyətdir. Xüsusən də, çarizmin əleyhinə fəal təbliğatçıdır. Ona görə də Axundun güllələnməyinə başqaları kimi birdən-birə qol çəkməyə cəsarət etməmişdi. Ona demişdi ki, Sizi bu gecə güllələməmək də olar. Amma gərək bir-iki sınanmış yoldaş sənə zamənət versin, varmı belə tanışların? Axund dərhal cavab verir ki, bəli var:- Nəriman Nərimanov və Mirzə Cəlil. Bu hadisə N.Nərimanova dərhal çatdırılmışdı. Onun köməyi sayəsində Axund güllələnməkdən xilas olmuşdur. İnqilab komitəsinin sədri və xüsusi şöbənin rəisi onu faytonla evə gətirib özündən və ailəsindən üzr istəmişdilər.

Axund Pişnamazzadə 30-cu illərdə Bakıya köçmüş, Aşağı Dağlıq məhəlləsinin Suraxanski küçəsinin kəsişdiyi yerdə yaşayırdı. Həmin illərdə milli və dini duyğusu güclü olanlara Quranı, əski əlifbanı, ərəb-farsı gizlincə öyrədirdi. Mərhum yazıçımız Əzizə xanım Cəfərzadə ərəb əlifbasını 38-ci ildə Axunddan öyrənmişdi. Əzizə xanım özünün televiziya çıxışlarının birində bunu demiş, böyük şəxsiyyətin onun yaddaşında əbədi iz saldığını söyləmişdir. Axund Zaqafqaziya müsəlmanları Şeyxülislamının müavini vəzifəsində ömrünün sonunacan işləmişdir. 1946-cı ildə İraqa din xadimlərinin yığıncağına və Həcc ziyarətinə getmişdir.

Sovet hökuməti onu dini işlərlə əlaqədar Moskvaya, Daşkəndə, Bişkekə, Ufaya ezam edirdi.



Vətənini, dil və dinini, elmi, xalqını sevən, əsil ruhani, bəşəri xilqət olan Axund Pişnamazzadə 1952-ci ildə aprelin 10-da vəfat etmişdir. Onun dəfninə dünyanın çox yerindən din xadimləri gəlmiş, cənazəsi evdən qəbiristanlığacan çiyinlərdə canfəşanlıqla aparılmışdır.

Gəncəli məhəlləsinin digər bir adlı soyu da **"MÖVLƏ-ZADƏLƏR"**dir (patronim) – ki, onların babaları Şeyxülislam Məmmədhəsən Şəkuyi Quranın məşhur tərcüməçisi və bilicisi kimi tanınmışdır. M.Şəkuyi də dövrün mütərəqqi fikirli, xüsusən də azadlıq və istiqlaliyyət fikirli ruhani alim olduğu üçün çar üsul-idarəsinin ondan heç xoşu gəlmirdi. 1907-ci ildə Qafqaz Şeyxülislamı Əbdülsalam Axundzadə vəfat etdiyindən millət ziyalıları onu bu vəzifəyə keçirilməsini üsul-idarədən tələb edirdi. Mütərəqqi ideyalarına görə çar Rusiyası onu təsdiq etmək istəmirdi. Ziyalıların tələbilə 1908-ci ilin əvvəlində onu bu vəzifəyə təsdiq etsələr də, 1909-cu ildə isə azad edirlər. Sovet hakimiyyəti qurulandan sonra da ərəb, fars və türk dillərini, Şərq ədəbiyyatını, tarixini, islamı dərindən bilən Şeyx tərcümələrinə görə də dini işlərdən uzaqlaşdırılır. Lakin bolşevik hökuməti onun zəngin kitabxanasını və əlyazmalarını yandırır. Əhali arasında çox güclü nüfuza malik olduğuna görə ona toxunmamışlar. Alim 1932-ci ildə 79 yaşında Tiflisdə vəfat etmişdir.

Mövləzadələr nəslinin davamçılarından texnika elmləri doktoru, professor Vaqif Zahid oğlu Azərbaycan Politexnik İnstitutunun "Maşınqayırma texnologiyası" kafedrasının müdiri vəzifəsində çalışır. Filologiya elmləri namizədi Səmayə Ələkbər qızı Mövlayeva isə Nizami adına Ədəbiyyat Muzeyinin əməkdaşıdır. Onlar özlərinin elmi və əməli fəaliyyətlərilə ata-babalarının söhrətini həmişə uca tutaraq yaşayırlar.

Mövləzadələr soyunun bir ziyalısı da Atayeva (Mövləzadə) Elmira Zahid qızıdır.1958-ci ildə Azərbaycan Sənaye İnstitutunun geoloji-kəşfiyyat fakültəsini bitirən Elmira xanım dağ mühəndisi-geoloq ixtisasına yiyələnmişdir. Azərbaycan

Elmlər Akademiyasının Geologiya İnstitutunda əvvəlcə kiçik elmi işçi kimi çalışmış, sonra isə aspiranturada oxumuşdur.

1967-ci ildə akademik Q.Ə.Əlizadənin rəhbərliyi altında "Qərbi Azərbaycanın Kür və İori çaylararası sarmat çöküntülərinin stratiqrafiyası və "molyuska faunası" mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdir. E.A. Mövləzadə Geologiya institutu "Mezokaynozoyun regional stratiqrafiyası" laboratoriyasında aparıcı elmi işçi vəzifəsində çalışır və miosen çöküntüləri üzrə ekspert kimi fəaliyyət göstərir. O, Azərbaycanın neogen stratiqrafiyası və paleocoğrafiyası üzrə bir sıra problemləri həll etmiş, onlara həsr olunmuş 60-dan çox elmi əsərin müəllifi və həmmüəllifidir. Onun əsərlərindən iyirmisi ölkəmizdən xaricdə- Moskva, Saratov, Sankt-Peterburq, Afina, Budapeşt, Barselona, London, Dallas, Nissa, İstanbul, Sivaş, Təbriz və Maltada çapdan çıxmışdır.

Onun elmi tədqiqatlarının nəticəsi neogenin neftli-qazlı çöküntülərinin stratiqrafik bölgüsünün dəqiqləşdirilməsində böyük əhəmiyyət kəsb etdiyi kimi, onlardan bir çoxu neftçi geoloqların və stratiqrafların stolüstü kitablarındandır. Xüsusən də "Azərbaycanın geologiyası, Stratiqrafiya, Mezazoy və Kaynazoy" kitabları ən işlək kitablardandır.

E.A.Mövləzadənin elmi fəaliyyəti haqqında "Şəki-alim və ziyalıları" (Ə.Məmmədov, F.Xalıqov, Bakı, 2002) kitabında əhatəli yazılmışdır (səh. 44-47).

Biz bu həmyerlimizlə də fəxr edir, ona uzun ömür, yaradıcılıq uğurları arzulayırıq.

**"CİNAĞALAR"** (patronim) – Tacir Ağa adlı birinə verilən bu adı artıq ikinci yüz ildir ki, böyük nəsil daşıyır. Tacir Ağa ata-babadan məhəlləyə saxsı borularla gətirilən dağ çeşməsi olan Taclıq suyunun sevəni və qoruyucusu olub. Daim suyun qayğısını çəkər, çeşmənin başına, kürəbənd yerlərinə nəzarət edərdi. Hər mövsümün özünə görə su lülələrinin təmizliyinə fikir verərdi. Onu su başında səhər, axşam tez-tez gördüklərinə görə ləqəbi həmişə dəqiqliklə deməyi xoşlayan



Şəki əhli ona "Cin Ağa" adını demişlər. Deyim və inamlara görə də su başında cinlər çox olur. Məhz buna istinadən tacir Ağaya həmin ləqəb verilmişdir.

Yenə də xalq deyən bu fikri təkzib etmədən tarixi bir faktı da qeyd etmək istəyirik. Belə ki, tarixdə Cinli adlı türk tayfası da mövcuddur. Qafqazda bu tayfa ilə bağlı toponimlər çoxdir.

Cin Ağanın övladlarından Məşədi İsmayıl, Əbülfəz də tacir olublar. Əbülfəzə "Əmioğlu" ləqəbilə müraciət edərdilər. Həmin Əmioğlu Əbülfəz İrana, Türkiyəyə-Tiflisə alver üçün gedib-gələndə öz evinə həmişə klassik rəssamların əsərlərindən gətirərdi. Çox incə zövqlü, gözəllik duyumu yüksək olduğundan bu onun üçün bir növ xobbi idi. Çox təəssüf ki, onlardan tək bircəsinin kiçik həcmdə olan Rafaelin əsərinin fotosurət çıxarışını gördük.

Məşədi İsmayılın oğlanları Abbasəli, Ağaəli, Mirzəli, Cabbar və Muxtar da tacir olublar. Mirzəli yerli gimnaziyanı oxumuş, sovet dövründə mühasib işləmişdir. Nəslin indiki varislərinin söylədiyinə görə, bu ailənin Nisəbəyim, Ağabəyim, Anabəyim, Zəhrabəyim adlı gəlinləri olub. Nökərli, qaravaşlı evin bu gəlinləri həmişə milli geyimli, bəzəkli, tikmə işilə məşğul olan, gəlingörməsi, xınayaxdı, qız toylarında günlərini keçirən xanımlar olublar. Onlardan biri Zəhrabəyim Mənçəri məhləsindən Molla Əlihüseynin qızı olub. Şəhərin axundu olan Molla Əlihüseyn məşhur din xadimi Axund Fərəcullah Pişnamazzadə ilə siğə qardaşı olub. Sovet hökuməti qurulandan sonra çox elmli dindarlarımız, halallığı həmişə əsas tutan tacirlərimiz güllələndi, sürgün olundu. Bir çoxunun da ürəyi bu hökumətin Allahsızlığına, despotizminə dözməyib dünyasını dəyişdilər. Molla Əlihüseyn də dözməyib vəfat etdi.

Cinağaların əsas ilkin ata-baba yurduna baxdıq. Bu nəslin nəvələrindən olan, uşaqlığı da həmin mülkdə keçən hazırda 17 saylı uşaq bağçasında çalışan, yarım əsrə qədər pedoqoji stajı olan, Şəki əhli tərəfindən yaxşı tanınan Həyat müəllimənin

verdiyi təsvirdən evdə heç nə görmədik. Milli dəyərlərimizi gözəl bilən Həyat müəllimə bu evi rəfli, taxçalı, noğuldanlı, şəbəkəli və s. təsvir etmişdir. Uzun illər baxımsız qalan ev vərəsələr tərəfindən satılmış, evin yeni sakini ona tamamilə müasir görkəm vermişdir. Təkcə ikinci mərtəbədə kərpicdən tağşəkilli hörmə tavanı olan kiçik bir otaq, yanlarında isə taxçalı, rəfli, qədim tirləri yanıb qorsaq olmuş kiçik otaqlar gördük. Ev də çox böyük olmayan həyəti də uzun yüz illər boyu yatağı çox dərin, enli yarğana çevrilmiş Qurcana çayın lap kənarında yerləşir. Çayın həyət tərəfdəki divarlarında dağılmış şirəli köhnə bir evin içərisi, taxçası aydın görünür. Bu hansısa zamanda selin qurbanı olmuş bir evin son izləridir.

Burada vaxtı ilə yaz aylarında lalə toplayan uşaqlardan birinin çayın bu qaranlıq dərəsinə düşüb öldüyünü də söylədilər. Bu dərəyə Qanlı dərə də deyirlər. Bəlkə uşağın ölümünə görə, bəlkə selin-suyun uçurub dağıtdığı evə görə, bəlkə də bolşeviklərin Qalada saxladıqları dustaqları gecə ikən soyundurub, paltarlarını bu dərəyə atıb, özlərini də dağ yaxasında güllələdiklərinə görə bu ad qoyulub. Nəyə görə qoyulubsa da, elə indiki dəhşətli görkəminə bu ad yaraşır.

Cinağalar nəslinin bugünkü varislərindən biri olan, qədim həkkaklıq sənətinin Şəkidə yeganə yaradıcısı olan Ağayev Əli Allahyar oğlundan bir qədər məlumat verməyi lazım bilirik. Metal, qiymətli daş, şüşə, gil kimi cisimlər üzərində iti uclu alətlər vasitəsilə həndəsi, nəbati, piktoqrafiq naxışlar, nəsihə-tamiz sözlər, klassiklərin əsərlərindən nümunələr, sonralar Qurandan götürülən müqəddəs kəlamlar həkk olunardı. Bu qədim həkkaklıq sənəti e.ə I minilliyin başlanğıcından XX əsrə qədər olan uzun bir dövrün müxtəlif mərhələlərində yaranmışdır.

Dünyəvi ticarət şəbəkəsində olan, qədim İpək yolu üstdə dayanan Şəkidə digər sənətlərlə yanaşı, bədii metal işləri də çox olub. İndi elə nümunələrə adlı muzeylərdə tamaşa edir, səliqəli-saxlanclı evlərdə rast gəlirik.



Milli sənətkarlıq dəyərlərimizi yaxşı bilən, qədim yurdumuza bağlı olan cavanlarımızdan biri Əli Ağayev metal üzərində həkkaklığın vurğunudur. Qədim nəsillərə məxsus evlərdə qalan mis sərpuş, məcməyi, sini, satıl, sərnic, qazan dəstləri, üstü naxışlı xəncərlər, qədim xalça naxışları uşaq vaxtlarından onu öz sehri ilə ovsunlamışdır. Xan sarayının naxışları, yaşadığı yurdun təbiət çalarları ilə bu qablara həkk olunmuş naxışlar arasında çox yaxınlıq, doğmalıq görürdü. Ona görə də öz sələflərindən öyrənə-öyrənə bu gün də sevdiyi işlə məşğuldur. Qədim karvansaranın 5 saylı hücrəsində oturub çalışan Əli əldə etdiyi naxışsız mis və digər qabların üzərinə naxışlar həkk edir, hücrənin qabağına düzür. Sifarişlər də qəbul edir. Karvansaranın əzəməti bu qabların gözəlliyini birə-beş artırır. Gəlib-gedən turistlər sözsüz ki, biganə qala bilmir, hərəsi bir nümunə alıb aparırlar. Gənc sənətkarın əl işləri diyarbadiyar gəzib öz müəllifinə və yurduna şöhrət gətirir.

Cinağaların evinin qonşuluğunda gözəl, milli ənənələr üslubunda tikilmiş evlər var. Bunlardan biri Azərbaycanın tanınmış ziyalılarından olan, həmyerlimiz müəyyən müddət Neft Sənaye Naziri vəzifəsində çalışmış Bəxtiyar Məmmədovun nənə-babasına, dayısına məxsus ev olubdur. 2 mərtəbəli, daş və kərpic hörmələrdən tikilmiş evin eyvanındakı taxta oymalar kənardan çox gözəl görünür. Qapısı bağlı, bərpa işləri aparılan bu evin indiki sahibi Şəki bazarının müdiri olduğunu qonşular söylədi.

**"BƏXTİYAR MƏMMƏDOV"**un (antroponim) – uşaqlığı, cavanlığı bu yerlərdə çox keçib. Tanıyanların hamısının yaddaşında o xalqını, yurdunu sevən böyük şəxsiyyət kimi qalmışdır. Bəxtiyar Məmmədovun ata tərəfi Nuxa küçəsində Kəblə Göyüşlər nəslindən olsa da, bu Yuxarı məhəllənin sakinləri onun haqqında rəğbətlə danışırdılar.

B.Məmmədov 1925-ci ildə anadan olub. 10 saylı məktəbi bitirdikdən sonra 1949-cu ildə Azərbaycan Sənaye İnstitutunu (Az.Neft Akad.) bitirib. Təyinatla hələ tələbə ikən işlədiyi

Suraxanı mədənlərinin Qaraçuxur sahəsində mühəndis işləyib. 50-ci ildə Moskvaya aspiranturaya oxumağa göndərilir. Qayıdandan sonra onu Suraxanı mədənində böyük mühəndis vəzifəsinə, daha sonra isə Umbakı mədəninə baş mühəndis vəzifəsinə göndərirlər. Bir neçə aydan sonra isə həmin mədənin müdiri vəzifəsinə irəli çəkilir. Bu həmin illər idi ki, Azərbaycan daxil olmaqla böyük bir ölkə müharibənin yaralarını sağaltmaqla məşğul idi. Neft daşları işə düşmüş, dənizdə yeni yataqlar aşkara çıxarılmışdı. Neft daşlarında keçdiyi sınaqlar, burda əldə etdiyi uğurlar B.Məmmədovun güclü təşkilatçılıq və yüksək mənəvi keyfiyyətlərini üzə çıxarır, bunlar isə respublika rəhbərliyinin diqqətindən kənarda qalmırdı.

Məhz həmin illərdə 1956-cı ildə Sosialist Əməyi Qəhrəmanı, bir il sonra isə Neft ustası adlarını alması onun əmək rəşadətinə verilən layiqli qiymət idi. Doğma el-obası Şəkidə, Bakıda yaşayan şəkililər isə onu zarafatla "qara qızılın atası" adlandırırdılar.

Bir müddət sonra onu dövlət xəttilə Nigeriyaya neft sənayesinə kömək məqsədilə göndərirlər. İki il orada vicdanla, özünün, təmsil etdiyi xalqın adına layiq bir ləyaqətlə çalışır. Zəhmətinə görə çalışdığı dövlətin ordeni ilə təltif olunur. Həmin illərin Nigeriya prezidentilə birgə fəxri şəkli ölkənin populyar qəzetlərində verilir. Haqqında televiziya və radioda mütəmadi çıxışlar olur.

İşlədiyi 2 il ərzində Nigeriyada çoxlu səmimi dostlar qazanır. Orada özünə qarşı həm sənətinin gözəl bilicisi, həm də dəyərli şəxsiyyət hörməti, məhəbbəti xatirəsi qoyub qayıdır.

Qayıdandan sonra Moskvada Sovet hökuməti ona SSRİ Neft Naziri olmağı təklif etdilər. Keçmişi dərin bilən, gələcəyi uzaqgörənliklə görən B.Məmmədov buna razılıq verməyib, Azərbaycana qayıdır.

Elə həmin il 1963-cü ildə Azərbaycanda Neft sənayesi naziri vəzifəsinə irəli çəkilir. Xüsusən də, Xəzər neftinin həcminin artıb, planın doldurulmasında xüsusi xidməti olur.



Ona görə də Azərbaycan Neft sənayesinin taleyi ona tapşırıldı. Onu da deyək ki, o, bu işdə çox yox, 1965-ci ilin sonuna qədər çalışır. Ürəyi çox sancırdı. Daş deyil, dəmir deyil. İnsan idi, qəlbinin odunu Yerin təkindən çıxardığı əbədiyanarlıq möcüzəsi olan neftdən alan Od oğlu od idi. Vəfatı şöhrətli müğənnimiz Rəşid Behbudovun ölümü ilə eyni aya düşüb. Aralarında 10 gün fərq olub. R.Behbudovun baş rolda çəkildiyi "Bəxtiyar" filminin canlı, real simvolu Bəxtiyar Məmmədov elə özü idi. Dövrünün şöhrətli şəxsinin kino obrazını yaradan sevimli Rəşid Behbudov da dünyasını dəyişdi, həyatdakı real Bəxtiyar da ömrünü əzizlərinə, yaxşı insanlara bağışlayıb bu dünyadan köç etdi. Bu da həyatın bir qəribəliyidir.

Bəxtiyar Məmmədov doğma el-obası Şəki üçün sağlığında rəhmət qazandırası çox işlər görmüşdür. Şəkiyə qaz çəkilişinin əsas səbəbkarından və köməkçilərindən biri olub. Rayonda teleötürücü qüllənin yaradılmasında yardımçı olub. 60-cı illərdə Şəki İpək kombinatının qazanxanasının böyük qazanı partlayıb sıradan çıxmışdır. Təzə qazanın Bakıdan Şəkiyə gətirilməsini məxsusi təşkil etmiş, kombinatın rəhbəri Tacəddin Əfəndiyevə yola saldığını zəng vurub bildirmişdir. Hazırda oturub işlədiyimiz Elmi Mərkəzin binası onun köməkliyilə Neft Nazirliyinin fondu hesabına tikilmişdir. Şəkidən kim gətsə idi, hər hansı kömək üçün müraciət edəni gözlətməz, böyük ehtiramla qəbul edib, yola salardı. Doğmalarından qardaşı oğlu Fikrət Məmmədov deyirdi ki, işçilərə ev paylananda evin order və açarlarını özü öz əliylə verirdi ki, birdən kimsə onları incidib şirinlik istəyərlər.

Rayonlara, buruqlara yola düşəndə, maşın xarab olanda sürücü ilə bərabər maşının altına girib təmirə kömək edərdi. Belə sadə, insanpərvər adam idi Bəxtiyar.

İndi Bəxtiyar Məmmədovun oğlu Yaşar da atasının yolunu seçib. Neft Akademiyasını bitirib. Dövlət Neft Şirkətində çalışır. Yaşarın qızı Rübabə də şirkətin əməkdaşıdır. Oğlu Kənan da bu işin yolçusudur. Babasının vaxtilə nazir olmasından qürurlanan

Kənan "vaxt gələcək mən özüm də Dövlət Neft Şirkətinin prezidenti olacağam"-deyir. Buna inanmaq çətin də deyil. O cür insanın vərəsəsi ona oxşamaya bilməz. Hər gün Neftçilər prospektində babasının adı verilmiş küçə ilə qürurla addımlayan nəvə çalışacaq ki, onun adına layiq varis olsun.

Haqqında bəhs etdiyimiz məhəllədə xalq ustaları tərəfindən tikilmiş çox qədim evlər var. Onların əbədiyaşar memarlığının bugünkü inşaatçılar üçün nə qədər yaxşı nümunə, məktəb olduğunu bir daha təsdiq etdik.

Belə ənənəvi evlərdən biri də haqqında yuxarıda qeyd etdiyimiz görkəmli bəstəçi Xəyyam Mirzəzadənin babası evidir.

Məhəllədə tacir Məşədi Məcidə və qardaşları Məşədi Sadıq və Məşədi Baqıya məxsus mülk də çox gözəgəlimlidir, milli üslubda tikilmişdir. Bu ailə də sovet dönəmində əziyyətə düçar olur. Mülkləri müəyyən müddətə müsadirə olunur, Məşədi Məcidin bir oğlu Məşədi Cəfər Ağazadə Xoçik dağ yaxasında güllələnənlərdən biri olur.

**"HACI ZEYNALABDİNLƏR"** (patronim) – Giləhli məhəlləsinin sonluğu, Gəncəli məhəlləsinin başlanğıcı olan **ÇAY MƏHƏLLƏDƏ** (8-ci rayon, Əlövsət Sadıqov küç.) bir həyətdə iki böyük milli memarlıq üslubunda göz oxşayan mülklər var. Bu mülklər 1858-1900-cu illərdə çeşid-çeşid ipək parça satışı ilə məşğul olan tacir qardlaşlara məxsus idi. Hacı Zeynalabdin və Hacı Qafar adlı qardaşlar Şəkinin ünlü taciri, xeyriyyəçisi Hacı Məmmədsadıq Əliyevin əmioğulları idilər. Bu soyun 73 yaşlı varisi Hacı Zeynalabdinin nəvəsi İsa Zeynalovun qızı Rahilə xanımın nəslin yaşlılarından eşitdiklərinə görə, babasının satdığı ipək kimi parlaq və yumşaq ürəyi olub. Halal tacir olmaqla yanaşı, milli dəyərlərin təəssübkeşi olub. Onun etdiyi adi yaxşılıqlardan biri uzaqgörənliklə ruhun, mənəvi dəyərin, böyük bir faktorun qoruyuculuğu keşiyində dayanırdı. **BELƏ Kİ, İLK DƏFƏ AİLƏ QURAN CAVAN KİŞİLƏR ÖZ ELİNDƏN, MİLLƏTİNDƏN QIZ ALARDISA, HACI ZEYNALABDİN GƏLİNƏ YEDDİ NÖV PARÇA, BİR BAŞ ÖRPƏYİ, BƏYƏ BAHALI MİLLİ PAPAQ VƏ MÜƏYYƏN MİQDARDA PUL TOY PAYI VERƏRDİ. BU XƏRC İRİ ALVER EDƏN TACİR ÜÇÜN ƏSAS DEYİLDİ. BAŞLICA MƏQSƏDİ QARIŞIQ NİKAHLARA YOL VERMƏMƏK, MİLLİ QANIN TƏMİZLİYİNİ QORUMAQ İDİ.**



Xanımı Mərçənsə də əri kimi qulluqçulara, qohumlara müəyyən bayramlarda ipək yaylıq, tumanlıq, köynəklik parça pay verərdi. Hacı Zeynalabdinin evinin qonaqları əskik olmazdı. Onlardan biri də özü ilə həmsənət olan İpək Doqqazın sakini Hacı Səlim və oğlu Hacı Əbdürrəhim olub. Mülklərində ipək Qans dəzgahları olan bu sahibkarların Kişdən gələn ağ su ilə yuyulan baramadan əldə etdikləri ipək saplar qumaş və atlas üçün əvəzsiz idi. Qeyd edək ki, həmin su məxsusi hazırlanmış quyu və hovuzlarda saxlanılıb çökdürülərək istifadə edilirdi. Hacı Zeynalabdin belə baramanın məhsulunu satdığı üçün müştərisi heç əskik olmazdı. Odur ki, onların halallıqla təmiz işlədikləri mala, həm də gözəl insani xüsusiyyətlərinə görə bu ata və oğulla yaxınlıqları güclü idi.

Tacir Hacı Zeynalabdinin nəvəsi İsa Heydər oğlu Zeynalov təhsilini Peterburqda almışdır. Yurduna gələndən sonra bir müddət atası kimi ipək tacir olur, eynilə atasının iş üsulunu, ənənəsini davam etdirir. Lakin dövran dəyişir. İsa Zeynalov sovet dövrünün ilkinliklərində Maliyyə şöbəsində işləyir, bir müddətdən sonra dünyasını dəyişir.

Hacı Zeynalabdinin evilə bir həyətdə qeyd etdiyimiz kimi qardaşı Hacı Qaffarın da evi var. Bu mülk Şəki üçün ənənəvi memarlıq üslubundadır. Qədim taxta qapısı Yuxarı məhəlləyə-Mirzə Fətəli Axundovun ev muzeyinə doğru istiqamətdə, Hacı Zeynalabdinin qapısı isə Doqquz Para tərəfə açılır. Bu mülkdə diqqətimizi çəkən o, oldu ki, Qurcana çaya yaxın tikildiyi üçün iki əsrin seli-suyu yarğanı böyütmüş, torpaq aşınması evin bünövrəsinəcən çatmışdır. Uzaqdan gözəlliyi ilə diqqəti cəlb

edən bu evin uçmaq təhlükəsini duyanda heyfsilənməyə bilmirsən. Qardaşların hər ikisinə məxsus çoxotaqlı, taxçalı-noğuldanlı, buxarılı, qədim güzgülü, qəndilli mülkünü gəzdikcə ruhlarını doğmalarından və bütöv millətindən şad olsun duasını diləyirdik.

Ulu babasının qoyub gəldiyi ənənəvi mülklə Rəşad Tofiq oğlu Məmmədovun bizə həvəslə göstərdiyi şəkillər, verdiyi izahatlar diqqətimizdən yayınmırdı. Milli ruhu güclü olan bu cavan nənəsinin dizi dibində oturub soylarına məxsus bütün məlumatları bircə-bircə toplamışdır. Həm anası, həm də babasının əmioğlu nəvələrindən olan Zeynallı Pərviz müəllim onda bu dərin marağı yaratmışdır. Odur ki, yaşının kamilliyə doğru getdiyi vaxtda orta təhsilini Bakıda yox, Şəkidə babalarının yurdunda almağı qərarlaşdırdı. Onun ata tərəfi də şəkilidir. Ali təhsilli fizika-riyaziyyat müəllimi Muxtar Məşədicabbar oğlu Məmmədov Rəşadın ata babası olub. Bazarbaşı məhəlləsinin Misgərlər soyundan olub, həm də Hacı Məmmədsadıq Əliyevlərin qohumudur. Muxtar müəllim 1941-ci il müharibəsi zamanı cəbhədə əsir düşür. Savadı, ziyalılığı, dil bilməyi həmin dövrdə Qərbdə olan türk-müsəlman təəssübkeşlərinin diqqətini cəlb edir, əsirlikdən qurtarırlar. O, bir müddət Almaniyada və İngiltərədə sadə həyat keçirir. Çıxdığı vətəni üçün qəbahətli heç nə etmədiyinə əmin olan, el-oba, doğmalarının həsrətini çəkdiyinə görə yurduna qayıtmağı qərarlaşdırır. Bir müddət Şəkidə Pedoqoji Texnikumda dərs deyir. Günlərin birində Muxtar müəllimi dərs deyən zaman gəlib həbs edirlər. Rusiyada həbsxanada saxlayırlar. Ona bircə dəfə uşaqlarının anası Validə xanımla görüş verirlər. Ondan sonra Muxtar müəllimi güllələyirlər.

Məhəllənin 9-cu rayon Mir Bəşir Qasımov küçəsində çayın kənarında **"Dərə hamamı"** (orotoponim) – adıyla tanınan bir qədim (19-cu əsrin axırı XX əsrin əvvəllərində tikilən) hamamı da var. Yaşlılar ona Məmmədnəbi hamamı deyir. Çünki bu hamam həqiqətdə eyni adlı adam tərəfindən tikdirilmişdir. 1980-cı illərə



qədər, müəyyən fasilələrlə məhəllə camaatına xidmət etmişdir. Qurcanaçayın dərin yarğanı yaxınlığında yerləşdiyinə, yaxud pillələrlə dərinliyə düşüb sonra hamamın salonuna daxil olduğundan görünür belə adlanır. Çünki Gəncəli məhəlləsinin lap qurtaracağında Rəşid bəy Əfəndiyevin evinin yaxınlığında çökəkdə "Dərə hamamı" adlı bir hamam 20-ci əsrin 30-cu illərinə qədər mövcud olub. Məhəllənin yaşlı adamlarının dediyinə görə Dərə hamamı məhz həmin indi tikintisinin heç izi də qalmayan hamam olubmuş. Haqqında danışdığımız Məmmədnəbi hamamı yaxınlığında çox əzəmətli bir qədim bina var. Burada Azərbaycanın görkəmli kimyaçı alimi, Azərbaycan EA-nın müxbir üzvü, professor, Əməkdar elm xadimi, respublika Dövlət mükafatı laureatı, müharibə və əmək veteranı **Zülfüqar Hüseynqulu oğlu Zülfüqarov** (antroponim) doğulub böyümüşdür.

Bu iri 2 mərtəbəli möhkəm bina nəslin ulu babası tacir Məşədi Hüseynqulu tərəfindən 1800-cü ildə tikdirilmişdir. Qardaşları Hacı Rzaqulu, Hacı Möhsün də tacirliklə məşğul olmuşlar. Zülfüqar müəllimin qardaşlarından birinə "Azərbaycan Qasım" deyirlər. Məlum oldu ki, bu ləqəb ona eyniadlı oyun havasını məharətlə oynadığına görə verilib.

Zülfüqar müəllimin digər qardaşı Əlinin oğlu Nizami Zülfüqarov f.r.e.n.-dir. Bacıları ali təhsillidirlər. Onlardan birinin Roza Haşımovanın oğlu Abiddin hələ uşaqlıqdan qeyri-adi istedada malik idi. 5 yaşında olarkən əlifba kitabını, bir sıra qəzet-jurnalları oxuya bilirdi. 1983-1984-cü tədris illərində Təhsil Nazirliyinin xüsusi komissiyasının rəyilə Abiddin Nəsimi rayonundakı 44 saylı ərəb dili təmayüllü orta məktəbin I sinfinə qəbul olundu.Yaxşı oxumağı və qavrama qabiliyyətinə görə seçilən Abiddin 2-ci sinifdə oxumağına baxmayaraq 4-cü sinfin məsələ və misallarını sərbəst həll edirdi. Onda dəqiq elmlərə maraq güclü idi. Özünün riyaziyyat müəllimi Mahiyyə Xəlilovanın təşəbbüsü və Elmi-Tədqiqat Pedaqoji Elmlər İnstitutunun komissiyasının qərarı ilə Abiddin 2-ci sinifdən 4-cü sinfə, 1988-ci ildə isə məktəb pedaqoji şurasının qərarı ilə 4-

cü sinifdən 8-ci sinfə keçirildi. Məktəbi gümüş medalla bitirən Abiddin Həşimov İstanbul Universitetinin texniki fakültəsini də müvəffəqiyyətlə bitirib. Hazırda o, layiqli mütəxəssis kimi Prezident aparatında işləyir.

**"QIZIL ONLUQLAR"** (antroponim) – nəsli təkcə yaşadıqları Gəncəli məhəlləsində yox, şəhərin hər yerindən onları yaxşı tanıyanlar "Çox ağır taxta nəsil, iri tayfadırlar" deyirlər.

Bu sözlərin sanbalı bizi düz onların mülkünə aparıb çıxardı. Bizi qarşılayan evin iki ixtiyar yaşlı gəlinləri, biri məhəllənin Layişlər (Lahıclar) nəslindən, digəri isə artıq haqqında danışdığımız Pişnamazzadələr soyundandır.

Bu soydan olan Raisa Pişnamazovanın verdiyi məlumata görə, "Qızıl onluqlar"ın babası tacir Əbdüləli İranda, xüsusən də Şiraz şəhərində xəz-dəri alveri edib. Gediş-gəlişlərinin birində tacir Əbdüləli Şəkiyə qayıda bilmir. Şimali Azərbaycanda Sovet hökuməti qurulur. Məcbur olub orada qalır, evlənir, yaxşı mülk tikdirir. Lakin ailə ilə əlaqələr kəsilir. Yalnız müharibədən sonra İran hökuməti ev-eşiyi dövlət hesabına keçirib, müəyyən faiz pulu Əbdüləlinin Şimali Azərbaycandakı 9 uşağının adına göndərir. Tacir Əbdüləlinin qəbri də Şirazdadır. Onun övladlarından ikisi oğlan olub. Ələkbər və Ələsgər adlı yaraşıqlı, gözəl xasiyyətli olduqları üçün ləqəbləri də özlərinə görə qoyulub.

Ələkbərə "Qızıl onluq" (ən qiymətli, yüksək), Ələsgərə isə "Xaç ikillik" deyərdilər. Bu adlar çox qəribə də olsa, kartla bağlı oyuna məxsus sanballı kartların adıdır.

Ələsgər Sovet hökumətindən qabaq Şəkidəki gimnaziyada təhsil alıb, Sovet quruluşu zamanında uzun müddət müxtəlif yerlərdə mühasib işləyib.

Ələkbər isə Hacı Məhəmmədsadıq Əliyevin ticarət şəbəkəsində xırda tacir işləyib. Sovet dövründə isə Həkim Ocaqovun vaxtında vərəm dispanserində aşpaz, sonra isə internatda eyni işdə işləmişdir. Əli düz, nəfsi tox, qəlbi yumşaq adam idi. İnternatda uşaqlara tapşırardı ki, kim yeməkdən



doymasa, bir-iki ağız öskürsün ki, mən bilim. Hər şey norma, müəyyən hədd çərçivəsində verilsə də o, bunu da düşünərdi. İnternatda oxuyub, xəstə olanda gəlməyən ev uşaqlarının da payını evlərinə göndərərdi, yaxud xəbər göndərərdi ki, gəlib onların yemək paylarını aparsınlar. Çox gözəl də biş-düş qabiliyyəti var idi. Mömin idi, hər işdə, hər addımda allahını və vicdanını unutmazdı. Dünyasını 74 yaşında dəyişdi. Oğlu Abbas da halallıqda, qəlb yumşaqlığında, qabiliyyətdə, hər cür yaxşı əməldə atasının eyni idi. Özündən başqa ailədə 7 bacı-qardaş atalarının vəfatından sonra böyük qardaş Abbasdan "atalığı" görüblər, karıxmayıblar. Atadan sonra məhz onun köməkliyilə hamısı təhsil alıb, savad-sənət, ailə yiyəsi oldular.

Abbas Ələkbər oğlu Nəcəfov təhsilini Tiflis ticarət texnikumunda alıb. Müharibə başlanır. O, cəbhədən az müddətə məzuniyyətə gələndə, həmin zaman Şəkidə katib olan Əhməd Əbdürrəhmanlı onun haqqında M.C.Bağırova yazır ki, belə savadlı və qabiliyyətli mütəxəssisə çox ehtiyacımız var, onu bronla saxlamaq lazımdır. Xahiş uğurlu alınır. Onu maliyyə şöbəsinə məsul işçi qoyurlar. 20 il həmin sahədə müdir işləyir, elə olur ki, heç bir komissiya ondan heç vaxt iş qüsuru tapa bilmir. El arasında da ona "Finotdel Abbas" deyirdilər. Maliyyədən sonra da Yun idarəsinin müdiri kimi ömrünün sonunacan (1965-ci ilədək) işləyir. Yenə də qüsursuz və halallıqla çalışır. Uzun zaman şəkər xəstəliyindən əzab çəkən A.Nəcəfov 1965-ci ildə dünyasını dəyişir. Onun dəfni həmin dövr üçün çox qeyri-adi şəkildə görünürdü. Kütləvi camaat axını və orkestrin sədaları ilə keçirilmişdir. Mərhumun cənazəsi dağ qəbiristanlığına çatanda gələnlərin bir ucu hələ ayaqda şose yolunda idi. Mərhumun 40-ı çıxınca mərkəzi və yerli mətbuatda adına başsağlıqları dərc olundu. Öz nəslinin güman yeri, məhəllə sakinlərinin, digər dost-tanışlarının ağsaqqalı idi. Deyilən və deyilməyən nə qədər yaxşılığın yiyəsi olub:

- özü də dəfn olunduğu Sona qəbiristanlığının 4 tərəfini sağlığında özünün iştirakı ilə iməcilik yolu ilə hasarladıb;

- işləyənlərin həmişə yemək haqqını öz cibindən ödəyib;

- yüz illər boyu sevilib-qorunan Taclıq suyunun boru xətlərini bərpa edib;

- məhəllənin başlanğıcından sonunacan küçələrə fərş döşənməsini təmin edib;

- yenə də iməcilik yoluyla məhəllədə indi Qaqarin parkı kimi tanınan gözəl istirahət guşəsinin yaranmasına səbəb olub;

- hər yeni ildə ata-baba evlərinin böyük eyvanında məhəllə uşaqları üçün çox iri yolka bəzədər, hədiyyələrini, şaxta babalarını yerbə-yerində təşkil edərdi;

- məhəllənin ənənəvi qaydasına görə hər aşura günü plov, halva bişirdib, kasıb-kusublara yedirdərdi;

- bir kasıbın diləyi düşsə, tez yerinə yetirərdi.

Hansını deyəsən?...

Övladları Akif, Vasif və Yusuf də atalarının, nəslin adına layiq yaşamağa çalışırlar. Üçü ali təhsilli mütəxəssisdirlər. Akif Nəcəfov Bakıda rabitə sahəsində məsul vəzifədə çalışır. Vasifin babasının adını daşıyan oğlu Abbas da Iqtisadiyyat Universitetində oxuyur, onun yolunu davam etdirmək istəyir. Qardaşı Ələsgərin övladlarından Cahangir hüquqşünas olub, indi pensiyaçıdır. Qızı Tamara həkim-terapevt kimi Neftayırma zavodunun xəstəxanasında işləyir. Cahangirin oğlu Cavanşir isə Bİ-Pİ neft şirkətində işləyir.

**"SEYİD CAVADLAR"** (patronim) – bu məhəllənin ən qədim nəsillərindən biridir. Məhəllədəki 4 saylı məktəbin müdiri Ağa müəllim, atası Abid müəllim bu nəslin bugünkü tanınmış varisləridir. 71 yaşlı Abid müəllimin ümumilikdə məhəllənin qədim soyları ilə bağlı çox maraqlı məlumatları var. Öz nəsilləri barədə söylədiyinə görə, qədimdən üzü bəri bu soy seyidlər olaraq tanınıblar. Ulu baba Mirməhəmməd də özündən qabaqkı ata-babalarının bu adının daşıyıcısı olub. Onun zamanında da belə bir adət var idi ki, seyid olduqlarına görə bu adın daşıyıcılarına xırman sahibkarları ianə göndərərdi, yaxud özləri gedib alardı. Belə gedişlərin birində həmin Seyid



Mirməhəmməd xırmanda olan basırığı, sahibkarın onlara acıqlanmasını görüb bu adətə ikrah edir. Gəlib dəmirçilik sənətini öyrənir, ianə qəbul etmir, öz əllərinin zəhmətilə dolanır. Oğlu Mirəliabbas da, nəvəsi Mircavad da bu sənətin daşıyıcısı olublar.

Dəmirçi Mirməhəmmədin Bazarbaşında Şeytanbazar hissəsində (indiki Dolçalar) dəmirçi dükanı olub. Oğlu Mirəliabbasın dəmirçi dükanı isə Ərəş mahalında 4 yolayrıcı hissəsində olub. O, yeganə sevimli və gözəl qızını Ərəş mahalının Güleyşə kəndinin hampasına ərə verdiyi üçün, qızını da tez-tez görmək arzusu ilə dükanını onlara yaxın yerdə tikdirmişdir. 20-ci illərdə Azərbaycanın hər yerində olduğu kimi, Şəkidə imkanlı adamların iri, geniş evlərində XI Qızıl Ordunun əsgərləri yerləşirdi. Abid müəllimin anasının söylədiyinə görə onların da evində 3 nəfər qalırdı. Anası Fatmaxanım onların iri, qupquru qara buxanka çörəyini isladıb yediklərini görüb soruşmuşdu ki, onu necə yeyirsiniz? Ona cavab vermişdilər ki, bunu da tapmayan vaxtımız olacaq. Sarı buğdanın çörəyini yeyən xanıma həmin vaxt bu sözlər çox uzaq görünürdü. Ancaq varlılardan başqa ortababları da kulak adıyla damğalayıb məhv edən bu quruluş çox Fatmaxanımlara dedikləri aclığı, yoxsulluğu göstərdi.

**"MÜRİDLƏR"** (patronim) – adından göründüyü kimi, Müridizm mistiq dini təlimi ilə bağlıdır. Rusların Qafqazı itaət altına almağa başladığı bir vaxtdan Müridizm təlimi siyasi xarakter aldı. Böyük mübarizə ideologiyasına çevrildi ki, bu da İmam Şamilin adı ilə bağlıdır.

Məhəllə sakini, mömin adam olan Məmmədhəsəni bu adla tanıyıblar. Nəvəsi Akif Məmmədov da, onun atası Səttar-xan da bu adla tanınıb. Müridoğlu Səttarxanın gəncliyi Sovet quruluşu illərinə düşüb. Mövcud quruluşa vicdanla qulluq edib. Az savadlı olmasına baxmayaraq çox qabiliyyətli, işgüzar olduğu üçün Cəfərabad nahiyəsində kənd soveti sədri, kənd-şəhər dəyirmanları üzrə müvəkkil işləyib. Çalışıb-yaşadığı illər

ərzində kimsəyə pislik etməyib, ziyan vurmayıb. Fəaliyyəti ərzində hökumət tərəfindən mükafat və təltifləri olub. Onun oğlu Akif Məmmədov ali təhsilli meşə təsərrüfatı işçisidir. 54-cü ildə Gəncə Kənd Təsərrüfatı İnstitutunu bitirən Akif Məmmədov 40 ilə yaxındır ki, meşə təsərrüfatı sahəsində çalışır. Bölgə üzrə flora-faunamızın gözəl bilicisidir. Dağ-daşı gözəl tanıyır, relyef problemləri barədə kifayət qədər dolğun məlumatlıdır. O, həm də gözəl dini bilgisi olan, milli dəyərlərimizi dərindən bilən bir kamil şəxsiyyətdir.

Həmişə dəyərləndirib, ehtiramla yanaşdığı həyat yoldaşı Natella xanım məşhur musiqiçi, hərtərəfli ziyalı olan İbad Salmanovun qızıdır.

İbad müəllim gimnaziya təhsili alıb, rus dilini gözəl bilib. Tibb texnikumunda rus dili müəllimi işləyib. Musiqiyə çox həvəsi olduğu üçün, xüsusi musiqi təhsili olmasa da alətlərin hamısında gözəl çalırdı. I saylı musiqi məktəbinin yaradılmasında Baxşəli Əfəndi ilə birgə onun da əməyi böyük olub. İbad müəllimin musiqi qabiliyyətinə görə tanınmış bəstəkarlar Səid Rüstəmov, Sultan Hacıbəyov onu Bakıya aparmaq üçün evinə gəliblər. Lakin səhhətinə görə o buna razılıq verə bilməyib. Bir insan kimi də gözəl etikası, mədəniyyəti olan İbad müəllimin diqqətəlayiq rəssamlıq qabiliyyəti olub. Kitabdakı şəklə baxaraq Aya-Sofya məbədinin iri həcmdə gözəl rəsmini çəkib. Qızının dediyinə görə, həmin şəkil İbad müəllimin ana nənəsinin evində (tacir Nəcəfqulunun mülkü 4 saylı məktəblə üzbəüz 2 mərtəbəli gözəl memarlıq abidəsi) durur. Təəssüf ki, evin bir hisəsini gəzib, digər ailəyə məxsus tərəfini gördük. Rusiyada qətl olunan cavan bir subay oğlanın karandaşla çəkdiyi cəlbedici rəsmləri gördük. Görünür istedad və qabiliyyət bu soyda irsidir. Cavanın ölümünə təəssüflənib gözü yaşlı Həqiqət anaya bacardığımız qədər təsəlli verdik. Yaşadıqları bu böyük mülkün təmir olunub qorunması üçün dövlət köməyi arzusunda olduq.



**"DADLILAR"** (patronim) – soyunun indi təkcə Şəkidə deyil, bütöv dünya üçün artıq tanınmış olduğunun az qala gündəlik şahidi oluruq. Telekanallarda tez-tez reklam olunan "Dadlılar" makaronu məhz bu nəslin adıyla bağlıdır.

Sadə, ancaq milli dəyərləri gözəl bilən, qiymətləndirib yaşadan nəsil olub. Nəslin ağbirçəyi, məhəllənin **AĞA-MİRZƏLƏR** soyundan olan Minayə xanım məhəllənin xeyir-şər məclislərinin aşpazı olub. Milli mətbəximizin gözəl bilicisi olan bu xanım bildiklərini övladlarına da öyrədib. Əri Şirəli bu bilgilərə daha çox maraq göstərib, özünün Aşağı Karvansara yaxınlığında, keçmiş su anbarı tərəfdə olan pitixanasını qabiliyyətlə işlədərdi.

Dadlılar nəslinə baş ucalığı gətirən bir nümayəndəsi də var. Çingiz Mustafayev ucalığı, qəhrəmanlığı. Milli qəhrəmanımız, döyüşçü, jurnalist Çingizin qanı düşmən tərəfindən işğal olunmuş Qarabağ torpağından çəkdiyi video-lentlər əlimizdə ən tutarlı dəlillərdir. Öz ürəyinin sərəncamı ilə ölüm-dirim mübarizəsinə gedib, elə ölümün də özünə meydan oxuyaraq dəhşətli səhnələri tutarlı fakt kimi əldə etdi. Sənin haqqında çox yazılıb, hələ yazılacaq da, Çingiz. Biz isə Sənin elə bizim elin oğlu olduğunu bir daha nəzərə çatdırmaq istədik. Axı, bizim sevimli məsəlimizdir: "Südü süd olsun".

**"İSLANMIŞLAR"** (patronim) – bu maraqlı nəsil barədə məlumatı evin ixtiyar yaşında olan gəlini Nəcibə xanım və oğlu verdilər. Nəslin indiki varisləri 1800-cü il tarixdə tikilən çox gözəl memarlıq abidəsi olan ənənəvi bir evdə yaşayırlar. Qeyd edək ki, hazırda bu ənənə binanın interyerinə daha çox aiddir. Kənarlardan tikilən əlavə tikililər həmin evi içəridə saxlayır. Nəslin ulu babası Məhərrəm kişi qeyrətli və igid olub. Cavan yaşlarında "Doqquz para" məhəlləsindən keçərkən bulaqdan su dolduran məhəllə qızına Qalada olan çar əsgərlərinin sataşıb, qorxuzduğunu görür. Bunu özünə sığışdırmayan Məhərrəm əsgərləri tutub baş-başa vurub, Qurcanaçayın dərəsinə atır. Özü isə qaçıb yaxınlıqda dağda gizlənir. Ədalətdən

çox uzaq olan çar məmurları igid el oğlunun lap incə yerindən tuturlar. Ağbirçək anasını evdən gətirib, Qalaya salırlar. Namus, qeyrət yolunda bir canı heç bilən igid gəlib, təslim olur, ananı xilas edir. Onu Sibirə sürgün edirlər. Elə getdiyi ay ərzində haqsızlığa dözməyib sürgündən qaçır. Gecə-gündüz 6 ay meşə və dağlarla gizlənə-gizlənə yol gəlir. Ağır sətəlcəm olur. Xəstə halda evə gəlib çıxır. Gələndən sonra bir neçə ay yatıb vəfat edir.

Nəsil xəttini Məhərrəmin oğlanları Kərbəlayi Əlirza və Məmmədrza davam etdirir. Bu qardaşlar üzbəüz dağın yaxasında özlərinə məxsus kirəc quyularının gəliri ilə dolanırdılar.

Nəcibə xanımın söylədiyinə görə onlar dağa kirəc quyularına nəzarət etməyə gedəndə bərk yağan yağışdan islanıblar. Üzlərini hündürlükdən evə sarı tutub çığırıblar: "Fatmanisə, Balaxanım, biz islanmışıq, bizə paltar gətirin".

Yaxınlıqda yaşayıb, bu nəslə qohum olan **"ŞAMÇILAR"** (patronim) – soyunun qocaman varislərindən Dostuxanım nənə söylədi ki, quraqlıq zamanı onların lap ulu babaları Tanrıdan yağmur diləmək üçün dağdakı Müsəlla yerinə qalxmış, ayinləri icra etmiş, dağdan düşüb evə gəlincə, yağmur olmuş, tamam islanmışlar. Dostuxanım nənə bunları özünün nənə-babalarının danışdığını, onlardan eşidən anasından öyrəndiyini dedi.

Bu soyun fəxr etməli babası Məhərrəmin ölümündən əsrdən çox vaxt keçməsinə baxmayaraq, onun mərdanəliyi, zülmə, müstəmləkəçiliyə, düzgün olmayan siyasətə qarşı barışmazlığı indi də eşidib-bilən yaşlılar tərəfindən məclisdə, məqamı düşdukcə danışılır, cavanlara örnək göstərilir.

Məhərrəmin nəvələri də bu ideyanın daşıyıcıları olduğu üçün çox əziyyət çəkirlər. Onun oğlu Kərbəlayi Məmmədrzanın oğlu Əbdülrza Qaladakı dustaqların qaçırılmasında qaçaqlara köməkçi olduğu üçün tutulub dağ yaxası Xoçikdə güllələnir. Əlirzanın oğlu Məhərrəm isə (babasının adının daşıyıcısı) Bakıda Tibb İnstitutunda oxuduğu zamanlardan



diqqət mərkəzində olub. Milli tariximizi, ənənələrimizi gözəl bilən, dünyəvi siyasətdən, iqtisadiyyatdan aydın fikirləri, bilgi və məlumatları olan, rus, ingilis, fars, türk dillərini fərasətlə bilən bu qabil şəxsiyyət elə saydığımız keyfiyyətlərin səfasını yox, cəfasını çəkir. Belə ki, İnstitutun buraxılış gecəsində əhatəli söhbətləri zamanı o deyir ki, mənim anladığıma görə Rusiya və Almaniya arasında müharibə labüddür. 1-2 ilə bu olasıdır. Dövri mətbuatı, radio dalğalarını izləyib, məntiqlə nəticə çıxardığı üçün Məhərrəm bu sözləri deyərək, ehtiyatsızlıq etmişdir. Onun bu sözləri hər zaman dövründə mövcud olan cəmiyyət parazitləri – çuğullar (satqınlar) tərəfindən müəyyən yerlərə çatdırılır. Nə az, nə çox Məhərrəm düz 8 il Saratov və Alma-Ata şəhərlərində siyasi dustaq kimi həbsxanalarda yatıb. Müharibə qurtarandan sonra 1946-cı ildə buraxılıb. Hətta ondan sonra da onun doğma Azərbaycana qayıtmağına mane olurdular. Bu həbsə görə özüylə birgə oxuyan Turan adlı sevdiyi qızdan da əli üzülür. Çox gecdən-gec məhəllənin Lahiclar soyundan Sima adlı qızla evlənib, 3 qız atası olur. Şəkidə ilk ingilis dili müəllimliyini də o edir. Qocalığı da əvvəlki tək özünəməxsus təmkinli, savadlı, əli Quranlı olub. Bu fəxretməli ziyalı 1990-cı ilin əvvəllərində dünyasını dəyişib.

Hazırda xəstə olan, öz soylarının, eləcə də Şəkinin çox tarixi dövrlərindən sanballı məlumatı olan Sadıq Salahov adlı biri Bakıda yaşayır. O, Kərbəlayi Əlirzanın qızı Minayə xanımın oğludur. Sadıq müəllim gözəl bank işçisi olub.

Məhərrəmin qardaşı Ənnağı da Leninqradda oxuyub həkim olub, orada yaşayıb. Keçmiş Xalq Təsərrüfatı İnstitutunda müəllim olmuş mərhum Səmədov Kamil Qasım oğlu da ana tərəfdən "İslanmışlar", ata tərəfdən isə məhəllənin "Şamçılar" soyundandır.

**"MÜƏZZİNLƏR"** (patronim) - bu ad Azərbaycan xalqının gözəl tanıyıb, sevdiyi mərhum müğənnimiz, xalq artisti Əlövsət Sadıqovun soyuna deyilir. Onun atası müəzzin

Şirəli adıyla tanınırdı. Məhəllənin yaxınlığında Yuxarı Karvansara ilə üzbəüz, əsası Pişnamazzadələr tərəfindən qoyulmuş məscidin müəzzini-yəni azan çəkəni olub. Quranı gözəl bilən bu sakit təbiətli ruhani adamın çox qəlbə yatımlı, xoş səsi olub. Görünür elə atasının səsidir ki, Əlövsət Sadıqova irsən keçib.

Müəzzin Şirəlinin iki oğlu Əlövsət və İsmayıl da Şəki əhlinin çoxu kimi fabrikdə ipəkçi fəhlə olub. Zamanında rayonlara gedib çox şeylə maraqlanan, xüsusən də istedad axtarışında olan qədirbilən ustadımız Üzeyir Hacıbəyov onun səsindən xəbərdar olur. Çoxlarına dayaq olduğundan Əlövsət Sadıqova da himayədarlıq edib. Xalq Konservatoriyasını oxuyub, təhsil almağına imkan yaradıb. Beləliklə, müğənni tanınmağa başlayır, Milli Operanın solisti olur. Şöhrətli müğənnilərlə - Rübabə Muradova, Həqiqət Rzayeva ilə özünün tenor səsinə görə tərəf müqabil olur. Lirik-dramatik rolların öhdəsindən məharətlə gəlib səsinin məlahətliyini təsdiq edir.

Xarici ölkə qastrollarında dünya şöhrətli Rac Kapurla, Rita ilə tanış olub, birgə şəkillər çəkdirmişlər. O, ailə quranda da qəlbinə yaxın bir adamla qohum olur. Məşhur tarzənimiz Əhsən Dadaşovun həkim qızı Sara xanımla evlənir. I oğul və I qız atası olur. Qızına çox sevib oxuduğu "Xumar oldum" mahnısının şərəfinə elə Xumar adı qoyub. İndi Xumar da anası tək həkimdir, tibb elmləri doktorudur, eyni adlı Universitetdə çalışır, gəlini Fəxrəndə də tibb elmləri doktorudur.

Mərhum sənətkar Bakıda yaşamağına baxmayaraq, vaxt-aşırı doğma yurda- məhəlləsinə gələr, qohum-əqrəba ilə görüşərdi. Səhhətinə, səsinə dağ havasından sığal çəkib gedərdi. Oğlu Nadir Azərbaycan Sənaye İnstitutunun Neft-mədən fakültəsini qurtarıb-mühəndisdir.

Müəzzinlər soyundan bizə bilgi verən həmin soyun qohumu Dilşad xanım və əri məhəllə sədri Əjdər müəllim ümumi məhəllədən geniş məlumat verdilər. Əjdər müəllim ata tərəfdən Mollalar nəslindən, ana tərəfdən isə bənna Yaqubun



soyundandır. Onun dediyinə görə, bənna Yaqub Şəkinin ən adlı qədim binalarında divar peçlərinin hörgüsünü işləyib. Əjdər müəllim məhəllənin Qumçu Əli (Yetimoğlu Əli) adlı bir ustası haqqında da danışdı.

Qumçu Əli tikiniti işlərində qumun bol olmadığı vaxtı çaydan qatırla kisələrdə qum daşıyıb həm satırdı, həm də özünün ustakar işlərində istifadə edərdi. O, bir həvəskar kimi də yaxşı limon ağacları yetişdirərdi. Qumçu Əli bir müddət məhəllənin Dərə hamamını təmir edib, camaat üçün işlətmişdir. Oz arzusına uyğun olaraq məhəllənin qəbiristanlığında Şəkidə indi yeganə olan ailə sərdabəsi tikmiş, üzərinə limon şəkli də həkk etmişdir. Orada anası, cavan ölən oğlu və özü dəfn olunub. Yaxınlarına demişdir ki, vəfat edəndən sonra məni sərdabədəki yanaşı düzəldilən 3-cü yerə qoyub, daşını əbədi hörərsiniz.

**"AXUNDLAR"** (patronim) – bu ad Şəki əhlinin soyunu da, özünü də gözəl tanıdığı mərhum ziyalımız, ədibimiz və jurnalistimiz Teymur Xəlilovun həm ata, həm də ana tərəfinə aiddir.

Toplayıb, yazdıqca dəyərli, seçilmiş kəslərin çoxunun adının qabağına mərhum sözünü yazırıq. Yazdıqca da heyif-slənir, ağrı çəkirik. Teymur müəllimin adına mərhum yazdıqca isə göz yaşı aman vermirdi... Başqaları haqqında eşidib yazırıqsa, Teymur müəllimi şəxsən tanıyıb, ünsiyyətdə olmuş, şəxsiyyətinə heyran qalmışdıq. Deyirlər, qüsursuz insan olmur. Vallah, onun xarakterinin qüsuru yox idi. Xalq şairimiz Bəxtiyar Vahabzadə onu dünyanın ən ədəb-ərkanlı, nəzakətli, əxlaqlı, insanpərvər, humanist adamı adlandırmışdır." Mən onunla həmişə fəxr edərdim"-deyib, Bəxtiyar müəllim. Bizim digər istedadlı şairimiz Vaqif Aslanın Teymur müəllim haqqında dediyi: "O mələk kimi yaşadı" sözünü də ürəyincə, gözəl dediyini vurğuladı.

Qələm dostu Abdul Qəni "Teymur nur idi..." - deyib sirdaşının xiffətini çox çəkdi.

Teymur müəllim bizim Elmi Mərkəzin qonağı olarkən folklordan çox əhatəli söhbətlər edirdi. Folklorun qarğış, bəddualar növündən danışarkən 2 hadisəni də əlavə etdi. Necə də yaddaqalan, səmimi, ibrətamiz danışdı. Dedi ki, biz jurnalistlərin öz yurdunda çətin ki, ayağı dəyməyən yer olsun. Bir evin qonağı idim. Həyətdə oturmuşduq. Qonşudan səs-küy eşidildi ki, bəs kəkilli, xallı fərə yoxa çıxıb. Arayıb, axtardılar tapılmadı. Yanıb-heyfsilənən evin xanımı nə ətraf adamlarla dava-dalaş etmədi, nə də qarğımadı. Təkcə onu dedi ki, toyuğun oğurlansın, toyuğumu oğurlayan. Bu kiçik hadisə mənim yadıma digər bir şahidi olduğum, yaddaşımda möhkəm iz salan hadisəni xatırlatdı.

Tanıdığım bir ailənin yenə də qonağı idim. Həyətə gələn vergi orqanı işçilərindən biri cavan, üstü əriklə dolu meyvə budağını əyib dərər. Üstü meyvəli körpə budaqlardan biri qırılıb düşər. Evin orta yaşlı qadınlarından biri "qolun qırılsın" deyib qarğış edər. Tanışımın dediyinə görə, həmin qadın qırılmış budağa görə az qala hər gün onu istəmədən qıran adama "qolun qurusun" deyib qarğayırdı. Qısası qəzavü-qədər elə gətirdi ki, o qadının qolu iflic olub, quruyub elə o dərdlə də dünyadan getdi. Qırılmış budağın əvəzini təbiət özü tənzimlədi. Qarğıyanın qarğışı isə Allaha xoş getmədi, necə deyərlər qarğışını öz başına sancdı.

Teymur müəllim bu iki hadisəyə istinadən qarğış, alqış, insanlıq baxımından öz münasibətini bizə çox əhatəli, həyati faktlarla açıqladı. Özü də necə, torpağına, xalqına, el-obasına, insanlara sevgisi dilindən bal kimi süzülə-süzülə danışdı.

Teymur müəllim Şəki qaçaqları haqqında yazdığı "Böyük məhəbbət" əsərinin nəşrini görmədən dünyasını dəyişdi. Yerli "Şəkinin səsi" (3, 12, 20 oktyabr və 3, 16 noyabr 1994-cü il nömrələri) qəzetindən hissə-hissə oxuyub tanış olduğumuz bu gözəl əsərin ayrıca kitab şəklində işıq üzü görməsini necə də həsrətlə gözləyirdik. Əsər dəqiq faktlar, tanınan məşhur simaların hər birinin obrazı verilmiş, məhəllələr, yer adları öz



adıyla etnoqrafik, toponimik zənginliklə dolu bir sanballı yaradıcılıq nümunəsidir. Bu əsər Şəki həyatını və tarixini çox oxunaqlı şəkildə bədiiləşdirilib yazılmış Mahmud İsmayılovun "Ağ yapıncı", Zaman Qarayevin "Könüllülər" əsərləri kimi oxunaqlı, səviyyəli əsərdir. Əvvəlki məlumatlarımızda qeyd etmişdik ki, Teymur müəllimin doğmaları, xüsusən də bacanağı Ağatağı müəllim bu əsərin tam halda çap olunması üçün çalışır.

Teymur müəllimin atası və əmisi Əbuzər və Əliheydər Həşim oğlu Xəlilovlar, qeyd etdiyimiz kimi, Axund Pişnamazzadələr soyundan, öz dayıları Axund Cabbarın Füruzə və Kubra adlı qızlarına evlənmişlər. 1915-ci ildə Şəkidəki gimnaziyanı oxuyan Abuzər Xəlilov həm də gözəl din bilicisi olduğu üçün "Axund Abuzər" kimi tanınırdı. Nəslin "Axund-lar" adı da beləcə yaranmışdı.

Bu qardaşların övladları da nəslin adına layiq şəxsiyyətlər olub. Onların demək olar ki, coxu dünyasını dəyişib. Cəlil Xəlilov uzun müddət dövlət aparatında işləyib, Marksizm-Leninizm İnstitutunda işləyib, hazırda təqaüdçüdür. Bacıları İsmət, Həcər də təqaüdçüdürlər. Kimyaçı alim Rəhimə xanım dünyasını dəyişib.

Gəncəli məhəlləsinin iki böyük küçəsinə, birinə baba Axund Pişnamazzadənin, digərinə isə nəslin varislərindən olan Teymur Xəlilovun adının verilməsi şəhər ictimaiyyətinin qədirbilənliyindən xəbər verir.

**"ŞAMÇILAR"** (patronim) – bu qədim nəsil məhəllənin əzəli sakinləridir. Ulu babaları şamçılıq sənəti ilə məşğul olduğuna görə onlara hörmət əlaməti olaraq, Şamçı sözünü özlərinə soyadı götürüblər. Bu faktı təkzib etmədən onu da qeyd edək ki, Səlcuq türklərinə məxsus Şamlı qəbiləsi var. Bu qəbilə monqolların Azərbaycana hücumu zamanı (XIII əsr) Şama (Suriyaya) köçüb orada yaşamışlar. XIV əsrdə Teymur-ləng tərəfindən həmin qəbilə - Şamlılar İrana köçürülmüş, oradan da Azərbaycana keçmişlər.

Bu soydan olan Şamçı Heydər tərəfindən əsası qoyulan, onlara məxsus qədim mülkün 1800-cü ildən tarixi var. 18 otaqdan ibarət ənənəvi mülkün hal-hazırda 8 otağı salamatdır. 48-ci ildə evin bir hissəsi kasıbçılıq ucbatından dağılıb gedib. Sonralar varislər bir çox Şəki tacirləri kimi ipək işinə baxıblar. Sovet hökuməti qurulunca Şamçiyev qardaşlarının İsanın, Ələkbərin həmin o 18 göz otağı olan evin alt mərtəbəsində qansı (ipək üçün əl dəzgahı) olub. Hökumət onların da var-dövlətini milliləşdirdikdən sonra qardaşlar kasıblamış, övladları da fabrik-zavodlarda fəhləlik etmişlər.

Özlərinin dediyinə görə, təkcə Şəkidə 200 nəfərdən çox bu soy adının daşıyıcıları var. Haqqında danışdığımız mərhum Teymur Xəlilovun həyat yoldaşı Afərdə xanım da bu soydan olan Şamçı Həsənin qızıdır. Əməkdar elm xadimi, iqtisad elmləri doktoru Kamil Səmədov, hüquqşünas Əli Şamçiyev də bu soydandır.

Bolşevik Qulamın Şamçılar soyundan evləndiyi ikinci həyat yoldaşı Züleyxa xanımdan olan övladları- tanınmış bəstəkarımız Şəfiqə Axundova, qardaşı kinorejissor Nəriman Axundov, onkoloq İsmət Axundova, rus dili müəlliməsi Rəfiqə Axundova məhz bu soyun varisləridirlər. Atalarının birinci həyat yoldaşından olan övladı Zümrüd Axundova (akademik Məmməd Arif Dadaşzadənin həyat yoldaşı, Araz Dadaşzadənin anası) olub.

**"YETİM ƏSGƏRLƏR"** (patronim) – bu adla tanınan çox imkanlı və qabiliyyətli bir tacir soyundan söhbət gedir. Hazırda 2 əsrdən çox yaşı olan 2 mərtəbəli qədim ev onun özü tərəfindən milli ənənələr üslubunda tikilmişdir. Evin zirzəmisi (sonradan ondan ev kimi də istifadə ediblər) yerdən 4 m hündürlüyündədir. Şəkinin bütün qədim evlərində olduğu kimi, bu evin də çox möhkəm divarları, indidən belə neçə əsr yaşaya biləsi qalın tir-tavanı, pəncərə və qapıları, dolabları, buxarısı çox göz oxşayandır.



Ulu baba Əsgər ağa tanınmış tacir olduğu üçün dost-tanışları da çox olub. Onlardan biri də məşhur milyonçu Musa Nağıyevin qardaşı Mehdi ağa olub. Mehdi ağa həm dostunu, həm də Şəki təbiətini, iqlimini, yeməklərini çox sevirdi. Vaxtaşırı bu gözəl diyara gələrdi. Bu gəlişlərin bir məqsədi də onun çox iri miqyasda xam ipək alverilə məşğul olması idi.

Hər gələndə də dostu Əsgər ağagildə qalardı. Mehdi ağanın həyat yoldaşı ölmüş, kiçik yaşlı 1 oğlu, I qızı vardı. Oğlu da kiçik ikən vəfat etmişdi. Mehdi ağa dostu Əsgər ağanın oğlu, Peteqburq və Nijni-Novqorod şəhərlərilə sıx alver edən tacir Məmmədin qızı Züleyxa xanımı razılıqla özünə həyat yoldaşı almışdı.

Mehdi ağanın Qobustanda neft buruqları olub. Oğlu Əliağa müəllimin dediyinə görə bu haqda rəsmi sənədlər qalmayıb. Bakıda Təzə Pir məscidi tərəfdə 28 otaqlı çox möhtəşəm mülkü varmış. Hökumət həmin evi onun əlindən alıb. Onun eyni zamanda Gəncədə ata mülkü də olub. Əliağa müəllimin uşaqlıq xatiratları Gəncə ilə çox bağlıdı. Onun dediyinə görə, həmin mülk Gəncəçayın sahilində yerləşirdi. Hazırda Gəncə Dram teatrı o mülkdə yerləşir.

Əliağa müəllimin xatırladığına görə, mülkün bir küçə qapısı da Gəncəçay tərəfə, üzü dəyirmana açılırdı. Uşaq ikən bu çayın içində qonşu uşaqlarla çox oynadığını, bəzən də suda yumurtlayan ördəklərin yumurtalarını yığdıqlarını şirin xatirə tək danışdı.

Əliağa müəllimin eşidib-bildiklərinə görə anası Züleyxa xanım istər Bakıda, istərsə də Gəncədə Şəki üçün həmişə ağlayıb-sızlayardı. Əri Mehdi ağa ona görə də məhz Gəncəli məhəlləsinin özündən Səhnə adlı bir uşağa baxan qulluqçu, (Əliağa müəllim qeyd etdi ki, Səhnə xalanın nəvə-nəticələri indi də durur və bu faktı bilirlər) bir də Şəki yeməklərini gözəlcə bişirib-düşürən Məstan adlı aşpaz qadın gətirmişdir. Onun xatırladığına görə, həyət-bacanın səliqəsinə baxan eşikağası kişi xeylağı da var idi. Əliağa müəllim onu da qeyd

etdi ki, Mehdi ağanın birinci arvadından olan Əliyə adlı qızı onun anası Züleyxa xanım özünün doğma balası kimi əzizləyib böyütmüşdür. Həmin yaraşıqlı, tərbiyəli qızı da Züleyxa xanımın qardaşı Əhməd ağa almış, ikibaşlı, çox mehriban qohum olmuşdular. Çox təəssüf ki, dəyişən zaman, quruluş çox gözəllikləri, doğmalıqları alt-üst etdi.

Qeyd edək ki, Əsgərov Əliağa Mehdi oğlu ali təhsilli qocaman coğrafiya müəllimidir. Şəkidə təhsilin ön cərgəcələrində gedən aparıcı müəllimlərdən olub. O, 1 saylı İnternat məktəbində, 5 saylı məktəbdə müdir işləmişdir. "Azərbaycanın Maarif əlaçısı" döş nişanı, "Rəşadətli əməyə görə" medalı ilə təltif olunan ali dərəcəli baş müəllim Ə.Əsgərovun maarif sahəsindəki xidmətləri Almaz Qeysər qızının "Mənəviyyatımızın memarları" kitabında hərtərəfli qeyd edilib. ("Sumqayıt nəşriyyatı", 2002). Təkcə onu qeyd etmək istəyirik ki, keçmiş Molla Kazım məktəbinin, sonradan isə 5 saylı nümunə məktəbinin 150 illik tarixi haqqında dəqiq, sənədli məlumatlar toplusundan hazırlanan kitabda (S.Əfəndiyev, N.Əhmədov) Əliağa müəllimin böyük əməyi olub. Yorulmayan pedaqoq 3 saylı məktəbdə fəaliyyətini davam etdirir.

Gəncəli məhəlləsindən hərtərəfli təsvir və təsəvvür yaradırıqsa, vaxtilə bu məhəllənin sakini olmuş mərhum **"QOÇU NƏRİMAN"** (patronim) haqqında da söz açmalıyıq.

Qoçu, Dəli, Qoçaq sözlərinin əzəmətini indiki zamanımızda şef, bos və s. kimi sözlər əvəz edir. Aralarındakı fərq isə elə deyilişindən təsəvvür edilir. İndi hər sahənin polis məntəqəsi, tək-tək polis nəzarətçiləri olduğu kimi, çox-çox qabaqlar hər məhəllənin, obanın elə öz içindən doğulub-böyüyən, sevən, irili-xırdalı hər bir işdə ənənəvi qaydaların təəssübünü çəkən qoluzorlu, gözündə qorxu olmayan, bir kəlmə kişi sözünə başıyla cavabdeh olan, tanrı verən gücün, qorxmazlığın tək özünə yox, sevdiyi el-obasına da aid olduğunu dərk edən igidləri olub. Onlar çoxluğun içindən seçilmişlər olublar. Beləlgəri indi də var. Ancaq nədənsə belə



qabağından yeməyənlərin çoxunun sorağı həbsxanalardan gəlir. O zamanlar da beləlgəri bəy və xanların bəzilərinin zülmündən, mövcud quruluşun təqibindən dağlara, meşələrə sığınıb yaşayıb fəda olublar. Belə seçilmişlərin çoxu da indi Şəhidlər Xiyabanında uyuyur.

**"KƏRBƏLAYİ MƏMMƏDLƏR"** - (Kəblə Ələsgər) (antroponim) - bu soyla bağlı Şəkidə yaşlı adamların xatirəsində çox əhvalatlar qalıb. Bir şeyə çox təəssüfləndik ki, bu soyun yaşlı sakinlərindən olan, bizimlə bir həftə sonra görüşüb söhbət etməyə razılıq verən qəssab Bəxtiyar dayı qəfildən vəfat etdi, çox bilgilərini isə özüylə qəbr evinə apardı.

Tacir Əliyev qardaşları haqqında yazanda qeyd etmişdik ki, Kərbəlayi Ələsgər onların qoçusu olub. Sovet hökuməti gələndə tuthatut qızışmamış Kərbəlayi Ələsgər Tiflisə gedir. Yeni quruluşdan bir müddət keçəndən sonra yerli camaat onun ev-eşiyinə qayıtmağını istəyir. Hökumətin etibarlı adamları ilə də danışıq olur. Kərbəlayi Ələsgər ata-baba mülkünə qayıdır.

Kərbəlayi yaşayıb, qəssablıq sənətilə məşğul olsa da üzərindəki nəzarəti hiss edirdi. Ruhu da heç cürə bu quruluşla barışa bilmirdi. Ölümünün tanrı tərəfindən sanki tez gəlməyini istəyirdi. Elə-beləcə də oldu. Dağda, əkin yeri adlanan, çox sevdiyi yerdə onu dəfn etdilər.

Haqqında danışmaq istədiyimiz Qoçu Nəriman da, atası qəssab Məşədi Muxtar da həmin Kərbəlayi Ələsgərlə bir soyun adamlarıdır. Məşədi Muxtar kolxozdan göndərilən hökumət mal-qarasını kəsərdi. Ancaq ağız dadını bilənlər üçün o, gizlincə mal-qaranın arasında özünün bəslədiyi erkək qoçları da kəsərdi. Fərdi qəssablıq o zaman qadağan idi.

Məşədi Muxtarı yenə də bir dəfə qanunsuz fərdi ət kəsdiyinə görə həbs edib, məhkəməsini qururlar. Məhkəmə elə Gəncəli məhəlləsində Duzlu Yusifin mülkündə yerləşirdi. Hakim və məhkəmənin katibi onu günahlandırdıqca, o söyüşlə, lağ-lağı ifadələrlə, sərt zarafatlarla cavab verirdi. Abid müəllim iştirakçısı olduğu o məhkəməni şou kimi təsvir edirdi. Məşədi

Muxtara bu günahına görə də iş vermirlər. O, bu əti bir qəssab kimi ağız dadını bilənlər üçün kəsdiyini sübut edə bilmişdi. Məşədi Muxtar bu quruluşda yaşasa da, keçmişi bildiyinə görə qəlbən bunlarla barışa bilmirdi. Zarafat və istehza ilə bunu hiss elətdirirdi.

Hökumətin qaçaqlarla mübarizəsi zamanı bəzən gözündə qorxu olmayan belə adamlardan istifadə edə bilirdilər. Məşədi Muxtardan Şəkidə hökumət adamı olan Nəzər Heydərov müəyyən qədər istifadə edə bilmişdi. Elə o vaxtdan da onunla dostlaşmışdılar. Qəlyan çəkən Muxtar dayı hərdən artıq Ali Sovet sədri olan dostu N.Heydərovgilə çiyni xurcunla, içində halvası ilə qonaq da gedərdi. Özünü qonaq getdiyi evdə şəhərsayağı aparmayan, qəlyanın külünü də hiss etmədən yerə tökən Məşədi Muxtarın gəlişinə N.Heydərovun xanımı üz-gözüylə narazılığını bildirərdi. Zəng vurub ərinə deyər ki, bu kimdi, sən dəvət etmisən. N.Heydərov tez deyər ki, nəbadə narazılığını bildirəsən, o elə adam deyil ha? Narazılığı duyub evə gəlir. Qapıdan girən kimi Məşədi Muxtar N.Heydərova deyər ki, "Əşi, bu nə arvaddı sən saxlayırsan".

"Banditizmlə" mübarizə zamanı Məşədi Muxtar ona verilən tapancanı qaytarmırdı. Ara sakitləşsə də ondan heç cürə ala bilmirdilər. Bir gün qonaqlıq edirlər. Məşədi Muxtarı da dəvət edirlər. Birini də öyrədirlər ki, sən onun xətrinə dəyən sözlər de, qızışdır. Belə də olur. Tanışları əlaltdan Məşədi Muxtara deyirlər ki, sən nətəri dözürsən bu təhqirə, onu güllə ilə vur. Deyir ki, bəs tapancamda güllə yoxdur. Əlaltdan tapancanı alıb, elə oradaca içinə boş gilizlər qoyurlar. M.Muxtar atır. Öyrədilən adam yalandan yerə yıxılır. Məhkəmə qurulur. Vurulan adamı da gətirirlər. Məşədi onu görüb işi anlayır. Beləcə ondan tapancanı alırlar. Hiylə həmişə irili-xırdalı siyasətin güclü qolu olub.

Oğlu Nəriman da elə idi. Nə isə bu ədalətli quruluşun, kasıb-kusubun havadarı olan Şura hökumətinin "Xoşbəxt" yaşayışındakı ədalətsizliyi də hiss edirdi. Büruzə verə bilmirdi.



Məşədi Muxtarın Əhməd adlı oğlu da II Dünya müharibəsində qəhrəmancasına həlak olmuşdu. Qızı Səyyarə də təhsil aldığı dövrdə respublika üzrə ilk qaçış üzrə çempionlardan olmuşdu. Həmişə Məşədi Muxtar deyərdi ki, qızım çempion, oğlum qəhrəmandır.

Məşədi Muxtarın Nəriman adlı oğlu da çempion olub. Gedən-gələn qoçu xislətli, bədən qabariti, şəkililər demişkən ciyərli oğul olması onu çoxlarından fərqləndirirdi. Sümüyü oynadan, qanı cuşa gətirən nağara-zurnanın əzəmətli sədasının vurğunu idi. Elə yeniyetmə vaxtlarından güc, iradə, möhkəmlik tələb edən "Dülədöymə" oyununun mahir oyunçusu idi. Bir də yaşadığı gözəl Şəkinin, onun Gəncəli məhəlləsində öz əzəmətilə keçirilən Novruz bayramının vurğunu idi.

Bu vurğunluqlar onun görkəmli, güclü cüssəsinin zorunu birə-beş artırırdı. Məqam, imkan axtarırdı ki, onu istədiyi kimi üzə çıxarsın, kökdən gəlmə qoçu xislətinə bir möhür də o vursun. Tale ona bunu qismət etdi.

1955-ci ildə 15 yaşında Xankəndində "Spartak" cəmiyyətinin birinciliyi uğrunda pəhləvanların yarışında ilk dəfə fəxri kürsünün ən uca pilləsinə qalxdı.

1961-ci ildə isə o, Belorusiyanın Qomel şəhərində "Spartak"ın Mərkəzi şurasının birinciliyindən Şəkiyə qızıl medalla qayıdır. Təkcə medalla yox, ona doğma və xoş olan Qoçu adına tam yiyələnib gəlir. Yarış zamanı Qomeldə oradakı azarkeş qızlar ona Cigit (Djiqit) deyib ətrafında dolananda, Nəriman etiraz edir ki, bizdə belə deyilmir. Qızlar harayla, həsrətlə soruşurlar ki, bəs sənin kimi qüvvətli, qüdrətli adamı necə çağırırlar? O cavab verir ki: "pəhləvan", "cəngavər", "qoçu". Qızların xoşuna "Qoçu" sözü gəldiyindən Nəriman güləş döşəyi üzərinə çıxan kimi "Qo-çu" harayından Qomeldəki idman zalının pəncərə şüşələri titrəyirdi.

Elə həmin vaxtdan Şəkidə də onu "Qoçu Nəriman" çağırmağa başladılar.

Sonrakı 1961-1963-cü illərdə Qoçu Nəriman Xarkov, Rostov, Çerkassk şəhərlərində keçirilən "Spartak" cəmiyyətinin daha 3 yarışında müvəffəqiyyət qazanır.

Qoçu Nəriman həm də yetim-yesir havadarı idi. Vaxtilə yerli sahibkarlardan Zülfüqarovlara, Dadanovlara məxsus möhtəşəm mülklərdə yerləşən uşaq evi, internat onun həmişə ürəyi atlanıb tez-tez havadarlıq, yaxşılıq etdiyi yerlər idi. Bu qədər kimsəsizliyi, atılmışlığı onun qəlbi qəbul etmirdi. Bu uşaqların da atalı-analılar kimi yaxşı geyinməyini, adlı-dadlı təamlar yeməyini arzulayırdı. O bilirdi ki, boy artımı dövründə uşaqlar göy-turş alçanı çox sevirlər. Bir dəfə yaz yağışı palçığına bata-bata Ağdaşda dost-tanışlarının bağından nə az, nə çox düz 30 vedrə alçanı öz əllərilə dərib, gətirib uşaqların qabağına tökmüş, gözlərini tox etmişdir. Soydan gəlmə qəssablıq sənətini də bacardığı üçün özünün çox sevdiyi ləziz kababları da onlardan əsirgəmirdi. Onlar üçün bir neçə dəfə qoyun alıb, özü kabab bişirib, yedirmişdir. Bahar bayramında da paylarını əsirgəməzdi.

Bu qoluzorlu, cüssəli pəhləvanın o qədər yuxa ürəyi vardı ki... Bacısı oğlu Furman müəllimin dediyinə görə, onunla yeməkxanaya nahara gedəndə görürdün ki, çöldə hərlənən pişiyə də ət atardı.

Bu qədər yumşaq ürək sahibinin yurdunu, adət-ənənəsini sevən bir kəsin dönüm-dönüm cəza evində oturma səbəbini dərindən bilmək istəyənlər "Avtoritetin" 17 və 29 dekabr 1999-cu il və 5 və 12 yanvar 2000-ci il saylı nömrələrinin, "Kriminal Azərbaycan" qəzetlərində Bəhram Çələbinin "Məşədi oğlu Nəriman" və "Şəki Qartalı" adlı məqalələrində oxuya bilərlər.

Qoçu Nərimanın artıq kartserlərdə oturmaqdan bədənindəki daxili orqanlar sıradan çıxmışdı. Oğlu ilə son görüşdə burada ölmək istəmədiyini, onu qurtarmağını xahiş edirdi. Öləndə Şəki ilə, Gəncəli məhəlləsilə vidalaşıb getmək istəyirəm. Danış, gör nə istəyirlər, tap, ver...

Oğlu Söhrab və bacısı oğlu Furman müəllim danışığı başa çatdırınca evə olunan zəngdə üç kəlmə nisgilli söz eşitdilər:



"Allah cənnətlik eləsin". "Qəbri nurla dolsun". "Qartal idi, Şəki qartalı".

Biz isə sadəcə onu deyirik ki, rəhmətlik daha adlı pəhləvan olmaqla yanaşı, yetirmələrilə fəxr edən məşqçi də ola bilərdi. Əsgəri xidmət edən gənclərə gözəl, gərəkli fəndləri, manevrləri öyrədən hərbçi komandan da ola bilərdi. Düşmənə qənim üçün sənin kimilər bizə bu gün necə də gərəkdi. Qolu zorlu, elini sevən oğullara torpağın altında yox, üstündə ehtiyac çoxdu.

Məhəllənin Sona qəbiristanlığı bir seçmə oğlunu da dağ yaxasında öz qoynuna aldı. Buradan isə şəhər əl içi kimi görünür. Onun sevdiyi guşələrin çoxu əzgilli, fındıqlı dərələr, çeşmələr, sevə-sevə düşdüyü Körpüqulağı, Karvansara, Xan sarayı buradan açıq-aydın görünür... Üst-üstə çəkdiyi həbs illərində bu yerlərin nə qədər həsrətini çəkmişdi...

Qoçu Nərimanın idmançı bacısı mərhum Səyyarə xanımın oğlu Bədən Tərbiyəsi İnstitutunun məzunu, 60-cı illərdə tələbəlik vaxtlarında Ukraynada tələbə-gənclər arasında güləş üzrə çempion olmuş Furman müəllim danışdı. Həm də öz ailəsi haqqında jurnalist Mirzəağa Məmmədov tərəfindən yazılmış "Axın" adlı kiçik kitabçanı da təqdim etdi.

1969-cu ilin nəşri olan kitabçada bir neçə idmançı azərbaycanlı ailəsindən oçerklər verilmişdir.

Furman müəllimin atası mərhum Bəkir müəllim və anası Səyyarə müəllimə də Azərbaycanda ilk idmançılardan olublar. Bəkir müəllimin atası Abdulla boy-buxunlu, qüvvətli-biləkli, cüssəli olsa da çox kasıb idi. Nökərçilik edər, Şəkidə Azax bəyin fabrikində bir qarın çörək puluna işləyirdi. Abdullanın gənclik illəri Dağıstanın Şəkiyə yaxın, muğallar çox olan Qıdınıq kəndində keçmişdi.

Abdulla Azax bəyin fabrikinin fəhlələri ilə birgə ala bilmədikləri çörək puluna görə tətilə qoşulur. Şəhər bələdiyyə rəisi Cahan bəyin sərəncamı ilə tətil edənlər polislərin qırmanc və təpikləri altında döyülüb, əzilirlər. Kimisi də Azax bəy tərəfin-

dən fabrikdən qovulur. Abdulla da həm zədə alır, həm də işdən qovulur. Elə həmin ərəfələrdə Şəki mahalına bir gürcü pəhləvanı gəlib, onunla güləşə biləcək bir adam tapılmasa, çoxlu bac verilməsini tələb edirdi.

Şəkili Əhmədxan sarayı şəhərin adlı-sanlı adamları ilə dolu idi. Şəhərin qoçuları, qolugüclü cavanları, zorxana pəhləvanları da dəvət olunmuşdu.

Ata-babalardan üzü bəri gəlmiş el adətinə görə, başqa vilayətdən gələn pəhləvanın qarşısına yerli xanlıq güləşçi çıxarmasa, o zaman çoxlu miqdarda gərək bac verəydi. Bu hal Əhməd xanı dəhşətə salmışdı.

Şəhərin darğası kömürçü İsmayıl dönə-dönə xana ərz elədi ki, bəs şəhərimizdə yaxşı pəhləvanlarımız var, ancaq onunla cəngə girə biləcək adamımız yoxdur. Ümid verəsi bir nəfərdir, qorxuram ona da Siz razılıq verməyəsiz. Əvvəllər Azax bəyin fabrikində fəhləlik edərdi, indi işsizdir. Darğa kömürçü İsmayıl Əhməd Xanın razılığını alandan sonra Abdullanı axtarmağa başladı. Şəhərin küçə və dükanlarını, dəyirman və tinlərini çox axtardı, gördüm deyən olmadı. Faytonu dağ yolu ilə Qıdımığa sürdürdü (qeyd edək ki, həmin dağ yolu Şin dərəsi deyilən yerdən Qafqaz Albaniyası dövrlərinə aid qədim yol idi. Çar hökuməti Dağıstanda baş vermiş Şamil hərəkatının yayılmasından ehtiyat edərək həmin yolu dağıtdırmışdır. Sonralar isə yol bərpa edilməmişdir. Beləliklə, biz Samur çayı hövzəsində yaşayan xalqlardan çox kəskin şəkildə ayrı düşdük).

Şəhərin darğası Abdullanı xanın hüzuruna gətirir. Abdulla etiraz etdikcə, Əhməd xan onun qəlbinin ən incə yerlərinə toxunurdu. "Oğlum, bizə, mahala ayıb olar ki, Şəki kimi böyük bir şəhər yad bir pəhləvanın qarşısında aciz qalsın? Əgər boyun qaçırsan, veriləcək bac camaatdan yığılacaq". Abdulla ehtiyac içində boğulan camaatın çapılıb-talanmasına razı ola bilməzdi.

Təyin olunan vaxt camaat Qala qabağındakı meydana axışdı. Lap qabaq cərgədə Şəki qoçuları, tacir və baqqalları ortada xalçalar üstündə cövlan edən Abdulla ilə gürcü pəhləvanının güləşini maraqla izləyirdilər. Uzun, gərgin mübarizədən sonra Abdulla bütün qüvvəsini toplayıb özündən çox gövdəli olan gürcü pəhləvanını başı üzərində havaya qaldırıb, yerə atır. Alqış səsləri ətrafı bürüyür. Camaat Abdullanı qaldırıb Əhməd xanın sarayına qədər əlləri üstə aparırlar. Xan Abdullanı təbrik edir, ona gümüş xəncər, qırmızı arxalıq və bir cüt qırmızı çərkəzi uzunboğaz çəkmə bağışlayır.

Bu təntənə uzun çəkmir. Həmin gündən Abdulla yenə küçələrə düşüb iş axtarmağa başlayır. İşsizlik, ehtiyac onu qılınc kimi kəsirdi. Bu dərddən o şam kimi əriyib, zəifləyir və bir gün də qara, çovğuna düşüb, yoxsul komasındakı yatağında vəfat edir.

Ailənin ağırlığı hələ sümükləri bərkiməmiş Bəkirin üzərinə düşür. Şəkidə bir tacirə nökər durur. Qazancı bir qarın çörəkdən o yana keçmir, ailəsinə kömək edə bilmir.

Çox keçmir ki, Şura hökuməti qurulur. Fabriklərin çoxu, eləcə də qabaqlar atasının fəhləlik etdiyi Azax bəyin fabriki də hökumətin tabeliyinə keçir. Hökumət yoxsul fəhlələri həmin fabriklərdə işə götürür, axşamlar isə istəyənləri savad kurslarında oxudur.

Belə yeni həyat Bəkir kimilərinə qol-qanad verir, atası kimi itib-batmır. O, hər gün 8 saat işləyir, axşamlar savad kursuna gedir, istirahət günləri və boş vaxtlarında fabrikdə yaradılmış ilk bədən tərbiyəsi dərnəyində məşğul olurdu. Zatən güləşməyə meyl göstərən Bəkir həm də yüngül atletika bölməsinə üzv idi. O, 1926-cı ildə ağacla hündürlüyə tullanmaqda ən yaxşı nəticə göstərdiyi üçün respublika həmkarlar ittifaqı tərəfindən mükafatlandırıldı.

1929-cu ildə Bəkir güləşmə yarışlarında Şəki birinciliyində çempion oldu. Həmin il Sabunçuda keçirilən Azərbaycan birinci spartakiadasında güləşdə ikinci yeri tutdu.

İdman sahəsində mütəxəssis kimi tanındığı üçün 1931-ci ildə rayonda yeni təşkil edilmiş bədən tərbiyəsi və idman işləri

komitəsinə sədr seçildi. O, ilk dəfə bədən tərbiyəsi kollektivləri yaratmağa çalışır, yarışlar və idman tədbirləri keçirməyə başlayır. Gənclər idmanı sevir, ona meyilli olurdular.

Belə bir zamanda idmana qızları cəlb etməyin adını belə çəkmək olmazdı. Qara çadraya bürünüb, məktəbə gələn qızlar dərsdən sonra kölgə kimi itirdilər. Ancaq onların da içində istəyi güclü olan cəsarətlilər vardı.

Həmin qoçu Nərimanın bacısı, sonralar Bəkirin həyat yoldaşı olmuş Səyyarə məhz belələrindən idi. Təqib və təhqirlərə baxmayaraq Bəkir qız idmançıların yetişdirilməsində fəaliyyətini dayandırmır. Yetirmələrindən 19 yaşlı Səyyarə 1935-ci ildə ilk dəfə azərbaycanlı qızlar arasında dəmir lövhə tullamaqda yüksək nəticə göstərərək birinci yer tutur. 1938-ci ildə isə Bəkir və Səyyarə Orta Asiyada SSRİ İpəkçilərinin birinciliyi yarışlarında gözəl nəticələr qazandılar. Səyyarə ipəkçi qadınların çempionu adını aldı. Bəkir də layiqli yerlərdən birini tutdu. Yarışdan qələbə ilə qayıdan iki idmançı xoşbəxt ailə qururlar. Böyük Vətən müharibəsinin başlanması artıq əli körpəli olan ailənin arzu və istəyini yarımçıq qoydu. Bəkir 4 il namusla vuruşaraq Ukraynadan Berlinə qədər şərəfli döyüş yolu keçdi. Evə qəhrəmanlıq nişanları ilə qayıtdı. Yenə də etibarlı həyat yoldaşı ilə birgə sevimli işlərilə məşğul oldular.

1946-cı ildə müntəzəm məşq edən Səyyarə Ümumazərbaycan çempionatında dəmir lövhəni 44 metr 50 sm məsafəyə tullayaraq, özündən əvvəlki idmançı Sona Qasımovanın keçmiş respublika rekordunu arxada buraxıb, çempion adını qazandı.

Bəkirin də 1953-cü ildə müəyyən etdiyi rayon rekordunu uzun illər təzələyən olmamışdır.

Xeyli sonralar Səyyarə xanım uşaq bağçasında tərbiyəçi, müdirə, rayon idman Qadınlar Şurasında və yüngül atletika bölməsində ictimai məşqçi kimi fəaliyyət göstərmişdir. Övladları da idmana məhəbbət ruhunda böyümüşlər. Qızı Səlimət anası kimi yüngül atletika ilə – qısa məsafələrə qaçmağa, oğlu



Telman uzununa tullanmağa, Murad isə ağırlıq qaldırmağa maraq göstərmişlər.

Haqqında yuxarıda bəhs etdiyimiz Qoçu Nəriman da güləşin fəndlərini bacısı Səyyarənin ilk övladı Furman müəllimdən öyrənmişdir. Çox-çox heyf ki, onun bu qabiliyyətindən nə özü, nə də xalqı çox yarıyıb, bəhərlənmədi...

**"KƏBLƏ SƏMƏDLƏR"** (antroponim) – Gəncəli məhəlləsinin bu soyu ənənəvi Şəki halvasının ustakarları kimi tanınırlar. Onlara "halvaçılar" da deyirlər. Ulu baba Kərbəlayi Səməd öz atasından üzü bəri bu sənəti nəsil sevə-sevə davam etdirir.

Halvaçı Yahya Səmədov Şəkidə halvanın ustadlarından biri kimi tanınıb. Şəhərdə bu sənətin sirlərini çoxlarına öyrədib. İndi mərhum Yahya dayının oğulları Nadir və Kamil də, onların oğlanları Ramin, Əbülfəz Səmədovlar sənəti davam etdirirlər. Onlar ulu babalarından qalma halva tiyanını, qıfı və kəfgiri özləri üçün müqəddəs hesab edir, qoyub gedən əzizlərinin ruhlarına daim dua edirlər. İndi onların kiçik istehsal sexi Yuxarı karvansara binasının hücrələrinin birində yerləşir.

Gəlib-gedənlərin, daxili və xarici turistlərin gur yeri olan karvansara əhatəsindən müxtəlif sənət nümunələri alanlar Şəki halvasının da ecazkar dadını gəldikləri yerə damaqlarında, tərifini isə dillərində aparırlar. Halva sexinin qabağına vurulan simvolik işarədə "Halvaçı Yəhya adına şirniyyat sexi" sözləri isə onların işinin ənənə üzərində kökləndiyini bir daha təsdiq edir.

**"GÜLLÜHLƏR" – "ÇUSTÇULAR"** (ktematonim) – bu soy da Gəncəli məhəlləsindəki adlı, sayımlı, milli dəyərlərin mühafizəkarı olan nəsillərdən biridir. Məhəllənin görkəmli yerində yerləşən ata-baba mülkünün vaxtilə çox böyük qızıl güllərdən ibarət güllük sahəsi olub. Baba Səməd kişinin sənəti çustçu olmağına baxmayaraq o, qardaşları Avdıkərim və Hüseyn də özlərinin ata-babasından yadigar qalan bu gülüstanı sevər və qoruyardılar. Elə babalarının dilindən söylədiyinə görə bu qızılgüllərin kökü Xan Gülüstanı məhəlləsi olan xanın

bağatlığından paylanmış pöhrələrdəndir. Gül bülbülü, bülbül gülü çağıran vaxtlarda bu qızıl güllərin ətri Körpüqulağına qədər – yəni məhəllənin girəcəyinədək yayılardı. Hamı istəyirdi ki, gülabını, gülqəndini, gülsuyunu və mürəbbəsini Çustçu Səmədin həyətindəki ata-baba gülündən hazırlasın.

Çustçu Səmədin vəfatından sonra oğlu Çustçu Həsən və onun məhəllədə evdarlığı birinci olan xanımı Zahidə bu güllərin qayğısını çəkirdi.

Qızı Şirin Həsən qızının dediklərinə görə, anamın axşam və səhər tezdən bizə yığdırdığı güllərin gülabının üzərini gülyağı örtərdi. Bir damcısının iyi adamı bihuş edərdi. Darboğaz kitabi, yumru, süvərək şüşələrə istəklə yığdığı gülabdan qışda firnisində, halvasında, südlü aşında bol-bol istifadə edərdi. Xəstələnəndə ılıqladıb içirərdi ki, sinəni təmizləyir, ürəyə təravət verir. İlaxır süfrəsinə düzəltdiyi gülablı-gülsuyulu-ədviyyəli ovşaranın süfrədən qayıtdığını görməmişik.

Çustçu Səməd ata-baba sənətini də çox gözəl bilirdi. Məsələn, uzunboğaz çəkmə və çarıq sifarişlərini daha çox alırdı.

1941-ci ilin müharibəsi başlanır. Cüssəsi və boy-buxunu ilə seçilən çustçu Həsən Səməd oğlu Əsgərov da cəbhəyə göndərilir. Vicdanla döyüşən çustçu Həsən düz 7 ildən sonra sinəsində orden və medallarla, bədənində isə qəlpə qırıqları ilə evinə qayıtdı.

Ömür-gün yoldaşı Zahidə ana dövrün çətinliklərinə dözüb övladlarını qoruyub böyüdə bilib. 7 ilin gözləməsində əhd etdi ki, ailəm balalarımın üstünə sağ salamat gəlsin, niyyət edirəm ki, hər Bahar bayramında, ilaxırda "Qubba səməni" cücərdib, bişirib paylayacam. Baharın şah əsəri olan səməni cücərtmək iki cür olur: biri yaşıllıq, bolluq, bərəkət rəmzidir, təbiətin yenidən canlanmasına işarədir. O biri isə "Qubba səməni" adlanır ki, niyyət tutub deyirsən: "bayramadək filan istəyimə çatsam, səməni bişirib payladacağam". Belə də olur. Zahidə ana əri gələn ildən niyyətinə hər il əməl etməyə başlayır. Xan sarayının qala bürcündən ilaxır topu atılan gündən



sinilərə, süzgəclərə niyyət səmənisini tökərdi. Gündəlik qayğısına qaldığı, cücərməyə başlayan buğdanın üstünü nəmlər, örtüklə basdırıb nəzarət edərdi ki, boy atmasın, cimini kökə versin. Bir neçə gündən sonra onları cəmləyib əl dingi deyilən uzunsov həvəngdəstələrdə yeddi dəfə döyüb, mis qazana tökürlər. Bir az da un qatıb ocaq üstündə bir qədər qaynadırlar. Zahidə ana bu işi özü kimi işlək qızlarının köməyilə edərdi. Çünki fiziki cəhətdən köməyə ehtiyac olan prosesdi. Mis qazanda həl bişəndən sonra süzgəcdən keçirilib simsar adamların hərəsinə bir qubba (yəni bir pay) verirlər. Çox dadlı, şirin olan bu təbii təamın faydası əvəzsizdir.

Bu ailənin oğul övladı, şəhərimizin tanınmış ziyalısı, 10 saylı məktəbin direktoru Niyazi Əsgərov deyir ki, anamın vəfatından sonra da ailəmizin bu ənənəsi davam edir. Anamızın evdarlıqda yaşatdıqlarını bircə-bircə yığıb özündə cəmləşdirən bacım Şirin hər il eyni vaxtda qubba səmənini hazırlayır.

N.Əsgərovun çox nəcib xanımı Kəmalə Rəcəb qızı da qaynanası Zahidə ana haqqında dedi ki, həddən artıq təmizkarlığı olan qadın idi. Bizim iki oğlan uşağımıza da bunu təlqin etmişdir. O, həm də müsəlmana xas olan bütün bayramları, əziz günləri, çilləni, onun qaydalarını, duaları, xüsusən də gecə dualarını bizim uşaqlara lap balacalıqdan anladıb, beyinlərinə həkk etmişdir. Onun nənə kimi bu xidməti çox əvəzsizdir. Qəbri nurla dolsun. İndi bizim belə milli ruhda böyüyən övladlarımız Türkiyənin "Reney-Ssans-Konstrakşin" şirkətinin, Rusiyanın ayrı-ayrı şəhərlərdə yerləşən bölmələrinin məsul işçiləridirlər.

Kəmalə xanım özü məhəllədə Göygöz Əsədullah adıyla tanınan məşhur bir tacirin nəticəsidir. Hazırda Kəmalə xanımın yaşadığı evin alt hissəsində tacir Əsədullahın ənənəvi qaydalar əsasında tikilmiş mülkü olub. Bu evin özünəməxsusluqlarından biri də bu olub ki, onun sahibi evdən çaya qədər məsafədə adamın rahatlıqla gəzə biləcəyi çox mötəbər bir kanalizasiya tuneli qazdırıb, divarlarını hördürmüşdür. Kanalizasiyanın axarı məhəlləyə girəcəkdə tikilən tağlı körpünün yaxınlığındakı

"qaranlıq dərə" deyilən yerə tökülür. Elə camaat bu körpünün özünə də çox vaxt "qaranlıq körpü" deyirlər. Bu memarlıq abidəsi olan körpü haqqında bizim Elmi Mərkəzin əməkdaşı, sənətşünaslıq namizədi Nərgiz Saleh 1996-cı il 2 saylı "Elm və həyat" jurnalında əhatəli yazmışdır.

Şəkinin bir çox tacirləri kimi, çox cah-cəlallı yaşayan tacir Əsədullahın da malı-mülkü müsadirə edilib, özü isə güllələnmişdir. Azərbaycan Respublikası Milli Təhlükəsizlik Nazirliyinin orqanı olan "Yaddaşın bərpası" qəzetində bəraət alanlar sırasında Qasımov Əsədullahın da adı var. Tacir Əsədullahın qız nəvəsi Rəcəb Zeynalovu Şəki əhli çox gözəl tanıyır. 1946-cı ildə müharibədən gələn gənc Rəcəb köhnə, sınıq maşını özü təmir edib, sürücülük edib. Öz qüvvəsilə əvvəl texnikum, sonra İnstitut oxuyub. Sonralar Şəki Avtobazasında müdir, daha sonra isə ət-süd nazirliyində məsul vəzifədə işləyib. Kəmalə xanım 1983-cü ildə dünyasını dəyişmiş atasının bu sözlərini oğlanlarına da təlqin edir: "Əsil kişiliyin bir tərəfi də odur ki, kasıb vaxtı ilə varlı vaxtı bilinməməlidir".

**"FARS ƏSƏDULLAH UŞAĞI"** (patronim) - bu ləqəbli işgüzar tacir əslində zatən Gəncəli məhəlləsindən olub, Kərbəlayi Sadığın oğlu idi. Təhsili barədə dəqiq məlumat bilməsələr də, o çox gözəl mühasib olub, messenant-milyoner Hacı Zeynalabdin Tağıyevin kontorlarının birində çalışıb. Sonradan əldə etdiyi xeyli vəsaitlə tacirliyə başlayıb. Xüsusən də onun tacirlik əlaqələri İranın Xorasan şəhərilə sıx bağlı olub.

Onun orada 8 otaqlı gözəl evi, dükanları olub. Ailəsini də bu taydan o taya aparıb. Sovet hökuməti qurulub Cənubi Azərbaycanla sərhəd bağlanmağa başlayanda tacir qiymətcə ağır, vəzncə yüngül varidatını və ailəsini götürüb doğma yurda qayıdıb. Elə o vaxtdan onun adının qabağına "fars" sözü də əlavə olunub, bu adla tanınmağa başladı. Tacir özü də farsı, ərəbi gözəl bilirdi.

Fars Əsədullahın qızı Suriyyə Xorasanda mədrəsə təhsili almış, farsı gözəl bilib, ərəbcə Quran oxuyurdu. Çox gözəl də



avazı vardı. Dini mərasimlərdə, yas mərasimlərində bu sahədə qabiliyyətilə tanınıb məşhurlaşmışdı. Molla Suriyyənin qızı Əzizə xalanın dediyinə görə, tanınmış aktyor, həmyerlimiz Lütvəli Abdullayevin ona çox böyük rəğbəti, dini biliyinə hörməti vardı. Bacı-qardaş kimi yaxın ünsiyyətləri olub. Hərdən L.Abdullayev zarafatla deyərdi ki, "Şəkinin artisti mənəm, mollası da sənsən".

Müstəqilliyə gediş dövründə Cənubi Azərbaycanla ara açılan zaman Molla Suriyyə o taya gedən dayısı nəvəsi Zərif müəllimə ünvan vermişdi ki, gedib böyüdüyü ev-eşiyə, məhəlləyə baxsın, bir xəbər gətirsin. Lakin qədər-qismət elə gətirdi ki, o gedincə Molla Suriyyə dünyasını dəyişdi. Zərif müəllimə gedib-gələndən sonra oradan gətirdiyi torpağı Molla Suriyənin qəbri üzərinə səpdi.

Molla Suriyənin Əhməd adlı qardaşı tanınmış cərrah olub. Əhməd Sadıqov digər məşhur cərrah Nazim Qarayevlə birgə Bakıda işləyib. Sonradan Rusiyada Poltava vilayətində baş həkim olub. Vilayətin əhalisinin (burada köhnə alman mənşəli nəsillər çoxdur) ona böyük məhəbbəti vardı. Rüşvət adlı məfhum Hippokrat andı içən bu həkim üçün qəbulolunmaz idi. O, öz xərcilə həmin vilayətdə xəstəxana tikib, xəstəxananın həyətinin bir tərəfində isə özünə münasib, çox da iri olmayan ev də tikmişdir. Ailəsi və iki övladı ilə orada yaşamışlar.

Onun bir həkim və insan kimi xidmətlərinə görə Poltava vilayətinin əhalisi xəstəxana həyətində həmişə can sağlıqlarının keşiyində durmuş sevimli həkimlərinin büstünu ucaltmışlar. Vilayətdən Azərbaycan mətbuatına təşəkkür məktubu da göndərilmişdir (təəssüf ki, bunu aramaq imkanımız olmadı). Doğmalarının dediyinə görə, onun iki övladı hazırda xaricdə işləyib yaşayırlar.

Sağlığında Şəkiyə tez-tez gələrdi. Şəki təbiətini çox xoşlayırdı. Qohum-əqrəbanın dərd-sərinə həm həkim, həm də qohum kimi yarayırdı. Əzizə xala onun danışdığı söhbətlərdən yadında qalanlardan birini söylədi: "Əhməd Sadıqov ağır cər-

rahi əməliyyatı başa çatdırıb, dəhlizdə siqar çəkib, pəncərədən çölə baxırdı. Xəstəxanaya yaxın küçədə elektrik dirəyində işləyən mantyoru açıqca görür, onun işini izləyirdi. Birdən gördü ki, mantyoru cərəyan vurub yerə saldı.Ləngimədən iki tibb bacısı ilə xərəyi götürüb küçəyə qaçıb, onu xilas etməyə çalışır. İlk yardımdan sonra xəstəxanaya gətirib müalicə edib, zərərçəkəni həyata qaytarır". Həmin mantyor Əhməd həkimlə qardaşdan da yaxın dost olmuşdur. Əhməd Sadıqovun belə xilas edib doğmalaşdığı əzizlərinin sayı çox olduğuna görə onun qəbri üstündə ilin bütün fəsillərində tər çiçəklər olur.

Əhməd Sadıqovun Əbülfəz adlı qardaşı hazırda Sibirdə Saxalin şəhərində orqanda məsul vəzifədə çalışır. Şəkiyə 3 günlük gələn Əbülfəz Sadıqovu görüb müəyyən sorğularla ona müraciət edə bilmədik. Gəncəli məhəlləsindən Əlihüseyn Əliyev adlı bir ziyalı Moskvada yaşayır. Uzun illər orada işləyib, yaşamağına baxmayaraq, hər il doğma yurda gəlir, qohum-əqrəba, qonşular və tanışlarla ünsiyyətdə olur. O yay olmasın ki, Əlihüseyn müəllim doğma yurda, məhəlləyə gəlməmiş olsun. Məhəllə məscidinə baş çəkir, məscidin müəyyən ehtiyaclarına gücü çatan miqdarda kömək edir, dindarlarla ətraflı söhbət edir. Getdiyi Həcc ziyarəti, hazırda məşğul olduğu dini araşdırmalar haqqında əhatəli söhbəti hamı üçün maraqlı olur.

Ə.Əliyev dünyada mövcud olan bütün dinlər və onun sektaları (tirələri) üzərində sosioloji tədqiqatların araşdırıcısıdır. Dünyanın çox ölkələrində olub. Təkcə Azərbaycanın və Moskvanın ziyalı elitası tərəfindən deyil, Qərb dövlətlərinin teoloq və araşdırıcıları tərəfindən də yaxşı tanınır.

Ə.Əliyev gənclik vaxtlarında Stalinlə görüş xatirələri, Qafqazın hər 3 respublikasının dini rəhbərlərilə görüşləri, xarici səfərləri və s. Haqqında toplu halında işləyib kitab çap etdirəcəyini söylədi.

**"RÜSTƏMOVLAR"** (patronim) – bu nəslin yaşlı varislərindən Cəfərova Rəfiqə Əliqulu qızının ulu babası tacir Əlihüseyn olub. Onun Yusif, Şirməmməd və Mahmud ağa adlı



3 zəngin, qabiliyyətli oğlu olub. Mahmud ağa Peterburqda təhsil almışdır. Onun Bakıda Balaxanıda neft mədəni, Şəkidə duz mədəni olmuşdur. Onun Bakının indiki dəniz limanı tərəfdə böyük mülkü də var idi. Hökumət tərəfindən mülkü və varidatı müsadirə edilmişdir.

Mahmud ağanın Nadir, Cahangir adlı nəvələri-biri heykəltəraş, digərisə rəssam olub. Tacir Əlihüseynin qızı Zeynəb xanım ədəbiyyatımızın cəfakeşi, tədqiqatçısı, toplayıcısı, repressiya qurbanı olmuş Salman Mümtazın həyat yoldaşı olmuşdur. Salman onu çox sevib, həmişə də həddən artıq qayğısını çəkərdi. İcazə verməzdi ki, ev işlərilə məşğul olsun. Evində qulluqçular xidmət edərdi.

Salman Mümtazın atası Məmmədəmin tacir olmuşdur. O, dünyasını erkən dəyişdiyindən S.Mümtaz böyük oğul olduğu üçün ailənin qayğısını çəkməyə məcbur olmuşdur. Orta Asiyada (Aşqabadda) dayısının himayəsində yaşayıb, orada xalxallı Mirzə Əsədulladan ərəb və fars dillərini, urdu dilini öyrənmişdi. Məhz bu dilləri bilməyinin sayəsində ədəbi nümunələri oxumuş, onları oxuculara da çatdırmaq meyli onda qüvvətlənmiş, tacirliklə qazandığı qızılların əsas hissəsini əlyazmalara, dəyərli kitablara xərcləyib. Rəsmən ali təhsil ala bilməsə də məmləkətdə zəngin elmli adamlardan biri olub. Dünyada ən qiymətli şəxsi kitabxanalardan biri ona məxsus olub. Sandığının qızılları hesabına sonsuz əziyyətlə mənbələr toplayıb üzərində canyanğısı ilə işlədiyi kitablardan vur-tut on doqquzunu yazıb çap etdirə bildi. Lap minini də yazıb çap etdirə bilərdi. Ancaq Azərbaycan xalqının 84 min ən seçmə, ən savadlı oğullarını məhv edən, hər on ildən bir bizə yeni əlifbalar "bəxş edən" (ata-babaların qoyub getdiklərini oğullar oxuya bilməyib, kökündən bixəbər olsun deyə) Stalin qoymadı ki, Salman Mümtaz yaşasın, xalqına fayda versin. Nəinki qoymadı, ömrünü, varını sərf edib yığdığı dəyərli mənbələri, kitabları torbalara doldurtdurub, soyuq payız gecəsində elə Salman Mümtazın özünə daşıtdırıb maşına boşaltdılar. Elə o gedən

getdi, özü də, kitabxanası da... Bunları sevimli xanımı Zeynəb düz 27 il sonra ağlaya-ağlaya Mümtazşünas alimimiz Ədalət Tahirzadəyə danışmışdı. Zeynəb xanım Hacı Cəfərlər soyundan İsa həkimin xalası, Seyid Cavadlar soyundan Abid müəllimin atası dəmirçi Mircavadın xalası qızıdır. Abid müəllimin söylədiyinə görə, Azərbaycan ədəbiyyatının görkəmli nümayəndələri 80-cı illərdə Salman Mümtaz Əsgərovun yubiley ilinə gəlmişdilər. İsa həkim həmin gələn qonaqlara evində layiqli süfrə açmışdır. Salman Mümtazın doğma ailəsilə – Zeynəb və Şəhla xanımlar, oğlu Urxan, akademik Məmmədcəfər Cəfərov, Ədalət Tahirzadə, yerlilərdən Baxşəli Əfəndi Axundov, Tacəddin Xasıyev və başqaları bu kövrək məclisdə iştirak edirdilər. Məmmədcəfər müəllim gənclik xatirələrindən söylədi ki, mən də, Səməd Vurğun da, digər gənc yazarlar da Salman əmi otaqda oturub işləyəndə, qapısı açıq olurdusa dəhlizdən ehtiyatla, qorxa-qorxa keçərdik. Onun biliyi, zəhmi, böyüklüyü qarşısında ehtiramımız həddən artıq idi.

Əli Fəhmi özünün elmi-tədqiqat işləri zamanı Şəkiyə çox gəlib-getmişdi. Xüsusən də tarixin, dilin gözəl bilicisi, hərtərəfli müdrik sima olan Nuhbala Əfəndinin evindən torbalarla kitab, əlyazmalar, digər mənbələr aparıb. Bir çox tərcümələrdə, təhlillərdə elə Nuhbala Əfəndinin özündən kömək alıb.

Əli Fəhmi elə bu zamanlardan Şəkinin böyük dəyərlər xəzinəsi olduğunu görmüş, Salman Mümtazı isə xəzinədar adlandırmışdır.

Əgər ona imkan versəydilər, o dünyada ən qiymətli əlyazmalar, qədim kitablar, cünglər- bəyazlar xəzinəsinin sahibi olardı.

Nəinki imkan verildi, belələrinin məhvindən başqa, ərəb əlifbasına zərbə vurdurub, evində bu əlifbada yazı tapılan adamları yox etdirirdilər. Ona görə də o illərdə nə qədər qiymətli xəzinələr torpaqda basdırıldı, təndirlərdə yandırıldı, suda axıdıldı.



Salman Mümtaz məhz belə illərdə mənəviyyatımıza edilən səlib yürüşünü görüb, bütün varidatını sərf edib, bitli köçlərdə gecələyib, yatalaq xəstəliyinə tutularaq işləyirdi, toplayırdı, çap edib onlara yeni həyat verirdi. Bunu edirdi ki, nəsillər arasında əlaqə qırılmasın. Düşmən də bunu görüb, öz məkrini yeritdi...

**"HACI CƏFƏRLƏR"** (antroponim) – Hacı Cəfərlər ata-babadan sərraclıqla məşğul olan bir nəsil idi. Onun Məşədi Məmməd Qasım və Hüseynbala adlı oğulları da bu sənətin davamçıları olublar. Hüseynbalanın övladları isə tibb təhsilinə meylli olduqları üçün Mina, Rübabə, Südabə, Nazilə, Mülayim, Əli və Fikrət ali təhsil alaraq həkimlik sənətinə yiyələnmişlər. Məşədi Məmməd Qasımın övladlarından İsa həkim, Mənsurə və Zivər isə müəllimə olublar. Hər iki bacı Respublikanın Əməkdar müəllimi adına layiq görülmüşlər.

Müharibə dövründə İsa həkim 42-ci ildə gedib, 7 ildən sonra podpolkovnik rütbəsi ilə qayıdıb. O, şəhərin adlı pinevmoloq həkimi kimi tanınırdı.

Mənsurə müəllimə uzun illər şəhərin müxtəlif məktəblərində dərs demiş, direktor işləmişdir. 1949-1950-ci illərə kimi qız məktəbi olan 5 saylı nümunə məktəbində çalışıb. 50 ilə yaxın pedaqoji stajı olan müəllimə həm də müharibə vaxtı arxa cəbhədə yaralılara kömək etdiyinə görə orden və təltiflərə layiq görülüb. Hər bir hərəkətində, danışığında ölçü-biçini gözləyən, müəllimə ixtiyar yaşındadır. Ona sağlıq diləyirik.

**"QAZIZADƏLƏR"** (patronim) – hər məhəllənin haqqında yazdıqca, qədim nəsilləri araşdırdıqca fəxr, qürur hissi bizə yaxın olur.

Belə soylardan biri də Qazıyevlərdir. Biz onlardan ən yaşlısı və tanınmışı olan mərhum Əli müəllim Qazıyevlə şəxsən tanış idik. Qurcanaçayın sol sahilində, dağ məhəllədə yerləşən, iki əsrdən çox yaşı olan əzəmətli ata-baba evinin qonağı olmuşuq. Qazıyevlərin axarlı-baxarlı həyatinin gündoğar isti-

qamətindəki bala qapıdan maraqla girib, günbatar tərəfdəki iri darvazadan böyük məmnunluqla çıxmışıq.

Güllü, çiçəkli, meyvəli, zəfəranlı, hətta 2 ədəd iri şabalıd ağaclı gözəl həyətdə yerləşən iki mərtəbəli ev ənənə və Şəki memarlıq üslubunun bütün cəhətlərini özündə birləşdirmişdir. Onun çöl və interyeri, hətta nənə Fatma xanımdan qalma baməzə qaydaları bizi heyran etmişdi. Bax elə onda mərhum Əli müəllim çardağa doğru uzanan səliqəli, şirəli pilləkənləri göstərib demişdir ki, rəhmətlik Salman Mümtaz bu evə tez- tez gələrdi. "Xoş gəldin"ə, "sağ olun"a bu pillələrdən çıxa-çıxa cavab verərdi. Deyərdik ay Salman, bir evə gəl, çay iç, çörək ye, görək evdə-eşikdə nə var, nə yox? Ruhu millətindən, torpağından şad olmuş deyərdi ki, çardaqdan düşəndə doyub düşəsiyəm. Doğrudan da, düşəndə görərdin ki, qucağı dolu kitablar, əlyazmalar üzündə fərəhlə düşür...

Əli müəllim Qazıyevlərdən Məmməd bəyin oğludur. Məmməd bəy dövrünün mütərəqqi fikirli adamlarından idi. O, Alcanbəylər soyundan Soltan Məmməd bəyin qızı Fatma xanımla evlənmişdi. O, Fatma xanımı ki, ər evindən atası evinə qonaq gedəndə (yaxın olduğu üçün bəzən qulluqçuları ilə piyada, faytonsuz gedərdi) - Qala qabağı meydanını keçəndə onun gözəl, zəngin və zövqlü geyiminin, gözəlliyinin, durna yerişinin tamaşasına qız-gəlinlər maraqla yığışardılar. Fatma xanımın nur yağan, gülümsər çöhrəsindən sanki hərə özünə düşən payı götürüb sonra dağılışardı.

Fatma xanımın bu məhəlləyə nişanlandığı vaxt qonşuluqda yaşayan dayısı tacir Əbdülsalam ağa (Avdısalam) bacıqızının düşəcəyi evin genişlənib daha zəngin və böyük tikilməsində ustakar işlərinə özü göz qoymuşdur. Əbdülsalam ağanın mülkü dədə-baba kərpic karxanasına (Hacı Abbasın idi bu karxana, sonradan Sovet hökuməti milliləşdirdi, kərpic zavodu tikdi) qalxan yolun sol tərəfində təqribən bir kvartal sahəni tuturdu. Tin başında onun tikdiyi yığcam məscid və yanında hamamı vardı. İndi onların heç birindən əsər-əlamət qalmamışdır. Ancaq vaxtilə məscidin həyətində əkdirdiyi Xan çinarı əzəmətlə durur. Çinar indiki aptekin arxasındadır.Əbdülsalam ağanın övladı olmayıb. Əhatəli, zəngin evində hər gün 7 çeşiddə, 7 qazanda yemək bişərdi. Yeyilən yeyilərdi, qalanı da məhəllənin 7 imkansızın evlərinə göndərilərdi. Pul və qızıl yığmazdı, onları yığanlara da gülərdi. Yığdığı yüksək karatlı, çeşidli daş-qaşlar olardı. Özü hər yeri, Rusiyanı da gəzib, maraqlı həyat sürərdi. Deyilənlərə görə, onun böyük tövləsi, çoxlu atları da olub. Zaman dəyişilib, mülklər dağılıb, milliləşib, imkanlılar pərən-pərən olan zamanda Əbdülsalam ağanın da iri yurd-yuvası dağılmışdı. İndi həmin sahədə çoxlu yığcam evlər tikilib.

Haqqında danışdığımız Məmməd bəyin və Fatma xanımın Abdulla, Əli və Ənvər adlı oğulları vardı. Ziyalı müəllim Abdulla bəy 2-ci Dünya müharibəsində həlak olub. Onun xanımı isə yenə də Alcanbəylər soyundan olan, İsmayıl bəyin qızı Qönçə xanım idi. O, tanınmış fizioterapevt-pnevmoloq, tibb elm.dok., prof., Türkmənistanın əməkdar tibb işçisi Fuad Mustafa oğlu İsmayılovun bibisi olub. Respublikanın Əməkdar həkimi kimi, tibb elm.nam. xanım Qazıyeva uzun illər Bakıda Azərbaycan Dəmiryolunun 1 saylı xəstəxanasında işləmişdir. Qönçə xanım Şərq təbabətində ən qədim müalicə üsullarından biri sayılan iynəbatırma metodunun Azərbaycanda ilk tətbiq edənlərindən biri kimi tanınıb. Onun professor N.Mollazadənin və Z.Salayevanın rəyilə çap olunan "İynəbatırma ilə müalicə" (Bakı, Az. Döv. nəş., 1985) kitabı Azərbaycanda bu sahə üzrə doğma dildə ilk çap olunan elmi əsərlərdən biridir. Elə bu qədim üsulla müalicə metodu Azərbaycanda 1961-ci ildən işlədiyi 1 saylı Dəmiryol xəstəxanasında, sonra 1977-ci ildən isə 3 saylı şəhər poliklinikasında həyata keçirilməyə başlamışdır. Qönçə xanım uzun illər işlədiyi xəstəxanadakı iş təcrübəsindən müəyyən etmişdir ki, dəmiryol nəqliyyatı, metro tikintisi və metropoliten işçiləri arasında müəyyən yeri allergik xəstəliklər, xüsusilə bronxial astma, hipertoniya xəstəliyi, periferik sinir sisteminin zədələnmələri, xüsusilə bel-oma radikuliti forması

şəklində damar xəstəlikləri daha çox yer tutur. Q.Qazıyeva çox sayda vətən övladlarını məhz 3000 ildən çox yaşı olan qədim müalicə üsulu ilə sağaldıb, fəal həyata qaytarmışdır.

Qönçə xanımın həyatı ilə bağlı məlumata bir faktı da əlavə etməyi özümüzə borc bilirik. Doğmalarının repressiya, mülk və avadanlıqlarının müsadirə olunduğu vaxtlarda belə ailələrə dayaq duranlar çox az tapılırdı. Məhz belə bir dövrdə özü də repressiya təhlükəsi altında olmasına baxmayaraq, Şəkinin Dəmirçilər soyundan dəmirçi Əsgərin oğlu Saleh Əsgərzadə dayaq durdu.

Saleh Əsgərzadə həmin dövrlərdə Universitet və Sənaye İnstitutunda ali riyaziyyat fənnini ilk tədris edənlərdən, onun proqram və dərsliklərinin yaradıcılarından biri idi.

Saleh müəllim çəkinmədən çoxlarına etdiyi himayədarlığı Qönçə xanımdan da əsirgəmədi. Onun marağını tibb təhsili istiqamətinə yönəldib öz əllərilə həmin İnstituta aparmışdır. Bu adlı pedoqoqun vəfatından sonra həm müəllimə, həm şərqşünas olan xanımı Həmidə Əli qızı Qönçə xanıma olan himayədarlığı, qayğını davam etdirmiş, daim isti münasibətdə olmuşlar. Qönçə xanım yeri düşdükcə bu yaxşılıq haqqında hiss və həyacanla danışardı.

Bu faktı bizə söyləyən mərhum Saleh müəllimin qızı sənətşünaslıq elmləri namizədi Nərgiz Əsgərzadə atasının bu yaxşılığının itmədiyinin canlı şahidi olmuşdur. Xoş bir təsadüf nəticəsində, göydə Tanrının, yerdə həkim Qönçə xanımın köməyi sayəsində ölümün pəncəsindən xilas olmuşdur.

Övladlarına gözəl ana, millətinə ləyaqətli həkim oldu Qönçə xanım. Yaşasaydı, bugünkü tibb elminin inkişafını görüb, qəlbi dağa dönərdi. Xüsusən də özünün sevdiyi iynəbatırma ilə müalicə sahəsindəki yüksəliş, Çinli mütəxəssislərlə əməkdaşlıq onu necə də fərəhləndirərdi. Bu onun arzusu idi. Əli Qazıyev Fatma xanım və Məmməd bəyin ortancıl övladıdır. O, ilk təhsilini Şəki darülfünunda almışdır. Mərhumun özünün söylədiyinə görə, həmin vaxtlar elə darülfünun xəttilə



Şəkidə yay kursları da açılmışdı. Bu bir növ təkmilləşdirmə kursuna oxşar üsul idi. Mən özüm də o kursu keçmişdim. Onunla paralel kursda şairlərdən Səməd Vurğun və Osman Sarıvəlli də oxumuşdur.

O dövrün qanunlarına görə, bu təhsili alıb, 3-4 il müəllim işləyəndən sonra maarif inspektorluğu ezamiyyə sənədi verərsə, onda arzusu olan İnstituta qəbula gedə bilər. Ə.Qazıyev də təhsilini İnstitutda davam etdirmək istəyində olsa da, bu qanuna görə işləməyə məcbur olur. Əvvəl Qarayazı bölməsinin Candarkəpənəkli kəndində (qazma evlərdən ibarət), sonra Borçalıda işlədi. Həmin dövrlərdə Əlimirzə Nərimanov (N. Nərimanovun əmisi oğlu, müfəttiş), Mustafa Quliyev və Rəcəb Əfəndiyev Tiflis Maarif Komissarlığı ilə çox çalışsalar da, Əli Qazıyevi bu qaydadan kənarlaşdıra bilmədilər.

Tiflis Pedoqoji Müəllimlər İnstitutunu oxuyandan sonra, O, elə oradaca genetika üzrə aspiranturada oxudu. Həmin vaxtlar isə 37-38-ci illərin ən dəhşətli zamanı idi. Belə çətin zamanda Ə.Qazıyevin bilgi vəsaiti kimi istifadə etdiyi Müllerin "Genetikası", Qartmanın "Ümumi biologiyası" silsilə əsərləri qadağan edilmişdir. Müller əvvəl Rusiyada çalışıb. İnqilabdan sonra Amerikada yaşamış, sovet ideologiyasına uyar gəlməyən məqalələr yazdığına görə əsərlərinə qadağa qoyulmuşdur.

Qartmanın əsərlərinin giriş hissəsində yenə sovet ideologiyasına uyğyn olmayan sözlər olduğu üçün qadağan edilmişdir. Ə.Qazıyevin söylədiyinə görə, həmin vaxt professor Şiriya (Beriyanın sağ əli) bilmişdir ki, məni Mərkəzi Komitəyə çağırıb o kitabları təhvil verməyi tələb etmişlər, mən isə verməmişəm. Şiriya səbəbini qəzəblə məndən soruşmuş, mən isə ondan bu sualı gözlədiyim üçün qabaqcadan cavab hazırlamışdım. Ağlıma gələn bu aldadıcı cavabı ona dedim. Bəs, vaxt gələcək onların bizim ideologiyamıza uyğun gəlməyən fikirlərini sübut edib, cavabların vermək üçün bu kitablar bizə lazım olasıdır. Hamısını məhv etmək olmaz ki? Uydurduğum bu cavab Şiriya-

nın ağlına batıb, xoşuna da gəldi. Mən isə zəhlətökən bu tələbdən canımı qurtardım.

Bu ailənin Ənvər Qazıyev adlı ortancıl övladı həm simaca çox yaraşıqlı, cəlbedici, həm də xasiyyətcə xoşrəftar adam olub. Fatmaxanım bu övladını çox sevərdi.

Ə.Qazıyev Bakı Dövlət Universitetinin filologiya fakültəsinin jurnalistika şöbəsini bitirib. Təhsilini bitirdikdən sonra 1936-cı ildə hərbi qulluqda olub. 39-cu ildə Rusiya-Finlandiya müharibəsinin iştirakçısı olub. Sonra da 41-ci ilin II Dünya müharibəsində döyüşüb. Əsir düşüb. Onun peşəsi və qabiliyyəti Avropada çalışan, əsirlər arasında öz həmsoylarını arayıb-axtaran türk millətli ziyalıların diqqətini cəlb edib.

Onun Münxen radiostansiyasında (Azadlıq) çalışmağına şərait yaradıblar. Ə.Qazıyev öz istəyilə bir müddətdən sonra Türkiyəyə keçib gəldiyi dövlətin vətəndaşlıq sənədini, almağa bir gün qalmış, onu izləyən sovet DTK-nin agentləri tərəfindən tutulub, bir gecənin içində Bakıya çatdırılıb, güllələnmişdir. Qardaşı Əli Qazıyevin söylədiyinə görə, tanınmış aktrisamız Məhluqə Sadıqova Ənvərlə birgə oxumuşdur. Mən Bakıya gedəndə həmişə onunla görüşər, Ənvər haqqında danışdığı xoş xatirələri dinləyər, müəyyən sorğu-suallarına cavab verərdim.

**"HACI MİR ALI BABANIN NƏSLİ"** və ya **"HACI SEYİD SALAMLAR"** (patronim) – Gəncəli məhəlləsində bu soyun özünəməxsus ad-sanı, hörməti var. Ulu baba Hacı Mir Alı kəramətli, nüfuzlu bir din xadimi olub. Onun məhəllənin Güldəstə qəbiristanlığında olan qəbri sakinlər tərəfindən bir ziyarət kimi tanınır. Məsciddə isə şəkli saxlanılır.

Hacı Mir Alı baba camaatı Həccə aparan zəvvar olub. Otuz beş dəfə gedib. Otuz altıncı gedişin gəlişi zamanı doğma yurda çatana yaxın Türyançaydan keçərkən çoxalan su axını atla bərabər onu aparıb. O, apardığı zəvvarları belə ağır məqamlarda heç qabağa buraxmazdı. Həmin gün zəvvarların etirazına baxmayaraq gur suya girib ki, hər halda keçmək olar. Lakin atın qulağına su dolub, iti axara düşüb həlak olublar.



Zəvvarlar çay qırağı aşağı kəndlərin adamlarına hadisə barədə tez xəbər veriblər. Paltarı və əmmaməsi kollara ilişdiyi üçün camat onun cəsədini tapıb gətirmişlər. Onun dəfnindən sonra vərəsələr on beş gün ehsan vermişlər. H.Mir Alı babanın yaşadığı mülkdə indi də varisləri yaşayır.1800-cü illərdə tikilən çox gözəl taxta oymalar, kərpic naxışlarla tikilən bu ənənəvi bina göz oxşayır. Bu mülkdə Hacı Mir Alı babanın ikinci arvadı Şərəbanıdan olan Seyid Əhməd adlı oğlu yaşayır. Seyid Əhmədin Əfruz adlı xanımı Tiflisin müsəlman bəylərindən birinin övladı olub. Seyid Əhmədin övladlarından biri çovuş olduğu üçün onlara hazırda çovuşlar da deyirlər. Hacı Mir Alı babanın vəfat edən birinci xanımından dörd qızı və Hacı Seyid Salam adlı bir oğlu olub.

Hacı Seyid Salam təhsilini İstanbulda almışdır. O da atası kimi, zamanının tanınan, sayımlı-seçimli, bilgisi dillərdə təriflənən din xadimi olub. Atası özünün qardaşı qızı Xanımı Hacı Seyid Salamla evləndirib. Bu izdivacdan onların on bir evladı olsa da, onlardan dörd qız və bir oğlan qalıb. Qalanları isə körpə ikən vəfat edib.

Hacı Seyid Salam Sovet hökumətinin ilkinliklərində, tut-hatut vaxtında vəfat edib. O, Axund Fərəcullah Pişiamazzadə kimi mötəbər bir şəxsin də tutulduğunu görüb bərk sarsıntı keçirir və xəstələnir. Tezliklə də 1920-ci ildə vəfat edir.

İndi Hacı Seyid Salamın nəvə-nəticələri yaşayan yığcam, lakin çox cəlbedici, ikimərtəbəli, yerli materiallardan inşa edilən binanın tikilisinə 1919-cu ilin axırlarında 1920-ci ilin əvvəllərində başlanmışdır. Onun iç tamamlanma işlərini isə uzun illər varislər başa çatdırmışlar.

Onu da qeyd edək ki, Hacı Seyid Salam şəhərimizin tanınmış müəllimi Salman Salamovun və Azərbaycanın şərqşünas alimi Vasim Məmmədəliyevin ana babasıdır.

**"HACI QAFARLAR"** (patronim) – ulu kökü Şirvan elindən gəlmələrdən olan bir soydur. Məhəllənin ən hündür, görkəmli yerində iki ədəd, ayrı-ayrılıqda məsafəcə yaxın olan

üçmərtəbəli evləri çox heyranedicidir. Biri 1900-cü, digəri 1910-cu illərdə tikilən bu evlərdə Şəkiyə məxsus xalq memarlığının bütün ünsürlərini görmək mümkündür. 7 qardaşdan ibarət Hacı Qafarlar tacir, sahibkar olublar. Rusiya, İran, Türkiyə, Şimali Qafqaz ilə ticarət əlaqələri olub. Bugünkü varislər onların hamısının adlarını bilmir. Teymur Abbasəli oğlu Həsənovun və bacısı Rəhimə xanımın eşitdiklərinə görə, Tağı adlı qardaşın Türkiyədə zavodu və bankda hesabı olub. Bu qardaşların indiki İnternat məktəbin ayrı-ayrılıqda olan binalarının birində tütün işi ilə də məşğul olduqlarını eşidiblər. Qardaşlardan ikisi bolşeviklər gələndə yaxınlıqdakı Xoçik dağ yaxasında güllələnib. Nağı adlı biri müharibə vaxtı vəfat edib. Onun iki qızı 60-70 yaşlarında xəstələnib vəfat ediblər. Bu mülklərdə bir müddət 1946-cı ildə Cənubi Azərbaycandan gələn 21 Azər inqilabçılarının ailələri oturublar. Sonrada ev bir müddət bağça kimi fəaliyyət göstərib. Hazırda evlərə varis Teymur və övladları yiyəlik edir. Digər əmizadələrdən də varislər var.

Məhəllənin yaşlı sakinlərindən Salman Salamovun eşitdiyinə görə, Çopurların adıyla tanınan mülk də vaxtilə Hacı Qafarların 7 qardaşdan birinə məxsus olub, ondan satın alıblar. Bu mülkün də gözəl ənənəvi görkəmdə çöl qapısı və iç interyeri var. Eyvanının taxta oyma bəzəkləri, sütunları məhv olunduğu üçün şüşəbəndlə əvəz olunub.

**"BOLŞEVİK QULAMGİL"** – bu soyda Qulam Axundovun və qardaşının varisləri yaşayırlar. Onlardan eşidib bildiyimizə görə sovetləşmə dövründə bu qardaşlar çox çətin məqamlarını yaşayıblar. Belə ki, Qulam təzə hökumətin tərəfdarı olduğu halda, Abbas bəy bu quruluşu heç cur qəbul edə bilməyib. Qulam Axundov Şəkidə ilk partiya komitəsi katibi vəzifəsinəcən yüksəlib. Ona məxsus bəzi hökumət sənədləri yerli muzeydə saxlanılır. Fəaliyyəti dövründə o, qardaşı Abbasdan dönə-dönə xahiş edib ki, yeni hökumətin tərəfdarı olsun. Abbas bəy Batumidən ona məktub göndərib ki, o, özü bolşeviklərdən ayrılsın. Lakin bolşevik əqidəsilə möhkəmlənən Qulam təkrar



tələb edib ki, özündə olan varidatı hökumətə ver, təzə quruluşu qəbul et!

Abbas bəy təcrübəli və imkanlı tacir idi. Şimali Qafqazda, Batumidə iri dükanları, böyük mülkü olub. Qardaşlar arasındakı əqidə ayrılığı faciə ilə tamamlanır. Vəziyyəti gərgin görən, doğma qardaşı ilə üz-göz olmaq istəməyən Abbas bəy qəti qərara gəlir. Müəyyən dəyərli saxlancını arvadı Seyidxanıma verib atası evinə yola salır, deyir get, lobyalı aş bişir gəlirəm. Sonra özünü asıb məhv edir.

Qulam Axundov Abbas bəyin oğlu Bəxtiyara qəyyumluq edir. Belə ki, o dövrdə Moskvada N.Krupskayanın şəxsən özünün nəzarətində olan uşaq evində bolşevik partiyasının məsul işçilərinin də övladları böyüyürdü. Bəxtiyar da orada böyüyüb oxuyur. Bir müddətdən sonra Mərdəkandakı uşaq evinə göndərilir. Həmin ərəfədə dayıları onu axtarıb tapıb, əlaqə saxlayırlar. 15 yaşında olan Bəxtiyar özünün xahişi ilə II Dünya müharibəsinə gedir, 1946-cı ildə ordudan orden və medallarla qayıdır. Ata yurdu Şəkidə dülgərliklə məşğul olur. Rusdilli olduğu üçün ona "Rus Bəxtiyar" deyirlər. Bəxtiyar öz anasının nəslindən olan Minaxanım adlı qızla ailə qurur. Atası Abbas bəyin Batumidə Cürgü qızından olan Süleyman (Abulati soyunda) adlı qardaşı ilə görüşüb, onu Şəkidəki ata evinə qonaq gətirir. Süleyman Abbas bəyin Batumidəki mülkündə 80 yaşınadək ömür sürür. Bəxtiyar Axundovun Abbas adlı oğlu və xanımı Şərəbanu müəllimədən eşitdiyimizə görə, Süleyman Abulatinin bir qızı olub, o da Kuba vətəndaşıdır.

Qeyd edək ki, sənəti və istedadı ilə fəxr etdiyimiz el qızı, şöhrətli bəstəkarımız Şəfiqə Axundova Bolşevik Qulamın qızıdır.

**"MİSGƏRLƏR"** (ktematonim) – Gəncəli məhəlləsində yaşayan bu soy elin yaxşı tanıdığı sənətkarlar nəslidir. Babaları Misgər Yusif sovetləşmədən qabaq özünün ata-baba sənətini davam etdirib. O, əlindən çıxan işi zərgər dəqiqliyi və gözəlliyi ilə işləyən, kasıbı nəzərə alan halal bir sənətkar kimi də tanınmışdır. İndi evlərdə saxlanan mis qab-qacaqların içində "Mis-

gər Yusifin əl işidir" - deyib saxlancını əzizləyən ev xanımlarımız çoxdur. Bu soydan olan 65 yaşlı Ələfsər Ələkbər Mustafayevin xanımı Nəfisət deyir ki, onun əlindən çıxan qab-qazanın sayası, bərəkəti, üzağlığı həmişə çox olub.

Misgər Yusifin oğlu misgər Bağır da atası təkin adlı sənətkar olub. Şəkinin Köhnə Bazar deyilən məhəlləsində misgər Bağırın dükanı adla tanınır. Mis qab alan, qalayladan şəkililər həmişə ona və dükan qonşusu, həmsənəti İzzət Muxtar oğlu Allahyarova müraciət edirlər. Sovet dövründə istər yerli, istər respublika qəzetlərinin çoxunda bu sənətkarların şəkli fotoqrafçılar tərəfindən çəkilib əks etdirilmişdir. Şəkiyə aid kitab və bukletlərdə iş zamanı usta Bağırın rəsmi verilib. Dünyasını dəyişən misgər Bağırın oğlu Kamal da indi ata-baba sənətini davam etdirir.

**"QƏNNADI KƏRBƏLAYİ MƏMMƏDBAĞIR – MOLLAOĞLULAR"** (patronim) – bu nəsildən Mollaoğlu Mənəf adıyla tanınan bir el ağsaqqalı var. Həyatın fəlsəfəsini gözəl bilən, inandığı təkcə Tanrının köməkliyi ilə hər cür xətalardan xilas olan yaxşı bəndələrdəndir. Atası Kərbəlayi Məmmədbağır həm qənnadçı, həm də xırda tacir idi. Məhəllədəki dükanında bir tərəfdə özünün şəyirdləri ilə birgə bişirdiyi növbə-növ Şəki şirniyyatını, digər tərəfdə isə parça satardı. Qəlbində və əllərində insaf-mürvət olan tacir idi. Bütün müsəlman bayramlarında məhəllə uşaqlarının şirniyyatı əskik olmazdı. Xəstə, xüsusən də zahı qadınlara bir sini məxtəlif şirniyyat payını arvadı Nərgiz Kərbəlayi Əsgər qızı ilə göndərərdi. Çox zəhmətkeş olan qənnadçı Məmmədbağır biş-düşünün sərin saxlancı üçün lazım olan buzu əldə etməkdən ötrü yaxın tanışı Kişli Gülənbər dayı ilə səhərə yaxın, bəzən də gecə Kiş yaylağından buz gətirməyə gedərdilər. Kürəklərinə kilim atıb, buz torbasını çətinliklə gətirərdilər. Sonralar Şəkidə Dodu, Dabbaqxana məhəllələrində və Aşağı Karvansara əhatəsində buzxanalar yarandığı üçün bu iş xeyli asanlaşdı.



Kərbəlayi Məmmədbağır Quranı, əski əlifbanı gözəl bildiyi üçün yaşlı vaxtında mollalıq etmişdir. Ona görə də sonrakı varislər bu adla tanınmışdır. Kərbəlayi Məmmədbağırın oğlu Mənəf atasından qənnadı sənətini öyrənib, davam etdirmişdir. Atasının dabbaqxana məhəlləsində olan dükanını işlətmişdir. Hazırda 100 yaşın astanasında dayanan Molla oğlu Mənəf Məmmədov hamı tərəfindən yaxşı tanınan el ağsaqqalıdır.

Mənəf babanın yaşadığı ata-baba evi Şəki Qalası və meydanı ilə üzbə-üz Qurcana çayın yaratdığı yarğanın lap kənarındadır. Hərdən həyətdə kətili qoyub Qalaya, dərəyə baxıb dərin düşüncəyə dalır. 1937-ci ildə Qalada təkadamlıq əziyyətini bir müddət görüb. Təsadüfi yaxşılıqla oradan qurtarıb. Dərəyə baxan evinin pəncərəsindən gecə ikən birdən 200-300 dəst dustaq paltarının yarğanda neft tökülüb yandırılmasını, sahiblərinin isə yarı çılpaq güllələnməyə aparılmasını çox görmüşdür. O illər barədə çox xatırlamalarını həmişə dərin bir köks ötürməklə bitirir. Bizə də çox şey danışdı. Yazası olsaq, bu özü böyük kitab idi.

Mənəf baba həm də, ikinci Dünya müharibəsi iştirakçısı olub, çoxlu medalları, ordeni var. Keçdiyi döyüş yolunun xatirələri bircə-bircə yadında qalıb. Hətta o da yadındadır ki, 1944-cü ilin mayında Rumuniyada kilsənin yanında "Verxniy ulisa-Boqdanov 2" ünvanında səhər döyüşündə yaralanıb. 15 gün meşədə qalıb, bir rumun arvadı daxmasında ona kömək edib. Sonra 5283 saylı qospitalda, sonra Moskvadan 38 km məsafədə yerləşən Podolsk şəhər hərbi qospitalında yatıb, sağalıb el-obasına qayıdıb. Müharibə veteranı kimi çox şəhərlərin sanatoriyalarında dincəlib. Mənəf baba cavan vaxtlarında 45 dəqiqə tək ayaqla "Daşbulaği", "Qozağacı" oyun havalarını oynadığından həvəslə danışdı. İndi üç ayaqlı olmuşam deyib hərdən tutub dikəldiyi çəliyini göstərdi.

Dünyamız düzələ, torpaqlarımızın alınmasını görəm, bir də Leylaxan nəvəmin toyunun yiyəsi olam, sonra Allahın məsləhətidir. Nəvəmin də, anasının da başının böyüyü mənəm

axı... Xoş günlər gəlsin, 1983-cü ildə Şəkidə keçirilən Gülüş bayramından bir də olsun. O, bayram elə ürəyimcə olmuşdu ki... Bu Karvansarada xarici qonaqlar mənim şəklimi onda çox çəkmişdilər. Allah qismət eləsin...

**"KƏNDİRLƏR"** (patronim) - məhəllənin bu soyu sadə ailələrdən biridir. Özlərinə də məlum olmayan bu adın daşıyıcılarıdırlar. Ata-babalarımızdan da kəndir toxuma işi ilə məşğul olanını eşitməmişik. Kəndirlərin Məmmədəli, Əli, Adili bu adla tanınıblar.

Əslində isə Kəndirlər yox, Çəndirlər Oğuz tayfasının bir tirəsidir. Qazax rayonunda Qıraq Kəsəmənli kəndində Çəndirli məhəlləsi, Orta Asiyada və Türkiyədə Çəndir kəndi, tayfası mövcuddur (Ə.Əliyev, "Elm və həyat", 1978, № 6).

**"SABUNÇULAR"** (patronim) – bu nəslin də davamçılarının çox mübahisəli izahları var. Ad soyun ulu babası Sabunçu İbrahimxəlilin, oğlu Abbasın adı ilə bağlıdır. Müsavat partiyasının rəhbəri İsa Qənbər ana tərəfdən bu soydandır. Rüstəmovların, Hacı Cəfərlərin onlarla qohumluğu var.

Çox deyənlər oldu ki, Şəki ipək diyarıdır, emalında sabunla bağlı proseslər var. Deməli, sabunçuların olması labüddür. Bu çox uyarlı fikirdir. Lakin bununla yanaşı, Sabınçı (Sabunçu) türk tayfalarının geniş yayılma arealı var. "Saban" qədim türk dilində kotan, əkin, cütçü, əkinçi adlandırılıb. Bu bir türk tayfasının etnik adının yaşantısıdır.

**"ŞİŞPAPAQLAR – ŞİŞPAPAQLARIN QASIMGİL"** (antroponim) – bu soy haqqında ancaq məhəllədən, digər ətraf adamlardan məlumat topladıq. Nəslin özünə aid kimsəni görə bilmədik. Şişpapaqlardan Qasım kişiyə həm də Dadçı Qasım deyərdilər. Özünün məhəllədəki kiçik çayçı dükanında qış uzunu darçınlı, zəncəfilli, kəklikotulu çay verərdi. Bahara yaxın çərşənbələrdə isə səhləb çayına xüsusi fikir verərdi. Özü gedib, adı qalıb, odluqlu mis çaydanlarda dəmlədiyi ətirli səhləbin dadı da damaqlarda qalıb.



Nəslin ad açımına gəldikdə isə peşə, geyim, bədən üzvlərinin rənginə görə də tayfa adları mövcuddur. Geyim əlamətlərinə görə də türk tayfa və tirələri arasında müəyyən fərqlər olub. Herodot öz əsərində türkdilli sakları Şişpapaqlı adlandırmışdır. Keçədən tikilmiş təpəsi şiş papaq növü yalnız qədim türk tayfaları üçün xarakterik baş geyimi olmuşdur. İndi Novruz bayramı şənliklərində Kosanın başına geydiyi şiş papaq dövrün yaşantıda qalan izlərindən biridir. Həmçinin Ağdam rayonunda Şişpapaqlar kəndi də mövcuddur.

**"ALLAHSIZLAR"** (patronim) - İlk baxışdan xof gətirici bir addır. Lakin bu mövcuddur, özü də tarixi-siyasi bir hadisə ilə bağlı yaranıb. Sovetləşmədən sonra bir proses kimi din, məscid, din xadimləri dini ədəbiyyat əleyhinə təbliğatlar aparmaq üçün Allahsızlar cəmiyyəti yaranmışlar. Məhəllədən Mehdi adlı biri bu cəmiyyətin üzvü olduğu üçün həmin adı "qazanıb" varislər üçün "vərəsə" qoymuşdur.

**"ƏSƏDDƏR"** (patronim) **"FAYTONÇU QIZIL MƏMMƏD"**- Milli ənənələri həyat yaşamının hər bir istiqamətində qoruyub saxlayan Əsədlərdir. Əsəd Məmmədli özü papaqçı olub, oğlu Məmməd isə tanınmış peşəkar faytonçu idi. Camaatla səmimi, anlamlı, insaflı rəftarına, xasiyyətinə görə ona "QIZIL MƏMMƏD" deyərdilər. Qızıl Məmmədin qızının da adı Qənddi olub. Atası kimi gözəl xasiyyəti, qənd kimi şirin dili ilə özünə qoyulan ada bir daha "möhür" vurub. Bu soyda bizi bir daha cəlb edən ata-babadan qalma ev içi interyer və avadanlıqların səliqə- səhmanla saxlanmağı oldu. Oğul nəvəsinin xanımı Pedoqoji Texnikumun kitabxanaçısı Təranə müəllimə ənənə sevərliyi, hər qadında olmayan dərin səliqəsilə bizi heyran etdi. Ulu baba usta Əsəddən qalma əsryarımldıq işləməli güzgülərin və üstü cecimli taxtın şəklini minnətdarlıqla çəkdik.

Təranə müəllimə Qızıl Məmmədin 3 atı, 1 faytonu və arabası üçün tikilmiş damı bizə göstərdi. Evin içindən xüsusi qapı yeri qırmızı kərpic döşəməli dalana (dəhliz) açılır. Dalanın baş tərəfində bir əsrdən artıq yaşı olan, arxa küçəyə açılan iri

dəmir bəzəkli taxta qapı var. Dalanın sol divarı tərəfdən bir qapı da at damına açılır. Çox hündür, yuxarıda kiçik pəncərəli, yeri kustar üsulu ilə bişmiş kərpicdəndir. Döşəmənin ortasında müəyyən çökəklik var ki, bu atların pəşov çıxarı üçündür. Həmin çökəklikdən də axarı bayıra olan nazik arx var. Tərano müəllimə indi bu damdan saxlanc yeri kimi istifadə edir. O, faytonun qunut, qantarğa, bəzək hissələri və fayton üstünü yerli ustalardan birinin apardığını söylədi. Nəvəsi Tomris xanım (Tumu xala) Qızıl Məmmədin hər gün müəyyən saatlarda arabası ilə şəhərdən kənarda yerləşən Quru çaydakı sallaqxanadan şəhər dükanlarına ət daşıdığını da söylədi. O, adicə əti təhvil alıb, təhvil verib, zəhmət haqqını götürməklə kifayətlənməzdi. İşinə özünəməxsus məsuliyyətlə yanaşardı. Ət doldurulan kisələri evində gündəlik yudurardı. Şəkililərin ağız dadıyla təzə, tamlı, erkək qoç əti, körpə dana əti yediklərini bilirdi. Ətə baxan kimi təzə ya köhnə, sağlam ya qeyri-sağlam olduğunu təyin edirdi. Qətiyyən keyfiyyətsiz əti arabaya qoyub gətirməzdi. Hər işində dəqiqliyi ilə yanaşı, xeyirxah qəlbi də vardı. O, küçədə rast gəldiyi bir yetim rus uşağını evə gətirib ona qəyyumluq etmişdir. Rus olduğu üçün də adına İvan demişdir. İvan böyüyüb, Odessada ev-eşik, ailə yiyəsi olandan sonra da onu yaşadan bu ailəni unutmamışdır. İndi də İvanın övladları, nəvələri onlarla isti əlaqəni saxlayırlar. Qardaşı oğlu Sabirə də (Laqan Sabir) himayədarlığı Qızıl Məmməd etmişdir. Göründüyü kimi, Qızıl Məmməd ona qoyulan dəyərli adı ömrü boyu doğrultmuşdur.

**"DOQQUZ PARA"** (patronim) – bu ad soy-kökümüzü bilənlər üçün çox aydındır. El arasında elə hey deyirlər ki, bəs körpü ətrafı yol ayrıclarının sayına görə bu ad deyilir. Ancaq "Doqquz para" deyilən hissədə Qala meydanın tən ortasında dayanıb, ana yoldan kənarlara ayrılan istiqamətləri saydıq. Belə ki, Yuxarı başa gedən əsas yol, Gəncəli məhəlləsinin Dərə Hamamı (Məmmədnəbi hamamı) tərəfi, Giləhli məhəlləsinə gedən hissə, bir də Bazarbaşı istiqamətinə olan ayrıcları



gördük. Bu faktlar deyilən 9 istiqaməti, ayrıcı təsdiq etmədi. Doqquz para (Tokuz Oquz) toponiminin olduğunu təxmin edirik. C.Heyət "Türklərin tarix və mədəniyyətinə bir baxış" kitabında (səh.38) yazır: "Bizanslılar da Çinlilər kimi qardaş olan Dokuz Oğurlarla Otuz Oğurların aralarını pozdular. İki qardaş bir-birinə hücum etmiş, Dokuz Oğurlar məğlub olmuş, bir qismi Trakiyada yerləşmişdir".

T.İ.Hacıyev, K.İ.Vəliyev "Azərbaycan dili tarixi" kitabında V.V.Bartoldun təsdiqinə istinadən (səh.27) yazırlar: "Oğuzlar ən qədim türk etnoslarındandır. Başqa türkdilli tayfaların yaranmasında da oğuzlar ulu başlanğıc olmuşlar. İlk əvvəllər oğuzların 9 qrupdan (Tokuz Oquz) ibarət olması söylənilir". F.Rəşidəddin "Oğuznamə" kitabında (səh. 37) oğuzların oxlara bölünməsi haqqında geniş yazmışdır.

**"SAATDI-SAADLI"** (patronim) – bu məhəllə Şəkinin Yuxarı Karvansara, Bazarbaşı məhəllələri əhatəsindədir. Çox da böyük əraziyə malik olmayan məhəllə Saadlı türk tayfalarının adı ilə bağlıdır. Ərazi şəhərin İnternat məktəbinin qızlar üçün yataqxana binasının qurtaracağında olan kiçik bir dalandan başlayır. İndiki İmam Əli məscidi (keçmişdə Pişnamazzadə qardaşları tərəfindən əsası qoyulan) əhatəsindəki ərazidə təxminən 150-170 evdən ibarət məhəlləni qocalar və orta yaşlı sakinlər köhnə adı ilə tanıyırlar. Saatdı məhəlləsinin Sərraclar soyundan olan, 1929-cu il təvəllüdlu Kamal Kərbəlayi Həsən oğlunun atasından eşitdiklərinə görə bu məhəllənin də öz məscidi, hamamı vardı. Məscidi çox yığcam, 2 göz ev miqdarında idi. Kiçik pəncərələri olduğu üçün adına **"Qaranlıq Məscid"** deyərdilər. Yanında **"Şıx hamamı"** (Şeyx) deyilən çox da böyük olmayan isti, təmiz məhəllə hamamı vardı.

Çay məhəllədən Axund Ələsgər buraya namaza gəldiyi üçün qardaşı nəvəsi kiçik Mirzə Fətəli Axundov da ilk dini bilgilərini burada almışdır. İndi məscidin də, hamamın da yeri yarısı şəxsi evlərə, bir hissəsi isə çox da böyük olmayan küçənin payına düşür.

Məhəllədə Karvansara divarlarına yaxın olan böyük mülk var. Çöldən ikimərtəbəli görünür, içəridən isə üçmərtəbəlidir. Birinci mərtəbə zirzəmisi yer altındadır. Kamal dayının atasından eşitdiyinə görə 1911-ci ildə bu bina Bank olub. Bolşeviklər gələndə onların bir hissəsi burada yerləşib. Onlar mülkün həyətindəki meyvə ağaclarını, məhəllədəki hamamın yerə əyilən tirlərini qoparıb, doğrayıb qızınmaq üçün yandırıblar. Vaxtilə zəngin olan Xoçik bağatlığına da bir neçə dəfə balta vurublar. Çox vaxt həmin məhəllənin cavanları onları daşa basıb, ağacları qırmağa qoymayıblar. İkinci Dünya müharibəsi zamanı Xoçikdə əvvəlkindən az qalan meyvə ağacları camaatın aclığına dayaq olub.

Bolşeviklərdən sonra bu mülk idman, peşə, musiqi məktəbləri olub. Yerli memarlıq üslubunun bütün qaydaları əsasında tikilmiş binanın damı çox təhlükəli vəziyyətdədir, baxımsızdır.

**"SƏRRACLAR"** (patronim) – Türkün at belinə qalxdığı zamandan bu qövm indiyəcən Sərraclıq sənətini yaşadır. Doğrudur zaman, texniki inkişaf yəhər, quşqun, qayış, at bəzəkləri kimi sərrac mallarını istehsal və satışını azaltsa da, tamamilə sıradan çıxara bilmədi. Ucqar əyalətlərdə, kəndlərdə sərrac, nalbənd kimi sənətkarlara tələbat var.

Etnotoponimik axtarışlarımız zamanı Şəkidə şəhərin özündə bir neçə sərraclar və nalbəndlər adında soylara rast gəldik. Bunlardan biri də Yüxarı Cümə məscidi aralığında olan Sərraclar nəslidir. Həmin sənətlə məşğul olmuş nəslin üzvlərindən Xəlil Yusif oğlu, Niymət Bəkir oğlu, Ömər və Osman Məmmədovlar uzun illər tanınmış sənətkarlar olmuşlar. Onlardan Xəlil Məmmədovun əl işləri sovet dövründən Moskvada Şərq Xalqları İncəsənəti muzeyində saxlanılır. İndi də həmin nəsildən Nəriman Ömər oğlu Məmmədov bu sənəti yaşadır. Nəriman ustanı şəhərdə, ətraf kəndlərdə, qonşu rayonlarda çox yaxşı tanıyırlar. Sərrac Nəriman əlinin halal zəhmətilə, qədim sənətin sayəsində ailəsini yaşadır.



**"ORTAQLI EŞİK-OTAQ EŞİYİ"** (oykonim) – Azərbaycan orta əsr memarlığının ecazkar sənət incilərindən biri olan Şəki Xan sarayının tikilişindən sonra (1762) Azərbaycanda, xüsusən Şəkidə həmin saraya oxşar ev və malikanələr tikilməyə başlanmışdır.

Sarayın təsirilə bina edilmiş malikanələrdən biri də elə **HACI ÇƏLƏBİ XAN** nəslinin özünəməxsus malikanəsi olmuşdur. Sonralar bu ev "Şəkixanovların evi" adıyla tanınmışdır. Şəki xanlarından Fətəli xanın oğlu Kərim Ağa Fatehin sağlığında çar hökuməti Cəfərqulu xan Xoylunu (1803-1806-cı illərdən Cənubi Azərbaycanda Xoy şəhərinin xanı, "Dünbülü Batman Qılınc" soyundan) Şəkidə hakimiyyət başına qoyduğu vaxt Şəkixanov famili onlara deyilmişdir.

Şəki xanlarının evi Xan sarayından bir məhəllə qabaqda (Bazarbaşı məhəlləsindən sonra) Məhəmməd Həsən xan Müştaqın tikdirdiyi birinci Cümə məscidinə – Xan Məscidinə və karvansaralara yaxın ərazidə bina olunmuşdur. Qeyd edək ki, həmin zamanlarda mövcud karvansaralar beşlik təşkil edirdi. Dövrün həm təbii, həm də iqtisadi-siyasi olayları bu karvansaraların üçünü sıradan çıxarmışdır. Hazırda Yuxarı və Aşağı Karvansaralar zamanın keşməkeşlərinə sinə gələrək qocaman ömürlərini yaşayırlar.

Şəki Xanlarının malikanəsi hazır olan vaxtlarda xanlığın yaxın, səlahiyyətli adamları, əyalətin tanınmış imkanlıları tədricən həmin malikanənin ətrafında mülklər tikdirib yaşamışlar. Nəticədə **ORTAQLI EŞİK-İÇ EŞİK** – yaranmış, bir növ dövrünün daxili işlər nazirliyi simasında əhəmiyyətli məkan olmuşdur.

Zaman üstə zaman gəldikcə artan tikililərdən sonra da məhəllənin coğrafi görkəmi də bu **ORTAQLI EŞİK** adını təsdiq edir. Yuxarıda izah etdiyimiz məna dəyərindən uzaq olsa da, belə ki, mülklərin əhatəsində qalan boş ümumi həyətyanı sahə indi də ortaqlıdır. Kiçik, səliqəli evlərlə yanaşı, dar giriş-çıxış döngələrin əhatəsində olan ortaqlı həyət müsəlman bay-

ramlarında, xüsusən Bahar bayramında çox yığnaqlı, şənlikli olur, məhəllə sakinləri əvvəlkindən mehriban olurlar. Ortaqlı eşik məhəlləsinin bu özəl adı zaman keçdikcə dildə assimilyasiyaya uğrayaraq Ortaq eşiyi şəklinə düşmüşdür. Şəki xanlarının iki mərtəbəli evinin divarları ornamentli divar rəsmləri, Nizami Gəncəvinin "Xəmsə"sinin qəhrəmanlarının portretləri, gül-çiçək, heyvan və quş təsvirlərilə bəzədilmişdir. 60-cı illərdə burada aparalan uğursuz bərpa işi binanın bir çox özəlliklərini məhv etmişdir. Ortaqlı iç eşiyin başlanğıc hissəsinə yaxın yerdə tikilmiş birinci şəhər Cümə məscidi çox əzəmətlidir. Həyətində 300-dən çox yaşı olan 4 ədəd əzəmətli Xan çinarları var. Xan çinarları Şəkidəki məscidlərin demək olar ki, hamısının həyətində var. Başı buludlardan nəm çəkən bu dədə çinarlar nəhəng görkəminə, onlara olan inama, insanlara göstərdiyi xidmətə görə elə məscidin, islami dəyərlərin özü qədər müqəddəsdir.

Xan məscidinin bədii metal qapısı isə uzaq keçmişdən zəmanəmizədək çox az qalan sənət nümunələrindən biridir.

Ortaqlı eşiyin sayımlı-seçimli, əzəli soylarından biri də **"ƏFƏNDİLƏR"**dir. Bu nəsil əsil ziyalı ailəsi kimi tanınırdı.

Türkiyədə təhsil alan İsmayıl Əfəndinin oğlanları Qazi Hüseyn Əfəndi, Rəşid bəy Əfəndiyev, Abdulla bəy Əfəndiyev və qardaşı Əsədulla Əfəndinin oğlu Rəcəb Əfəndiyev Azərbaycan elmi, maarifi, mədəniyyəti və ictimai fikrinin inkişafında müstəsna xidmətləri olan şəxsiyyətlər idilər. Onların övladları bu yolun davamçıları olmuşlar.

İstanbul təhsili almış Qazi Hüseyn Əfəndi kamil ruhani alim, tarixçi, qazi olub. Azərbaycanda ilk Demokratik Respublika qurulduqdan sonra Şəkidə oğlan gimnaziyasında şəriət dərsi deyib. Gimnaziyanın rektoru Məmməd bəy, prorektoru isə Əbdül Məbud Əfəndi olmuşdur.

Sovet dövründə Qazi Hüseyn Əfəndi Şəkidəki 5 saylı "Ünas" (qız məktəbinin) müdiri vəzifəsində çalışıb. Həmin dövrlərdə o özünün iki cilddə "Zübbətül-Əhkamil-şəriət" kitabını da yazmışdır. Qazi Hüseyn Əfəndidən sonra "Ünas" məktəbinin müdiri dramaturq Sabit Rəhmanın əmisi Ələkbər Mahmudov olmuşdur. Qazi Hüseyn Əfəndinin böyük oğlu Məmmədemin Azərbaycan Demokratik Respublikası vaxtı hökumət tərəfindən dəmiryol mühəndisi ixtisasını almaq üçün Almaniyaya oxumağa göndərilib. Vətənə qayıdandan bir müddət Bakıda işləyib, sonra İrana mühacirət edib. Digər oğlu Şahid isə riyaziyyat müəllimi olub, uzun müddət Zaqatalada işləmişdir. Qızı Siddiqə də Gəncə Kənd Təsərrüfatı İnstitutunu bitirmişdir. Qazi Hüseyn Əfəndinin özündən kiçik qardaşı Rəşid bəy Əfəndizadə isə tanınmış pedaqoq, yazıçı-dramaturq, folklor örnəklərinin toplayıcısı olmuşdur.



Rəşid bəy Əfəndiyev ilk təhsilini şəhər mollaxanasında alsa da, hərtərəfli bilgiyə malik olan atası ruhani İsmayıl Əfəndi oğlunun mollaxanada oxuduğu Quranla kifayətlənməyib gecələr ona əlifba, lüğət, sərfi-nəhvi və məntiq kitablarından dərs verər, Hafizin külliyyatının, Sədinin "Gülüstan" və "Bustan", Füzulinin "Leyli və Məcnun" əsərlərini əzbərlətdirərmiş.

Mütərəqqi fikirli dindar İsmayıl Əfəndi öz övladlarını şəhər rus məktəbində oxutmuşdur. Rəşid bəy Əfəndiyev 1878-ci ildə həmyerlisi, böyük dramaturq M.F.Axundovla Tiflisdə yaxından ünsiyyətdə olur. Böyük ədib onu yaxın gələcəkdə açılacaq Zaqafqaziya müəllimlər seminariyasında müsəlman şöbəsində hökumət hesabına oxumağa düzəldəcəyini vəd edir.

Beləcə 1879-cu ildə Qori seminariyasında müsəlman şöbəsinin müfəttişi olan, böyük, tərəqqipərvər ziyalı A.O.Çernyayevski bir çox qəzalara, eləcə də Nuxaya gəlib şöbəyə tələbələr yığır. O, Rəşid bəylə birlikdə 6 nəfər şagirdi də şəhər rus məktəbindən seçib Qoriyə aparır. Yeri gəlmişkən qeyd edək ki, humanist bəşəri ideyalara malik olan A.O.Çernyayevskinin Azərbaycan xalqına etdiyi xidmətlərinə görə onun ruhu qarşısında baş əyirik. Biz bu ziyalının canayanarlığını "Dəli Kür" filmində çox yaxından cörüb, duyduq. Rəşid bəy Əfəndiyev seminariyanı bitirdikdən sonra 8 il Qutqaşendə işləyib. 1899-cu

ildə Tiflisin Azərbaycan məktəbində ana dili müəllimi və Zaqafqaziya ruhani idarəsinin katibi vəzifəsində işləyir.

Onun Şərq, rus dillərini mükəmməl bilməsi, geniş etnoqrafik və tarixi biliyə malik olması, Zaqafqaziya ruhanilər idarəsində və "Ömər məktəbi"ndə etdiyi tərcümələr Qafqaz maarif dairəsinin başçısı N.X. Lopatinskidə və Şərq xalqlarının tarixi və etnoqrafiyasını öyrənməklə məşğul olan B.M.Rozendə müsbət rəy yaratmışdı.

Həmin illərdə (1896-1899) R.Əfəndiyev Tiflis Aleksandrovski Müəllimlər İnstitutunda qiyabi oxuyur. 1900-cu ildə isə oranı bitirərək Qori Müəllimlər Seminariyasında müəllimliklə yanaşı, 1916-cı ilə qədər seminariyanın müsəlman şöbəsi tələbələrinin pedoqoji təcrübə dərslərinə rəhbərlik edir.

R.Əfəndiyev öz fəaliyyəti haqqında yazılarında demişdir ki, İ.L.Lopatinski mənə assur dilinin lüğətini şərh etmək işində ərəb və fars kəlmələrinin seçilib yazılmasını həvalə etdi. Professor B.M.Rozen Şərq ölkələrinin asari-ətiqəsini mənim vasitəmlə şərh edirdi. İranda və sair Şərq ölkələrində yazılmış tarixi məcmuələri mənim rəfaqətimlə (yaxından köməyimlə) tərcümə edirdi.

Rəşid bəy K.D.Uşinskinin təliminin metodlarını özünün pedaqoji fəaliyyətində rəhbər tuturdu. Uşinski Rusiyada yeni tipli milli xalq məktəbləri yaratmaq üçün ana dilində əlifba və qiraət kitabları yazdığı kimi, Rəşid bəy də Azərbaycan xalq məktəbləri üçün birinci növbədə ana dilində dərs kitabları yaratmağı qarşısında məqsəd qoyur. Eləcə Uşinskinin dərs kitablarına əsaslanaraq "Uşaq bağçası" adlı yeni əlifba kitabını yazır və bu kitabı ailə vəziyyətinin çətin olmasına baxmayaraq, onu həmişə yaxşı başa düşən, varlı ailədən olan xanımı Zeynəbin verdiyi pulla İstanbulda çap etdirir. Sonra ədəbiyyat müntəxəbatı kimi, "Bəsirətül-ətfal- Uşaq gözlüyü" adlı qiraət kitabını 1901-ci ildə Bakıda çap etdirib Azərbaycan məktəblərində yayır, özü də bu kitabla dərs keçir. Onun "Müəllimlər üçün üsuli-cədid üzrə ən əvvəl dərsə süru etmənin qəvaididir" adlı



metodik kitabı Azərbaycan müəllimlərinə ana dili və rus dili tədrisində xeyli kömək olmuşdur. Rəşid bəy seminariyaların pediqogika dərsləri üçün "Pedaqogikaya dair" mühazirələr məcmuəsini tərtib edərək, Prudonun "Psixologiya" kitabını Azərbaycan dilinə çevirir.

Rəşid bəy 1918-1919-cu illərdə Bakıda seminariyanı təşkil edir və direktoru təyin olunur. İşə həvəslə başlayan ədib hansısa səbəblərdən vəzifədən imtina edir, doğma yurdu Nuxada qız və oğlanlar üçün darülməlumat və darülmüəllimeynin açılışında fəallıq göstərir. Darülmüəllimeynin direktoru olsa da, hər ikisində dərs deyir. Sonralar məhz Rəşid bəyin səyi nəticəsində hər iki təhsil ocağı birləşdirilib indiki Pedoqoji texnikum yaradılır.

Biz Rəşid bəyin fəaliyyət və yaradıcılığının müəyyən bir hissəsini açıqladıq. Bir faktla da fəxr edirik ki, Rəşid bəyin həyat və yaradıcılığından həmyerlimiz, tanınmış alim Əbdürrəhman Məmməd oğlu Abdullayev (trubka Avdırəhman) özünün "Maarif pərvanəsi" (Bakı, Maarif nəş., 1982) kitabında əhatəli yazıb.

Digər həmyerlimiz, ŞREM-in əməkdaşı Ulduz Bəşir qızı Mürşüdova isə 1998-ci ildə "Rəşid bəy Əfəndizadə və folklor" mövzusunda namizədlik dissertasiyasını müdafiə edib, onun folklor sahəsində fəaliyyətini geniş açıqlamışdır. R.Əfəndiyevin övladları da Azərbaycanın ziyalı elitasının öndərlərindəndir. Onun oğlu Məmməd Əfəndiyev təhsilini Tiflisdə və Peterburqda almışdır. O, əvvəl Qori Müəllimlər Seminariyasında müəllim, 1915-ci ildən isə Şəki şəhər gimnaziyasında müəllim, sonra müdir işləmişdir. 1920-ci ildə isə o, N.Nərimanovun təşəbbüsü ilə Bakıya dəvət olunur. O, 1921-ci ildə Pedaqoji İnstitutda fizika-riyaziyyat fakültəsinin dekanı, sonra müdiri təyin olunur. 1941-ci ildən isə ADU-nun tərkibində Fizika-riyaziyyat Elmi-Tədqiqat kafedrası açılır. Həmin yerə artıq Əməkdar elm xadimi və professor olan M. Əfəndiyev rəhbər təyin olunur. O, elmi-pedaqoji fəaliyyətinə görə Lenin

ordeni, 2 dəfə Qırmızı Əmək Bayrağı ordeni və digər medallarla təltifi olunmuşdur. Onun çoxsaylı yetirmələri də adlı-sanlı alimlərimiz kimi tanınmışlar. Rəşid bəyin Nadir adlı oğlu həkim olmuşdur. Qızı Maytəvan isə Nuxa Qız seminariyasının ilk direktoru olub, kiçik qızı Naymə isə ipəkçilik üzrə mühəndis olmuşdur.

Söylənilənlərə görə, Rəşid bəy və Qazi Hüseyn Əfəndi çox mehriban qardaşlar olublar. Onlar ailə qurunca hər ikisi Gəncəli məhəlləsinin kərpic zavodu istiqamətində milli ənənələrə üyğun, yığcam və yaraşıqlı evlər tikdirib, həmin məhəlləyə köçmüşlər. Hər iki ev çox da böyük olmayan bir həyətdə olub, aralarında heç bir hasar olmayıb. Hazırda bu evin sakini olan 1921-ci il təvəllüdlü, Əməkdar müəllim Sərraclar soyundan Hacı Cəfərin nəvəsi Mənsurə Məmməd qızı Cəfərovanın və qardaşlara çox yaxın olan qonşu mərhum ziyalı Əli Qazıyevin evin satılması barədə söhbətləri olub. Belə ki, Qazi Hüseyn Əfəndi övladları sənət qazanıb hərəsi bir tərəfə pərvazlanıb, qarısı da vəfat etdiyindən, ehtiyac da olduğundan özünün evini satır. Rəşid bəy hər vəchlə bu sövdələşməyə mane olmaq istəyib. Rəşid bəy razılaşa bilmirdi ki, doğma ev, həyət kənar adamlarla bölüşdürülsün. Onun gözləri pəncərələri belə bir-birinə yaxın olan evdə doğmaları görməyə adət edib, yuva satılmasına, dağılmasına da həmişə pis baxırdı. Milli folklor örnəklərinin toplayıcısı olan Rəşid bəy həm də ənənələrimizin mühafizəçisi olmuşdur. Qısası, evi alan şəxslər çox ehtiyatla avadanlıqlarını küçə qapısından yox, küçəyə baxan yan pəncərədən yığıblar. Rəşid bəyin evi ilə alınan ev arasında təzə ev sahibləri həyətdə taxta hasar qururlar. Vəziyyətlə heç cür barışa bilməyən Rəşid bəy hər gecə qoyulan hasarı söküb atırdı.

Qazi Hüseyn Əfəndi isə qonşuluqda, yolun gündoğar hissəsində Şamaxılıların evi adıyla tanınan 3 mərtəbəli möhtəşəm bir evin müəyyən hissəsində kirədə yaşayıb. Mələksima adlı yaşına uyğun bir qadınla da izdivac qurub, ömrünü başa vurmuşdur. Onu məhəlləyə yaxın dağ hissədə yerləşən Xoçik qəbiristanlığında müharibənin ağır vaxtlarında dəfn etmişlər. Çox təəssüf ki, ağır illərdə vəfat etmiş kamil şəxsiyyətin qəbrinin nişangahı olmayıb. Qeyd edək ki, Xoçik dağ hissəsinin ətəyində gözəl, zəngin meyvə bağları olub ki, onlardan biri də Qazi Hüseyn Əfəndinin olmuşdur. İndi o bağlardan demək olar ki, əsər-əlamət qalmayıb.

Abdürrəhman Abdullayev R.Əfəndiyevin həyat və yaradıcılığını araşdırarkən böyük pedaqoqun qəbrini Xoçik qəbiristanlığında arayıb axtarmış, onu tapıb səliqəyə salmışdır.

Bu qardaşların üçüncüsü Abdulla bəy Əfəndizadə də çox tanınmış pedaqoq və milli dəyərlərlə zəngin bir siyasətçi olub. O, 1885-ci ildə əvvəlcə Gəncə şəhər sənət məktəbinin kənd təsərrüfatı şöbəsini ipəkçilik və bağçılıq ixtisası üzrə bitirmişdir. Amma kökdən gəlmə müəllimlik sənətinə olan həvəsi onu Tiflis Aleksandrovski Müəllimlər İnstitutuna gətirib çıxarmışdır. 1899-cu ildə təhsilini başa vurandan sonra Bakıda xalqımızın maarifpərvər, qeyrətli oğlu Hacı Zeynalabdin Tağıyevin köməkliyilə fəaliyyət göstərən, azərbaycanlılara məxsus 2-ci dərəcəli, ilk natamam orta təhsil məktəbində yenilikçi bir pedaqoq kimi işə başlayır. Ali tipli təhsil müəssisəsi hesab olunan bu məktəbin fəxri müdiri elə H.Z.Tağıyev, rəsmi müdiri isə Sultan Məcid Qənizadə idi. Abdulla bəy Əfəndizadə ilə birlikdə o dövrün məşhur pedaqoqları Əliskəndər Cəfərzadə, Süleymanbəy Əbdürrəhmanbəyov, Nəsibağa Qiyasbəyov da dərs deyirdilər.

A.Əfəndizadə doğma yurdunu da unutmur. 1906-cı ildə Nuxada Azərbaycan dilində pulsuz pedaqoji kurslar açıb, həmyerlilərinin maariflənməsində böyük rol oynamışdır. O, bu kurslarda pedaqogika, didaktika və metodika fənlərini tədris edib, bir il ərzində 17 ixtisaslı müəllim hazırlamışdı.

Fəaliyyətinin belə gərgin vaxtlarında o, Bakıda Azərbaycan müəllimlərinin birinci qurultayının (1906) komissiyasının müzakirə məsələlərinə görə Krım müəllimlərinin işinə kömək məqsədilə ora göndərilir. Krımdan qayıdandan sonra o,

Fərhad Ağazadə və Süleyman Sanı Axundovla birlikdə tədrisi asanlaşdırmaq üçün ərəb əlifbasının islahını təklif elədi, ana dili və ədəbiyyatın tədrisi və dini dərsliklər yaratmaq barədə təşəbbüslərlə çıxış elədi. Həmin dövrdə onun S.S.Axundovla birgə yazdığı "Əlifba" kitabı vətəndəki, Krımdakı müsəlman balalarına hədsiz sevinc bəxş elədi. Onun İ.A.Krılovdan, M.Y.Lermontovdan etdiyi tərcümələr inqilabdan qabaqkı dövrü mətbuatda kitab halında nəşr olunub. O, Şəki məktəbində onunla birgə dərs demiş, "Molla Nəsrəddin" jurnalının banilərindən biri Ömər Faiq Nemanzadə ilə birgə M.F.Axundovun "Molla İbrahimxəlil kimyagər", "Müsyo Jordan" komediyalarını tamaşaya qoymuşdur. Abdulla bəy qardaşı Rəşid bəy Əfəndizadə kimi Şəki ətrafı kəndlərdən folklor nümunələri toplayıb, rus dilinə tərcümə edərək Tiflisdə nəşr olunan məşhur "Сборник материалов для описания местностей и племён Кавказа" (SMOMPK) məcmuəsinin 1894-cü il sayında çap etdirmişdir.

Abdulla bəy 1918-ci il Azərbaycan Demokratik Respublikası elan olunanda qəlbinin hökmü ilə fərəhilə siyasi hadisələrə qoşulur. O, gizli səsvermə yolu ilə Şəkidən ADR-in parlamentinə üzv seçilmişdir. Abdulla bəy Müsavat partiyasının məramnaməsinə yaxın olan yeni bir fraksiyanın - **"Əhrar"** partiyasının yaradıcısı oldu. "Əhrar" partiyasına daxil olanların əksəriyyəti Kür çayından şimalda yerləşən hissənin və əsasən sünni məzhəbindən olan əhalidən ibarət idi. Bu partiyanın fraksiyası aqrar reformasının layihəsinin hazırlanmasını və Azərbaycan parlamentində qəbul olunmuş bir çox müsbət qərarların həyata keçirilməsini hərtərəfli müdafiə etmişdir.

Abdulla bəy 1920-ci ilin əvvəllərində "Əhrar" partiyasından çıxaraq Azərbaycan parlamentində sol müstəqil tərəf kimi çıxış etmişdir.

Bildiyimiz kimi, Azərbaycan Respublikası hökumətinin qərarı ilə 1919-cu ilin martında latın əlifbasına keçmək haqqında xüsusi komissiya yaradılmışdır. A. Əfəndizadə həmin



ildə latın əlifbası ilə "Son türk əlifbası" kitabını hazırlayıb çap etdirmişdir.

1920-ci il aprelin 27-də baş verən məlum hadisələrdən sonra bu ailənin də çoxları kimi rahatlığı pozulur. Tuthatutlar vaxtı Abdulla bəy imkan olsa da, Türkiyəyə, yaxud başqa ölkələrə mühacirət etmir. Şamaxıda dostu İsgəndər bəyin evində gizlənib bir müddət yaşayır. Ara sakitləşəndən sonra da Şəkiyə gəlib, sonra ailəsilə birgə Bakıya köçür. Azərbaycan Pedaqoji İnstitutunda dərs deyib, Bakı Dövlət Universitetinin yaradılmasında xüsusi fəallıq göstərir. Həmin illərdə o ali məktəb tələbələri üçün "Fənni tərbiyə" adlı kitabını yazıb çap etdirir. Kitab bu sahədə Azərbaycanda ilk addım idi. Əsərdə tərbiyənin insan həyatında böyük rolu işıqlandırılmışdır.

Abdulla bəyin uşaqlar üçün də çoxlu şerləri, səhnə əsərləri olub. O, elə bir ziyalı idi ki, bütün dövri mətbuat evində çeşidilə olardı. Bakıda ziyalılar bir-birinin evinə qonaq gedəndə "nə var, nə yox?" sualına belə cavab verərdilər: - "Nə bilim, Abdulla bəygilə getməmişəm deyə heç nə bilmirəm".

Abdulla bəyin xanımı Alagöz elə məhəllənin özündən Əbülfət ağa, Məmməd ağa və Cəfər ağanın bacısıdır. Yeri gəlmişkən qeyd edək ki, Kərim Ağa Fatehin Bikəxanım, Cəlimxan adlı nəticələri – biri Bakıda, digəri Moskvada yaşayıblar. Hacı Çələbi xanın nəticəsi Suriyada Dəməşq şəhərində yaşayan Əlfət Ömər Bəşir xanımın 1991-ci ildə Şəkiyə qonaq gəldiyindən də məlumatlıyıq. Lakin onların indi hər birinin salamat olub-olmadığını biz bilmirik.

Otaq eşiyindəki Şəki xanlarının mülkündə yaşayan Əbülfət ağanı sovet dövrünün ilkinliklərinə qədər görənlər var. Lakin məlum səbəblərə görə, Şəkidə bir müddət idarəedicilik Cəfərqulu xan Xoylular (Cənubi Azərbaycanın Dünbülü-Batman Qılınc soyundan olan nəsildir. Dünbülü tayfa adıdır. Batman Qılınc da görünür tayfa başçısının ağır qılıncı ilə bağlıdır) nəslinə həvalə edilir. Odur ki, Hacı Çələbi xan soyunun həmin vaxtdan əhatəli ardıcıllıqla izlənilməsi qeyri-müəyyən olur. Be-

lə ki, zamanında qaçan-qaçmışları, tutulub-tutulmuşları, soyadlarını dəyişənləri, başqa yerlərdə yaşayanları da olmuşdur. Odur ki, bu ardıcıllığı dəqiq tarixə, soyun özünə üyarlı faktlarla bizə təqdim edən hər bir kəsə minnətdar olarıq. Çünki Şəkixanovlar adının arxasında böyük tarix durur.

Yuxarıda qeyd etdiyimiz kimi, Abdulla bəyin xanımı məhəllənin bəyzadə soyundandır. Atası İsmayıl ağa yeganə qızını məhəllədən kənar yerə verməyəm, demişdir. Öz torpaq sahəsindən onun adına pay ayırmış, Abdulla bəy də orada ev tikmişdir. Evi də xanımının adına qeyd etdirmişdir. İlk övladları Ziya Əfəndiyev (Hikmət Ziyanın atası) 1 yaşında olanda (1901-ci ildə) ev hazır olub. Abdulla bəyin oğlu Ziya Əfəndiyev də Qori Məllimlər Seminariyasında oxuyub. Z.Əfəndiyev sonralar APİ-də rus bölməsində riyaziyyatdan dərs deyib. İkinci oğlu Bahadur Əfəndiyev isə rus təhsilli olub, Gəncədə aqronom təhsili alıb. Zaqatalada görkəmli alim İmam Mustafayevlə birgə təcrübə dayaq məntəqəsində işləyib. Şamil adlı oğlu isə 20 yaşında vəfat edib. Nailə xanım adlı qızı isə Qori seminariyasında oxusa da, ərə getdiyi üçün onu tamamlaya bilməyib. Nailə xanım dövrün öndər, fəal qadınlarından olan Gülarə Köylü qızının qardaşı Yusif Qazıyevə ərə gedib. Yusif Qazıyev dövrünün uzaqgörən ziyalılarından olduğu üçün repressiya qurbanı olub. Bakıda yaşayan bu ailənin övladları da - Azad və Xalidə dünyalarını dəyişib, onların övladları yaşayır. Repressiya qurbanı olmuş bibi Köylü qızı Gülarənin də adını Azadın qızı daşıyır.

Abdulla bəyin oğlu Ziya Əfəndiyev özünün yaxşı tanıdığı Şamaxı bəylərindən Həsən bəyin qızı Bəyim xanım Tərlanbəyova ilə ailə qurmuşdur. Bu izdivacdan Hikmət Ziya və Fikrət Əfəndiyev olmuşlar. H.Ziya 1947-ci ildə Bakı Dövlət Universitetinin filologiya fakültəsinin jurnalistika şöbəsini bitirmiş, uzun müddət "Göyərçin", "Azərbaycan pioneri", "Ulduz" jurnallarında çalışıb. 30-a yaxın təmsil, şer, tərcümə kitablarının müəllifidir. Bu məlumatların çatdırılmasında bizə



yaxından kömək edən onun həyat yoldaşı Güllü xanıma, Fikrət Əfəndiyevin həyat yoldaşı Elmira Ağalar qızı Əfəndiyevaya sonsuz təşəkkürümüzü bildiririk. Elmira xanım ərinin soyundan olan Rəşid bəy Əfəndiyevin ev muzeyində çalışır. Əhatəli məlumata malikdir. Güllü xanım isə Bakının Suraxanı kəndinin keçmiş neft maqnatları nəslindən olub. İxtisasca jurnalistdir. 42 il "Azərbaycan qadını" jurnalının nəşrində fəaliyyət göstərib. Övladlarından Vüsal jurnalist, Arzu isə ədəbiyyat müəllliməsidir.

Əfəndizadələr soyundan Əsədüllah Əfəndinin oğlu Rəcəb Əfəndiyev də tanınmış pedaqoq olub. Qori Müəllimlər Seminariyasını bitirən Rəcəb Əfəndiyev 40 ildən artıq müddətdə ibtidai məktəb müəllimi, məktəb direktoru, Xalq Maarifi Komissarlağının inspektoru, Pedaqoji İnstitutun dosenti, kafedra müdiri, direktor müavini, ETİ-nin baş elmi işçisi kimi fəaliyyət göstərmişdir. Özündən sonra zəngin pedaqoji, metodik və bədii irs qoyub getmişdir. R.Əfəndiyev görkəmli rus alimlərinin hazırladıqları irihəcmli "Pedaqogika", "Psixologiya" dərsliklərini yüksək səviyyəli tərcümədə Azərbaycan oxucularının ixtiyarına vermişdir. Dünənimizin və bugünümüzün pedaqoqu olan R.Əfəndiyevin "Seçilmiş əsərləri" kitabı iri həcmdə zəhmətkeş alim M. Qiyasbəylinin tərtibatında oxuculara çatdırılmışdır.

Onun qızı Münəvvər Əfəndiyeva öz soylarının çoxu kimi riyaziyyatçı alimdir. APİ-də dosent vəzifəsində çalışmış, hazırda təqaüddədir.

Ümumiyyətlə, bir çox Şəki ziyalıları kimi, Əfəndiyevlər soyunun da dünənki və bugünkü öndər ziyalılarından "Şəki-alim və ziyalıları" kitabında əhatəli məlumat verilmişdir. Əsas odur ki, bu soy heç bir zaman ziyası sönməyən bir nəsildir.

**"AĞVANLAR"** (patronim) – Otaq eşiyi məhəlləsinin bir hissəsi Ağvanlar adlanır. Camaatın dilində bu məhəllə çox vaxt Əğvanlar, Əfqanlar, Ağbanlar, Albanlar kimi də işlədilir. Ağvanlar patroniminin kök açımı ətrafında mülahizələr çox olsa,

da mənbələrə əsasən tədqiqatçılarımız tərəfindən gözəl açıqlamalar edilib. Ə.Dəmirçizadənin, M.İsmayılovun, A.Axundovun, Q.Qeybullayevin, E.Nuriyevin və b. mütəxəssislərin qədim tarixi mənbələrə əsasən, özlərinin də dediklərinə istinadən qısaca olaraq qeyd edirik.

Ağvanlar adının arxasında qədim və böyük tarix durur. Ağ-var, Al-ban toponiminin camaatın bəzilərinin dilində deyilən Əfqanlar kimi işlədilməsinin əfqan xalqı ilə heç bir tarixi ilişiyi yoxdur! Al-ban, Ağ-van "yüksək, yuxarı, şimal, dağ", van-ban isə "yer, yurd, ölkə" mənasındadır. Deməli, zamanında mövcud olan (VII-VIII əsrə- Ərəblər gələnə qədər) Qafqaz Albaniyası dağ yeri Dağıstan, şimal yuxarı böyük dövlət anlamında olub. Alban ağlıq mənasında da işlənib. Həmçinin qədim türk dillərində "yüksəl, qalx, ucal, yuxarı" mənalarını da bildirir. Alp-alb həmçinin "sərrast atıcı, qəhrəman, pəhləvan, igid, cəsarətli" anlamındadır.

Al-banın "ağlıq" mənası xaqanlığın, xanlığın əlamətlərindən biridir. "Ağban, Altunban" - evlər, çadırlar hakimiyyətin fərqlənmə əlaməti kimi də qəbul olunmuşdur. Şəkidə vaxtilə Ədil xanın Otaq eşiyindəki və Daşüz atçılıq zavodunda yerləşən mülklərinin banında-üstündə həmişə ağ bayraq yellənərmiş. Bunu bizə hazırda şəhərin Dağ dibi məhəlləsində yaşayan 1897-ci il təvəllüdlü Sultan baba danışdı. Biz bu faktı M.Seyidovun "Ağ, qara, göy rənglərin əski inamla bağlılığı" məqaləsində də oxuduq (Xəbərlər bülleteni, 1978, № 2)

Yeri gəlmişkən qeyd edək ki, məhəllənin bu hissəsində Azərbaycanın ən görkəmli komedioqrafı Sabit Rəhman doğulub, yaşamışdır. Dramaturqun ata-baba soyuna el arasında "Daşagirənlər" demişlər. Yaşlıların söylədiyinə görə, adın açımı bununla bağlıdır ki, nəslin ata-babaları gözəl daş mülkü tikdirib başa çıxandan sonra elə daşdan da səliqəli hasar hördürüb, ənənəvi taxta darvazanı (qapını) qoymuşlar. O dövrdə ətraf evlərin çoxu çiy kərpicdən idi. Hətta hasarlar da çiy kərpicdən olub, üstünə iki en ya kirəmid döşənərdi, ya samanla örtülərdi. Bəzi



hasarlar isə qamış və çırpıdan örtülərdi. Məhəllədəki ilk daş hasar bu adın yaranmasına səbəb olub.

**"DƏMİRÇİZADƏLƏR"** (patronim) – Otaq eşiyi məhəlləsinin bu adlı nəsli Azərbaycanın böyük dilçi, filoloq alimi Əzəl Dəmirçizadənin soyudur. Nəslin ulu babası Dəmirçi Rəsul olub. Onun Xoçik dağ qəbiristanlığının yola baxan tərəfində Qurcanaçayın sol sahilində ticarət və sənətkarlar cərgəsində 2 mərtəbəli dükanı vardı. Dəmirçi Rəsulun oğlu Məmməd atasından sənətkarlığı öyrənmişdir. Bu soyun adlı ziyalıları Azərbaycan elminin önündə gedənlər olublar. Ə.Dəmirçizadə fizika-riyyaziyat elmləri namizədi Abuzər Rəsulov, kimyaçı Seylan Rəsulova, 9 kitab müəllifi, ədəbiyyatçı Rövzət Dəmirçizadə, jurnalist Cövdət Məmmədov (hazırda təqaüddədir) xalq tərəfindən yaxşı tanınıblar.

60-cı illərdən başlayaraq Rövzət Dəmirçizadənin şeyrlərini yerli "Nuxa (Şəki) fəhləsi", "İpəkçi" qəzetlərində daim görməyə alışan yerli sakinlər onun isti, səmimi, bir-birindən səmimi poeziyasını həvəslə oxumağa alışmışlar.

Bu soyun tanınmış üzvlərinin hər biri barədə ayrı-ayrılıqda maraqlı, sanballı oçerk yazmaq olar. Sağlıq olsun. Fəxr etdiyi soyu barədə bizə məlumat verən Hikmət Qafar oğlunun danışdığı bir hadisəni isə qeyd etmək istəyirik. Dəmirçi Rəsulun bazarı bir müddət kasad olur. Günlərin birində ləvazimatlarını yığışdırıb yay axşamında yol başlayır. Harada işi gətirsə, qazancı yaxşı çıxsa orada qərar tutacağını fikirləşir. Araba Şəkinin Turud düzünə çatanda Dəmirçi Rəsul göy üzünə muncuq-muncuq səpələnmiş ulduzlara, işıqlı aya baxıb sınıxmış səslə arabaçıdan soruşur: - Bu hansı ulduzlardır, o hansı aydır? Arabaçı ay işığında təəccüblə Dəmirçi Rəsula baxıb deyir? – Usta, elə göydə özünə yer tutan həmişəki ay-ulduzlardı da...

-Elə isə hara getsəm də başım üstə o ay-ulduz olasıdır, çevir arabanı elimə obama tərəf. Qazancı, dolanışığı yetirən Allah burada da yetirər. Yurddan, ailədən ayrı düşmək də bir güzəran deyil. Atalar demişkən, el içi, ev içidir.

**"ZƏRGƏRLƏR"** (patronim) – Əsrlər boyu insan gözəlliyinə xidmət edən, onun məişətinə rövnəq verən zər-zivər sənəti zərgərlik Şəkidə sevilən və sənətkarları çox olan bir sahədir. Odur ki, Şəkidə Zərgərlər adlı nəsillərlə bərabər, Zərgərov (ova) soy adlı adamlar da çoxdur. Onlardan biri də Zərgər Əzizin nəsli və onun sənətkar övladlarıdır. Övladlarından Zərgər Əhməd kök olduğu üçün ona Pota Əhməd də deyirdilər. Zərgər Əhməd Stalinlə eyni ildə və gündə anadan olduğu üçün 1949-cu ildə Şəkidən Moskvaya onun gümüşdən hazırladığı kofe üçün stəkan və nəlbəki dəsti göndərilir. Hədiyyə edilən digər pay isə həkim babanın üstü meyvəli bir ağac limonu olub.

Zərgər Əhmədin övladları Rəsul (Çeşmək Rəsul), Ayaz (həm də rus dili müəllimi olub) və Ənvər zərgərlik sənətini davam etdiriblər. Ənvər eyni zamanda Sənaye İnstitutunu oxumuş, Mikrobiologiya İnstitutunda elektron mikroskoplar laboratoriyasının rəisi olub. O, bu sahənin avadanlıqlarının quraşdırılıb işlədilməsində gözəl mühəndis kimi tanınırdı. Ənvər qohum və qonşuları olan xalq artisti İsmayıl Osmanlının qızı Sona xanımla ailə qurmuşdur.

Zərgər Əhmədin qardaşı Yusif və oğlu Niymət də zərgərliklə məşğul olublar. Hazırda Zərgər Niymətin oğlu Yusif bu sənəti davam etdirir. Zərgər Ənvərin övladları Fuad və Emin də Bakıda tanınmış zərgərlərdir. Zərgər Əhmədin yeznəsi Zərgər Süleyman da bu sənəti qaynı Ənvərdən öyrənmiş, ömrü boyu məşğul olmuşdur. Onun ata-babalarının sənəti isə dabbaqçılıq olmuşdur. Zərgər Süleyman və qardaşı prokuror Cabbar Eldarovlar Zərgər Əhmədin iki qızı ilə ailə qurmuşlar. Hazırda Zərgər Süleymanın oğlu Əli diş texniki, Cabbarın oğlu Adil isə Şəkinin tanınmış zərgərlərindəndir.

Zərgər Süleyman Eldarov 1941-ci ildə müharibəyə gedib. 4 il müharibənin odlu-alovlu illərini keçmiş, cəsur mina atıcı, artilleriyaçı və atıcı hissənin komandiri kimi diviziyada şöhrət qazanmışdır. O, müharibə iştirakçılarının çox az qisminin qazana biləcəyi **ŞÖHRƏT ORDENİNİN 3 DƏRƏCƏSİ** ilə təltif edilmişdir. Süleyman Eldarov Şəki-Zaqatala bölgəsində bu fəxri ada layiq görülmüş yeganə adamdır. Tanınmış rus yazıçısı Konstantin Simonov onun haqqında "Geniş addımlarla" kitabında əhatəli məlumat vermişdir. Həmçinin Süleyman Eldarov onun "Əsgər gedirdi" filmində çəkilmişdir. Kursk, Oryol, Dnepr şəhərləri, Karpat dağlarında, Moskva ətrafında, Çexoslovakiyada gedən döyüşlərin öndəri olan S.Eldarov 1945-ci il iyunun 24-də Qızıl meydanda keçirilmiş Qələbə nümayişində iştirak edərək, bayraqdar kimi öz polklarına məxsus bayrağı aparmışdır. Fəxr etdiyimiz bu həmyerlimizin dövlət tərəfindən yarım büstü yapdırılıb şəhərimizin Dağüstü Xatirə ansamblı muzeyinə verilmişdir. S.Eldarov ömrünü çox sevdiyi zərgərlik sənətinə həsr etmiş, 72 yaşında vəfat etmişdir.

S.Eldarovun qardaşı Cabbar Eldarov isə hüquqşünas idi. C.Eldarov da müharibə veteranı, 2-ci qrup əlil olub. Bir ayağını cəbhədə itirmiş 1-ci dərəcəli Vətən Müharibəsi ordeni, Şərəf nişanı ordeni və medallarla təltif edilmişdir. C.Eldarov 1948-ci ildən 1973-cü ilə qədər Azərbaycanın müxtəlif yerlərində hüquqşünas işləyib, dünyasını 1973-cü ildə dəyişib. Bu qardaşların bacı Xanım müəllimə Şəkidə "Tələsən Qafur" adıyla tanınan, İpək sahəsində ilk ali təhsilli mühəndislərdən olan, Qəhrəmanov Qafurun gəlini olub. Q.Qəhrəmanov 1920-1941-ci illərə qədər 1 saylı, sonra 3 saylı İpək fabriklərinin direktoru idi. Çox məsuliyyətli, namuslu insan olmuşdur. O, ömrün qısalığını dərindən duyduğu üçün tanrı verən müddəti insanlara xeyirxahlıq etmək, yaxşı əməllər yiyəsi olmaq üçün həmişə tələsmiş və ləqəb qazanmışdır. Xanım müəllimə onun oğlu Yusif Qəhrəmanovun həyat yoldaşı olub. Yusif Qəhrəmanov 1941-ci ildə müharibəyə getmiş, cəsur döyüşçü olmuş, orden, meydallarla təltif edilmişdir. Qolundan və qıçından zədə alaraq evə qayıtmışdır. Müharibədən sonra Şəki Pedoqoji Texnikumunu, Gəncə Kənd Təsərrüfatı İnstitutunu bitirmişdir. Bir müddət Şəkidə Kənd Təsərrüfatı Texnikumunun direktoru olmuş, aspiranturanı bitirmişdir. Elmlər doktoru elmi dərəcəsinə-

dək yüksəlmiş, professor vəzifəsini daşımışdır.Kənd təsərrüfatı üzrə bir neçə kitab və elmi məqalələrin müəllifi olmuşdur. 6 övladına ali təhsil vermiş, 2002-ci ildə dünyasını dəyişmişdir.

Zərgərlər soyu barədə bizə danışan Rəmziyyə həkim (C.Eldarovun qızı) və əri mühəndis Rafiq İsmayılov oldular. Hər iki mütəxəssis Şəkidə yaxşı tanınandılar. Rafiq İsmayılov atası Umar həkim Leninqradda baytarlıq ixtisası üzrə ali təhsil alıb. Müharibə iştirakçısı olub, kapitan rutbəli, Qırmızı Ulduz ordenli veteran cəbhədən zədəli qayıdır. Uzun müddət qoltuq ağacı ilə gəzib. Şəkidə baş baytar həkim, kolxoz sədri işləyən Umar İsmayılov həmyerlilərinin yaddaşında işıqlı adam təkin qalıb. O, 7 ali təhsilli övlad böyüdüb. Onun xanımı İpək ustası, 1928-1930-cu illərdə Törə Salamın zavodunda (5 saylı fabrik) qabiliyyət və bilgisilə müdir işləmiş Əhməd Qəhrəmanovun qızı Mülayim müəllimə olmuşdur. Mülayim müəllimə Şəkidə maarif şöbəsində müfəttiş, rayon komitəsində təlimatçı, müəyyən vaxta qədər də baxça müdirəsi işləmişdir.

Onun övladlarından Rafiq İsmayılov Şəkidə elektrikləşdirmə işlərinin tanınmış mütəxəssislərindən olub. O, 1987-1991-ci illərə qədər respublikanın 12 rayon üzrə SSRİ Energetika Nazirliyinin mühəndis müfəttişi vəzifəsidə işləmişdir. Hazırda ikinci dərəcəli əlildir, buna baxmayaraq cavan vaxtlarından öyrənib bildiyi musiqi alətlərinin ustası işi ilə məşğuldur. Özünün dediyi kimi indi mühəndis daşıdığı, usta isə qazandığı addır. Onun evindəki dülgər, taxta-oyma işlərinə baxdıqca, sanki onları həvəskar yox, adlı bir sənətkarın yaratdığını güman edirsən. Qardaşı şəbəkə ustası Soltan İsmayılovu da Şəkidə hamı tanıyır. Qədim sənətin ustakarı olan Soltan həvəsində olan bu işi uşaqlıqdan anasının xalası oğlu, şəbəkəçi, mərhum Əşrəf Rəsulovdan öyrənmişdir.Hazırda Bakıda ŞƏHİDLƏR XİYABANINDA, Türk Xatirə Məscidində, "Təzə bəy" hamamında, Atatürk Mərkəzindəki şəbəkələr onun əsas işləridir.



## ŞƏKİ ŞƏHƏRİNİN ÖZÜNƏMƏXSUS MƏHƏLLƏ, YER ADLARI VƏ NƏSİL LƏQƏBLƏRİ

| | | |
|---|---|---|
| 1. | Yuxarı Baş məhəlləsi | toponim |
| 2. | II Gözətçi bürcü | toponim |
| 3. | Xan yaylağı | antroponimik oykonim |
| 4. | Pişoot bulağı | hidronim |
| 5. | Söyüdlü bulaq | fitohidronim |
| 6. | Soyuq bulaq | hidronim |
| 7. | Ləléli bulaq | hidronim |
| 8. | Qurdlu bulaq | zoohidronim |
| 9. | Arpa dərəsi | fitooronim |
| 10. | Otdağ dərəsi | oronim |
| 11. | Kor dərə | oronim |
| 12. | Urus quyusu | toponim |
| 13. | Lahıcların yurdu | etnooykonim |
| 14. | Hacı Əhməd yurdu | antropooykonim |
| 15. | Ağamməd dayının yurdu | antropooykonim |
| 16. | Hümmət dayının yurdu | antropooykonim |
| 17. | Kirəc quyusu | toponim |
| 18. | Pir təpə (Qəbiristanlıq) | oronim |
| 19. | Su anbarı | hidronim |
| 20. | Köç yolu | dromonim |
| 21. | Güney doqqaz | dromonim |
| 22. | Nar doqqaz | fitodromonim |
| 23. | Məhəllə məscidi | oykoekklezionim |
| 24. | Qobu | oronim |
| 25. | Qızlar bulağı | hidronim |
| 26. | Hacı Qədir məscidi | toponim |
| 27. | Qobu körpüsü | toponim |
| 28. | Səhləb doqqaz | fitodromonim |
| 29. | Qapanxana (yer) | toponim |
| 30. | Dəmirçi bulağı | hidronim |
| 31. | Qala yolu | dromonim |

| | | |
|---|---|---|
| 32. | İmam Əfəndilər məscidi | antropo ekklezionim |
| 33. | Dərə bağça | adooronim |
| 34. | Daş mədən | toponim |
| 35. | Çatqal dərəsi | zoooronim |
| 36. | Qəbiristanlıq | nekronim |
| 37. | I Gözətçi bürcü | toponim |
| 38. | Xan Gülüstanı məhəlləsi | antroponimik toponim |
| 39. | Taclıq bulağı | hidronim |
| 40. | Qaratoyuq bulağı | zoonimik hidronim |
| 41. | Heyvalı dərə | fitonimik oronim |
| 42. | Mustafa bəy bağatlığı | antroponimik toponim |
| 43. | İsitmə bulağı | spesifik hidronim |
| 44. | Giləhli Qəbiristanlığı | antroponimik nekronim |
| 45. | Vəzirxan təpəliyi | antroponimik oronim |
| 46. | Çay məhlə | oykonim |
| 47. | Dəyirmanlıq (yer) | toponim |
| 48. | Bazarbaşı məhəlləsi | oykonim |
| 49. | Qullar məhəlləsi | patronimik oykonim |
| 50. | Mallı qaya | zoonimik oronim |
| 51. | Baydunlu-Bəydili | patronim |
| 52. | Hamam tiki (yer) | toponim |
| 53. | Saatlı-Saadlı məhəlləsi | patronimik oykonim |
| 54. | Pişnamazzadələr məscidi | patronimik ekklezionim |
| 55. | Daşlı bazar | toponim |
| 56. | Karvansara yeri | toponim |
| 57. | Xan məscidi | antroponimik ekklezio-nim |
| 58. | Dolçalar | patronim |
| 59. | Daş pilləkən | toponim |
| 60. | Qədiroğlu tiki | antroponimik toponim |
| 61. | Məmmədnəbi hamamı | antroponimik toponim |
| 62. | Gəncəli məhəlləsi | miqrasiyon oykonim |
| 63. | Güldəstə piri | antroponimik aqionim |
| 64. | Sona qəbiristanlığı | antroponimik nekronim |
| 65. | Su dərəsi | hidronimik oronim |
| 66. | Kirəcxana (yer) | toponim |
| 67. | Zəyzid yolu | oykonimik dromonim |
| 68. | Xoçih | oronekronim |
| 69. | Dərə hamamı yeri | orotoponim |
| 70. | Buzxana (yer) | orotoponim |
| 71. | Karvansaralar (yer) | orotoponim |
| 72. | Ortaqlı eşik məhəlləsi (Otaq eşiyi) | orooykonim |
| 73. | Qoç Abbas hamamı | antroponimik toponim |
| 74. | Şəki xanlarının evi | toponim |
| 75. | Ağvanlar-Albanlar | etnonim |
| 76. | Şəmmədlər | patronim |
| 77. | Yetərlər | patronim |
| 78. | Ağabəylər | patronim |
| 79. | Rəhimovlar | patronim |
| 80. | Yühlar | patronim |
| 81. | Qiyalar | patronim |
| 82. | Xillosilər | patronim |
| 83. | Cərrolar | patronim |
| 84. | Qasımovlar | patronim |
| 85. | Ətəyi daşlılar | patronim |
| 86. | Qur-qurlar | patronim |
| 87. | Qəssab Qədirlər | antroponim |
| 88. | Hacı Mahmud Əfəndilər | patronim |
| 89. | Peyğəmbər Cəlilgil | antroponim |
| 90. | Pəhləvan Məhərrəmlər | patronim |
| 91. | Hacı Şıxəlibəyovlar | patronim |
| 92. | Atayevlər | patronim |
| 93. | Loğman Durna | antroponim |
| 94. | Yezid oğlu Yusif | arxaik antroponim |
| 95. | Burux Vəsilə | patronim |
| 96. | Tikanlı Paşa | patronim |
| 97. | Meşəbəyi Rəhim | patronim |

| | | |
|---|---|---|
| 98. | Saqqal oğlu Kərim | antroponim |
| 99. | Xəlifəzadələr | patronim |
| 100. | Xalisəqarızadələr- İmam Əfəndilər | patronim |
| 101. | Əyyubovlar-Çustçular | patronim |
| 102. | Əcəmlər | patronim |
| 103. | Abbaslar | patronim |
| 104. | Əlibəyovlar | patronim |
| 105. | Mustafa Əfəndi soyu | patronim |
| 106. | Zərgərlər- Hacıkərimlər | patronim |
| 107. | Hacıyevlər | patronim |
| 108. | Şəbəkəçilər | patronim |
| 109. | Hacı Alpaşalar | patronim |
| 110. | Səmədovlar | patronim |
| 111. | Misgər Cəlilgil | antroponim |
| 112. | Nağıbəyovlar | patronim |
| 113. | Qədimbəyovlar | patronim |
| 114. | Bədəlovlar | patronim |
| 115. | Xəlfələr | patronim |
| 116. | Nadir pəhləvanlar | patronim |
| 117. | Hacı Hüseynbəylər | patronim |
| 118. | Ayaqyalınlar | patronim |
| 119. | Həsənbəylər | patronim |
| 120. | Hacı Məmmədsadıq Əliyev-lər | patronim |
| 121. | Zülfüqarovlar | patronim |
| 122. | Yezidlər | patronim |
| 123. | Kəblə Səttar uşağı | patronim |
| 124. | Baxşəli Əfəndigil | antroponim |
| 125. | Sənəmlər | patronim |
| 126. | Əmbəbələr | patronim |
| 127. | Quruşdar | patronim |
| 128. | Pullu Qulugil | antroponim |
| 129. | Sarıpapaq Kərimuşağı | patronim |



| | | |
|---|---|---|
| 130. | Nəbibəyovlar | patronim |
| 131. | Fərzəlibəyovlar | patronim |
| 132. | Hacı Cəlillər | patronim |
| 133. | Hacı Məmmədlər | patronim |
| 134 | Hacı Süleymanlar | patronim |
| 135. | Petlər | patronim |
| 136. | Cinağalar | patronim |
| 137. | Axundovlar | patronim |
| 138. | Məşədi Baqılar | patronim |
| 139. | Hacı Zeynalabdinlər | patronim |
| 140. | Hacı Qafarlar | patronim |
| 141. | Zülfüqarovlar | patronim |
| 142. | Mollaoğlular – Qənnadı Məmmədbağırgil | patronim |
| 143. | Kəblə Nəbilər | atroponim |
| 144. | Kəblə Məmmədlər | atroponim |
| 145. | Qızıl onluqlar | patronim |
| 146. | Axundlar | patronim |
| 147. | Şamçılar | patronim |
| 148. | Mənçəli-Nəmçəli | etnonim |
| 149. | Seyid Cavadlar | patronim |
| 150. | Müridlər | patronim |
| 151. | Yetim Əsgərlər | patronim |
| 152. | Dadlılar | patronim |
| 153. | Kəndirlər | patronim |
| 154. | Tacir Əsgərlər | antroponim |
| 155. | Kəblə Səmədlər | antroponim |
| 156. | Müəzzinlər | patronim |
| 157. | Allahsızlar | patronim |
| 158. | Bülbülatanlar | zoopatronim |
| 159. | Göygözlər | patronim |
| 160. | Sabunçular | patronim |
| 161. | Misgərlər | patronim |
| 162. | İslanmışlar | patronim |

| | | |
|---|---|---|
| 163. | Qızıl Məmmədlər | antroponim |
| 164. | Güllüklər | patronim |
| 165. | Fars Əsədullahlar | patronim |
| 166. | Çovuşlar | patronim |
| 167. | Əfəndilər | patronim |
| 168. | Hacı Seyid Salamlar | patronim |
| 169. | Hacı Qafarlar | patronim |
| 170. | Çopurlar | patronim |
| 171. | Rüstəmovlar | patronim |
| 172. | Şirvanlılar | patronim |
| 173. | Mövləzadələr | patronim |
| 174. | Qazıyevlər | patronim |
| 175. | Qumçu Əli | patronim |
| 176. | Saadlı | patronim |
| 177. | Doqquz para | patronim |
| 178. | Misgər Yusifgil | antroponim |
| 179. | Bolşevik Qulamgil | antroponim |
| 180. | Hacı Cəfərlər | patronim |
| 181. | Şişpapaqlar | patronim |
| 182. | Sərraclar | patronim |
| 183. | Şəkixanovlar | patronim |
| 185. | Əfəndilər | patronim |
| 186. | Dəmirçizadələr | patronim |
| 187. | Daşagirənlər | patronim |
| 188. | Ağvanlar | patronim |
| 189. | Zərgərlər | patronim |
| 190. | İpək doqqaz | patronim |
| 191. | Qarneylər | patronim |

Yeri gəlmişkən qeyd etmək lazımdır ki, tədqiq olunan ərazilərdə yaşayan əhalinin sayı da bizim üçün və gələcək tədqiqatçılar üçün maraqlı olduğundan biz məhəllələr üzrə sorğu aparmışıq. Məhəllə komitələrindən aldığımız məlumatlara görə, Yuxarı baş və Güləhli məhəllələrində 1595 nəfər,



Gəncəli məhəlləsində 988 nəfər, Qullar Bazarbaşı məhəllələrində 1515 nəfər, Ortaqlı eşik (Otaq eşiyi) – 2100 nəfər, Sarıtorpaqda 1870 nəfər, İpəkdoqqaz, Arx üstü 880 nəfər, iç məhəllədə isə 1050 nəfər rəsmi qeydiyyatda olan əhali yaşayır. Yəqin ki, bu rəqəmlər əsasən 18 yaşından yuxarı, səsvermə hüququ olan vətəndaşlara aiddir.

Aparılan toponimik araşdırmalar nəticəsində müəyyən edilmişdir ki, qoruq zonasına aid ərazinin toponimiyası çoxtəbəqəlidir. Belə ki, burada 101-patronim; 12-antroponim; 16-toponim; 7-hidronim; 1-antroponimik oykonim; 2-atroponim; 5-antroponimik toponim; 3-antroponimik oykonim; 3-orotoponim; 3-dromonim; 4-oronim; 2-oykonim; 2-patronomik oykonim; 1-zoohidronim; 1-fitohidronim; 1 miqrasion oykonim; 1- oykonimik dromonim; 1-adooronim; 1-zooorónim; 1-etnooykonim; 2-fitodromonim; 1-oykoekklizionim; 1-antroekklizionim; 1-patronomik ekklizionim; 1-antroponimik ekklezionim; 2-antroponimik nekronim; 1-nekronim; 1-antroponimik aqionim; 2-etnonim; 1-zoopatronim; 1-fitooronim; 1-antroponimik oronim; 1- hidronimik oronim; 1-oronekronim; 1-orooykonim; 1-arxaik antroponim; 1-zoonimik hidronim; 1-fitonimik oronim; 1-spesifik hidronim müəyyən edilmişdir.

Ərazinin toponimik fonunun əsasını Azərbaycan-Türk təbəqəsi təşkil edir: 98%. Qeydə alınmış toponimlərin bəziləri eramızdan əvvəlki dövrlərə aiddir. Toponimlərə fikir verdikdə Azərbaycan Türklərinin etnogenezində iştirak edən qədim türk tayfalarından olan bir çox adların qorunub saxlanmasının şahidi oluruq.

Təbiət aləmi ərazinin toponimiyasında kifayət qədər öz əksini tapmışdır.

Oroqrafik və hidroqrafik obyekt adları, yerli coğrafi terminlər xalqımızın mənəvi sərvətlərinin bir hissəsi kimi xüsusi əhəmiyyət kəsb edir.

Ərazinin toponimiyası ilə əlaqədar əldə olunan məlumatlar Şəkinin tarixi coğrafiyasının, o cümlədən dil, etnik, si-

yasi və iqtisadi tarixinin, habelə keçmiş və müasir landşaftının öyrənilməsi baxımından gələcək tədqiqatçılar üçün qiymətli faktlarla zəngindir.

Beləliklə, qoruq ərazisinə aid məhəllə adları və ləqəblərlə əlaqəli yuxarıda qeyd olunan məlumatların yekununda qeyd etməliyik ki, qələmə aldıqlarımız heç də ərazini tam dolğun əks etdirmir və yazılanlar bizim imkanımız daxilində olanlardır. Bir çox qapılar bağlı olduğundan bizə məlumat verən olmayıb. Bəzi evlərin sakinləri də qoca, xəstə olduqlarından məlumat almaq mümkün olmayıb.

Biz bir daha hörmətli oxucularımıza xatırlatmalıyıq ki, kitabımızda istər iri məhəllələrdə olan yer, məscid, qəbiristanlıq, dəyirman və s., istərsə də soylara məxsus adların incələnməsində qeyri-dəqiqlik ola bilər, bitkin olmayan fikirlər də yazıla bilər. Bu da ondan irəli gəlir ki, biz görənlərdən çox, xatirə söyləyənlərdən məlumat toplamışıq. Eyni zamanda bu məlumatların toplanması prosesində rastlaşdığımız çətinliklərə baxmayaraq, sevimli həmyerlilərimizin heç birinin xatirinə dəyəsi, öz doğmalarımız qədər əziz olan insanlar arasında ayrı-seçkilik salmadan, yalnız söyləyicilərin dediklərini qeydə almağa, yazmağa çalışmışıq. Çox təəssüflə qeyd etməliyik ki, araşdırmalar apardığımız ərazilərdə adları ilə xalqımızın fəxr edə biləcəyi bir çox alimlər və ziyalılar doğulub, boya-başa çatmışlar ki, biz onlarıfn soyları haqqında məlumat toplaya bilməmişik. Demək olar ki, onlar nəsilliklə köçüb başqa şəhərlərdə məskunlaşmışlar. Ona görə də biz tanıdıqlarımızdan, məşhur akademiklər Cəlil Hüseynov, Cəbrayıl Hüseynov, eləcə də akademiyanın müxbir üzvləri Mahmud İsmayılov və Yaşar Qarayevin soyları haqqında Bakıda yaşayan qohumlarından ətraflı məlumat toplayıb, 2-ci kitabda yazmağı planlaşdırırıq. Bu kitabımızda isə diqqətinizi çəkə biləcək kiçik bir qüsur üçün də Sizlərdən üzr istəyirik. Çalışacağıq ki, eyni adlı kitabın ikinci cildinə birinci kitaba düşməyən yer adlarını, sayımlı-seçimli soylara, ziyalılara, sənətkarlara məxsus məlumatları



əlavə edək. Bu iş yenə də Sizlərin köməkliyilə olacaq. Çünki biz unudulmaqda olan tarixi dəyərlərimizi yeni nəslə çatdırmaq məqsədilə çalışan təəssübkeşlərdənik.

Ona görə də istər Şəkidə, istər Bakıda, istərsə də xaricdə yaşayan soydaşlarımıza həm kitabımızla, həm də tele-radio, internet vasitəsilə müraciət edirik. İşimizi dəyərləndirən, maraqlanan hər bir həmyerlimizə bu yönümdə bizə köməkçi olmağı xahiş edirik. Özlərindən və başqalarından eşidib bildikləri, fəxr etməli dəyərli məlumatları bizdən əsirgəməsinlər. Əminik ki, xahişimizə müsbət cavab alacağıq. Çünki bu məlumatlar toplusu təkcə bu gün üçün aktual deyil, sabahkı nəslin öyrənib biləcəyi tarix, etnoqrafiya, yaşayacağı siyasi dövr haqqında biliklərini genişləndirən əyani vəsait olacaq.

# ƏDƏBİYYAT


1. *Abdullayev B.* Haqqın səsi. Bakı, Azərnəşr, 1989.
2. *Adilov M., Paşayev A.* Azərbaycan onomastikası. Azərbaycan Universiteti Nəşriyyatı, 1987.
3. *Axundov Ağamusa.* Torpağın köksündə tarixin izləri. Bakı, Gənclik, 1983.
4. Akademik Bəkir Nəbiyev haqqında soraq kitabçası. Azərb. Ensiklop. NPB., Bakı, 1999.
5. *Aleksandr Düma.* Qafqaz səfəri. Bakı, Yazıçı, 1985; *Axundov Ağamusa.* Torpağın köksündə tarixin izləri. Bakı, Gənclik, 1983.
6. *Алиев Кемал* – Топонимика и етнонимика об етногенезе на территории Азербайджанской ССР. Материалы докладов II научной конференции, посвященной изучению топонимии Азерб.ССР., Баку, Елм, 1981, с. 31-33.
7. *Ашурбейли Сара.* Государство Ширваншахов (VI-XVI вв). Баку, Елм, 1983, с.344.
8. *Aydın Əhmədov.* Şəkidən başlandı uzaq səfərlər. Bakı, 1997.
9. Azərbaycan etnoqrafiyası. Bakı, Elm, 1958, I cild.
10. Azərbaycan tarixi. Dərslik. Bakı: Azərnəşr. 1994.
11. Azərbaycan toponimləri. Ensiklopedik lüğət. Azərbaycan ensiklopediyası nəşriyyat-poliqrafiya birliyi. Bakı, 1999.
12. *Bahəddin Ögəl.* "Böyük Hun imperiyası", I kitab. Bakı, Gənclik, 1992.
13. *Bartold B.B.* Müsəlman dünyası tarixində Xəzəryanı bölgələrin yeri. Bakı, Elm, 1999.
14. *Бретаницки Л. Датиев С., Мамиконов Л., Мамиконов Д. Мотис.* Нуха. Москва, 1948 (Академия Архитектуры СССР).
15. *Budaqov B.Ə.* "Azərbaycan toponimiyasının öyrənilməsi və vəzifələri haqqında". Azərbaycan toponimiyasının öyrənilməsinə həsr edilmiş elmi konfransın materialları. Bakı. Elm, 1973, s. 5-6.
16. *Budaqov B.Ə.* "Azərbaycan coğrafi terminlərinin bəzi məsələlərinə dair". Azərb. SSR EA Xəbərləri. Geologiya, coğrafiya elmləri seriyası, 1959, № I, s. 149-153.
17. Бунядов З.М. Новые данные о нахождении Крепости Шаки. ДАН Азерб.ССР, т. XV, 1959, № 9, с.869-872.
18. *Bünyadov Z.M.* "Azərbaycan Atabəylər dövləti". Bakı, Elm, 1983.
19. *Bünyadov T.* Mərd qalalar, sərt qalalar. Bakı, Azərnəşr, 1986.
20. *Cavad Heyət.* "Azərbaycan şifahi xalq ədəbiyyatı". Bakı, Azərnəşr, 1990.
21. *Cavad Heyət.* Türklərin tarix və mədəniyyətinə bir baxış. Bakı, Azərnəşr, 1993.





22. *Cavadov Q., Hüseynov R.* Udilər. Bakı, Elm, 1999.
23. *Çıraqzadə V.A.* Qədim ipəkçilik diyarı. Bakı, Azərnəşr, 1988.
24. *Dəmirçizadə Ə.* Azərbaycan ədəbi dilinin tarixi. I hissə, Maarif, 1979.
25. *Dəmirçizadə Ə.* 50 söz. Bakı, Gənclik, 1968.
26. *Дяконов И.М.* История Мидии, От древнейщих времен до конца IV века до н.е. М.Л. 1956.
27. Elm və həyat jurnalı. N.Saleh. "Şəkidə məhəllə adları". 2001, № 1-2.
28. *Əhmədov A.* Şəkidən başlayan uzaq səfərlər. Bakı, Gənclik. 1997.
29. *Əhmədov T.* Azərbaycan toponimikasının əsasları. Bakı Universiteti Nəşriyyatı, 1991.
30. *Əhmədov T.* Azərbaycan paleotoponimiyası. Bakı, 1985.
31. *Əyyubov Ə.* Şəkinin iqlimi. Bakı, Elm, 1988.
32. *Əzizov E.* Söz xəzinəsi. Bakı, Maarif, 1995
33. *Faruq Sümər.* Oğuzlar. Bakı, Gənclik, 1992.
34. *Füzuli Bayat.* Oğuz epik ənənəsi və Oğuz kağan dastanı. Bakı, Sabah, 1993.
35. *Göyüşov R.* Arxeologiya və din. Bakı, Azərnəşr, 1965.
36. *Hacıyev T.İ., Vəliyev K.N.* Azərbaycan dili tarixi. Bakı, Maarif, 1983.
37. *Həmidov Ənvər.* Loğmanlar diyarı. Bakı, İşıq, 1991.
38. *Hüseynov Ç.* Fətəli fəthi. Bakı, Yazıçı, 1986.
39. *Xəlilov Pənah.* Kitabi-Dədə Qorqud. Bakı, Gənclik, 1993.
40. *Xəlilova Firəngiz.* Adət və ənənələr. Bakı, Gənclik, 1986.
41. *İsmayılov Mahmud.* Ağ yapıncı. Bakı, Yazıçı, 1979.
42. *İsmayılov M.* Sənin ulu baban. Bakı, Azərb. Dövlət Nəşriyyatı, 1989.
43. *İsmayılov M.* Şəki. Bakı, Azərb. Dövlət Nəşriyyatı, 1982.
44. *İsmayılov M.* Azərbaycan xalqının yaranması. Azərb. Dövlət Nəşriyyatı, 1995.
45. *Kalankatyklu Moisey.* Albaniya tarixi. *Mxitar Qoş.* Alban Salnaməsi. Bakı, Elm, 1993.
46. *Касумова С.И.* Азербайджан в III-VII вв., Баку, Елм, 1993.
47. *Kaşqari Mahmud.* Kitabi-divani-lüğət-it-türk.
48. *Qarayev Yaşar.* Tarix yaxından-uzaqlardan. Bakı, Sabah, 1996.
49. *Qarayev Yaşar.* Azərbaycan folkloru antologiyası (IV), Şəki folkloru, I cild. Bakı, Sədə, 2000.
50. *Qasımlı M.* El güzgüləri, elat söyləmələri. Bakı, Azərnəşr, 1993.
51. *Гейбуллаев Г.А.* Топонимия Азербайджана (историко-етнографическое исследование). Баку, "Елм", 1986.
52. *Qeybullayev Q.Ə.* Azərbaycan toponimlərinin tədqiq edilməsi prinsipləri haqqında. Azərb. SSR EA Xəbərləri. Tarix, Fəlsəfə və Hüquq seriyası, 1976, № 2, s. 83-90.

53. *Qeybullayev Q.Ə.* Azərbaycan türklərinin təşəkkülü tarixindən. Bakı, Azərb. Dövlət Nəşriyyatı, 1994.
54. *Qeybullayev Q.* Qədim türklər və Ermənistan. Bakı, Azərnəşr, 1992.
55. *Quliyev N.A.* Azərbaycanda ailə məişətinin bəzi məsələləri. Bakı, Elm, 1986.
56. *Qumilyov L.N.* Qədim Türklər. Bakı, Gənclik, 1993.
57. *Mahmud İsmayıl, Maya Bağırova.* Şəki xanlığı. Bakı, Azərnəşr, 1997.
58. *Mahmudov U.* Səyyahlar, kəşflər. Bakı, Gənclik, 1985.
59. *Məşədiyev Q.İ.* Zaqafqaziyanın Azərbaycan toponimləri. Bakı, Elm, 1990.
60. *Məşədixanım Nemət.* Azərbaycanda pirlər. Bakı, Azərnəşr, 1992.
61. *Məmmədov Ə.* Şəki alim və ziyalıları. Bakı, Bakı Universiteti Nəşriyyatı, 2001.
62. *Мирзазаде Ч.Х.* Топонимы Азербайджана в средневековых арабеких географических источниках. Баку, "Елм", 1988.
63. *Мирзазаде С.М.* Топонимия северных районов Азербайджана. Баку, Маариф, 1979.
64. *Mollazadə S.M.* Azərbaycan dilində coğrafi adlar necə yaranmışdır? Mühazirəçiyə kömək. Bakı, Elm, 1974.
65. *Mollazadə S.M.* Azərbaycan toponimləri. Bakı, 1985.
66. *Mustafayev İ., Murtuzayev S.* İmam Şamil. Bakı, "Vətən", 1993.
67. *Mustafayev A.* Azərbaycanda şərbaflıq sənəti. Bakı, Elm, 1999.
68. *Mümtaz S.* Azərbaycan ədəbiyyatının qaynaqları. Bakı, Yazıçı, 1986.
69. *Mürşüdova U.B.* Rəşid bəy Əfəndizadə və folklor. Namizədlik dissertasiyası. Şəki, 1997.
70. *Nəbiyev N.* Coğrafi adlar. Bakı, 1982.
71. *Novruzova Cəmilə N.* "Fuad Əbdürrəhmanov". Bakı, "Nurlan"., 2004, 120 səh.
72. *Nuriyev E.B.* Azərbaycan toponimiyasında bitki və heyvan adları. Azərbaycan onomastikasına dair konfransın materialları. Bakı, 1986, s.172-174.
73. *Nuriyev E.B.* Şəki-Zaqatala zonasının bəzi etnotoponimləri haqqında. Azərbaycan SSR EA Xəbərləri. Yer haqqında elmlər seriyası. 1978, №6, s. 100-104.
74. *Nuriyev E.B.* Azərbaycan SSR-nin Şəki-Zaqatala zonasının toponimiyası. Bakı, Elm, 1989.
75. *Rəcəbov Ə., Məmmədov Y.* Orxon-Yenisey abidələri. Bakı, Yazıçı, 1993.
76. *Rəfik Özdək.* Türkün qızıl kitabı. Bakı, Yazıçı, 1992.
77. *Rəşidəddin Fəzullah.* Oğuznamə. Bakı, Azərnəşr, 1992.



78. Селевые явления бассейна р. Кишчай и мероприятия по борьбе с ними. Изд.АН Азерб. ССР, Баку, 1965, с.117.
79. *Seyidov Mirəli.* Azərbaycan mifik təfəkkürünün qaynaqları. Bakı, Yazıçı, 1982.
80. *Seyidov Mirəli.* Azərbaycan xalqının soy kökünü düşünərkən. Bakı, Yazıçı, 1989. səh. 496.
81. *Seyidov Mirəli.* Qam-Şaman və onun qaynaqlarına ümumi baxış. Bakı, Gənclik, 1994.
82. *Seyidov Mirəli.* Göy, ağ, qara rənglərinin əski inamla əlaqəsi. Azərb.SSR EA Xəbərləri (ədəbiyyat, incəsənət, dil ser.) , səh.20-37.
83. *Səfərov Kamandar.* Əbdülqəni Nuxəvinin kolleksiyasında olan əlyazmaları haqqında. Əlyazmalar xəzinəsində (əsərlər), Bakı, Elm, 1976.
84. *Səfərov Kamandar.* Ə.N.Xalisəqarızadənin kitabxanasından tərcümə. Əfqanıstan tarixi. VIII Respublika elmi-nəzəri konfransının materialları. Bakı, Nurlan, 2002. s. 197-200.
85. *Şərifli Kamandar.* "Əbdülqəni Nuxəvi Xalisəqarızadə". Bakı, Nurlan, 2002.
86. *Şahsoylu Beytulla.* "Hərum amazonları- Bərdə sənəmləri", Elm və həyat, 1986, № 10.
87. *Толстой Л.Н.* Хаджи Мурат. Гос. Изд.Художественная литература. Москва, 1938.
88. *Vahabzadə B.* Şənbə gecəsinə gedən yol. Bakı, Azərnəşr. 1991. s. 243-246.
89. *Vəlili (Baharlı).* Azərbaycan coğrafi, təbii, etnoqrafik və iqtisadi mülahizat. Bakı, Azərnəşr. 1993.
90. *Voroşil Q.* Azərbaycan paleotoponimləri antik qaynaqlarda. Azərb. onomastikası problemlərinə dair konfransın materialları. Bakı, 1986, s. 121-124.
91. Yaxşılar yurd salıb yaddaşımızda. Akademik Ə.Sultanov haqqında xatirələr. "Nafta-Press" nəşriyyatı. Bakı, 2001, səh. 81-84.
92. *Yüzbaşov R., Əliyev K., Sədiyev Ş.* Azərbaycanın coğrafi adları. Bakı, Maarif, 1972.
93. *Zəkəriyyə Mabud oğlu.* Əcdadlarımızın tibbi bilikləri deyimlərimizdə. Bakı, İsmayıl Nəşriyyat-Poliqrafiya müəssisəsi, 2002.
94. *Zəkəriyyə Mabud oğlu və Hədiyyə Şəfagül.* Ulularımızdan qalma öyüd-nəsihət və xeyir-dualar. Bakı, Nafta-Press, 2000.

## MÜNDƏRİCAT





# ŞƏKİ VƏ ŞƏKİLİLƏR HAQQINDA FOTOGÖRÜNTÜLƏR



Knyaz Tarкanovun yaşadığı, A.Dümanın Qonaq qaldığı güman olunan ev. 31-ci rayon, Nuxa кüç. 27.



Aşağı Karvansaranın кüçəyə baxan eyvanı



Cəvahir xala.
M.F.Axundovun nəslindən



Nağıbəyov Hacıbala Əbdürrəhman Ağa oğlu -
həkim işlədiyi vaxtlar.





Qazıyevlər soyundan Ənvər Qazızadə
(jurnalist, represiya qurbanı)



Qazi Hüseyn Əfəndi



Məşhur tarzən Əhməd bəy Tahirzadə



Axundov Baxşəli (Əfəndinin)
Fransada oxuduğu vaxtı





Zərgər Əhməd və tacir Mustafa



Umar İsmayılov (baytar həkimi)



İsmayıl Azax oğlu
Şəkinin məşhur sənətkarı börkçü,papaqçı
(papaqçı Qurbanın atası)



Məmmədov Əkbərağa Ağamusa oğlu
1878-ci ildə Şəki şəhərində Anadan olmuşdur





Dadanovlar soyundan
Zeynalabdin Dadanov - 1917-ci il.



Şəkinin XIX əsr ziyalılarından Molla Kazım
(Baxşəli Əfəndinin atası)
(nümunə məktəbi - köhnə 5 saylı - köhnə kişilərin
dini Molla Kazım məktəbi adlanırdı)



Ədəbiyyatşünas, Azərbaycanın tanınmış ziyalısı Firudin bəy Köçərlinin həyat yoldaşı Badisəba xanım Köçərli. Badisəba xanım (ortada, ordenli) Şəкidə uşaq evinin yaradıcısı və öz vəsaiti ilə həmin uşaq evinin təlimatçısı olub. Firudin bəydən qalan və özünün varidatını ancaq bu uşaq evinə sərf etmişdir.

ТИПОГРАФІЯ и ПЕРЕПЛЕТНАЯ
„МЭДЭНІЕТЪ“ (КУЛЬТУРА)
ГАСАНА МУСТАФАЕВА
въ НУХѢ.

مطبعه و جلد خانه مدنیت (قولتورا)
حسن مصطفی یوف
نخو شهرنده

Ağa Həsənin mətbəəsinə məxsus açıqça





Ağa Həsən Hacı Cəlil oğlu Mustafayev (Qozdağarların Şəkidə ilk mətbəə sahibi)



Zərgər İsmayıl (Qullar məhəlləsi)



Tanınmış Şəki milyoneri, xeyriyyəçi
Hacı Məmmədsadıq Əliyev



Milli genefondun qoruyuc, ipək taciri
İsa Heydər oğlu Zeynalov





Yuxarı karvansara, həyətin görünüşü



Alcanbəylərin evində buxarı



Pəriruh Axundzadə
(M.F.Axundovun Nəticəsi, Yaponiyada yaşayır)



Qədimbəyovlar soyundan Əbdürrəhman bəy
(ortada oğlu Əliosmanla birgə)





Şəkinin din xadimləri və ziyalılarının birgə şəkli
(XX əsrin əvvəlləri)



Tanınmış bəylər çar çinovniklərinin iştirakı ilə.
Musa ağanın oğlu Nəzir bəyin toy mərasimində



Hacı Murad



Xalisəqarızadələr soyundan
II Nurməhəmməd əfəndinin oğlu,
şərqşünas Əbdülkərim əfəndi Abdullayev





Professor R.Quliyev



Əkbər ağanın qızı professor Y.Məmmədova
Praqa şəhərində Beynəlxalq konqresdə



Üç Şöhrət Ordenli, II Dünya müharibəsi veteranı, zərgər Süleyman Eldarov



Ə.Əfəndiyevin Qızı Rübabə həkim





Əbdülkərim İmanzadənin həyat yoldaşı, Alcanbəylər soyundan Minəxanım İmanzadə



Əskər ağa (Əkbər ağanın qardaşı) və Hacı Hüseyn bəy (ayaq üstə dayanan)



Abdulla bəy Əfəndiyevin Şəki gimnaziyasının müəllim və tələbə heyətilə birgə şəkli



Rəşid bəy Əfəndiyevin ailəsi





İbad Salmanovun yaratdığı ilk tarzən ansamblı



Şəki bəylərinin üzüm bağlarında məclis



Bığ Əlihüseyn Əfəndiyev



Xalisəqarızadələr soyundan Əbdülkərim əfəndinin oğlu, gözəl fizika-riyaziyyat. Astronomiya müəllimi Yasin-Səbri Abdullayev





Xozeyn Dəllək Kərimlərin zavoduna barama gətirilməsi



Şəki bəyləri - 1920-ci illər.
1. Yuxarıbaşlı Hacı Sofu ağa



Şəki gimnaziyasının müəllim və tələbələri
Xan sarayında



Məşhur neftçi, Sosialist Əməyi Qəhrəmanı,
60-cı illərdə Neft Sənayesi Naziri olmuş
Bəxtiyar Məmmədov





Şəki şəhəri - ümumi görünüş



Şəki qalası Narınqalanın cənub qapısı.
El arasında vaxtilə bulvar kimi tanınan ərazi



Usta Mikayıl
Sandıq, mücrü, beşik və s. sənətkarı



Zərgər Əhmədin düzəltdiyi
Sinəbənd (qadın zinəti)





Yuxarı karvansaranın əsas yoldan görünüşü



Yuxarı Başda Mustafa Əfəndi məscidinin minarəsi



Əslən Hacı Qafarlara məxsus, sonradan Çopurların satın aldığı ev




Ağa Həsənə məxsus vizit кartı





Hacı Musa ağanın mülkü



İsmaylov Tehran Nurəli oğlu



Bığ Əlihüseyn Əfəndiyevin qaynanası -
Körpə Ələkbərin qızı,
Əttar Əbdülsalamın gəlini Kərimə xanım




Gəncəli məhləsindən Əsəddər soyundan
Qızıl Məmməd





Tuz Abidin evinin küçəyə açılan bala qapısı



İsa Zeynalovun evinin içi - buxarı



Çouşların (Gəncəli məhəlləsi)
Hacı Mir Alı babanın evi



Hacı Musa ağanın evinin buxarısı.
Tıkilmə tarixi III əsrə yaxındır.







Çouşların evinin giriş qapısı



Çopurların evinin кüçə qapısı



Qobu məhəlləsindən bir görünüş



Güllüklərin Şirin Həsən qızı Qubba səməni hazırlayarkən





Hazırda Şəkidə yeganə sərraf olan Nəriman Məmmədov



100-dən yuxarı yaşı olan təkaldüz Həsən Hacı Məhəmməd oğlu tərəfindən tikilmişdir. (Usta-zərgər Kərim Əbdül Mənəf uşağı soyundan)



Misgər məmulatı



Duluz qabları



# ŞƏKİDƏ MƏHƏLLƏ ADLARI, SOYLAR VƏ LƏQƏBLƏR

## I KİTAB

(QORUQ ƏRAZİSİ)

Bakı – 2004

Nəşriyyatın direktoru: **Hafiz Abıyev**
Nəşriyyat redaktoru: **Əminə Novruzova**
Korrektor: **Xəlil Nəbiyev**
Cildləyici: **İlyas Cəlilov**
Çapçı: **Mir Cəlal Kazımov**

Çapa imzalanmışdır: 25.06.2004 Həcmi: 21 ç.v. Formatı: 84x108 1/32
Sifariş № 17 Tirajı 550 nüsxə. Qiyməti müqavilə ilə

"Nafta-Press" nəşriyyatının mətbəəsi
Bakı – Az 1143, H.Cavid pr., 29A, tel.: 393972

